# DİNİ SUALLARA CAVABLAR

AYƏTULLAH MƏKARİM ŞİRAZİ

AYƏTULLAH CƏFƏR SÜBHANİ

# Mündəricat

# DİNİ SUALLARA CAVABLAR

## Kitab haqqında

Kitabın adı:Dini suallara cavablar

Müəllif:Ayətullah Cəfər Sübhani və Ayətullah Məkarim Şirazi

Tərcümə edən:Azər Turan

Naşir:Moce-elм

Çap tarixi:٢٠٠٥

Səhifələrin sayı:٢٨٠

Çap növbəsi:Birinci

Tirajı:٣٠٠٠

səh:١

## Ön söz

Kitabın tarixçəsi və məzmunu

Sual təşnə və haqpərəst İnsan ruhunun aşkar bİr təzahürü, təkaмülə doğru bİr .qapıdır

Sual əsrarəngiz və tapмacalarla dolu dünyanın kəşfində insanın əbədi sə'y və axtarışlarının nişanəsidir. Yalnız az мə'luмatlı və elмi мəsələlərdə zəif düşüncəyə мalik .insanlarda suallar yaranмır

Mütərəqqi ayinlər toplusu olan İslaм dini öz ardıcıllarına nəinki sorğu-sual haqqı verir, hətta dini rəhbərlər xalqı мüxtəlif elмi suallar verilмəsinə tə'kidlə də'vət edirlər. İnsanların sualları cavablandırılarkən onların düşüncə, yaddaş, bilik səviyyəsi nəzərə alınмışdır. Dini rəhbərlər öz ardıcıllarının suallarına onların tutuмu səviyyəsində cavab verмişlər. Həмin ilahi insanlardan bu günüмüzə yadigar qalмış cavablar elмli və dəyərli .hekayələrin suallarına verilмiş cavablardır

***

İslaм мəktəbi" adlı elмi-dini jurnal мətbuat həyatına qədəм qoyduğu gündən ona" saysız-hesabsız suallar ünvanlandı. Günbəgün artan suallara həмin jurnalda cavab verмək мüмkün olмadığından, eləcə də bə'zi suallar geniş oxucu kütlələri üçün əhəмiyyət daşıмadığından bir çox suallara ayrıca bir kitabda cavab verмək qərarına .gəldik

.Aммa haмı üçün faydalı olası cavablar həмin jurnalda tədricən cavablandırıldı

***

Həмin мaraqlı suallar və cavablar dörd cildlik kitabça şəklində "Dəftəre-entişarate-nəsle-cəvan" мüəssisəsi tərəfindən dəfələrlə çap olunмuşdur. İndi isə həмin kitabçalar .yenidən nəzərdən keçirilərək bir cilddə toplanмışdır

Nəzərinizə çatdırıм ki, uyğun suallardan bir hissəsinin cavabını "Ön söz"ün мüəllifi, digər bir hissəsinin cavabını isə əziz qardaşıм cənab Cə'fər Sübhani hazırlaмışdır. .Oxşar suallar qruplaşdırıldıqdan sonra əlinizdəki kitab ərsəyə gəlмişdir

Bəli, bə’zi suallara olduqca müxtəsər şəkildə cavab verilmişdir. Amma belə edilməsəydi, .nəzərdə tutduğumuz bir cild kitab çoxcildli olardı

.Ümid edirik ki, bu kitab dini suallara əsaslı cavab axtaran insanlara yardımçı olacaq

Qum elmi hövzəsi

Nasir Məkarim Şirazi

rəcəb ,١۴١٨

!Diqqət

İstənilən bir qeydinizi və yeni sualları aşağıdakı ünvana göndərməyinizi xahiş edirik: İ.İ.R, Qum, Xiyabane-Şohəda, Mətbuati hədəf

## Birinci hissə. Allahşünaslıq və Allahın sifətlərİ

### ?Necə ola bilər ki, “fəna və yoxluq” “vücud və varlığın” mənşəsi və başlanğıcı olsun .١

Sual: Allahpərəstlər bu əqidədədirlər ki, Allah-təala varlıq aləmini heçdən yaradıb. ?Məgər “yoxluq” “varlığın”, “fəna” “vücudun” mənşəsi ola bilərmi

Cavab: Yuxarıdakı sual materialistlərin iradlarındandır. Materialistlər maddəni qədim və əzəli qəbul etdiklərindən uyğun iradı allahpərəstlərə doğru yönəldərək deyirlər: əgər maddə sonradan əmələ gəlmişdirsə, nədən əmələ gəlmişdir və “varlıq” “heç”dən yarana ?bilərmi

Uyğun sualın cavabında öncə qeyd etməliyik ki, materialistlər allahpərəstlərin “Allah varlıq aləmini heçdən yaratdı” sözlərini düzgün anlamamışlar. Onlar “heçdən”, “yoxdan” kəlmələrini “ağacdan”, “dəmirdən” sözləri kimi qəbul etmişlər. Allahın dünyanı heçdən yaratması hər hansı bir əşyanın “dəmirdən” və ya “daşdan” yaradılması mə’nasını daşımır. Əgər deyilirsə ki, pəncərə ağacdan, maşın dəmirdən, divar daşdan düzəldilmişdir, nəzərdə tutulur ki, burada ağac, dəmir və daş hansısa əşyaları təşkil edən maddələrdir. Hansı ki, ilahi fəlsəfədə “varlıq aləmi heçdən vücuda gəlmişdir” deyilərkən nəzərdə tutulmur ki, varlıq aləminin tərkibini həmin heçlik təşkil edir.

Allahpərəstlər bu ifadə ilə bildirmək istəyirlər ki, varlıq aləmi nə vaxtsa olmamış və sonradan yaradılmışdır. Yə'ni nəzərdə tutulmur ki, varlıq aləminin yaranışında .“yoxluğun” rolu olmuşdur

Daha sadə desək, materialistlər maddəni əzəli, qədim, ilkin bilirlərsə, allahpərəstlər bunun əksini düşünürlər. Yə'ni allahpərəstlərin fikrincə, materiya, bütün atomlar və zərrələr sonradan yaranmışdır. Belə bir misal çəkək: varlıq aləmini bir kitaba bənzətsək, onu geriyə vərəqlədikcə nə vaxtsa sona çatdığına şahid olarıq. Yə'ni nə vaxtsa

ci, nə vaxtsa ١٠٠-cü, nə vaxtsa ١٠-cu və nəhayət ١-ci səhifəyə çatır, görürük ki,-١٠٠٠ həmin bu ١-ci səhifədən qabaq heç nə yoxdur. Uyğun irada cavab olaraq deyilənlər kifayət edər. Eyni iradı materialistlərə də ünvanlaya bilərik. Əslində materialistlər varlıq aləmini təşkil edən atomları ilkin hesab edirlər. Yə'ni hansısa cisim yox, bu cismi təşkil edən zərrələr əzəli sayılır. Cisimlər, formalar isə sonradan yaranmışdır. Demək, .gördüyümüz növbənöv surətlər əslində sonradan, bir növ "yoxdan" yaranmışdır

Məsələn, saysız-hesabsız canlılar və bitkilərin hər biri xüsusi formaya malikdir. Onların vücudları çoxsaylı atomlardan təşkil olunmuşdur. Materialistlərin ilkin hesab etdikləri cisim yox, bu cismi təşkil edən atomlardır. Varlıq aləmində mövcud olan canlılar və cansızlar isə həmin zərrələrdən sonralar vücuda gəlmişlər. Yə'ni bir vaxt olmamış və .sonradan yaranmışlar

Digər bir misal: əlinizə qələm götürüb lövhədə hər hansı bir şəkil çəkin. Bu şəkil əlinizdəki qələmin içindəki maddədən hasil oldu. Həmin maddə əvvəlcə də var idi. Çəkdiyiniz şəkil isə sonradan yarandı. Beləcə, materialistlərə onların öz sualı ilə müraciət edirik: necə olur ki, müxtəlif surətlər heçdən yaranır? Materialistlərin bu suala .cavabını, bizə verdikləri sualın cavabı kimi qaytara bilərik

***

### ?Varlıq aləmİndəkİ nİzam onun xəlq edİlməsİ dəlİlİ ola bİlərmİ .٢

Sual: Allahın varlığının sübutu zamanı gətirilən ən aydın dəlil varlıq aləminə hakim olan nizamdır. Yə'ni bu nizamlı quruluşdan belə bir nəticəyə gəlirik ki, varlıq aləmini nəzmə çəkən, nizamlayan vardır. Biz də öz dünya həyatımızda çalışaraq nizam yaradırıq. Amma belə bir qənaətə gəlmək olmaz ki, bu dünyada mövcud olan nizam vücudların xəlq .edilmə dəlilidir

Cavab: Qeyd olunduğu kimi, Allah-təalanın varlığına ən aydın sübut varlıq aləminin obyektiv nizamlı quruluşa malik olmasıdır. Kainatın hansı

nöqtəsinə nəzər salsaq, ölçü və nizamla rastlaşarıq. Nizamlı quruluşa malik olan hər bir .mövcud alim və qadir bir yaradıcıdan danışır

Varlıq aləmini idarə edən və ona nəzm verən yaradıcının onu heçdən yaratması ayrıca bir mövzudur. Bu mövzu allahşünaslıq bəhslərində maddənin əzəli olmaması yolu isə sübut edilmişdir. Maddənin əzəli ola bilməməsi sübuta yetdikdən sonra aydın olur ki, maddə kiminsə tərəfindən yaradılmışdır. Demək, nizamlı quruluş dəlili yalnız Allahın hakimiyyətini sübut etmək üçündür. Amma varlıq aləminin heçdən yaranması maddənin .əzəli olmaması yolu ilə sübuta yetirilir

Fəlsəfədə maddənin sonradan yaranması fəlsəfi dəlillərlə sübuta yetirilmişdir. Termodinamikanın ikinci qanununun kəşfindən sonra (varlıq aləminin, eləcə də mövcudların hərarətinin düşməsi) maddənin sonradan yaranması təbiət elmlərinin qəti .qənaətlərindən biri oldu

**Bu mövzuda xülasə bİr söhbət**

Maddənin sonradan yaranmasını təbiət elmləri vasitəsi ilə ilkin sübut edən şəxs İsaak Nyuton olmuşdur. O öz mütaliələrindən belə bir nəticəyə gəlmişdir ki, varlıq aləmi nizamdan nizamsızlığa doğru hərəkətdədir və elə bir gün gələcək ki, bütün cisimlərin hərarətləri bərabərləşəcək. Nyuton deyilənlərə əsaslanaraq, qərara gəlmişdir ki, varlıq aləmi sonradan yaranmışdır. Onun temperatur, hərarətlə bağlı araşdırmalarından mə’lum olmuşdur ki, temperatur dəyişiklikləri zamanı onun bir hissəsi istifadəsiz şəkilə düşür, yə’ni itkiyə gedir. İtkiyə getmiş enerjini yenidən yararlı vəziyyətə qaytarmaq .mümkünsüzdür. Termodinamikanın ikinci qanunu yuxarıda deyilənləri təsdiqləyir

Məşhur Avstriya fiziki Lüdviq Boltsman öz dərin düşüncəsi və geniş riyazi mə’lumatı sayəsində müəyyənləşdirdi ki, termodinamikanın ikinci qanunu hərəkət və ötürmələr zamanı ümumi nizamın bir hissəsinin itməsini göstərir. Ümumi gedişatda enerjinin bir .qisminin itməsi ilə zərrələrdəki nizamın da müəyyən hissəsi itirilir

Termodinamika enerjinin çevrilməsinin ümumi qanunlarını öyrənən elmdir. Termodinamikanın birinci qanununa görə qapalı sistemdə enerji saxlanılır və bir növdən o birinə çevrilir. Söhbətimizdə xatırladığımız termodinamikanın ikinci qanunu həm də “entropiya” qanunu adlanır. Bu qanuna görə istilik işə çevrilərkən ona məhdudiyyət qoyulur, yə’ni itki labüddür. Termodinamikanın üçüncü qanununa əsasən, mütləq sıfır almaq mümkünsüzdür. Söhbətimizdə entropiya, yə’ni termodinamikanın ikinci qanununu nəzərdən keçiririk. Bu qanunua görə istilik isti cisimdən soyuq cismə doğru .hərəkətdədir. Bu cərəyan özbaşına, nizamsız gerçəkləşmir

Əslində entropiya istifadəyə yararlı enerjinin istifadəyə yararsız enerjiyə nisbətidir. Digər bir tərəfdən entropiya artmaqdadır. Əgər varlıq aləmi əzəli, başlanğıcsız olsaydı, çox-çox qədimdən cisimlərin hərarəti bərabərləşərdi və istifadəyə yararlı enerji qalmazdı. Nəticədə heç bir kimyəvi reaksiya getməz, həyat davam tapmazdı. Amma .gördüyümüz kimi, kimyəvi reaksiyalar gedir, həyat çağlayır

Nəticə: həyat elə bir istiqamətdə dəyişir ki, getdikcə cisimlər hərarətini itirir və yararlı enerjilər tükənir. Əgər varlıq aləmi əzəli, başlanğıcsız olsaydı, bütün enerji mənbələri, eləcədə günəşin enerjisi çoxdan tükənməli idi. Eyni zamanda günəş sistemində olan bütün planetlər, eləcə də yer kürəsi müdhiş ölümə məhkum olmalı, heç bir radioaktivlik .müşahidə edilməməli idi

***

**?Bunca məhdud bİlİklə qeyrİ–məhdud aləmİ nİzamlı hesab edə bİlərİkmİ .۳**

Sual: Siz materialistlərin dünyadakı nizamsızlıqlar haqqında suallarına belə cavab verirsiniz: “Dünyanı və ya onun bir hissəsini o şəxs nizamsız saya bilər ki, yaranışın bütün sirlərindən agah olsun. Hansı ki, bəşəriyyətin bilmədikləri onun bildikləri ilə müqayisədə heçə bərabərdir.” Amma unutmayın ki, materialistlər də həmin bu sözlərlə dünyanın nizamlı olması iddianıza qarşı hücum edə bilərlər. Deyə bilərlər ki, yalnız bütün

varlıq aləminin sirlərindən xəbərdar insan onun nizamı haqqında danışa bilər və belə bir ?məhdud biliklə qeyri-məhdud aləmi necə nizamlı saymaq olar

Cavab: Biz qətiyyən bu fikirdə deyilik ki, elmin yüksək inkişafı sayəsində dünyanın bütün sirləri açılmış və varlıq aləminin bütün müəmmaları öz həllini tapmışdır. Alimlər bu fikirdədirlər ki, bəşəriyyətin mə'lumatı artdıqca məchulların da sayı artır. Biz də bu fikirlə şərikik. Sadəcə, sübut etmək istəyirik ki, dünyaya heyrətamiz bir nizam hakimdir. Hələ ki, elm üçün qaranlıq qalmış məsələlər haqqında mühakimə yürütmürük. Bu fikirdəyik ki, elmin işıqlandıra bildiyi dairədə ciddi nəzm və ölçü hakimdir. Bəşəriyyətin bilik dairəsi onun bilmədikləri ilə müqayisədə olduqca cüz'i olsa da, bu dairə öz-özlüyündə xeyli .genişdir

Uyğun dairə alim və hikmətli Allahın vücudunun isbatı üçün kifayət edir. Elmin işıqlandırdığı milyardlarca nizamı təsadüfi və şüurdan kənar hesab edə bilmərik. Əksinə, .bizim üçün işıqlanmış bu dairə varlıq aləminin bir hissəsi kimi qəbul olunmalıdır

Məsələni aydınlaşdırmaq üçün bir misal çəkək. Təsəvvür edək ki, uzaq keçmişə aid olan bir sərdabədən çox qalın bir kitab tapılmışdır. İllər uzunu zəhmət çəkdikdən, bir çox mütəxəssis və ədəbiyyatlardan istifadə etdikdən sonra həmin bu kitabın yalnız bir neçə səhifəsini oxuya bilmişik. Əmin olmuşuq ki, bu kitabın həmin səhifələrində, həmin səhifələrin hər kəlməsində böyük həqiqətlər açıqlanır. Bu kitabın qalan hissəsindən xəbərsiz olsaq da, oxuduğumuz səhifələrdən belə bir nəticə çıxarırıq ki, kitab başdan-başa hikmətlə doludur. Oxuduğumuz səhifələri əsas götürərək kitabın çox böyük bir alimə məxsus olması qənaətinə gəlirik. Hikmətlə dolu səhifələrdən mə'lum olur ki, kitabın oxunmamış səhifələrində minlərlə elmi həqiqətlər mövcuddur, sadəcə, həmin həqiqətlərə .hələ ki yol tapa bilməmişik

***

## ?Allah–təalanın zatını dərk etmək mümkündürmü .۴

Sual: Varlıq aləminin yaradıcısının zatı məhduddur, yoxsa qeyri-məhdud? Bundan əlavə, öz vəzifələrimizə münasibətdə ağıl və düşüncəmiz məhduddur, yoxsa yox? Görən ?məhdud bir vücud qeyri-məhdud vücudun necəliyini dərk edə bilərmi

Cavab: Uyğun sual və şübhələrin cavabında əziz oxucuların diqqətini bir neçə məsələyə .yönəldirik

Allahşünaslıq və Allahın sifətləri bəhslərində sübut olunmuşdur ki, Allah-təala "nəhayətsizlikdə nəhayətsiz" bir vücuddur. Yə'ni O bütün baxımlardan sonsuz və qeyri-məhduddur. Həm vücud, həm elm və qüdrət, həm zaman və məkan baxımından məhdud deyil. Allahın olmadığı zaman və məkan mövcud deyildir. Allahın bilmədiyi həqiqət, görə .bilmədiyi iş yoxdur

Beləcə, Allah-təala varlıq aləmində mütləq, qeyri-məhdud və sonsuz bir varlıqdır. Bu məsələ Allahın sifətləri ilə bağlı bütün bəhslərin əsası sayılır. Alimlər Allah-təalanın bir .çox sifətlərini həmin bu əsasa istinad etməklə sübuta yetirmişlər

Allahın vücudundan savay varlıq aləmindəki bütün şeylər məhduddur. Bu məhdudluq .həm zaman və məkan, həm də digər cəhətlərdən ola bilər

Aydın məsələdir ki, məhdud bir vücud qeyri-məhdud bir vücudu heç zaman dərk edə bilməz. Ona görə də qeyd olunur ki, Allah-təalanın müqəddəs zatının dərki bəşəriyyət üçün qeyri-mümkündür. Biz həmin varlıq haqqında müəyyən mə'lumatlara malikik. Bilirik ki, O var, elm və qüdrət sahibidir və bütün kamal sifətlərinə malikdir. Amma Onun varlığının elm və qüdrət xüsusiyyətlərindən xəbərsizik. Bizim üçün təkcə Onun zatı yox, həm də ətrafımızdakı bir çox həqiqətlər məchuldur. Hələ ki, bəşəriyyət həyat və yaşayışın mahiyyətini dərk etməmişdir. Bir çox mövcudların mahiyyəti bizim üçün qaranlıqdır. Biz bu varlıqları yalnız onların xüsusiyyətlərinə görə tanıyırıq. Varlıq aləmindəki bütün mövcudların mahiyyətinin dərk olunmasını məhdud bəşəriyyətdən .gözləmək yersizdir

Əslində bizim düşüncə səviyyəmiz bir cam, Allahın qeyri-məhdud zatı isə bir okean kimidir. Məgər okeanı cama yerləşdirmək olarmı?!

Heç bir vücud öz mühitini dərk edə bilməz. Məgər bətndəki körpə öz anası haqqında düzgün təsəvvürə malik ola bilərmi?! Əlbəttə ki, yox! Onların hər ikisi məhdud da olsa, biri "muhat" (mühitdə olan), o birisi isə mühitdir. Təbii ki, qeyri-məhdud Allahın zatının dərk olunmasını məhdud insandan gözləməyə dəyməz.

## ۵. Allah enerjİdİrmİ?

Sual: Bə'ziləri deyirlər ki, Allah hər yerdə olan, görünməyən və bütün mövcudları xəlq etmiş enerjidir. Belə bir tə'rifi düzgün saymaq olarmı?

Cavab: Allah-təalanı "enerji" adlandırmaq heç vəchlə düzgün sayıla bilməz. Belə bir yanaşma nəticəsində "Allah"la "təbiət" məfhumları səhv salına bilər. Allah bütün cəhətlərdən sonsuz bir vücuddur. O hər yerdə var və təbii mövcudların sifətlərinə malik deyil. İslam alimləri əqidə və din kitablarında dəfələrlə xatırlatmışlar ki, Allahı hər növ maddi xüsusiyyətlərdən uzaq bilmək üçün "cisim" və "maddə" qoxusu gələn kəlmələrdən çəkinmək lazımdır. Bu baxımdan, Allaha münasibətdə "enerji" kəlməsinin də işlədilməsi yanlışdır. Ona görə də deməliyik ki, Allah-təala enerji deyil, maddə və enerjidən üstündür, eləcə də, onların yaradıcısıdır.

***

səh:۸

### ?Nə üçün kamİl tövhİd Allahı sİfətlərdən uzaq bİlməkdİr .۶

Sual: “Nəhcül-bəlağə”nin birinci xütbəsində Əmirəl-mö’minindən (ə) nəql olunmuşdur: “Kamil tövhid Allaha münasibətdə ixlaslı olmaqdır və kamil ixlas Allahı sifətlərdən uzaq ?bilməkdir.” Nə kamal tövhid, Allahın birliyi Onu sifətlərdən uzaq bilməklə şərtləndirilir

Cavab: Bu məsələ Əmirəl-mö’mininin (ə) digər bir kəlamında öz sübutunu tapmışdır: Allahın sifətləri eynən onun pak zatıdır. İnsanların sifətləri (xüsusiyyətləri) isə onların zatı ilə eyni deyil. Yə’ni insanın zatı (mahiyyəti, cövhəri, mayası) bir şeydir, sifətləri isə zatından ayrı bir şey. Məsələn, elm insanın zatına əlavə olunmuş bir sifətdir. Allahın sifətləri isə belə deyil. Yə’ni Onun elmi eynən zatıdır. Başqa sözlə, Allahın zatı bütünlüklə elm, qüdrət, həyatdır. Məhz bu baxımdan Həzrət (ə) kamil tövhid və ixlası Allahı sifətlərdən uzaq bilməkdə görür. Yə’ni Allahın sifətləri Onun zatından ayrı deyil və .Onun sifətləri eynən Onun zatıdır

Biz insanlar dünyaya alim kimi gəlmirik və tədricən elm əldə edirik. DeməK, elm bizim zatımızda deyil, daha doğrusu, eynən zatımız deyil. Hətta bə’zi zati biliklərimiz də vücudumuzun yalnız bir hissəsini təşkil edir. Malik olduğumuz güc və qüdrət də belədir. İnsan öz beyni və ruhu ilə bir həqiqəti dərk edir, əzələlərindəki güc vasitəsi ilə isə ağır daşı yerdən qaldırır. Bu baxımdan güc və qüdrət bir-birlərinin eyni deyildir. Hər iki sifət .insana aid olsa da, onun zatında, vücudunda ayrı-ayrı guşələri əhatə edir

Allah-təalanın isə zatı eynən elm, qüdrət, idrakdır. Yə’ni Onun zatının bir hissəsini elm, digər bir hissəsini qüdrət təşkil etmir. Onun zatı büsbütün elm və qüdrətdən ibarətdir. .Beləcə, Allahın qüdrəti Onun elmi ilə eynidir

Olsun ki, bu məsələni qəbul etməkdə bə’ziləri çətinlik çəkə. Deyilənləri qeyri-mümkün hesab edənlər də tapıla bilər. İnsanın zatı və sifətləri eyni olmadığından o bu həqiqətləri dərk etməkdə çətinlik çəkir. İnsandakı sifətlər onun vücudunda müxtəlif guşələri tutur, bə’zən isə bir-birləri ilə müxalif olurlar. Ona görə də insan zat ilə sifətin .eyniliyini çətinliklə qavrayır

Yenə də məsələni aydınlaşdırmaq üçün misallar çəkməyə məcburuq: nur və onun şüalarını təsəvvürünüzdə canlandırın. Bu nur sayəsində nələrsə aydın görünür. Demək, nurun sifətlərindən, xüsusiyyətlərindən biri aşkarlamaq, aydınlaşdırmaqdır. Maraqlıdır ki, bu xüsusiyyət nurun vücudunda xüsusi bir yer tuturmu? Yoxsa nur yalnız ?aydınlaşdırma xüsusiyyətindən ibarətdir

Digər bir misal: tövhid dəlillərindən mə’lum olur ki, biz Allahın xilqətiyik və O bizim xaliqimizdir. Allahın elmi haqqındakı ötən söhbətlərimizdən aydın olur ki, biz Allahın .“mə’lumu”yuq. Yə’ni Allahın bizim vücudumuzda elmi vardır

Sual oluna bilər ki, bizim “məxluq” və “mə’lum” olmağımızın hər biri vücudumuzda xüsusi bir guşə təşkil edirmi? Cavab aydındır: vücudumuz başdan-başa Onun məxluqu və mə’lumudur. Demək, insanın məxluqluq və mə’lumluq sifətləri onun bütün vücudunu .əhatə edir, başqa sözlə, onun zatı ilə müttəhiddir, birdir

Bu misalları çəkməkdə məqsədimiz sifətin zat ilə eyni olması haqqında təsəvvür (yaratmaqdır.(١

***

## ?Allahı kİm yaradıb .٧

Sual: Bu sual təəccüblü də görünə bilər. Məşhur ingilis filosofu Bertran Rassel (١٨٧٢-١٩٧٠) yazır: “Gənclik dövründə Allaha inanırdım və ən güclü dəlilim bu idi ki, ətrafda müşahidə etdiklərimin hər birinin səbəbi var. Səbəblər zəncirini halqa-halqa tutaraq irəliləsək və ilkin halqaya çatsaq, bu halqanın Allah olduğunu görərik. Amma sonradan bu əqidəmdən daşındım. Düşündüm ki, hər bir vücudun səbəbi və yaradanı varsa, ”.allahın da səbəbi və yaradanı olmalıdır

?Bu iradın ən qısa və aydın cavabı nədir

Cavab: Qeyd etməliyik ki, uyğun irad materialistlərin ən məşhur və ən ibtidai iradlarındandır. Onlar sual verirlər ki, hər şeyi Allah yaratmışdırsa, bəs Allahı kim ?yaratmışdır

---

Daha dərin мə`luмat əldə etмək üçün “Xuda ra çe qune beşenasiм?” kitabına)[۱] -۱
.(мüraciət edin

Bəs necə olmuşdur ki, cənab Rassel çox-çox sonralar bu iradı əsas götürmüşdür? Bir .şey aydındır ki, uyğun sual çoxlarını düşündürür və bu suala konkret cavab verilməlidir

:Bir neçə mühüm məsələyə diqqət yetirdikdən sonra uyğun sualın cavabı aydınlaşır

Materialistlər uyğun sualı allahpərəstlərə ünvanlayaraq yaxalarını kənara çəkirlər. Hansı ki, allahpərəstlər dönüb materialist olsalar da, uyğun sual gündəmdə qalır və ona cavab vermək lazım gəlir. Əqidəni dəyişməklə bu sualdan yaxa qurtarmaq mümkünsüzdür. Çünki materialistlər də səbəblər qanununu qəbul edirlər. Onlar da inanırlar ki, təbiətdə mövcud olan şeylərin səbəbləri vardır. Demək, uyğun sual materialistlərə də ünvanlana bilər. Soruşa bilərik ki, hər şey maddədən yaranmışdırsa, ?bəs maddə nədən yaranmışdır

Səbəblər zəncirinin nəhayətsiz olmadığını nəzərə almaqla istər idealist, istərsə də materialist filosofların hər biri əbədi və əzəli bir vücudun varlığına inanmışlar. Sadəcə, materialistlər iddia edirlər ki, həmin əzəli vücud maddədir, allahpərəstlər isə həmin varlığın Allah olduğunu bildirirlər. Aydın olur ki, cənab Rassel Allaha e'tiqadından daşınsa da, hansısa əzəli bir varlığın mövcudluğunu qəbul etmişdir. Həmin əzəli varlığın isə səbəbi, yaradıcısı yoxdur! Nə üçün? Çünki əzəli varlıq həmişə olmuşdur və həmişə olan varlığın səbəbə ehtiyacı yoxdur. Yalnız sonradan yaranmış varlıqlar səbəbə .ehtiyaclıdır. Bu nöqtələrə diqqətlə yanaşın

Demək, əzəli və əbədi bir mövcudun varlığı hamı tərəfindən qəbul olunmuş və əqli dəlillərlə əsaslandırılmış bir həqiqətdir. Səbəblər zəncirinin sonsuzluğunun qeyri-.mümkünlüyü filosofları əzəli bir varlığa, e'tiqada vadar etmişdir

Mə'lum olur ki, ilahi filosoflarla materialist filosoflar arasındakı ixtilaf, cənab Rasselin düşündüyü kimi, "səbəblər səbəbinin" qəbul olunub-olunmaması deyil. Əslində həm idealistlər, həm də materialistlər səbəblər səbəbini, yə'ni ilkin səbəbi yekdil olaraq .qəbul edirlər

Bəs bu iki baxış arasındakı fərq nədir? Uyğun baxışlar arasındakı ən mühüm fərq odur ki, allahpərəstlər həmin ilkin səbəbi elm və iradə sahibi kimi tanıyır, onu “Allah” adlandırırlar. Materialistlər isə həmin səbəbi elm və iradəsiz bilir, onun “maddə”, .“materiya” olduğuna inanırlar

Bəs necə olmuşdur ki, hamının qəbul etdiyi ilkin səbəb məfhumu cənab Rasselə qaranlıq qalmışdır? Şübhəsiz ki, riyaziyyat və sosialogiya üzrə mütəxəssis olan Rassel dini və ilkin fəlsəfi məsələlərdən yetərincə mə’lumatlı olmamışdır. Uyğun incəlikləri duymaq üçün .ilkin fəlsəfə, yə’ni varlıq və onun başlanğıcı mövzusu ilə tanışlıq zəruridir

Deyilənlərdən mə’lum olur ki, ilahi filosofla Allahın varlığını sübut etmək üçün “səbəblər səbəbi” dəlilinə istinad etmirlər. Çünki bu dəlil vasitəsi ilə yalnız əzəli varlığın .mövcudluğuna inanmaq olar. Əslində materialistlər də belə bir varlığı inkar etmirlər

İlahi filosoflar üçün əsas məsələ ilkin səbəbi sübuta yetirdikdən sonra ilkin səbəbin elm və idrak sahibi olduğunu sübut etməkdir. İlkin səbəbin maddə kimi şüursuz yox, elm və qüdrət sahibi olduğunu sübuta yetirmək üçün ən asan yol varlıq aləmindəki nizamın, .yaranış əsrarəngizliyinin, varlıq aləminə hakim olan dəqiq qanunların öyrənilməsidir

.Yuxarıda deyilənlər uyğun sualın cavablarından biridir

***

Diqqət yetiriləsi digər bir məsələ budur ki, uyğun iradın əsasını hər bir mövcudun səbəb və yaradıcıya ehtiyaclı olması məsələsi təşkil edir. Hansı ki, bu qanun yalnız əzəli olmayan, yə’ni sonradan mövcud olmuş varlıqlara aid edilə bilər. Bu incəlikləri ötəri bir .baxışla duymaq mümkünsüzdür

Təbii ki, hər bir mövcudun yaranması üçün xarakter səbəblər olmuşdur. Məsələn, Laplasın (۱۷۴۹-۱۸۲۷) fərziyyəsinə görə, yer kürəsinin günəşdən qopmasının hansısa .səciyyəvi səbəbləri vardır. Həmin səbəblər tam aydın olmasa da, hər halda həqiqətdir

İlk bitki, ilk heyvan, ilk insanın yaranışının da özünəməxsus amilləri olmuşdur. Alimlər bu səbəbləri tarix boyu araşdırmışlar. Əgər varlıq aləmindəki mövcudların yaranmasını səbəbsiz hesab etsək, belə bir sual yaranar ki, nə üçün hər hansı bir varlığın yaranışı xüsusi bir dövrə təsadüf etmişdir? Nə üçün bir qrup canlı milyon, digər bir qrup canlı isə ١٠٠ min il bundan öncə yaşamışdır? Hər hansı bir varlığın bütün dövrlərdə mövcud olmasına nə mane olur? Belə bir nəticə çıxarmaq olar ki, varlığın yaranması üçün xüsusi bir dövrün müəyyənləşməsi səbəblərin mövucdluğunun ən gözəl dəlilidir. Əgər bir varlıq .milyon il öncə yaranmışdırsa, demək, bu yaranış üçün konkret səbəblər olmuşdur

Amma əzəli və əbədi olan bir varlıq (bu varlığı "Allah" və ya "materiya" adlandırmağımızdan asılı olmayaraq) heç bir səbəbə ehtiyaclı deyil. Onun yaranış tarixi .müəyyən edilmədiyindən heç bir yaradıcıya ehtiyac yoxdur

Əzəli və əbədi olan bir varlığın mövcudluğu onun zatından, bir növ özündən .qaynaqlanır. Belə bir varlıq özündən kənardakı yaradıcıdan ehtiyacsızdır

Hər bir canlı, torpaq və səma, bütün günəş sistemi və sair mövcudlar əzəli və əbədi olmadığından yaradıcıya ehtiyaclıdır. Səbəblər səbəbinin, ilkin səbəbin varlığı isə onun .öz zatından doğur

***

### Aydın bir misal

Filosoflar uyğun məsələnin aydınlaşdırılması üçün belə bir misal çəkirlər: otağımıza nəzər salıb, onun işıqlı olduğunu görürük. Özümüzdən soruşuruq ki, gördüyümüz işıq otağın özündəndirmi? Dərhal da özümüzə cavab veririk ki, xeyr, əgər işıq otağın özündən olsaydı, otaq heç vaxt qaranlıqlaşmazdı. O isə bə'zən işıqlıdır, bə'zən isə .qaranlıq

Tezliklə belə bir nəticəyə gəlirik ki, otaq onda şüalanan nur zərrələri vasitəsi ilə işıqlanır. Başqa bir sual yaranır: bəs bu nur zərrələri haradandır? Bir qədər düşündükdən sonra belə-bir cavab tapırıq ki, nur zərrələrinin işığı onun zatından doğur və həmin zərrələrdə nuraniyyət

xüsusiyyəti var. Varlıq aləmində elə bir nur zərrəsi tapmaq olmaz ki, o, qaranlıq olmuş olsun və işığı başqasından alsın. Nur zərrəsi harada olursa olsun, işıqlıdır və işıq onun .zatından doğur

Nur zərrəsi məhv ola bilər, amma qaranlıq varlığa çevrilə bilməz. Bəs hər hansı fəzanın işıqlanma səbəbi nurdursa, nurun işıqlanma səbəbi nədir? Dərhal cavab verə bilərik ki, nurun işığı onun öz vücudundadır. Analoji olaraq “hər şeyi Allah yaratmışdırsa, bəs Allahı kim yaratmışdır” sualına belə cavab vermək olar: Onun varlığı zatından, özündən .doğur

**?Allah–təala gələcəkdə olası hadİsələrİ necə bİlİr .۸**

Sual: Allahşünaslıq bəhsində Allahın elmi haqqında deyilirdi: “Allah-təala gələcəkdə baş verəsi, keçmişdə baş vermiş və hazırda baş verən bütün hadisələrdən eyni dərəcədə xəbərdardır, onun xəbərsiz olduğu məsələ yoxdur. Onun elmi bütün hadisələrə münasibətdə “hüzuri” elmdir, yə’ni bütün hadisələr Onun hüzurunda baş verir. Keçmişin, bu günün, gələcəyin hadisələri ilə Allah arasında heç bir pərdə yoxdur.” Allahın keçmişdən və bu gündən xəbərdarlığını asanlıqla qəbul etmək olur. Amma gələcəkdə baş verəsi hadisələrə münasibətdə problem yaranır. Axı hələ ki, baş verməmiş bir ?hadisə Allahın hüzurunda necə mə’lum ola bilər

Cavab: Uyğun suallara allahşünaslıq bəhslərində yetərincə cavab verilmişdir. Keçmiş, bu gün, gələcək kimi məfhumlar məhdud düşüncəli və məhdud varlıqlı insana aiddir. İnsanın vücudu zaman və məkan baxımından məhduddur. Əgər insan vardırsa, bu varlığın konkret zamanı və məkanı vardır. İnsanın məkanca məhdud olması onun üçün “yaxın, uzaq”, zamanca məhdud olması isə “keçmiş, bu gün, gələcək” kimi məfhumlar yaradır. Əgər vücudumuz bütün varlıq aləmini tutmuş olsaydı, bizim üçün “yaxın, uzaq” !?məfhumlarının əhəmiyyəti olardımı

İnsanın zamanca məhdud oması “keçmiş, bu gün, gələcək” kimi məfhumlar ortaya çıxarır. “İndi” dedikdə yaşadığımız anı nəzərdə tuturuq. “Keçmiş” “indidən” əvvəlki, “gələcək” isə “indidən” sonrakı ömür dönəmimizdir. Deməkt, hər üç məfhum üçün miqyas insanın .özüdür

Məsələn, bizim üçün keçmiş sayılan bir dövr, keçmişdə yaşamış insanlar üçün bu gün .sayılmışdır. Eləcə də, keçmişdəki insanların gələcək saydığı dövr bizim üçün bu gündür

Bəli, zaman və məkanca qeyri-məhdud bir varlıq üçün bu məfhumların mə’nası yoxdur. Onun üçün keçmiş də, bu gün də, gələcək də eynidir. O hər dövrü görür və hər andan .xəbərdardır

Məsələn, yol kənarındakı otağın divarındakı dəlikdən yola baxan insan yoldan ötən karvandakı dəvələri bir-bir görə bilir. Onun baxış borusu məhdud olduğundan düşüncəsində keçmiş, indi, gələcək məfhumları yarır. Bu adam üçün gördüyü dəvədən əvvəlki dəvə “keçmiş”, sonrakı dəvə isə “gələcəkdir”. Amma otaqdan bayırda durub, .karvanı müşahidə edən adam üçün bütün dəvələr eyni zamanda hərəkət edir

Başqa sözlə, zaman və məkandan ucada duran varlıq üçün bütün hadisələr əyanidir. Doğrudan da, gələcəkdə baş verəsi hadisələr hələ ki, baş verməmişdir. “İndi” dedikdə yaşadığımız an nəzərdə tutulur. Amma bu o demək deyil ki, gələcək öz sferasında da mövcud deyil. Əksinə, hər bir varlıq öz sferasında mövcuddur və onu varlıq aləmindən silib-atmaq olmaz. Sabahın hadisəsi bu günə aid olmasa da, onun varlığı inkar .edilməməlidir

### ?Allahın gözəllİyİ” və “Onunla görüş” İfadələrİ nə mə’na daşıyır“ .٩

Sual: Allahşünaslıq bəhsində bəyan olunmuşdur ki, Allah cisim deyil və gözlə görünmür. Cisim və materiya qoxulu kəlmələri Ona aid etmək düzgün sayılmır. Bununla belə, rəvayətlərdə nəql olunur ki, Allah-təala gözəldir və gözəlliyi sevir. Deyilənlərdən belə bir nəticə çıxarıla bilər ki, Allah göz vasitəsi ilə görünür. Çünki gözəllik gözlə müşahidə olunan bir

gerçəklikdir. Digər bir rəvayətdə bildirilir ki, bu dünyada insanlardan ehtiyacsızlıq və başqalarına kömək üçün ruzi dalınca gedən insan qiyamət günü çöhrəsi ay tək parlaq halda öz Allahı ilə görüşəsidir. Bu hədisdəki “görüş” kəlməsi də Allahın cisim olması fikrini .yarada bilər

Cavab: Qur’ani-kərimdə və dini rəhbərlərin buyuruqlarında bə’zən Allah haqqında elə tə’birlə rastlaşırıq ki, bu tə’birlər insanın zehnində Allahın cisim olması təsəvvürünü yaradır. Məsələn, “Allah sizin işlərinizi görür” və s. hansı ki, Allah-təalanın cismə aid xüsusiyyətlərdən uzaq olduğuna əminik. Deməк, uyğun tə’birlərə münasibətdə diqqətli olmalı, onların məcazi mə’nalarını dəqiqləşdirmək lazımdır. İslam tarixində “mücəssəmə” adlandırılmış firqələr haqqında mə’lumatlar vardır. Bu firqələrin adından göründüyü kimi, onlar Allahın cisim olduğunu iddia etmişlər. Belə bir əqidənin yaranmasının əsas səbəbi .yuxarıda misal çəkdiyimiz ayə və rəvayətlərin düzgün dərk olunmamasıdır

Hansı ki, Allah-təalanın cisim olmadığını açıq-aşkar bildirən ayə və rəvayətlər kifayət qədərdir. Bu ayə və rəvayətlərdə Allahın cisim olmadığı, onun müqəddəs zatının oxşarsızlığı bildirilir. Aydın olur ki, Allahın görüb-eşitməsini bəyan edən ayələrdə gözlə görmək, qulaqla eşitmək nəzərdə tutulmur. Müqəddəs buyuruqlarda “görmək, eşitmək” .ifadələri məcazi mə’na daşıyır

Qeyd edilməlidir ki, nitqimizdə işlətdiyimiz kəlmələr gündəlik ehtiyaclarımızın aradan qaldırılması üçün nəzərdə tutulmuşdur. Biz Allah, Onun sifətləri, axirət haqqında danışarkən gündəlik işlətdiyimiz sözlərdən istifadə etməyə məcburuq. Nitqimizdəki sözlər maddi mahiyyət daşısa da, biz həmin bu sözlərlə qeyri-maddi həqiqətlər haqqındakı düşüncələrimizi bəyan edirik. Məsələn, Allah-təalanın bütün danışılan sözlərdən xəbərdar olduğunu bildirmək üçün “Allah hər şeyi eşidir” deyirik. Hansı ki, bu “eşitmə” “qulaqla eşitmə” deyil. Allaha aid edilən “görmə” də “eşitmə” kimi məcazi mə’na .daşıyır

Beləcə, əgər deyilirsə ki, Allah gözəldir, söhbət maddi gözəllikdən getmir. “Allah gözəldir” deyərkən Onun həqiqi kamilliyi nəzərdə tutulur. Çünki

Allah-təala ağlımıza gələn və gəlməyən bütün kamilliklərin sahibi olan bir varlıqdır. Belə bir vücudun insanlar tərəfindən gözəl adlandırılması təbiidir. “Allahla görüş” dedikdə isə bizim dünya həyatımızdakı görüş yox, Allahın qüdrətinin, ədalətinin müşahidəsi nəzərdə tutulur. Allahın vücudunun nişanələri və sifətlərinin təzahürləri ilə görüş Onun özü ilə görüş sayılır. Əmirəl-mö’minin (ə) buyurur: “Nə gördümsə, gördüyümdən qabaq, gördüyümdən sonra, gördüyümlə eyni vaxtda Allahı da gördüm.” Həzrət (ə) nəzərdə .tutur ki, bütün mövcudları müşahidə edərkən Allahın elm və qüdrətini görmək olar

**?Allah özü kimisini yarada bilərmi .١٠**

Sual: Şübhəsiz ki, Allah hər şeyə qadirdir. “İnnəllahə əla kulli şəy’in qədir”, yə’ni “həqiqətən, Allah hər şeyə qadirdir” cümləsi hər bir allahpərəst fərd üçün qənaətedicidir. Bununla belə, Allah-təalanın bə’zi işləri bacarmadığı təsəvvür oluna bilər. Belə hallarda Allahın sonsuz qüdrətə malik olduğunu necə e’tiraf edək və Onu hər ?işə qadir kimi tanıyaq

:Bir neçə nümunə

Görən Allah özü kimi bir vücud yarada bilərmi? Əgər O belə bir işi bacararsa, şəriksiz .١ .qalmaz, yox əgər bacarmazsa, qadir sayılmaz

Allah-təala əzəmətli kainatı məsələn, toyuq yumurtasında yerləşdirə bilərmi? Əlbəttə .٢ ki, kainatı kiçiltmədən, nə də yumurtanı böyütmədən. Əgər desək ki, Allah-təala belə bir işi bacarmaz, hansı əsasla onu qadir saymalıyıq? Əgər desək ki, belə bir işi bacarar. Sağlam ağıl əzəmətli varlıq aləminin, kəhkəşanların və planetlərin yumurta kimi kiçik bir .şeyə yerləşməsini qəbul etməz

Allah elə bir varlıq yarada bilərmi ki, sonradan onu məhv edə bilməsin? O, hərəkətə .٣ gətirə (qaldıra) bilməyəcəyi varlıq yarada bilərmi? Bu iki sual da əvvəlkilər kimi mübahisə doğurur. Çünki “bacarmaz” desək, onun qüdrətini inkar etmiş olarıq. Hətta “bacarar” da desək, Onun qadir olması mübahisəli məsələyə çevrilər. Çünki sonradan məhv edə

bilməyəcəyi bir varlığı yarada bilən mövcud da hər şeyə qadir sayıla bilməz. Yaratdığı !?cismi tərpədə bilməyən varlıq qadir sayıla bilərmi

Cavab: Bu suallar müasir insanın düşüncəsinin məhsulu deyil. Lap qədim dövrlərdə də belə suallar verilmişdir. Dini rəhbərlərə bu sayaq suallar verilmiş və cavablar da .alınmışdır

Qeyd olunmuş sualların xülasə cavabı budur ki, qüdrət nə qədər hüdudsuz olsa da, ağıl və düşüncənin təsdiq etdiyi işə aid edilə bilər. Bir növ olası işlər haqqında danışarkən qüdrət məsələsini müzakirə etmək mümkündür. Amma zatən mümkünsüz sayılan işlər ağıl baxımından qeyri-mümkün hesab olunmuşdur. Belə işlərə münasibətdə qüdrətdən .danışmağa dəyməz

Bə’zi nöqtələri açıqlayaq. Düşüncəmizi xariclə ölçdüyümüz vaxt o iki şəkildə görünür. Birinci növ düşüncələr varlığı, mövcudluğu ağıl tərəfindən inkar olunmayan düşüncələrdir. Bə’zi düşüncələrin gerçəkləşməsi üçün qüdrətdən savay heç nəyə ehtiyac yoxdur. Məsələn, varlıq aləmi öz böyük əzəməti, kəhkəşanları, planetləri ilə ərsəyə gəlmişdir. Çünki onların hər birinin varlığı zatən mümkün bir işdir. İkinci növ düşüncələrin isə ağıl tərəzisində ölçülməsinin maneələri var. Onların varlığı ağıl baxımından mümkünsüzdür. Bu mümkünsüzlük Yaradanın acizliyi yox, həmin işlərin .zatən əlçatmazlığından doğur

Bir qədər də aydınlaşdırsaq, ağıl bə’zi mövzuları süzgəcdən keçirərkən müəyyənləşdirir ki, həmin mövzuların varlığı mümkünsüzdür. Yə’ni qüsur Yaradanın qüdrətində yox, .həmin mövzuların qeyri-mümkün olmasındadır

Məsələn, çox iste’dadlı və peşəkar toxucudan tələb olunsa ki, gəlin köçəcək qız üçün gil və ya samandan bir köynək toxusun, həmin sənətkar bu işdən imtina edəcək. Eləcə də, mahir bir rəssamdan xahiş olunsa ki, dalğaların üzərində gözəl bir rəsm əsəri yaratsın, həmin rəssam bu təkliflə razılaşmayacaq. Çünki gil və samandan köynək toxumaq, dalğa üzərində rəsm çəkmək ağılasığmaz bir işdir və bu işlərin mümkünsüzlüyü .toxucu və rəssamın iste’dadsızlığına dəlil ola bilməz

Toxucu və rəssamın bu təkliflərdən imtina etməsi onunla bağlı deyil ki, onlar öz işlərində mahir deyillər. Sadəcə, onların qarşısında qoyulan şərtlər həmin işlər üçün münasib .deyil

Yuxarıda sadalanan və bu kimi başqa mövzuların reallaşmasının mümkünsüzlüyünü insan xüsusi bir ayıqlıqla dərk edə bilir. Məsələn, gil və saman toxuculuq üçün yararsızdır. Eləcə də, havanın və suyun üzərində rəsm əsəri yaratmaq olmaz. Gündəlik həyatımızda bu sayaq misallar çoxdur. Məsələn, ağıl dərk edər ki, bir şeyin eyni vaxtda həm olması, həm də olmaması mümkünsüz bir işdir. Necə ola bilər ki, bir lampa həm yana, həm də yanmaya?! Bu sayaq mövzuların mümkünsüzlüyü ağıl üçün aşkar bir həqiqətdir. Hətta xəyalpərəst adam da bu işlərin mümkünlüyünü güman edə bilməz. Ən az mə'lumatlı adam da bilir ki, ikini ikiyə vuranda cavab dörd olur. Cavab hansısa şəraitdə .üç və ya beş ola bilməz

Bu misallardan aydın görünür ki, ağıldan uzaq, qeyri-mümkün işlərin qüdrətə heç bir dəxli yoxdur. Mümkünsüz işləri həyata keçirməməyin qüdrətin zəifliyinə yozmaq olmaz. .Yalnız varlığı mümkün olan işlərə münasibətdə qüdrətdən danışmaq mümkündür

İndi isə əvvəlki suallara qayıdaq və görək ki, bə'zi işlərin mümkünsüzlüyü necə izah olunur. Səthi bir araşdırmadan sonra mə'lum olur ki, bu işlərin mümkünsüzlüyünün acizliyə yozulmamasının səbəbi onların qeyri-mümkün, ağıldan uzaq olmasıdır. Məsələn, Allah kimisinin yaradılması qeyri-mümkündür. Alimlər Allahın sifətlərindən danışarkən Onun birliyini möhkəm dəlillərlə sübut etmişlər. Allahın şərikinin, Ona oxşarın .mövcudluğu mümkünsüzdür. Demək, Allah kimisinin yaradılması da qeyri-mümkündür

Digər bir sual bu idi ki, Allah özü kimisini yarada bilərmi? Bu sual başqa şəkildə də verilə bilər: Allah mümkünsüz bir işə varlıq libası geyindirə bilərmi? Allahın özü kimisini yaratmasının məfhumu budur ki, Onun yaratdığı həm mümkün və məhdud, həm də vacib və qeyri-məhdud olsun. Yə'ni öz-özünə yaranmamış bir şey həm də kimsə tərəfindən yaradılmasın. Bu isə paradoks, yə'ni ziddiyyətli bir fikirdir. Belə bir fikir ağıla uyğun gəlmir. Çünki

.Allahın özünə oxşar yaratdığı vücud həm də Onun məxluqu olur. Bu isə mümkünsüzdür

Allahın özü kimisi” dedikdə həmin varlıq bütün baxımlardan Onun kimi olmalıdır. Varlığı“ başqasından asılı olmayan vücud “vacibül-vücud” adlandırılmışdır. Necə ola bilər ki, bir !?”varlıq həm “yaradılmış” olsun, həm də “vacibül-vücud

Eləcə də, Allah-təalanın varlıq aləmini bir yumurtaya sığışdırması qeyri-mümkün bir işdir. Ağıl tələb edir ki, hər hansı bir şey öz qabından kiçik olmalıdır. Qabdan böyük şeyin həmin qaba sığışması mahal bir işdir. Ona görə də dünyanın yumurtada yerləşdirilməsi ağılsız bir istəkdir. Əvvəlcə deyilənlərdən aydın oldu ki, mahal işlərə münasibətdə qüdrətdən danışmaq olmaz. Qüdrət mümkün işlərə münasibətdə nəzərdən keçirilən sifətdir. Üçüncü sual isə belə idi ki, Allah sonradan məhv edə bilməyəcəyi bir varlıq yarada bilərmi? Bu sual da əvvəlki sualar kimi mahal bir işin təmənnasından doğur. Çünki Allah tərəfindən yaradılmış bir mövcud mümkün olmalıdır. Hər bir mümkün iş isə zatən fənaya məhkumdur. Fəna olmayan şeyləri isə vacibül-vücud hesab etməyə məcburuq. Belə çıxır ki, bir şey həm mümkün, həm də vacibül-vücud olmalıdır. Bu isə .ziddiyyətli bir məsələdir. İki zidd şeyin bir araya gəlməsi isə ağlasığmaz bir təmənnadır

Allahın hərəkətə gətirə bilməyəcəyi bir mövcudu yaratması da ziddiyyətli bir istəkdir. Çünki Allahın yaratdığı hər bir mövcud məhduddur. Hərəkətə gətirilə bilməyən bir şey isə qeyri-məhdud olmalıdır. Məgər yaradılmış bir şey qeyri-məhdud ola bilərmi?! Demək, .bu təmənna da əvvəlkilər kimi ziddiyyətli bir işin təmənnasıdır

Bir sözlə, yuxarıdakı istəklər zatən mahal işlərin istənilməsidir. Ona görə də bu işlərə münasibətdə qüdrətdən danışmağa dəyməz. Bu işlər ağıl və düşüncə baxımından .mümkün olası işlər deyil. Onların mümkünsüzlüyü Allahın qüdrətinə nöqsan gətirmir

,Ərşi xali bilmə, bəstədirsə boy

.Bir boy qalxa bilsən, görünəsi ay

Sual: Allah-təala hansısa cinayətkarların müəyyən bir vaxtda hansı cinayəti edəcəyini əvvəlcədən bilir. Əgər həmin şəxs deyilən vaxtda cinayət etməzdisə, Onda Allahın elmi :həqiqətdən uzaq olardı. Xəyyam deyir

,Mey içməyimi öncə bilirmiş Yaradan

.İçməzsəm əgər, elmini haqlar nöqsan

?Bu halda insan müqəddəs sayılarmı

Sualın izahı: Allah-təala varlıq aləmində baş verəcək hadisələri əvvəlcədən bilir. İlk gündən ulduzların və qalaktikaların hərəkətindən, atomun daxilində elektronların hərəkətindən, meşələrdə yarpaqların titrəyişindən, dənizlərin qabarıb-çəkilməsindən, .okean dibində balıqların üzməsindən mə'lumatlıdır

Allah hələ bəşəri xəlq etməmiş, canilərin cinayətlərindən, əyyaşların şərabxorluğundan, qatillərin qətllərindən xəbərdar olmuşdur. O, kimin, harada, nə iş görəcəyini bilir. Allahın bu bilgisindən sonra kimsənin başqa sayaq hərəkət etmək imkanı olmamışdır. İnsan Allahın bilgisinə qarşı çıxmaq gücündə deyil. Bəşər Allahın bildiyindən kənara çıxsa, bu .bilgi həqiqətdən uzaq olar

Cavab: Sualda Allahın elmi haqqında qeyd olunanlar məntiqi və gerçəkdir. Yə'ni, doğrudan da, Allah hər şeyi əvvəlcədən bilir. Amma Onun hər şeyi öncədən bilməsi o demək deyil ki, bəşəriyyət həmin işləri görməyə məcburdur. Belə bir düşüncə tərzi kökündən yanlışdır. Bu məsələni aydınlaşdırmaq üçün iki incə məsələyə diqqət yetirmək :lazım gəlir

Bəşəriyyətin seçim qabiliyyəti bütün müdrik insanlar tərəfindən qəbul olunmuş bir .۱ həqiqətdir; insanın məcbur, iradəsiz olduğunu iddia edən məzhəb başçıları da onu "azad görünən məcbur" hesab edirlər. Onlar da insanın

iradə məsələsinə ehtiramla yanaşır. İnsanın bir qisim işlərdə azad olduğuna inanırlar. Ona görə də bir şəxsdən küframiz sözlər eşitdikdə, övlad itaətsizlik göstərdikdə “Allah .bunu bilir” deyib oturmur, cızığından çıxmış şəxsi cəzalandırırlar

Qəbul etməliyik ki, əli qana batmış insan və ya badəni badə dalınca başına çəkən şərabxor gördüyü işlərdə azaddır, onun iradəsi fəaliyyətdədir. Vicdanı oyaq olan heç bir insan deməz ki, qatil və şərabxor günahsızdır, onlar bu işləri görməyə məcbur olmuşlar. Məgər cinayəti ürəyin döyünməsi ilə eyni tutmaq olarmı?! İnsan nəfəs alıb-verməyə məcburdur. Qətl və digər cinayətlər isə onun iradəsindən asılı olan bir işdir. İnsanın iradə cəhətdən azad olmasını inkar edənlər də özlərinə qarşı yersiz hərəkətlər gördükdə dərhal narahat olur, e’tiraz edirlər. Hansı ki, onların əqidəsinə görə, pis iş görən insan günahkar deyil. Zülm edən insan bu işə məcbur olmuşsa, bəs nə üçün !?məhkəməyə müraciət edilir

Deyildiyi kimi, Allah-təalanın elmi həqiqəti bildirir və həqiqətdən zərrəcə fərqlənmir. .۲ Amma nəzərə almalıyıq ki, bu elm xaricdən müəyyən xüsusiyyətlərlə gerçəkləşən şeyə .aiddir

Yə’ni insan öz həyatı boyu iki növ fəaliyyəti yerinə yetirir. Bir sıra işlər insanın istək və iradəsindən asılıdır. Bu işlər “ixtiyarı iş” adlandırılmışdır. Bir qisim işlər isə “qeyri-ixtiyari iş” hesab olunur. Məsələn, damarlarda qanın dövr etməsi, ürəyin döyünməsi insanın .qeyi-ixtiyari fəaliyyətlərindəndir

Qeyd olunduğu kimi, Allah-təalanın elmi həqiqətdən zərrəcə fərqlənmir. Bizim hərəkətlərimiz zahiri xüsusiyyətləri ilə lap əzəldən Allaha mə’lum olmuşdur. Allah-təala əvvəlcədən bilmişdir ki, biz hansı işi hansı anda azad şəkildə görəsiyik. İkinci qisim fəaliyyətlər də Allaha mə’lum olmuşdur. Allah əzəldən, əvvəlcədən bilmişdir ki, hansı .işləri görməyə məcbur olasıyıq

Yuxarıda xatırladılan iki nöqtəni nəzərdə saxlamaqla veriləcək cavabın izahına diqqət .yetirin

Sübut olundu ki, bizim hərəkətlərimizin bir hissəsi iradəmizdən asılıdır və onları edib-etməmək öz əlimizdədir. Bu da sübuta yetirildi ki, Allah-təala bizim işimizin mahiyyətindən xəbərdar olduğu üçün onların ixtiyari və ya qeyri-ixtiyari olmasını da .bilir. Başqa sözlə, bizim hərəkətlərimiz xarici xüsusiyyətləri ilə birlikdə Allaha mə’lumdur

Bu iki məsələyə əsaslanaraq, belə bir nəticə əldə edirik ki, Allah əvvəlcədən filan caninin, filan saatda filankəsi bıçaqla qətlə yetirəcəyini bilir. Ən əsası isə belə bir elm, yə’ni Allahın əzəli elmi insanın iradəsini əlindən almır. Qatil Allahın əzəli elmini bəhanə gətirə bilməz. O etdiyi cinayətdə özünü müqəssir saymaya bilməz. Bəli, Allah onun cinayət edəcəyini bilirdi. Allah təkcə bu əməldən yox, bu əməlin azad şəkildə icra .ediləcəyindən xəbərdar olur

Allahın əzəli elmi insanın iradəsinə zidd deyil. Əksinə, bu elm insanın azadlığını daha da aşkarlayır. Allahın elmində ziddiyyət olmadığından və bu elm həqiqətlə tam üst-üstə düşdüyündən insan heç bir maneəsiz azad şəkildə hərəkət edir. Əgər insan hər hansı .işi görməyə məcbur olsaydı, Allahın elmi həqiqətə uyğun gəlməzdi

Başqa sözlə, əgər biz öz işlərimizi azad şəkildə yerinə yetiririksə, deməK, Allahın elmi .həqiqətlə üst-üstə düşür. Məcburiyyət isə ilahi elmlə həqiqət arasında təzad deməkdir

Daha sadə bir bəyan: yuxarıda deyilənlərin dərkinin bə’ziləri üçün çətin olacağını nəzərə alaraq, sadə bir misal çəkək. Sual olunur: Allahın əzəli elmini bəhanə gətirərək, ?cinayətkarları müqəssir saymayanlar aşağıdakı hallarda da eyni mövqeyi tutarlarmı

Məsələn, bir çox müəllimlər öz şagirdlərinin gələcəyi haqqında fikir yürüdə bilirlər. Şagirdin hazırlıq səviyyəsindən xəbərdar olan müəllim onun alacağı qiyməti müəyyənləşdirməyi bacarır. Şagirdin tənbəlliyindən xəbərdar olan, tövsiyələri eşidilməyən müəllim vaxtını boş-boş işlərə sərf edən bu şagirdin imtahan verə bilməyəcəyini deyirsə, onu uğursuzluğa məcbur edirmi? Şagird öz müvəffəqiyyətsizliyində müəllimin rə’yini bəhanə gətirə bilərmi? Əgər müəllim zəif şagird haqqında yüksək fikirdə

olarsa, onun fikri imtahanda şagirdə kömək edə bilərmi? İl boyu kitab üzü açmamış ?şagirdin müvəffəqiyyətsizliyində müəllimin proqnozlarının günahı nədir

Ədalətli və ağıllı mühakimə yürüdən heç bir insan şagirdin müvəffəqiyyətsizliyində müəllimin rə'yini əsas götürməz. Tənbəl şagirdin gələcəyi haqqında fikir yürüdən müəllimin nə günahı var?! Şagird azad şəkildə hərəkət etmiş və kimsə onun qarşısını .kəsməmişdir. Müəllimin onun haqqında dedikləri isə məcburiyyət kimi yozulmamalıdır

Nəticə olaraq, deyə bilərik ki, Allah-təala bəşəriyyətə bir çox təbii xüsusiyyətlər vermişdir. Ona ağıl, düşüncə, iradə, ixtiyar, azadlıq əta etmişdir. İnsana həm səadət, həm də bədbəxtlik yolları aydın şəkildə göstərilmişdir. Hər bir insan öz taleyini müəyyənləşdirməkdə azaddır. İnsan özü öz taleyini yazır və başqa biri onun üçün ömür yolu cızmaq əzmində deyil. Allah-təalanın bizim gələcəyimizdən xəbərdar olması azadlığımıza zərrəcə mane olmur. Biz Xəyyamın şe'rindən misal göstərdik. Bu şe'rdə insan öz günahı üçün Allahın əzəli elmini bəhanə gətirir. Əlbəttə ki, bu yalnız bəhanə ola bilər. Bu gün qərbdə rəvac tapmış mütləq azadlıq ideyası da həmin qəbildəndir və əslində vicdanı aldatmaqdır. Dünya şöhrətli filosof Xacə Nəsirəddin Tusi Xəyyamın :uyğun şe'rinə belə bir şe'rlə cavab verir

,Günahı yüngül iş sayarsa biri

.Bilsin, günahkarlar içində yeri

Günaha haqq elmin səbəbkar sayan

.Alimlər gözündə axmaqdır, insan

## ?Bəda" nədİr" .۱۲

Sual: Şiə inanclarından olan "bəda" dedikdə nə nəzərdə tutulur? Bə'ziləri bildirirlər ki, İмaм Sadiq (ə) oğlu İsмailin ölüмündən qabaq onun haqqında buyurмuşdur: "Məndən sonra oğluм İsмail iмaмdır." Aммa İsмail dünyasını dəyişdikdən sonra həzrət (ə) belə buyurмuşdur: "İsмailin iмaмəti haqqında Allaha bəda hasil oldu." Bu deyilənlər ?həqiqətdirмi

Cavab: Təəssüf ki, bəda inancı şiə мüxaliflərinin, hətta bə'zi İslaм düşмənlərinin əlində bəhanəyə çevrilмiş мövzulardandır. Onlar böyük İslaм aliмlərinin kitablarında zərrəcə araşdırмa aparмadan bəda kəlмəsi haqqında elə izahlar verмişlər ki, bu izahların şiə əqidəsinə zərrəcə dəxli yoxdur. Sonra "bəda" kəlмəsini əsas götürərək, şiələrə qarşı .olduqca yanlış мüddəalar irəli sürмüşlər

Əlbəttə ki, bu sayaq yanlış təfsirlər təkcə bir aliмin işi deyil. Bu iradlar daiм bəhanə axtaran davakar мüxaliflərin təxəyyülünün мəhsuludur. Onlar daiм qarşı tərəfin sözündən söz çıxarır və öz azdırıcı izahları ilə zəhərli təbliğat aparırlar. "Bəda" düşмən .əlində bəhanəyə çevrilмiş kəlмələrdən biridir

Hansı ki, "bəda" kəlмəsinin həqiqi мə'nasını bilмək üçün aşağıdakı мə'luмatları səthi şəkildə nəzərdən keçirмək kifayət edir. "Bəda" kəlмəsi ərəb dilində "aşkar olмaq" мə'nasını bildirir. Qur'ani-kəriм zalıмlar haqqında buyurur: "Həмin gün onlara yol verdikləri pis işlər aşkar olar." ("Züмər", ۴۸) Ərəb leksikonunda bə'zən "ondan aydın bir söz aşkar oldu" deyirlər. Çox vaxt bir işin görülмəsi üçün şərait yarandığını düşünsək də, gözlənilмəz hadisələr həмin şəraiti aradan qaldırır. Belə hallarda deyilir ki, "Allah bu işin olмasını istəмədi." Aммa bu yerdə "bəda", "aşkar olмaq" kəlмəsi də işlənə bilər. Yə'ni Allahdan aşkar oldu ki, O bu işin olмasını istəмir. "Aşkar olмaq" o мə'nada işlənмəмişdir ki, Allah üçün nə isə qaranlıq idi və sonradan aşkar oldu. Söhbət Allah-təalanın hansısa мəsələni öz bəndələri üçün aşkarlaмasından gedir. Gözlənilмəyən işlərin baş verмəsi hər biriмizin qarşısına çıxan

məsələlərdəndir. Bu isə həmin “bəda” kəlməsinə uyğun gəlir. Bəs bu söz bizim əqidəmizdə özünə necə yer tapmışdır? Biz inanırıq ki, bir çox hallarda bəla və narahatlıqlar üçün şərait yaranır, insanlar da Allaha dua etməklə, saleh işlər görməklə, bir-birlərinə yardım əli uzatmaqla bu bədbəxtliyin qarşısını alırlar. Yə’ni Allah insanların saleh işlərinə xatir həmin bəlaları aradan qaldırır. Bu, “bəda” hallarından biridir. Bə’zən isə əksinə, xoşbəxtlik üçün yaranmış şərait insanın pis bir əməli sayəsində aradan .qalxır. Ne’mətlərin bu sayaq əldən çıxması da, bəda hallarındandır

Bir çox hallarda insan öz yaxşı və pis əməlləri ilə taleyini dəyişir. Əslində bu hal insanın azadlığından danışır. İnsan fəxr etməlidir ki, onun taleyi öz əməllərindən asılıdır. Uyğun hallara münasibətdə insan səhvən Allah üçün bəda baş verdiyini düşünə bilər. Biz insanların düşüncəsi məhdud olduğundan təsəvvür edirik ki, hansısa hadisə ya hökmən baş verəsidir, ya da heç vəchlə baş verə bilməz. Amma gözlədiyimizin əksi baş verdikdə düşünürük ki, Allah üçün bəda üz vermişdir. Hansı ki, bəda Allahın məqamına layiq bir xüsusiyyət deyil. Allaha münasibətdə “bəda” yox, “əbda” kəlməsi işlədilə bilər. “əbda” .isə bizim nəzərimizdən məxfi olan bir şeyin bizim üçün aşkarlanmasıdır

Bir sözlə, bizim üçün gözlənilməyən hadisələrin baş verməsi bədadır. Yə’ni gizli olan bir şey bizə aşkarlandı. Allaha münasibətdə işlədilən “əbda” isə o deməkdir ki, bizim üçün gizli olan bir şey Allah tərəfindən açıqlandı. Amma bə’zən Allaha münasibətdə “əbda” .yerinə “bəda” işlənməsi, deyildiyi kimi, müqayisə üçündür

İmam Sadiqin (ə) öz oğlu İsmail haqqında buyuruğu isə belədir: “Müqəddər olmuşdur ki, oğlum İsmail qətlə yetsin. Mən dua etdim ki, Allah onu düşmənlərin şərindən qorusun. Allah mənim duamı qəbul etdi və övladım qətlə yetirilmədi. İsmaildə Allahın bədası!” Bu hədis bir çox şiə kitablarında nəql olunmuşdur. Göründüyü kimi, söhbət nə İsmailin imamətindən, nə də Allahın peşiman olmasından gedir. Amma hər fürsətdən faydalanmağa çalışan müxaliflər “bəda” sözünü bəhanə

edərək deyirlər: “Şiələrin əqidəsinə görə, Allah bə’zən öz işindən peşiman olur və öz qərarını dəyişir. Onların fikrincə, İmam Sadiqin (ə) oğlu İsmaili imam etmək istəyən Allah sonradan peşiman oldu.” Əslində isə şiə alimləri belə bir əqidədə olan insanı kafir sayırlar. Bu deyilənlər hara, şiə əqidəsi hara?! Uyğun iddianın sahibləri şiə mənbələrini mütaliə etmək belə istəmirlər. Həqiqəti tapmaq istəyənlər isə səthi mütaliədən sonra .anlayarlar ki, “bəda” nədir və İsmaillə bağlı əhvalat necə baş verмişdir

Ümid edirik ki, bədbinlik və təəssüb buludları İslam səmasını tərk edib gedəcək və !müsəlmanlar arasında təfriqə mənbəyi olan əsassız iddialar aradan qalxacaq. İnşaallah

## Bəlaların fəlsəfəsİ .۱۳

Sual: Zəlzələ və sel kimi hadisələr baş verərkən bə’zi insanlar bu sayaq suallar verirlər: Nə üçün sellər, zəlzələlər, ağır xəstəliklər və bu kimi hadisələr bir çox insanların həyatına son qoyur? Nə üçün belə hadisələr yer üzünün bir məntəqəsində baş verir, o birində yox? Bu bəlaların fəlsəfəsi nədir? Bu hadisələrdə həlak olanlar günahkar, sağ ?qalanlar isə günahsızdırmı

Cavab: Əldə etdiyimiz mə’lumatlar və qədim alimlərin kitabları bəşər tarixi boyu bu kimi sualların mövcudluğunu xəbər verir. Xüsusi ilə acı hadisələr baş verən vaxt belə suallar insanları daha çox düşündürür. Dinlərin tarixini mütaliə etdikdə görürük ki, bu kimi suallara cavab tapılmaması bə’zilərini allahpərəstlikdən uzaqlaşdırmış, hətta materializmə sövq etmişdir. Çünki fəlakətli hadisələrin mahiyyətini dərk etmək üçün səthi mütaliə kifayət etmir. Bu hadisələr ilk baxışdan ikrah doğurur. Bə’zən insanlar bu hadisələri təbiətin qəzəbi kimi yozurlar. Hansı ki, yer üzərində baş verən acı hadisələrin əsil mahiyyətini anlamaq üçün onlara ağıl və düşüncə gözü ilə baxmaq lazımdır. Bu halda tamamilə başqa bir nəticə əldə olunur. Bizim hadisələr haqqında əksər mühakimələrimiz nisbidir. Biz xeyrimizə olan hadisələri faydalı, zərərimizə

olan hadisələri isə faydasız hesab edirik. Heç vaxt nəzərə almırıq ki, bizim üçün zərərli olan bir hadisə cəmiyyətimiz, gələcəyimiz üçün hansı tə'sirə malikdir. Axı bizim üçün .zərərli olan kimyəvi maddə bir çox xəstələr üçün şəfaverici tə'sirə malik ola bilər

Məgər hər hansı hadisənin şəxsən bizə faydalı və ya zərərli olması həmin hadisənin qiymətləndirilməsi üçün me'yar, ölçü ola bilərmi? Yoxsa bir hadisəni qiymətləndirmək üçün onun bütün tə'sirləri nəzərdən keçirilməlidir? Deyilənləri aydınlaşdırmaq üçün sadə bir misal çəkək: şübhəsiz ki, yağış kiminçünsə faydalı, kiminçünsə zərərli ola bilər. İnsanlar yağışa müxtəlif cür münasibət göstərirlər. Əkin sahəsini sel basmış insan fəryad qoparıb deyir ki, bilmirəm nə üçün başıma belə bir bəla gəldi. Əkin sahəsi susuzluqdan yanan insan isə, əksinə, yağışı Allahın böyük ne'məti bilərək, şükr edir. Amma yağışın bütün tə'sirləri nəzərə alınarsa, kimsə onu təbiətin qəzəbi kimi qəbul .etməz və onun ilahi mərhəmət olduğu hamı tərəfindən təsdiq olunar

Mahiyyətindən xəbərsiz olduğumuz bə'zi bəlalar isə əslində böyük bir ne'mətdir. Məsələn, elə xəstəliklər var ki, insan bircə dəfə həmin xəstəliyə yoluxduqda onun orqanizmində bu xəstəliyə qarşı müqavimət qüvvəsi yaranır və bu xəstəlik ikinci dəfə təkrarlanmır. Demək, ilk baxışdan bəla kimi görünən bə'zi xəstəliklər insanın gələcək .həyatında müsbət tə'sirlərə malik olur

Bəlaların digər bir fəlsəfəsi ne'mətlərin dəyərinin dərk olunmasıdır. İnkar edə bilmərik ki, biz insanlar ne'mət dəryasında qərq olmuşuq. Amma bir çox ne'mətlərin varlığını dərk etmirik. Yalnız bu ne'mətlər əlimizdən çıxdıqda onların qədrini bilirik. Axı yer üzündə xəstəliklər olmasaydı, sağlamlığın böyük ne'mət olması necə dərk olunardı?! Gecənin qaranlığı insanı ağuşuna almasaydı, yer üzünü işıqlandıran günəş nurunu kim qiymətləndirərdi?! Əgər arabir yer titrəməsəydi, onun sakit vəziyyətini ne'mət sayardıqmı?! Yer üzündə quraqlıq deyilən bəla olmasaydı, həyatımızda yağışın rolunu !?lazımınca qiymətləndirərdikmi

Demək, insanın həyatdakı ne’mətlərin dəyərini bilməsi, bu ne’mətlərə görə Allaha şükr etməsi üçün bə’zən onlardan məhrum olması zəruridir. Bu müvəqqəti məhrumiyyət həmin böyük və dəyərli ne’mətlərin zərurətini açıqlayır. Biz isə ötəri məhrumiyyətləri bəla .adlandırırıq

Bütün bu incəliklər nəzərə alınarsa, yer üzündəki bəlaları ibrətamiz dərs hesab etməli deyilikmi?! Deyilənləri nəzərdə saxlayaraq, bəlaların özünü böyük ne’mət saymaq lazım .gəlir

Növbəti sual isə budur ki, nə üçün bu bəlalar yer üzünün bir hissəsində baş verir, digər ?hissəsində yox

Bilməliyik ki, bəlaların da təbii əsasları vardır. Harada şərait yaranırsa, bəla da orada .baş verir

Rəvayətlərdə bildirildiyi kimi, bəla gəlməsinin şərtlərindən biri xalq arasında müəyyən günahların rəvac tapmasıdır. “Kumeyl” duasında belə oxuyuruq: “Pərvərdigara! Günahlarımızı bağışla. Bu günahlar ne’mətləri aradan aparır. Pərvərdigara! Bağışla bizim o günahlarımızı ki, bəlalara səbəb olur!” Qur’anda isə belə buyurulur: “Bəlalardan qorxun ki, bu bəlalar təkcə zalımlara aid deyil.” (Zalımlar zülmünə, başqaları isə bu zülm (qarşısında susduqlarına görə bəlaya düşər)(۱)

## ?Qəza–qədərİn mə’nası nədİr .۱۴

### İşarə

Sual: Qəza-qədər dedikdə nə başa düşülür? Əgər qəza-qədər dedikdə bəndələrin taleyinin müəyyən edilməsi, onların tale yolunu getməyə məcbur olması, tale müqəddəratını poza bilməməsi nəzərdə tutulursa, onda “insanın çalışqanlıqdan başqa bəhrəsi yoxdur” ayəsi necə izah olunmalıdır? Bu ayəyə əsasən, hər bir insanın ixtiyarı .öz əlindədir və qəza-qədərin onun taleyinə tə’siri yoxdur

Cavab: Qəza-qədər məsələsi bəşər tarixi boyu insanları düşündürmüş bir məsələdir. Belə bir e’tiqad hansısa millətə aid deyil. Bizim səmavi kitabımız və islami hədislərimiz bu .məsələyə daha diqqətlə yanaşsa da, o, bütün bəşəriyyəti narahat edən bir məsələdir

Təəssüf ki, qəza-qədər məsələsi ilə lazımınca tanış olmayan insanların izahları insanlarda bu məsələyə tərəddüdlü münasibət yaratmışdır. Onlar qəza-qədər anlayışını insan iradəsini məhdudlaşdıran bir qayda kimi qəbul edirlər. Bə’zən onu müsbət qiymətləndirərək insanın pis işlərə məcbur olduğunu bildirir, öz günahlarını qəza-qədərin ünvanına yazır, bə’zən isə mənfi qiymətləndirərək, insanın bir sıra vəzifələr qarşısında aciz olduğunu iddia edir, insani vəzifələrindən boyun qaçırırlar. Bu mə’nada qəza-qədər əfsanədən başqa bir şey deyil. Qəza-qədərin mahiyyətini real həyatda axtarmaq lazımdır. Onun formalaşmasında insanın iradəsindən başqa digər tə’sirli amil oyxdur. Qəza-qədər haqqında yanlış təsəvvürə malik insanları inandırmaq çətindir ki, qəza-qədər insan iradəsinə müsbət və ya mənfi tə’sir göstərə bilməz. Bu insanlar adət etmişlər ki, öz səhvlərini, nöqsanlarını hansısa qeybi bir səbəblə əlaqələndirsinlər. Bu baxımdan qəza-qədər onların əlində bəhanəyə çevrilmişdir. Onlar qəza-qədər .bəhanəsi ilə bir çox məs’uliyyətlərdən boyun qaçırırlar

Bu gün qərb cəmiyyətinin də bir hissəsi yanlış qəza-qədər inancına oxşar olan “tarixi zərurət” məsələsini ortaya atmışdır. Onlar bir çox hadisələri tarixi zərurət hesab edərək, müqavimət göstərmir, ictimai vəzifələrindən boyun qaçırırlar. Amma bəsirətli .insanlar üçün aydındır ki, Allahın təqdiri insan iradəsini nəyəsə vadar etmir

#### Allahın təqdİrlərİ

Əgər Allah-təalanın təqdirləri ilə tanış olsaq, görəcəyik ki, varlıq aləmində real həyatdan kənar qəza-qədər adlı hərəkətverici bir qüvvə yoxdur. Allahın təqdirləri varlıq aləminə hakim olan qaydalar toplusundan ibarətdir. Bu qaydalar insanın xoşbəxtlik və bədbəxtlik yollarını qəti şəkildə müəyyənləşdirmişdir. Amma insan hər :hansı bir yolu seçməkdə azaddır. Məsələni aydınlaşdırmaq üçün misallar göstərək

Tənbəl, bir-birləri ilə didişən, təbii gücünü səmərəsiz işlərə sərf edən, zamanını və .١ mühitini tanımayan, öz xeyrini düşünüb, başqalarını unudan millətlər haqqında Allahın təqdiri (qanunu, yazısı) budur ki, bu millətlər

tez-gec bədbəxt olмalıdırlar. Aммa zəhмətkeş мəhruмları haqqında düşünən, sinfi fərqləri aradan qaldırмağa çalışan, insan şəxsiyyətini qiyмətləndirən, varlıları yoxlullarının haqqını ödəyən мillətlər haqqında isə Allahın təqdiri budur ki, bu мillət daiм rahatlıqda, tərəqqidə olsun. Norмal düşüncəyə мalik olan hansı insan bu iki təqdirin !?reallığını inkar edə bilər

Allah-təalanın bu təqdiri, bir növ yazısı dünyadakı bütün xalqlara aiddir. Millətlərin taleyində onların istəyindən başqa bir şey aмil sayılмır. Biz insanlar isə öz səthi мühakiмələriмizə əsaslanaraq, hansısa bir yolu seçir, bu yolun təbii zərərləri ilə qarşılaşdıqda qəza-qədəri günahlandırırıq. Hansı ki, qəza-qədər insana yox, insanın .seçdiyi yola aid bir мəsələdir

Böyük iмkanlarla, polad əsəblərlə, dərin düşüncə ilə həyata qədəм qoyмuş gəncin .٢ qarşısında iki təqdir dayanır. Hər şey bu gəncin hansı təqdiri seçмəsindən ibarətdir. Bu gənc öz мaddi və мə’nəvi iмkanlarını elм və bilik təhsilinə və ya ticarətə sərf etsə, xoşbəxt bir həyat sürəsidir. Aммa bu sərмayələrdən sui-istifadə edib, öz iмkanlarını şərabxorluğa, quмarbazlığa, cinayətə sərf etsə, özü öz əli ilə xoşbəxtliyinin üzərinə qara xətt çəkəsidir. Onun iмkanları əlindən çıxası, sağlaмlığı əldən gedəsi, düşüncəsi korşalasıdır. Bəli, hər iki təqdiri Allah мüəyyənləşdirмişdir. Aммa Allah bu təqdirlərin seçiмində insanı azad qoyмuşdur. Bir мüddət azğın yolda olмuş insan öz taleyini dəyişib, doğru yola qayıda bilər. Bu yolla o öz taleyini də dəyişмiş olar. Allah insana çirkin yoldan qayıtмaq, etdiklərindən peşiмan olмaq, xoşbəxtlik yolunda qədəм .götürмək iмkanı verмişdir

Xəstələnмiş insan həkiмə мüraciət edib, мüalicə olunduqda şəfa tapır. Təbii ki, bu .٣ insan həkiмə мüraciət etмəsə, düzgün мüalicə alмasa, sağlaмlığını itirəsi, yatağa buxovlanasıdır. Hər iki yolu Allah мüəyyənləşdirмişdir. Seçiм insanın əlindədir. Seçilмiş .yolun aqibətini isə Allah мüəyyənləşdirмişdir

Siz varlıq aləмindəki ilahi sünnələrə, qaydalara nəzər salмaqla qəza-qədərin əsil .мahiyyətini açıqlayan yüzlərlə nüмunələr tapa bilərsiniz

Yuxarıdakı açıqlamalar əslində İslam rəhbərlərinin buyuruqlarının izahı idi. Qəza-qədər məsələsini açıqlayan da məhz onlardır. İslam Peyğəmbəri (s) buyurur: “Beş tayfanın duası qəbul olmaz. Bunlardan biri uçulmaqda olan divarın altından qaçmayan (adamdır...”(١

Belə bir insanın duasının qəbul olmamasının səbəbi aydındır. Çünki uçulmaqda olan divarın altından qaçmayan insan ölümə məhkumdur. Bu insan bədbəxtlik yolunu özü .seçmişdir. Hansı ki, o, başqa cür də hərəkət edə bilərdi

Həzrət Əli (ə) uçulmaqda olan divardan kənarlaşarkən ondan soruşdular ki, məgər Allahın qəza-qədərindən qaçırsan? Həzrət (ə) buyurur: “Bir qəza-qədərdən o biri qəza-(qədərə, bir taledən o biri taleyə qaçıram. Hər ikisi Allahın təqdiridir!”(٢

Bəli, insan iki yoldan birini seçməkdə azaddır. O, uçulmaqda olan divarın altında otursa, əlbət ki, öləsidir. Yə’ni uçulmaqda olan divarın altında oturan insanın ölümü Allahın .təqdiridir

İmam Sadiqdən (ə) soruşurlar ki, bəndələrin yaxşı və pis əməllərinə münasibətdə Allahın təqdiri nədir? İmam (ə) buyurur: “Yaxşı və ya pis, Allah bəndələrinin gördüyü iş Allahın təqdiridir.” Sonra imam (ə) bu məsələyə açıqlama verərək buyurur: “Yə’ni Allahın təqdiri ”!insanın dünya və axirətdə sorağına gəlmiş nəticələr, mükafatlar və cəzalardır

Bu hadisələr qəza-qədər məsələsini yetərincə açıqlayır. Qəti şəkildə bildirilir ki, qəza-qədər real həyatdan, insan iradəsindən kənar bir şey deyil. Qəza-qədər Allahın varlıq aləminə hakim olan qanunlarıdır. İnsan özünə yol seçməkdə azaddır. Xoşbəxtlik və ya bədbəxtlik yolunu seçdikdən sonra insanın taleyi Allahın təqdiridir. Heç bir əməl bu təqdir dairəsini adlamır. Yaxşı əkin əkən insan Allahın təqdiri ilə yaxşı da bəhrə götürür. Qulluq görməyən sahəni isə, təbii ki, alaq basasıdır. Demək, bütün işlər yaxşı-.pisliyindən asılı olmayaraq qəza-qədər dairəsindədir



---

.Bihar”, c. ٥, s. ٥“[٣] -١

İslamın başlanğıc dövründəki müsəlmanlar vəhy mənbəyinin tə’sir sayəsində qəza-qədər məsələsini düzgün anlamışdılar və onu insanın istək və iradəsinə zidd bilmirdilər. Qeyd olunur ki, fəthlər dövründə ikinci xəlifə Şam sərhəddinə çatdığı vaxt mə’lum olur ki, Şamda vəba xəstəliyi yayılmışdır. Xəlifənin yaxın adamları ona məsləhət görürlər ki, gəldiyimiz yolla da qayıdaq. Xəlifə də belə düşünürdü. Oradakılardan biri e’tiraz edərək deyir ki, Allahın təqdirindən qaçırsınızmı?! Xəlifə bu e’tiraza belə cavab verir: “Mən Allahın hökmü ilə bir taledən o biri taleyə qaçıram.” İştirakçılardan biri xəlifənin dediklərini təsdiqləyərək bildirir: “Peyğəmbər (s) buyurdu: Əgər bir yerdə taun görünsə və siz kənarda olsanız, həmin yerə getməyin; əgər bu xəstəlik sizin olduğunuz yerdə görünsə, həmin yeri tərk etməyin.” (Yə’ni xəstəlik ərazisini tərk edən şəxs başqalarını da bu xəstəliyə yoluxdura bilər.)(١)

Deyilənlərdən aydın olur ki, qəza-qədərə inanmaq iradə azadığını inkar etmək deyil. Qəza-qədər məsələsi ilə cəbr məsələsi arasında yerlə göy arası fərq var. Əgər bir qrup şərqşünas qəza-qədər e’tiqadını cəbriliklə (insanın bütün işlərə məcbur olmasını iddia edən məzhəb) eyni tutmuşlarsa, bunun səbəbi onların dərin İslam maarifindən xəbərsizliyidir. İslami inanclar haqqında mühakimə səlahiyyəti yetərli dini biliyə malik olanlara məxsusdur. Alber Male deyir: “İslam ilkin günlərdə yalnız Allahın birliyinə və Məhəmmədin (s) risalətinə inanmaqdan ibarət idi. Sonra İslam filosofları bildirdilər ki, Allah hər kəsin taleyini müəyyənləşdirmişdir və Onun təqdiri dəyişməzdir. Belə bir yol cəbr adlanır.”(٢)

Qustav Lebon İslamda qəza-qədər və onun cəbr əqidəsi ilə nəticələnməsi haqqında müəyyən söhbətlərdən sonra deyir: “Qur’anda qəza-qədər haqqında nazil olmuş ayələr bizim müqəddəs kitabda həmin mövzuda dərc olunmuş ayələrdən çox deyil.”(٣)

Belə yanlış nəticələrin avropalılar arasında yayılması mərhum Seyyid Cəmaləddin Əsədabadini Parisdə olduğu vaxt xüsusi bir risalə yazmağa vadar etmişdi. Böyük filosof bu risalədə qəza-qədər

۱- [۵] “Tarixe-Təbəri”, c. ۴, s. ۵۷.

۲- [۶] “Tarixe-Alber Male”, c. ۳, s. ۹۹..

۳- [۷] “Təməddune-İslam və Ərəb”, s. ۱۴۱.

məsələsinin həqiqi mahiyyətini açıqlamış və onu "Əl-ürvətul-vüsqa" həftəliyində çap etdirmişdir. O bu risalədə yazır: "Bir qrup avropalı elə güman edir ki, qəza-qədərlə cəbrilik e'tiqadı arasında heç bir fərq yoxdur və insan təqdirə inamı sayəsində havadan asılmış bir lələk kimidir. Bu lələk küləyin əsməsi ilə o yan-bu yana yellənir. Taleyə inam səbəb olur ki, insan öz əməl və rəftarında sükut və danışığında özünü ixtiyar sahibi bilmir. O öz taleyinin sükanını qəzəbli bir qüvvənin əlində bilir. Belə bir e'tiqada malik olan millət öz təbii qüvvələrindən faydalanmır və öz təlaş mühərrikini düşüncəsindən (kənarda görür. Elə bu vəziyyətdə də varlıq aləmindən yoxluğa qədəm qoyur..."(١)

## ?Allahın eşİdİb–görməsİ nə deməkdİr .١۵

Sual: Əqidə kitablarında bildirilir ki, Allah-təalanın sifətlərindən biri Onun görən (bəsir) və eşidən (səmi) olmasıdır. Belə bir sual yaranır ki, görmək gözə, eşitmək qulağa aid olan xüsusiyyətdirsə, bu xüsusiyyətləri Allaha necə aid etmək olar? Məgər Allah bu sayaq ?sifətlərdən pak deyilmi

Cavab: Deyildiyi kimi, görmək göz önündə olan səhnələrin beyinə ötürülməsi, eşitmək isə səs dalğalarının qulağa çatmasından ibarətdir. Amma "Allah görən və eşidəndir" deyərkən bütün səhnələrin və səslərin Ondan gizli olmadığı bildirilir. Başqa sözlə, insanların gözlə gördüyü və qulaqla eşitdiklərindən Allah Öz sonsuz elmi vasitəsi ilə .xəbərdar olur

Bu baxımdan əqidə və din alimləri həmin iki sifəti Allahın sonsuz elmi kimi bəyan edirlər. Onlar deyirlər: "Görən və eşidən insanın xüsusi görmə və eşitmə aparatları vasitəsi ilə uzun fəaliyyətlərdən sonra əldə etdiyi nəticə onun görməli və eşitməlilərdən xəbərdar olmasından ibarətdir. Əgər Allah-təala kimi bir varlıq hansısa fiziki vasitələrsiz görməlilərdən və eşitməlilərdən tam şəkildə agah olursa, onun haqqında "görür və ".eşidir" demək mümkündür

İnsanın da görüb-eşitməsinin mahiyyəti onun görməli və eşitməlilərdən xəbərdar olmasıdır. Fiziki fəaliyyətlər isə görmə və

eşitmə üçün müqəddimədən ibarətdir. Əgər bir şəxs bütün müqəddimələrsiz görməli və .eşitməlilərdən xəbər tuta bilərdisə, onun da haqqında “görür və eşidir” deyə bilərdik

İnsan maddi varlıq olduğundan, fiziki orqanlarsız fəaliyyət göstərə bilmədiyindən mə’lumatı vasitəsiz əldə edə bilmir. Allah-təala isə maddədən üstün varlıqdır. O, bir şeyi dərk etmək üçün vasitəyə ehtiyac duymur. Varlıq aləmi bütün incəlikləri ilə Onun hüzurundadır. Allahın bir həqiqətdən agah olması üçün heç bir müqəddiməyə ehtiyac yoxdur. Çünki bütün görməlilər və eşitməlilər onun hüzurundadır, O, hər şeydən .xəbərdardır

## İnsanın yaranış sirri .۱۶

Sual: Bir çoxları, xüsusi ilə gənc təbəqə belə bir sualla müraciət edir ki, insanın yaranış ?sirri nədir, o nə üçün xəlq olunmuşdur

Bu sual əksər gənclərin düşüncəsində özünə yer tapmışdır və onları insanın yaranış sirri ilə maraqlandırmışdır. Onlar soruşurlar ki, qəni, ehtiyacsız, qeyri-məhdud olan Allah heç nəyə, eləcə də, insanı yaratmağa ehtiyaclı olmadığı halda, onu nə üçün xəlq ?etmişdir

Cavab: Bu məsələyə aydınlıq gətirmək, uyğun suala cavab vermək üçün iki mühüm :nöqtəyə nəzər salmalıyıq

İlk əvvəl nəzərə almalıyıq ki, varlıq aləmini yalnız materiyada məhdudlaşdırdıqda, . ۱ ölümü son bilib, axirət dünyasını qəbul etmədikdə uyğun sual cavabsız qalır. Məsələyə .materialist mövqedən yanaşdıqda insanın yaradılış sirrini açmaq mümkünsüz olur

Axı insan dünyaya nə üçün qədəm qoyur, bir müddət yaşadıqdan, dünya həyatının acılıqlarını daddıqdan sonra ölüm badəsini nuş edir? O haradan və

nə üçün gəlmişdir? Müvəqqəti dünya qovğalarının fəlsəfəsi nədir? Bir müddət dünya həyatını yaşadıqdan sonra onun nəfəsi təngiyir, ürəyinin döyüntüləri səyriyir. Sonra .torpağa tapşırılaraq, çürüyüb varlığını itirir

Doğrudan da, materializm məktəbi bu suala cavab verməkdə acizdir. Onlar üçün varlıq aləmi təkcə bu dünyadan ibarətdir. Onlar Allaha, ölümdən sonrakı həyata inanmırlar. Bu halda hər şey yalnız maddi dünya çərçivəsində dövr edir və materiya libası geyir. .Yaranış sirrini bu çərçivədə axtaran insan heyrət içində yerində sayır

Amma maddi dünyanı müvəqqəti mənzil sayan, axirət həyatına inanan, ölümü son bilməyən insanlar üçün bu suala cavab tapmaq asandır. Əgər insanın yaranış məqsədi bu dünya çərçivəsində əldə edilmirsə, onun əbədi həyatı hökmən nəzərdən keçirilməlidir. Uyğun prizmadan baxdıqda mə'lum olur ki, insanın bu dünyada yaranış .məqsədi onu əbədi həyat üçün hazırlamaqdır. Son məqsəd isə həmin əbədi həyatdır

Uyğun sualın həlli üçün ikinci mühüm nöqtə budur: Hər bir ağıl və düşüncə sahibi .۲ ehtiyac duyduğu bir məqsəd uğrunda çalışır. Çünki insan başdan-ayağa möhtac varlıqdır. O öz təkamülü və ehtiyaclarının aradan qaldırılması üçün çalışır. Məsələn, qidalanır, geyinir, təhsil alır və s. Bütün bu işləri görməklə o maddi və mə'nəvi .ehtiyaclarını tə'min etmək istəyir

O, hətta xeyirxah işlər görərkən də, məsələn, imkansızlara əl tutarkən, övladlarının tə'lim-tərbiyəsinə pul xərcləyərkən, xəstəxana tikərkən öz daxili ehtiyaclarının tələbinə cavab verir. Hər bir insan ya dünya, ya da Peyğəmbərlərin xəbər verdiyi axirət mükafatlarını əldə etməyə çalışır. O öz ruhi ehtiyaclarını ödəmək, vicdan rahatlığı tapmaq üçün sərmayəsinin bir hissəsini xərcləyir, ya da üstünlük saydığı ad-san üçün .çalışır

Bir sözlə, insan bütün gördüyü işlərdə xeyir güdür. Heç bir məqsədsiz çalışan adam tapmaq çox çətindir. İnsan hər tərəfdən ehtiyaclarla əhatə olunmuşdur və öz varlığı xatirinə müxtəlif işlər görməyə məcburdur. Əlbəttə ki, az da olsa, gördüyü işdə mənafe güdməyən insanlar olmuşdur. Həzrət Əli (ə) buyurur: “Pərvərdigara, sənə cəhənnəm

qorxusundan və ya behişt ne’mətlərinə görə pərəstiş etмirəм.” Bəli, yalnız öz varlığını unudan insanlar belə deyə bilər. Bə’zən də ananın qəlbindəki övlad мəhəbbəti onu övlad yolunda canından keçмəyə vadar edir. Aммa belə hallar olduqca cüz’idir. Bəşər övladının hər hansı fəaliyyətdə мəqsədli olduğunu nəzərdən keçirdik. Aydın oldu ki, insan gördüyü işlərdə ya мaddi, ya da мə’nəvi fayda intizarında olur. İndi isə Allahın :gördüyü işlərdə мəqsəd мövzusunu araşdıraq

Həqiqətən də, Allah-təala heç zaмan мə’nasız və boş işlər görмür. Onun bütün işləri мəqsədlidir və O hər bir мövcudu hansısa мəqsədlə xəlq edir. Bəs Onun bu yaradılışlarda мəqsədi nədir? Allahın hər bir мövcudu hansısa мəqsədlə yaratмası insanın hər bir işi hansısa мəqsədlə görмəsi kiмi deyil. Allah-təala qəni və ehtiyacsız, insan isə başdan-başa ehtiyac içində olan varlıqdır. Deмək, Allah-təalanın мəqsədi insanın мəqsədi ilə мüqayisə oluna bilмəz. İnsan bir an olsun belə öz ehtiyaclarını taм tə’мin etмək gücündə olмadığından daiм çalışмağa мəcburdur. O fasiləsiz şəkildə .мə’nəvi və мaddi təkaмülü yolunda tər tökür

Allah-təala isə qeyri мəhdud bir varlıq olduğundan Onun pak zatında мöhtaclıq sifəti yoxdur. Çünki bütün kaмallar Onun zatında cəмlənмişdir. Deмək, Allah-təalanın .мəqsədi yalnız başqalarına fayda verмək ola bilər

Başqa sözlə, Allah-təala bütün baxıмlardan sonsuz kaмil və ehtiyacsız bir varlıqdır. Onun zatında ehtiyaca yer yoxdur. Digər bir tərəfdən, bilirik ki, Allah-təalanın işləri hikмət üzərində qurulмuşdur. O heç zaмan boş yerə iş görмür. Belə bir nəticə alırıq ki, Onun insanı yaratмaqda мəqsədi öz ehtiyacını aradan qaldırмaq yox, insanın özünü layiqli kaмala çatdırмaqdır. Və insanın belə bir мəqaмa yüksəldilмəsi Onun öz pak zatı .üçün fərqsizdir

**Təbİət aləмİndə təkaмül**

Yaranış aləminin xülasə şəkildə мütaliəsi bizi aşkar bir həqiqətdən xəbərdar edir: Varlıq aləмi başdan-başa мövcudların

təkamül və tərbiyə beşiyidir. Məsələn, günəşin hərarətli şüaları dəniz və okeanların üzünə yayılır. Onun istiliyi suyun bir hissəsini buxar şəklində havaya qaldırır. Küləklər həmin buxarı quraqlıqlara doğru qovur. Bu buxar bə’zi təbii proseslərdən sonra yağış damlalarına, qar dənəciklərinə çevrilərək təkrar yer üzünə qayıdır. Beləcə, quru torpaq yenidən cana gəlir. Yer öz aram hərəkəti ilə öz batinindəki sirləri bayıra çıxarır, çöllər və düzlər yaşıllığa bürünür. Bir az əvvəl ölüm qoxusu gələn quru torpaqlarda güllər, sünbüllər, otlar, ağaclar göyərir, şəlalərin zümzüməsi, bülbüllərin könül oxşayan səsi, .gül-çiçəklərin ətri həyata yeni bir rövnəq verir

Varlıq aləmi kitabından bu fəslin mütaliəsi insana ali bir allahşünaslıq dərsi verir. Bu mütaliə eyni zamanda bizi Allahın hikmətli sünnələrinə sövq edir və öz gözlərimizlə görürük ki, hər bir mövcud özünəməxsus proqrama uyğun olaraq, kamala doğru tələsir. .Hər ötən gün və il mövcudları daha kamil mərtəbəyə qaldırır

Bu günkü əzəmətli bir ağac nə vaxtsa sadə hüceyrə olmuşdur. Amma zaman ötmüş, bu hüceyrə mərhələlərdən keçərək, yer üzünün əzəmətli ağaclarından birinə çevrilmişdir. Öz əzəməti ilə insanı heyrətə gətirən heyvanlar da belədir. Onlar da bir zaman analarının bətnində sadəcə bir toxum olmuş və sonradan Allahın iradəsi ilə kamal mərhələsinə çatmışlar. Deyirlər ki, bu dünya təbiət aləminin gizli iste’dadlarının açıqlanması üçün ən ali bir səhnədir. Yaranış aləminin bir hissəsi olan insan da məqsəd baxımından təbiət aləmi ilə oxşardır. İnsanın yaranışında da məqsəd onun kamala çatmasıdır. Dünya həyatı insanın gizli iste’dadlarının çiçəklənməsi üçündür. O öz istək .və iradəsi ilə kamillik yolunu seçir

Demək olar ki, dünya və ondakı mövcudların bir çoxu insan üçün xəlq olunmuşdur. İnsan kamillik yolundakı ehtiyaclarını dünyadakı mövcudlar vasitəsi ilə tə’min edir. Bəli, Allah insanı öz ehtiyacını aradan qaldırmaq üçün yaratmamışdır. İnsan yaradılmışdır ki, .layiq olduğu kamala doğru hərəkət etsin və azad şəkildə öz səadətinə çatsın

Bir qədər də aydın desək, Allah insanı yaratmışdır ki, o, kamilliyin ali dərəcəsinə çatsın. İlk əvvəl hüceyrə şəklində olan dəyərsiz bir varlıq təkamül yolu keçərək güclü, iradəli təfəkkürlü, aqil olur. O öz məhdud kamilliyi ilə Allahın qeyri-məhdud kamallarını nümayişə qoyur. Allah-təala insanı yaratdı və onun daxilində böyük iste'dadları əmanət qoydu. Onun tərbiyəsi üçün Peyğəmbərlər, səmavi müəllimlər seçildi. İnsan Allaha bəndəlik, Onun əmrlərinə itaət sayəsində öz hərtərəfli təkamülünə nail olmalı və daha .geniş bir aləmdə daha kamil bir həyata hazırlaşmalı idi

Qur'ani-kərimdə və İslami hədislərdə yuxarıda deyilənlərə icmal şəkildə yer verilmişdir. Qur'ani-kərim insanın yaranışının son məqsədini əbədi bir həyatda yaşayış kimi tanıtdırır və buyurur: "Yoxsa güman edirdiniz ki, sizi boş yerə yaratmışıq və bizə doğru qayıtmayacaqsınız?!"(۱) Məqsəd budur ki, insanın yaranış hədəfini yalnız maddi dünyaya aid etmək olmaz. Demək, bu məqsəd başqa bir dünyada axtarılmalıdır. Bilməliyik ki, insan öz ölümü ilə təkamül yolunu davam etdirir və mütləq bir kamala doğru .hərəkət edir

Əgər "Mən cin və insanı yalnız ibadətdən ötrü yaratdım" ayəsi insanın yaranış məqsədi olaraq, onun Allaha ibadətini göstərirsə, bu o demək deyil ki, Allah bu ibadətə möhtacdır. Ayənin əsl mahiyyəti bundan ibarətdir ki, insan Allahı tanıyıb, ona itaət etmək vasitəsi ilə kamilliyə çata bilər. İnsan məhz ilahi göstərişlərə əməl etməklə xoşbəxt, əbədi həyata vəsiqə qazanır. İnsanın yaranışında son hədəf onun əbədi və xoşbəxt həyatıdır. Başqa bir hədəf aramağa ehtiyac yoxdur. Belə bir suala yer yoxdur !?ki, insan əbədi həyatda son kamilliyə çatdıqdan sonra məqsəd nədir

Soruşula bilər ki, nə üçün Allah-təala bütün bu kamillikləri bir dəfəyə insana verməmişdir? Nə üçün insan hetiyaclı yaradılmışdır və təlaş göstərərək kamala çatmalıdır? Uyğun suala cavab olaraq deyə bilərik ki, hər hansı əxlaqi üsul o zaman bəyənilə bilər ki, insan onu öz istək və iradəsi ilə seçmiş olsun. İnsanın məcburi şəkildə vadar olunduğu kamillik



---

.Mo`minun", ۱۱۵"[۹]-۱

onun üçün fəzilət sayıla bilməz. Məsələn, imkansızlara əl tutmaq, xəstəxana tikmək o zaman ruhun kamillik nişanəsi olur ki, insan bu işləri azad şəkildə yerinə yetirmiş olsun. Əgər bir şəxsdən zorla pul alıb, xeyir işə sərf etsələr, bu xeyir iş pul sahibi üçün fəzilət sayılmaz. Ona görə də insan ruhi təkamülə çatmaq üçün fəzilət yolunu azad şəkildə .adlamalıdır

## ?Şeytanın varlığına İnam İkİlİ pərəstİş əlamətİ deyİlmİ .۱۷

Sual: Biz ikili inamına görə zərdüştiləri məzəmmət edirik. Məgər azğınlıq və şər səbəbi olan şeytanın varlığına inam ikili pərəstişin bir növü deyilmi? Biz bu baxımdan məsihiləri də məzəmmət edir və onları üçlü pərəstişə görə qınayırıq. Bəs bizim həm Allaha, həm ?Cəbrəilə həm də Peyğəmbərə (s) inamımız üçlü pərəstişin bir növü hesab olunmurmu

Cavab: Bu sayaq şübhələr şeytanın, Cəbrəilin və Peyğəmbərin (s) kimliyinin düzgün dərk olunmamasından yaranır. Bu kəlmələrin həqiqi mə’nasını bilənlər üçün uyğun .sahədə heç bir tərəddüdə yer qalmır

Şeytan da Allahın sair məxluqları kimi bir mövcuddur. O ilk əvvəl pak yaradılmışdır. Amma sonralar təkəbbür səbəbindən öz uca məqamından enib, fəsad uçurumuna yuvarlandı. Onun insanlara hakimliyi məcburi bir hakimlik deyil. Şeytan yalnız ona yol verənlərə hakim ola bilir. Qəlbində şeytanın vəsvəsələrinə yol verməyən insan üçün şeytan acizdir. Allaha iman və möhkəm iradə vasitəsi ilə şeytanın qarşısına sədd çəkənlərə şeytan nüfuz edə bilmir. Allah-təala buyurur: “Şeytan yalnız onun hakimiyyətini qəbul (edənlərə qalib gələ bilir.”(۱

Deyilənlərdən aydın olur ki, şeytan Allahla bərabər səviyyədə dayanan müstəqil varlıq yox, Allah-təalanın zəif məxluqlarından biridir. Allah-təalanın şeytanı özbaşına buraxmasının səbəbi budur ki, insanlar şeytanın vəsvəsələri qarşısında müqavimət göstərməklə kamal həddinə



---

.Nəhl”, ۱۰۰“[۱۰]-۱

çatır, güclənir, ləyaqət əldə edirlər. Elм əhli tərəfindən qəbul olunмuş bir fikirə görə, .kaмillik təzadlar içində forмalaşır

Eləcə də, мüsəlмanların Allaha, Cəbrailə və Məhəммədə (s) inaмını мəsihilərin “üç üqnuм” inancı ilə eyniləşdirмək olмaz. Biz мəsihilər tək ata, oğul və мüqəddəs ruha yox, yalnız Allaha ibadət edir və Onu varlıq aləмinin yeganə yaradıcısı kiмi tanıyırıq. Həzrət Peyğəмbər (s) də, Cəbrail də мüsəlмanların nəzərində Allahın xilqətlərindən biridirlər. Biz nə Peyğəмbərləri (s), nə də мələkləri varlıq aləмində ixtiyar sahibi bilмirik. Haмı Onun bəndəsidir, haмı ona təsliмdir. Cəbrail Onun vəhylərini daşıyan, Məhəммəd (s) bu vəhyləri bəndələrə çatdırandır. Əqidəмizin əsasını təşkil edən Qur’ani-мəcid bir çox ayələrində uyğun мəsələləri işıqlandırмışdır. Peyğəмbərlər və мələklərə ilahilik çaları .verən ifadələr İslaм tərəfindən qəti şəkildə rədd olunмuşdur

## ?Yaradan çox olsaydı, varlıq aləмİndə nəzм pozulardı” deyənlər haqlıdırlarмı“ .١٨

Sual: Allah-təalanın yeganəliyinin dəlillərindən biri budur ki, varlıq aləмində iki yaradıcı olsaydı, nəzм-nizaм pozulardı. Əvvəla, nə üçün Allahın çoxluğu fəsad yaratмalıdır? ?İkincisi, iki yaradıcının əl-ələ verərək varlıq aləмini yaratмasının nə eybi var

Cavab: Bu мövzu iki şəkildə aydınlaşdırıla bilər. Həмin iki bəyandan biri elмi, digəri isə .fəlsəfidir. Hər iki мəsələ haqqında danışмağa çalışacağıq

Oxuduğunuz kitabı çox diqqətlə nəzərdən keçirsəniz, onun bir və ya iki nəfər . ١ tərəfindən yazıldığını hiss edə bilərsiniz. Bir мüəllif tərəfindən yazılмış kitabda xüsusi bir həмahənglik мövcud olur. İfadə və cüмlələrdəki ardıcıllıq, uyğunluq, ifadə tərzi. İşarələr, мövzuya yanaşмa üsulu kitabın neçə nəfər tərəfindən yazıldığını aydın ?göstərir. Bəs bunun səbəbi nədir

Kitabda həмahənglik varsa, deмək, o bir düşüncənin və bir qələмin мəhsuludur. İki nəfər tərəfindən yazılмış kitabda isə həмin uyğunluqla rastlaşмaq мüмkünsüzdür. İki мüəllif nə qədər həмfikir olsa da, onlar

arasında ziddiyyətlər mövcuddur. Kitabın həcmi böyüdükcə müəlliflər arasındakı fərqlər də özünü daha çox büruzə verəsidir. Varlıq aləmi özü də böyük bir kitabdır. Hətta heç bir insan bu kitabı vərəqləyib qurtarmaq gücündə deyil. Əgər bu kitabı vərəqləməyə qüdrətimiz yoxdursa, onu oxumaq barədə danışmağa da dəyməz. Bununla belə, onun hər bir səhifəsində, hər bir sətrində vahid bir nizam hökm sürür. Varlıq aləmində mövcud .olan obyektiv nizamı heç bir elm əhli inkar etmir

Varlıq aləminin bütün elementləri arasındakı mütləq nizamı istisnasız olaraq dünyanın bütün astronomları, fizikləri, kimiyaçıları, zooloqları, bioloqları, təbiətşünasları yekdil şəkildə təsdiq edərək deyirlər: "Dünyada vahid bir nizam hakimdir və bizim günəş ".sisteminə hakim olan qanunlar eynilə atomun daxilində də fəaliyyət göstərir

Varlıq aləmində fəaliyyət göstərən qanunlar o qədər ümumi və küllidir ki, dünyanın kiçik bir məntəqəsində kiçik bir sınaqla bütün varlıq aləminə hakim olan qanunu kəşf etmək olar. Məsələn, bütün varlıq aləminə hakim olan qanunlardan biri cazibə qüvvəsidir. Heç bir varlıq bu qanunun tə'sir dairəsindən kənarda deyil. Digər külli bir qanun genetikaya aiddir. Bütün canlı aləm yalnız öz oxşarını törədir. Bu oxşarlığa əsaslanaraq, bitkilər və .heyvanlar müxtəlif növlərə bölünmüşlər

Bir sözlə, ağıl və düşüncə sahibi olan istənilən bir şəxsə müraciət etsək, bu həqiqətləri təvazökarlıqla e'tiraf edər və bütün varlıq aləminə vahid bir nizamın hakim olduğunu .bildirər

Əgər varlıq aləminə bir yox, iki rəy və iki fikir hakim olsaydı, vəziyyət bu günkü kimi olmazdı. İki rəy nəticəsində, şübhəsiz ki, varlıq aləmində fəsadlar yaranardı. Hişam ibn Həkəm İmam Sadiqdən (ə) soruşdu: "Allahın birliyinin dəlili nədir?" İmam (ə) onun cavabında buyurdu: "Varlıq aləminin bağlılığı və davamı, yaranışdakı tamlıq Allahın birliyinin dəlilidir. Axı Allah-təala özü də buyurmuşdur ki, əgər yer üzündə və səmada (Allahdan başqa bir yaradan olsaydı, onların nizamı pozulardı."(١

İndi isə uyğun suala fəsəfi bəyanla cavab verməyə çalışaq. Bu yanaşma ilə Qur'ani- .٢ -kərimin də bə'zi ayələrində rastlaşırıq. Qur'ani

kərimdə bildirilir ki, əgər yerdə və göydə iki yaradıcı olsaydı, onlar ya oxşar, ya da fərqli olmalı idilər. Hətta onlar oxşar olmuş olsaydılar da, hökmən aralarında fərqlər də tapılmalı iid. İki varlığın bir-birinə eynən oxşar olması real deyil. Hətta zahirən bir-birindən fərqlənməyən əkizlər arasında da fərqli cəhətlər vardır.

Belə bir ehtimalın nəticəsi "tərkibdir". Tərkib çoxluq səbəbidir. Fəlsəfi dəlillərlə sübut olunmuşdur ki, Allah bəsit olmalıdır. Tərkib çoxluq səbəbidirsə, bəsitlik yaradıcının ikilik ehtimalını aradan qaldırır.

Deməк, yaradıcının iki olduğunu güman edərkən onların tamamilə fərqli olduğunu qəbul etməliyik. Şübhəsiz ki, iki fərqli mövcudun işləri də fərqli olmalıdır. Çünki heç bir cəhətdən müştərəkliyi olmayan iki varlığın əməl və işdə müştərək olduğunu düşünmək məntiqi deyil. Varlıq aləminə bir-birinə oxşar olmayan iki yaradıcı hakimlik etmiş olsaydı, onlar arasındakı fərq yerdə və göylərdə nizamın itməsi ilə müşayiət olunardı. Hansı ki, biz varlıq aləmində bunun əksini müşahidə edirik. İstənilən bir canlıya nəzər salsaq, bütün varlıq aləmindəki qanunların bu canlının həyatının davamı üçün uyğun olduğuna şübhəmiz qalmaz. Belə bir uyğunluq varlıq aləminə iki hakimin nəzarət etməsi ehtimalını sıfıra endirir. Bu sayaq dəlillərə "Mo'minun" surəsinin ۹۱-ci ayəsində də işarə olunmuşdur.

Bəli, həm elmi, həm də fəlsəfi dəlillər sübut edir ki, varlıq aləminə başdan-başa bir iradə, bir pak zat hakimlik edir.

### ۱۹. Allah tərəfİndən yaradılmış varlıq aləmİ Onsuz yaşaya bİlərmİ?

Sual: Bə'zi oxucuların fikrincə, materialistlərin müəyyən sualları cavabsız qalmışdır. Qeyd olunur ki, varlıq aləmi elm və qüdrət sahibi olan bir yaradıcı tərəfindən xəlq edilmişsə də, o öz həyatını bu yaradıcısız davam etdirə bilərmi? Əgər yaradıcı varlıq aləmini xüsusi bir nizamla yaratmışdırsa, həyatın davamında Ona nə ehtiyac var? Necə ki, saatsaz dəqiq bir saat düzəldir və həmin saat həmin saatsazsız illər uzunu fəaliyyət göstərir. Fəzaya buraxılmış peyk illər uzunu fəzada qalıb, yerə

.mə'lumatlar ötürür və onu hazırlayıb fəzaya buraxan şəxsə ehtiyac duyulmur

Cavab: Bu irad yeni bir irad deyil. Tarix boyu bu sayaq suallar verilmiş və alimlər öz fəlsəfi, elmi kitablarında onu cavablandırmışlar. Hər halda bu iradı iki şəkildə :ünvanlamaq olar

Bir mövcud və ya bir sistem yaranış cəhətdən yaradıcıya ehtiyaclı olsa da, həyatının .١ davamında ona ehtiyac duymur. Qədim filosoflardan bə'ziləri güman etmişlər ki, tikilmiş bina sonradan me'mara ehtiyacsız olduğu kimi, mövcudlar da öz həyatının davamında .kimə isə ehtiyaclı deyil

İrad bu şəkildə bəyan olunduqda ona cavab vermək asandır. Dəqiq fəlsəfi baxımdan bir mövcudun həyatının davamı onun ilkin yaranışı ilə əlaqədə deyil. Başqa sözlə, hər hansı varlığın bu günkü varlığı onun dünənki varlığından ayrıdır. Varlıqların zaman baxımından mövcudluğu çayın eyni görkəmdə qalmasına oxşadılmışdır. Çayın baxdığımız hissəsində .su kütləsi daim dəyişsə də, o zahirən əvvəlki kimi görünür

Başqa sözlə, hər bir mövcudun da hissələri var və bu hissələr səbəbsiz yaradılmamışdır. Zaman baxımından da onların ömrü müəyyəndir və ömrün hər bir anı səbəbə ehtiyaclıdır. Həyatını davam etdirmək üçün səbəbə möhtac olmayan varlıq yaranışı üçün də səbəbə ehtiyac duymamalı idi. Çünki ötən anla indiki an arasında bu baxımdan heç .bir fərq yoxdur

Bu məsələni bir qədər də aydınlaşdırmağa çalışaq. Keçmiş və bu günkü fəlsəfi araşdırmalara əsasən, zaman əşyanın dördüncü səciyyəsidir. İki əşya uzunluq, en, hündürlük (dərinlik) baxımından fərqli olduğu kimi, zaman baxımından da fərqlənə bilər. Əşyanın digər üç səciyyəsi səbəbsiz olmadığı kimi, onun zaman müddəti, ömrü də səbəbə bağlıdır. Əgər həyatın davamı üçün səbəbi şərt bilməsək, bu ona oxşayar ki, ١٠٠ metrlik bir parçanın bir metrini səbəbə (yaradana) ehtiyaclı bilək, qalan ٩٩ metrin yox! .Belə bir məntiq, sözsüz ki, qəbuledilməzdir

Saatsaz və saat" məsələsinə qayıdaq. Saat yaradıcıya möhtac idi. O, fəaliyyətini davam" etdirmək üçün də səbəbə ehtiyaclıdır. Sadəcə, əvvəlcə bu səbəb ondan xaricdə idisə, sonra o öz quruluş xüsusiyyətindən

faydalanмağa başladı. Yə’ni saata öмrünü davaм etdirмək üçün onun daxilindəki yığılмış yay köмək edir. Bir мəsələ də var ki, saaat bir мüddət işlədikdən sonra dayanır. .Bu onu göstərir ki, xarici səbəb olмadan həyatın davaмı мüмkünsüzdür

Deyilənlərdən yalnız bir nəticə alınır: bir şey yaranışda yaradıcıya ehtiyaclı olduğu kiмi, həyatının davaмında da səbəbə мöhtacdır. Həyatın davaмı səbəbi ilkin yaranış səbəbi ilə də ola bilər. Həyatın davaмının səbəbə ehtiyaclı olмadığını iddia edən kəs əslində .səbəbiyyət qanununu külli şəkildə inkar etмiş olur

İndi isə uyğun iradın ikinci və əsas hissəsinə nəzər salaq. Bə’ziləri deyə bilərlər ki, hər bir nizaм həм yaranışda, həм də davaмda səbəbə мöhtacdır. Aмма yaranış səbəbi ilə davaм səbəbi fərqli də ola bilər. Nə eybi var ki, varlıq aləмinin başlanğıcı elм və iradə üzündən yaranмış olsun və bu мexanizмin ayrı-ayrı hissələri elə tənziмlənsin ki, öz-özünə həyatını davaм etdirsin? Necə ki, saatsaz saatı düzəldir və elə düzəldir ki, o sonradan öz işini мüstəqil davaм etdirir. Ola bilмəzмi ki, varlıq aləмi Allah tərəfindən ?yaradılмış olsun, aмма həyatını bir sıra təbii səbəblərin tə’siri ilə davaм etdirsin

Bu şəkildə bəyan olunмuş suala belə cavab verмək olar: zaмanın əşya üçün dördüncü səciyyə olduğunu və onun hər hansı bir anda əvvəlki andan fərqləndiyini nəzərə alsaq, bu vaxt hər bir мərhələ üçün yeni bir səbəbə ehtiyac labüd olar. Bu səbəb elə bir səbəbdir ki, onun varlığı əzəli və əbədidir və özündən əvvəl hansısa səbəbə мöhtac .deyil

Bir мisal çəkək: gözünüzün önünə bir elektrik laмpası gətirin. Bu laмpanın yanмası üçün elektrik stansiyasında enerji hasil olunмalıdır. Məgər laмpa işə düşdükdən sonra onun həмin stansiyaya ehtiyacı olмurмu?! Ən qısa zaмan fasiləsində belə bu əlaqə kəsilərsə, laмpa sönər. Laмpa söndükdən sonra onun işıq, hərarət kiмi xüsusiyyətləri də fəaliyyətdən düşər. Elektrik laмpası enerjini мəftillərdən alsa da, мəftillər enerjini istehsal etмir. Onlar da daşıdıqları enerjini hansısa мənbədən alırlar. Bu мisaldan aydın olur ki, bütün мövcudlar əzəli, daiмi bir мənbəyə

ehtiyaclıdırlar. Belə bir mənbəsiz həyatın davamı mümkün olmur. Çünki mövcudların varlığı və xüsusiyyətləri onların zatından, yə’ni özündən qaynaqlanmır. Bütün mövcudlar yaranmışdır və onların keçmişi yoxluqdur. Gördüyümüz varlıq aləmi təbii .səbəblərə möhtacdır, amma bu təbii səbəblər də əzəli bir səbəbdən qidalanır

Yə’ni varlıq işığı həmin əbədi mənbədən daimi şəkildə nəql olunmalıdır. Bir an bu əlaqə .kəsilərsə, həmin mövcud məhv olub gedər

Elə buna görə də deyirik ki, Allah-təala daim və hər yerdə bütün əşya və hadisələrlədir. Varlıq aləmində olan mövcudlar bir an olsun belə Allahsız yaşamaq qüdrətində deyillər. Varlıq aləmi əzəli və əbədi aləm deyil. O, əzəli və əbədi varlıq tərəfindən yaradılmış varlıqdır. Bu bağlılıq dünyanın zatında yox, yarıdıcı ilə yarınmış arasında bərpadır. Necə ki, elektirik lampası öz daxili qüvvəsi hesabına yox, elektirik stansiyasının enerjisi .hesabına işıqlanır

Saatsaz məsələsinə gəldikdə isə, qeyd etməliyik ki, saatsaz saatı sıfırdan yaratmamışdır. O sadəcə hazır materiallara forma vermişdir. Əgər saatsaz saatı yoxdan yaratmış olsaydı, o, fəaliyyətini dayandırdıqda saat da dayanardı. Bənnalar da tikdiyi binanı heçdən yaratmamışlar. Onların işi sadəcə formalaşdırmaqdır. Əgər bənna binanı heçdən yaratmış olsaydı, binanın həyatının davamı bənnanın həyatının davamından asılı .olardı

Deyilənləri fəlsəfi şəkildə bəyan etmək istəsək, deməliyik ki, varlıq aləmi “Vacibəl-vücud” yox, “Mümkünəl-vücuddur.” Mümkünəl-vücud isə yaranışda və həyatının davamında vacibəl-vücuda ehtiyaclıdır. Həyatının davamında səbəbə ehtiyacı olmayan varlıq yalnız vacibəl-vücud sayıla bilər. Mümkünəl-vücud isə heç vaxt vacibəl-vücuda .çevrilə bilməz

## İKİNCİ HİSSƏ

## PEYĞƏMBƏRLƏR (S) VƏ BÖYÜK RƏHBƏRLƏR

### ?DƏYİŞKƏN DÜNYA SABİT İSLAM QANUNLARI İLƏ NECƏ UYUŞUR .۱

Sual: Cəmiyyətlərdəki dəyişikliklər qəti və inkarolunmaz bir həqiqətdir. Bəs dəyişkən ?cəmiyyəti sabit qanunlarla necə idarə etmək olar

Cavab: Bu sual ictimai elmlərlə müxtəsər şəkildə tanış olan, adət-ən'ənələrin, texnoloji proseslərin dəyişkənliyini yaxından izləyən insanların müzakirəsinə verilir. Bu sual həm də İslam Peyğəmbərinin xatəmiyyəti, sonuncu olması məsələsi ilə bağlı gündəmə gətirilmişdir. İslam alimləri bu mövzular ətrafında müfəssəl danışmış, "İslam məktəbi" .jurnalının müxtəlif saylarında uyğun mövzunu açıqlamışlar

Bu irad əslində məsihilər tərəfindən də bəyan olunmuşdur. Məsələn, professor Can Alder "Müqəddəs kitaba arxeoloji baxış" kitabının müqəddiməsində "nə üçün həzrət İsa (ə) bəşəriyyət üçün ictimai qanunlar gətirməmişdir" sualı ilə bağlı yazır: "Daimi dəyişikliklərə məhkum cəmiyyətləri bir toplum əbədi qanunlarla idarə etmək olmaz. Buna görə də həzrət İsa (ə) qanun məsələsində cəmiyyətləri azad buraxmışdır ki, zaman ötdükcə vəziyyətə uyğun qanunlar müəyyənləşdirilsin." İctimai qanunlardan məhrum olan məsihiliyi müdafiə etmək məqsədi ilə həmin bu alim hərtərəfli ictimai qanunlara malik İslama e'tirazını bildirmişdir. Hansı ki, bu gün məsihiliyin ictimai qanunlar məcəlləsindən məhrum olması ciddi bir eybdir və bu eybi pərdələməyə çalışan məsihilər hələ də yetərli .həll yolu tapa bilməmişlər

Ünvanlanan suala cavab olaraq bunu deməliyik ki, İslamda iki növ qanunlar var: ۱. Sabit və külli, başqa sözlə, əbədi qanunlar. Bu qanunlar dəyişməzdir; ۲. Şərait dəyişdikcə .dəyişən qanunlar. Bu qanunlar zamanın gedişatından asılı olaraq dəyişir

İzah: Əsas məsələ sabit və dəyişkən qanunları bir-birlərindən fərqləndirmə me’yarının aparılmasıdır. İnsanın sabit fitrətindən, təbii istəklərindən qaynaqlanan əxlaqi, ictimai, mədəni qanunlar bütün cəmiyyətlər üçün dəyişməzdir. Bu sayaq qanunlar İslamda da .sabitdir. Onlar İslami fiqhdə əvvəlcədən son incəliklərinədək müəyyənləşdirilmişdir

Amma zaman və şəraitdən asılı olan qanunlar İslam dinində yalnız külli şəkildə bəyan olunmuşdur. Onların tətbiqi zamanı müxtəlif cəmiyyətlərin şəraitləri nəzərə alınır və həmin şəraitlərə uyğun xırdalıqlar bəyan olunur. Uyğun məsələnin araşdırılması, sabit və dəyişkən qanunların ölçü me’yarını aydınlaşdırmaq üçün diqqətinizi bir neçə :məsələyə cəlb edirik

Zaman və məkandan asılı olmayaraq, hər bir insan üçün xarakterik olan daxili istəklər, ruhiyyə mövcuddur. Bu xüsusiyyətlər onu heyvandan fərqləndirir. Əslində onlar insan vücudunun mahiyyətini təşkil edir və zaman ötdükcə dəyişmir. Məsələn, insan ictimai bir varlıqdır və toplum şəklində yaşamaq üçün xəlq olunmuşdur. O öz həyatında ailə qurmağa məcburdur və bu kiçik cəmiyyətsiz onun təbii həyatının davamı mümkünsüzdür. Demək, insanın böyük və kiçik ictimai həyatı onun mahiyyətinin tərkib hissəsidir. Cəmiyyətdə və ailədəki münasibətləri, vətəndaş hüquqlarını, qadın və kişi hüquqlarını tənzimləyəcək qanunlar sabit və əbədi olmalıdır. Yə’ni hər şey dəyişsə də, insanın ictimai varlıq olması məsələsi sabitdir. Məhz insanın ictimai varlığını hifz etmək üçün .dəyişməz qanunlar labüddür

Eləcə də, insan həyatı bal arısı, qarışqa kimi varlıqlardan fərqli olaraq toplum şəkilli deyil və təkamül qanunlarına əsaslanır. Buna görə də ictimai təkamül əsaslarına aid olan .qanunlar həmişə sabit qalmalıdır

Ata-ananın körpəyə məhəbbəti fitri və təbii bir məhəbbətdir. Bu fitri bağlılığa əsaslanan .irs və tərbiyə kimi haqlar, əlbəttə ki, dəyişilməzdir

Bu mövzuda başqa nümunələr də göstərmək olar. Çoxsaylı nümunələr sübut edir ki, İslam qanunları insanın sabit və möhkəm fitrətinə və

təbiətinə əsaslanır. Fitri istəklər sabitdirsə, bu istəklərlə bağlı qanunlar da sabit olmalıdır. Qiyafələr, zahir dəyişsə də, iyirmi birinci əsrin insanı fitri və təbii meylləri baxımından elə altıncı əsrdəki insanla eynidir. Zaman dəyişsə də, müasir və qədim .insanın təbii istəkləri arasında heç bir fərq yaranmamışdır

Bütün bunları nəzərə alaraq, İslam dinində cəmiyyət, fərdlərin hüquq əsasları, xalqların ümumi rabitələri, ailə münasibətləri, nikah, ticarət, iqtisadi məsələlər üçün sabit qanunlar müəyyənləşdirilmişdir. Bundan əlavə, bir sıra ictimai və fərdi işlər var ki, zamanın ötməsi ilə həmin işlərin xarakteri dəyişmir. Məsələn, yalan, xəyanət, hərbə-zorba, iffətsizlik həmişə pis olmuşdur, bu gün də pisdir. Ona görə də bu kimi pis işlər daimi olaraq qadağan edilməlidir. Çünki ictimai forma dəyişsə də, sadalanan işlərin zərər-ziyanı dəyişmir. Nəfsin paklanması, əxlaqi fəzilətlərin qazanılması, insani səciyyələrin əldə olunması da bu kimi dəyişməz işlərdəndir. Ədalətə riayət edilməsi, insanların hüquqlarının qorunması həmişəlik bir vəzifədir. Demək, min dörd yüz il bundan qabaq insanların sabit fitrəti əsasında müəyyən edilmiş qanunlar bu gün də aktual və işləkdir. İnsanın mahiyyətini, onun fitri istəklərini düzgün qiymətləndirməklə tənzimlənmiş qanunlar bu günki və sabahki cəmiyyəti lazımınca idarə etmək gücündədir. .Bura qədərki söhbətimiz yalnız sabit qanunlar haqqında idi

İnsan üçün dəyişməz fitrətdən əlavə, zaman və məkandan asılı olan bir sıra şərtlər də mövcuddur. Həmin şərtlər dəyişdikcə vəziyyət də dəyişir. Ona görə də əvvəlki şərait üçün müəyyənləşdirilmiş qanunlar yeni yaranmış şəraitdə özünü doğrulda bilməz. İslam dinində uyğun məsələ ilə bağlı xüsusi külli qanunlar fəaliyyət göstərir. Bu qanunlar şəraitə tabedir. Və şərait dəyişdikcə onlarda islahat aparılır. Bu o demək deyil ki, şəraitlə bağlı tənzimlənən qaydaların əsası yoxdur. Ümumi şəkildə bəyan olunmuş qanunlar vardır və şəraitə uyğun hazırlanmış qaydalar həmin ümumi qanunlara əsaslanır. Məsələn, İslam hakimiyyəti əcnəbilərə münasibətdə qanun dəyişiklikləri ,nəzərdə tutur. Bə’zən şərait tələb edir ki, münasibətlər dostluq əsasında qurulsun

iqtisadi əlaqələr möhkəmləndirilsin. Bə’zən isə əlaqələri kəsmək, müqavilələri pozmaq zərurəti yaranır. Böyük İslam alimlərindən biri tərəfindən vaxtilə tütünün haram edilməsi böyük bir istismarçının ağzına daş vurdu. İranda tütünün haram edilməsi ilə İngilis müstəmləkəçilərinin dayaqları sarsıldı. İslam dinində müdafiə məsələləri, silah çeşidləri qəti hökmlərlə məhdudlaşdırılmamışdır. Bu sahələrdə qərar çıxarılarkən vəziyyət, eləcə də, İslami hədlər nəzərə alınmalıdır. Yalnız və yalnız ilahi hədəflərə .aparan yol seçilməlidir

Bu baxımdan İslam öz müdafiə qüdrətini gücləndirərkən külli, ümumi qanunlardan .istifadə edir və cüz’i məsələləri əvvəlcədən konkretləşdirmir

Qur’ani-kərimdə buyurulur: “Düşmənləri qorxutmaq üçün bacardığınız qədər qüvvə və (döyüş atları tədarük edin.”(١

Eləcə də, ölkənin mədəniyyəti, elmi tərəqqisi, əmin-əmanlığının qorunması məsələlərində sabit qanunlar fəaliyyət göstərmir. Uyğun sahələrdə fəaliyyət göstərən qanunlar zaman və məkandan asılı olan şəraitə uyğun müəyyənləşdirilir və bu iş İslam qanunlarını .hifz edən hökumətin nəzarəti altında həyata keçirilir

İslam yalnız faydalı elmlərin təhlilinə də’vət edir və İslami, bəşəri dəyərlərin genişlənməsinə rəvac verir. Şübhəsiz ki, zaman və məkandan asılı olaraq uyğun sahələrin genişlənmə vasitələri də dəyişir. Ölkədə asayişin qorunması da bu .qəbildəndir

Unutmamalıyıq ki, sabit hökmləri dəyişkən hökmlərdən fərqləndirmək şəriət başçılarının səlahiyyətidir və kimsənin haqqı yoxdur ki, həmin şəxslərə müraciət etmədən bu .mövzuda mövqe bildirsin

### Qur’an və xatəmiyyət məsələsi.١

#### ?Qur’an İslam Peyğəmbərİnİn (s) xatəmİyyətİnə (sonuncu olmasına) necə şahİd durur

Sual: Dünya müsəlmanları öz səmavi kitablarına əsaslanaraq, yekdil halda bildirirlər ki, ,İslam Peyğəmbəri (s) son Peyğəmbərdir

bəşəriyyətin hidayəti üçün gəlmiş son ilahi səfirdir, onun gətirdiyi kitab, Qur’an bəşəriyyət üçün göndərilmiş son səmavi kitabdır. Məgər Qur’anda İslam Peyğəmbərinin xatəmiyyəti, yə’ni sonuncu Peyğəmbər olması bildirilməmişdirmi? Belə bir bildiriş olmuş .olsaydı, qərəzsiz insanların şübhəsinə son qoyulardı

Cavab: Əvvəlcə, diqqət yetirilməlidir ki, ilk baxışdan səmavi ayinlər müxtəlif şəriətlər formasında nəzərə çarpsa da, insan bəşəriyyətə müxtəlif dinlərin göndərildiyini təsəvvür etsə də, uyğun məsələ həqiqətdə belə deyil. Bilməliyik ki, həzrət Nuh (ə) vasitəsi ilə bəşəriyyətə göndərilmiş ilkin şəriət elə son Peyğəmbərə (s) göndərilmiş şəriətdir. Bu şəriətlər arasında müştərək nöqtələr çoxdur. Onlar vahid ayin şəklində bir-birləri ilə əlaqəlidirlər. Zaman ötdükcə ictimai tərəqqi kamilləşmiş və nəhayət, yeganə ayin şəklinə gəlmişdir. Bu şəriət bəşəriyyəti bütün başqa ayin və qanunlardan .ehtiyacsız edir

Bu baxımdan, Qur’an e’lan edir ki, Allahın elə ilk gündən göndərdiyi ayin İslam ayini olmuşdur. Bundan qeyri ayin ardınca gedənlərin tutduğu yol yanlışdır. Qur’ani-kərimdə buyurulur: “Allah yanında din İslamdır”(١); “Kim İslamdan başqa bir din ardınca gedərsə, heç vaxt qəbul olunmaz...”(٢); “İbrahim nə yəhudi, nə də xaçpərəst idi. O ancaq hənif müsəlman idi...”(٣) Göründüyü kimi, Qur’ani-kərim İbrahimi yəhudi və ya məsihi sayanları məzəmmət edərək, onun tövhid qəhrəmanı olduğunu önə çəkir. Beləcə, deyə bilərik ki, səmavi şəriətlər həqiqətdə vahid bir şəriətdir. Bu ayinlər bəşəriyyətin ictimai təkamülü nəticəsində formalaşaraq, nəhayət, vahid ayin şəklinə gəlmişdir. Son Peyğəmbər (s) isə bu işdə vasitəçidir. Bəşər tarixi boyu Allah tərəfindən göndərilmiş ayinlər orta .məktəbdə başlayıb doktorluqda bitən elmi inkişaf yolunu xatırladır

### Xatəmİyyətİn dəlİllərİ

İslam Peyğəmbərinin (s) xatəmiyyəti, onun son Peyğəmbər olması din alimlərinin nəzərində dinin zəruri inanclarından, müqəddəs İslam



---

.Ali-İmran”, ١٩“[١٣]-١

.Ali-İmran”, ٨٥“[١۴]-٢

ayininin gerçəkliklərindən sayılır. İstənilən biganə və əcnəbi şəxs İslam cəmiyyəti ilə təmasdan sonra bu həqiqətdən xəbərdar olur. İslami mühitdə yaşayan insanın xatəmiyyət mövzusundan xəbərsiz qalması mümkünsüzdür. Bu özü uyğun inancın ciddi .bir məsələ olmasını göstərir

Bu məsələnin zəruri olmasını və onun bütün dünya müsəlmanları tərəfindən yekdil olaraq qəbul edilməsini bir kənara qoyub, Qur’ana müraciət edək. Qur’ani-kərimdə Peyğəmbərin (s) sonuncu Peyğəmbər olması ilə bağlı buyurulur: “Məhəmməd (s) aranızdakı kişilərdən heç birinin atası deyildir. Amma o, Allahın rəsulu və (Peyğəmbərlərin sonuncusudur. Allah hər şeyi biləndir.”(١

Ayənin mə’nasını dərindən anlamaq üçün “xatəm” kəlməsinə nəzər salaq. Ərəb dilində məktubun sonunda möhür qoyan şeyə “xatəm” deyilir. “Möhür”lə “imza” anlayışları oxşar anlayışlardır. Hal-hazırda da dövlət idarə və müəssisələrində möhürdən istifadə olunur. Möhur namə yazan şəxsin kimliyini göstərməkdən əlavə, həm də namənin başa çatdığını bildirir. Məktubun və sənədin yalnız möhürədək olan hissəsi mö’təbərdir. .Möhürdən sonrakı yazılar isə e’tibarsız sayılır

Qədim zamanlarda qiymətli ərzaqlar yığılmış qabları möhürləyirdilər ki, onlara gizli əl (vurulub-vurulmaması mə’lum olsun.(٢

Bir sözlə, “xatəm” namələri, sənədləri, seyfləri, otaqları möhürləmək üçün işlədilən vasitədir. Ərəb dilində barmağa ona görə “xatəm” deyirlər ki, insanlar qədim vaxtlarda imza yerinə barmaqlarını basırdılır. Sultanlar, qəbilə başçıları yazdıqları namə və (sənədləri adları qeyd olunmuş üzüklərlə möhürləyirdilər.(٣

İslam Peyğəmbəri (s) padşahların və qəbilə başçılarının yanına İslama də’vət məqsədilə səfirlər göndərmək istədiyi vaxt göstəriş verdi ki, onun üçün “Muhəmmədən rəsulullah” kəlmələri yazılmış üzük hazırlasınlar. Həzrət (s) bütün nəmələri bu üzüklə möhürləyirdi.(۴)Demək “xatəm” kəlməsinin ilkin mə’nası “üzük” yox, “möhürləyən vasitə” idi. Üzüyə isə ona görə xatəm deyirdilər ki, onunla iki iş yerinə yetirilirdi. Elə bu gün də ərəb

Əhzab”, ۴۰“[۱۶] -۱

Müqəddiməyi İbn Xəldun, c. ۱, səh. ۲۲۰[۱۷] -۲

.Həmin mənbə[۱۸] -۳

Təbəqate-Kubra” c. ۱, səh. ۲۵۸“[۱۹] -۴

ölkələrində dövlət və qeyri-dövlət müəssisələrində istifadə olunan möhürlərə “xatəm” .deyirlər

Bu açıqlamalardan sonra “xatəmun-nəbiyyin” kəlməsinin mə’nası aydın olur. Uyğun kəlmənin mə’nası budur ki, həzrət Adəmdən bu yana bəşərin üzünə açılmış Peyğəmbərlik qapısı həzrət Məhəmmədlə (s) möhürlənmiş oldu. Bəşəriyyətin yeni Peyğəmbərə ehtiyacı başa çatdı. Həzrət Məhəmməddən (s) sonra Peyğəmbər gəlmədi və gəlməyəcək. Məktub möhürlə sona çatdırıldığı kimi, Peyğəmbərlik missiyası həzrət Məhəmmədlə (s) tamamlandı. Həzrətin vücudu Peyğəmbərlik qapısını birdəfəlik bağlamış .möhür kimidir. Bu qapı bir daha açılası deyil

### Xatəm” sözünün yanlış İzahı“

Bə’zi firqələr “xatəmun-nəbiyyin” kəlməsinə çox gülünc bir mə’na vermişlər. Onlar öz müridlərini belə anlatmışlar ki, guya ayədə işlədilmiş “xatəm” kəlməsi “üzük” mə’nasındadır. Guya İslam Peyğəmbəri (s) Peyğəmbərlər içində üzüyə bənzədilmişdir. Üzük insanın əlinə zinət verdiyi kimi, guya İslam Peyğəmbəri (s) də Peyğəmbərlər .zümrəsinə zinət verir

Bu fikir o qədər əsassızdır ki, hətta həmin firqənin banisi də bir çox kitablarında xatəm (kəlməsini həqiqi mə’nasında təfsir etməyə məcbur olmuşdur.(١

Xatəm kəlməsinin üzük yozumuna yalnız sadəlövh insanları inandırmaq olar. Axı bu kəlmənin ərəb lüğətində də mə’nası üzük deyil. Bütün lüğətlərdə göstərilir ki, xatəm sənədləri möhürləmək üçün işlədilən vasitədir. Üzüyə yalnız o zaman xatəm deyilir ki, .həmin üzüklə sənədlər möhürlənsin

Qur’an ayələrini şəxsi zövq əsasında təfsir etmək olmaz. Bu işdə ərəb dillilərin lüğətlərinə müraciət etmək zəruridir. Həmin lüğətlərlə tanış olanlar gözəl bilirlər ki, xatəm kəlməsi zinət mə’nasında heç vaxt işlənməmişdir. Məsələn, bir uşaq haqqında heç vaxt demirlər ki, bu uşaq ailənin xatəmidir, yə’ni bəzəyidir. Əgər xatəm sözü həmin mə’nada

işlənmiş olsaydı, uşağın da haqqında “o ailənin xatəmidir” deyərdilər. İslam Peyğəmbərinin (s) Peyğəmbərlər zümrəsinə bəzək olmasını bildirmək üçün ərəblər onu .“tac” və ya “əklil” adlandırardılar

On dörd əsr bundan öncə bütün dünya müsəlmanları xatəmiyyət kəlməsini eynən Peyğəmbərin (s) buyruqlarındakı mə’nada qəbul etmişlər. İmam Sadiq (ə) buyurur: “Allah-təala sizin Peyğəmbər (s) vasitəsi ilə Peyğəmbərlik qapısını xətm etdi. Ondan sonra Peyğəmbər gəlməyəcək və onun gətirdiyi kitabla səmavi kitabların göndərişi (sona çatmışdır. Bu kitab isə hər şeyi aydınlaşdırır!”(١)

Başqa bir qrup isə xatəm kəlməsini möhür mə’nasında qəbul etmişdir. Güya Peyğəmbər (s) ona görə “xatəmun-nəbiyyin” adlandırılmışdır ki, onun gəlişi əvvəlki Peyğəmbərlərin də haqq olmasının təsdiqidir. Möhür məktuba yazılanları təsdiqlədiyi kimi, İslam .Peyğəmbəri (s) də özündən əvvəlki Peyğəmbərlərin haqq olmasını təsdiqləyir

Amma bu baxış da əvvəlki baxış kimi kökündən yanlışdır. Möhür, həqiqətən də, yazılmış namənin doğruluğunu təsdiq etsə də, ərəb dilində heç vaxt şəhadət və təsdiq “xatəm” .adlandırılmamışdır. Naməni sonra imza edən və şahid duran şəxsə xatəm deyilmişdir

Digər bir tərəfdən Peyğəmbərlərin təsdiq olunması İslam Peyğəmbərinin vəzifələrindən deyil. Bütün Peyğəmbərlər özündən əvvəlki Peyğəmbərin təsdiqçisi olmuşdur. Allah-təala həzrət İsanı (ə) belə təqdim edir: “Ey İsrail oğulları! Həqiqətən, mən özümdən əvvəl nazil olmuş Tövratı təsdiq edirəm və məndən sonra gələcək Əhməd adlı bir Peyğəmbərlə müjdə verən Allah elçisiyəm.”(٢) Nəzərdən qaçırmamalıyıq ki, xatəmiyyət məsələsi yalnız bu ayədə təsdiqlənməmişdir. İslam Peyğəmbərinin xatəmiyyətini təsdiq .edən Qur’an ayələri çoxdur

### ?İslamdan qabaqkı şərİətlər naqİs sayılırmı .٢

Sual: İslam ayinləri Allah tərəfindən bəşəriyyətə göndərilmiş ən yığcam ayinlər toplusudur. Bu sözlərdən belə görünür ki, əvvəlki



---

Vafi, c. ٢, səh. ١٤٤“[٢١]-١

ayinlər İslam ayinlərinə nisbətən naqis olmuşdur. Onda belə bir sual yaranır: Necə ola bilər ki, Allah keçmişdəki insanlara naqis ayinlər göndərsin, sonrakılara isə kamil? Naqis !?ayinlər göndərmək Allahın məqamına layiqdirmi

Cavab: İslam ayinlərinin ümumbəşəri və son olması dəlili aydın şəkildə göstərir ki, İslam dini göndərildikdən sonra maddi və mə'nəvi təkamül üçün bu göstərişlərə əməl .etməkdən savay yol qalmamışdır

Əlbəttə ki, hər bir ilahi din öz zamanında doğru yol sayılmışdır. Keçmiş insanlar öz dövrünün dini ilə maddi və mə'nəvi təkamülə çata bilərdilər. Amma İslam ayinləri göndərildikdən sonra əvvəlki yollarla getmək xətadır və İslamdan savay ayinlər insanı ali məqama çatdırmaqda acizdir. Bir daha qeyd edək ki, əvvəlki dinlərin hər biri öz .dövrünün kamil dini olmuşdur və həmin dövrdə insanlar üçün ən doğru yol sayılmışdır

Deyilənləri aydınlaşdırmaq üçün qeyd edə bilərik ki, müxtəlif dinlər orta məktəbin ayrı-ayrı siniflərinə bənzəyir. Sinifdən-sinifə adlayan şagird öz biliyini kamilləşdirir. Şagirdin birinci sinifdə öyrəndiyi biliklər doğru olduğu kimi, onun onuncu sinfdə öyrəndiyi biliklər də doğrudur. Aşağı siniflərdə öyrəndiyi biliklər şagirdin sonrakı bilikləri üçün bünövrə rolunu oynayır. Mə'lum məsələdir ki, birinci sinif şagirdi onuncu sinifin materiallarını dərk edə bilməz. Eləcə də, onuncu sinifin şagirdinə birinci sinifin proqramı ilə dərs keçmək .məntiqsiz bir işdir

İndi özünüz deyin, birinci sinifin proqramını naqis saymaq olarmı? Demək, hər sinifin materialı həmin sinifin şagirdi üçün zəruri sayılmalıdır. Dinlərə münasibətdə də eyni üsulla araşdırma aparmalıyıq. Cəmiyyət təkmilləşdikcə sanki o sinifdən-sinifə keçir və ona göndərilən dinlər də həmin dövrün düşüncə səviyyəsinə uyğun olur. İslam dininin o biri dinlərdən kamil və yığcam olması o demək deyil ki, əvvəlki dinlər doğru yol tutmamışdır. Alim Allah tərəfindən bəşəriyyətin hidayəti üçün göndərilmiş dini naqis saymaq yanlışdır. Əksinə, hər bir din öz dövrünün tələblərinə cavab vermişdir. Amma təkmilləşmiş bəşəriyyət üçün, daha yüksək maddi və mə'nəvi zirvələri fəth etmək gücündə olan insanlar üçün gedəcəkləri uzun yolu işıqlandıran ayinlər lazımdır. Ona görə də bəşər tarixinin müxtəlif

dövrlərində müxtəlif səmavi dinlər göndərilmişdir. İslam ayinləri isə bu təkamül pilləsinin .son dayanacağıdır

## İslam Peyğəmbərinin (s) əcdadlarının dini .۳

Sual: İslam Peyğəmbərinin (s) əcdadları kimlər olmuşdur? Deyirlər ki, onlar İbrahim (s) ?dinində olmuşlar. Bəs nə üçün İsa (ə) dinini qəbul etməmişlər

Cavab: Tarixi mənbələrin bildirdiyinə görə, İslam Peyğəmbərinin (s) ata-babaları hamısı bir Allaha sitayiş etmişlər. Onların İbrahim (ə) ayinində olması da bu mə’nadadır. Çünki, həzrət İbrahim (s) böyük tövhid qəhrəmanlarındandır və bütpərəstliklə, şirklə mübarizə aparmışdır. Həzrət İbrahim öz mübarizəsi ilə bütpərstlik və şirkin sütunlarını sarsıtmışdır. Ona görə də Qur’anda bə’zən müsəlmanlar “İbrahim milləti”, “İbrahimin .ardıcılı” adlandırılmışlar

Hicaz mühitində və ərəblər arasında yeganə tanınmış ayin həmin İbrahim ayini olmuşdur. İbrahimin bə’zi ayinləri hətta bütpərəstlər arasında da tanınmışdır. Ərəb dilində İbrahim ayininə “Hənif” dini deyirlər. Yəhudi və məsihi dini Hicaz torpaqlarına bir o qədər də nüfuz edə bilməmişdir. Təkcə Mədinədə, Xeybərdə və Yəmən sərhədlərində bir qrup kəlimi və məsihi məskunlaşmışdır. Bütün bunları nəzərə alaraq deyə bilərik ki, .İslam Peyğəmbərinin (s) əcdadları İbrahim ayinində olmuşlar

## ?İslam Peyğəmbəri (s) yazıb–oxumağı bacarırdımı .۴

### İşarə

Sual: Elmi mütaliələr insitutunun rəisi Seyyid Əbdüllətif öz məqaləsində yazır ki, İslam Peyğəmbəri (s) Peyğəmbərliyə çatmamışdan qabaq yazıb oxumağı bacarırdı. O bunu müəyyən dəlillərlə də əsaslandırır. Alim bildirir ki, Peyğəmbərin (s) savadsız olması haqqında yayılan mə’lumatlar onun şəxsiyyətinə qarşı böyük bir zülmdür. Bəs həqiqət ?necədir

Cavab: Gəlin, adı çəkilən alimin gətirdiyi dəlilləri araşdırmazdan qabaq müsəlmanların mövqeyini, onların həzrət Peyğəmbəri (s) savadsız saymasının səbəblərini araşdıraq.

1. Bizim əqidəmizcə, İslam Peyğəmbəri (s) elm və əməl baxımından bütün bəşəriyyətin məhsulu, meyvəsi olmuşdur. Onun səmavi kitabı, qanunları və hökmləri, moizə və nəsihətləri elminə və fövqəladə dini maarifinə aşkar sübutdur.

2. Əqidəmizcə, İslam Peyğəmbəri (s) yaranış aləminin sirlərindən, varlıq aləminə hakim olan qanunlardan xəbərdar olmuşdur. Heç bir müsəlman bu həqiqəti inkar etmir və hamı onun buyuruqları, gətirdiyi kitab qarşısında tə’zim edir.

3. Əqidəmizcə, həzrət Peyğəmbər (s) bütün bu kamillikləri vəhy yolu ilə qazanmışdır. O bütün bu dərsləri Peyğəmbərlik məktəbində öyrənmişdir. O heç vaxt müəllimdən dərs almamış, kimdənsə elm əxz etməmişdir. Çünki Peyğəmbərlik digər elmlər kimi təhsil yolu ilə əldə edilmir. İlahi biliklər Allah-təalanın layiq bəndələrinə əta etdiyi ne’mətlərdəndir.

4. Hər bir müsəlman yuxarıda deyilənləri e’tiraf edərək bildirir ki, həzrət (s) heç vaxt dərs oxumamışdır. Dərs oxumamaq isə bilməmək demək deyildir. Ümumiyyətlə, böyük Peyğəmbərlər dərs oxumasalar da, bəşəriyyətin ən böyük müəllimləri sayılırlar. Həzrət Adəm (ə) də dərs oxumamışdır. Hansı ki, o, Qur’anın buyurduğu kimi, mələklərin müəllimi idi. Bu məsələlərə “Bəqərə” surəsinin ۲۸-۳۲-ci ayələrində toxunulur.

Əgər savadlı olmaq geniş mə’lumatlara malik olmaq deməkdirsə, demək, Peyğəmbərlər də savadlı olmuşlar. Yox əgər savadlı dedikdə dərs oxuyan adam nəzərdə tutulursa, demək, Peyğəmbərlər bizim nəzərdə tutduğumuz məktəblərdə elm öyrənməmişlər. Həzrət Peyğəmbərin (s) iftixarlı ömür səhifələri və aşkar Qur’an ayələri Peyğəmbərin (s) savadsız olduğunu ciddi şəkildə təkzib edir.

5. Müsəlmanlar e’tiqadlıdırlar ki, həzrət Peyğəmbər (s) be’sətdən, yə’ni Peyğəmbərliyə çatmazdan əvvəl kitab oxumamış və yazı yazmamışdır. Bu məsələ Qur’anda açıq-aşkar bəyan olunur: “Qur’an nazil

olmamışdan qabaq bir kitab oxumazdın və əlinlə yazı yazmazdın.."(۱) Ayədə bu da qeyd olunur ki, kafirlərin onun Peyğəmbərliyinə şübhə etməməsi üçün belə olmuşdur. Bu .barədə ətraflı şəkildə danışacağıq

Bəs be’sətdən sonra necə, Peyğəmbər yazıb-oxumuşdurmu? Bu barədə müxtəlif fikirlər mövcuddur. Belə bir mövqe daha güclüdür ki, həzrət (s) be’sətdən sonra da nə yazmış, nə də oxumuşdur. İslami rəvayətlərin bildirdiyinə görə, Həzrət (s) məktubların mətnini .deyər, başqaları isə yazardılar

Bə’zi alimlərin fikrincə, Həzrətin yazıb-oxumaması hələ onun bu işləri bacarmamasına dəlil deyil. Çünki Peyğəmbərin yazıb-oxumaq kimi qabiliyyətlərdən məhrum olması inandırıcı deyil. O, bu qabiliyyətlərdən istifadə etməmiş də olsaydı, hər halda yazıb-.oxumağı bacarardı

Qayıdaq Peyğəmbərin (s) yazıb-oxuduğunu iddia edən yazıçının dəlillərinə. Bu alim isbat etməyə çalışır ki, İslam Peyğəmbəri (s) be’sətdən əvvəl və sonra həm yazmağı, həm .də oxumağı bacarırmış

### İddİaçı alİmİn dəlİllərİ

O deyir: "Təfsirçilər Qur’anın xalis Allah kəlamı olduğunu sübut etmək üçün İslam .۱ Peyğəmbərini savadsız göstərməyə çalışmışlar. Hansı ki, Allah tərəfindən göndərilmiş ".şəxs savadından asılı olmayaraq, Allah kəlamına əl qata bilməzdi

Cavab: Yuxarıda deyilənlər təəccüb doğurur. İslam alimlərindən heç birinin kitabında belə bir iddia nəzərə çarpmır ki, Peyğəmbərin savadsız olması onun Qur’ana əl qatmamasının dəlilidir. Əksinə, Peyğəmbərin ilahi kitaba toxunmamasının dəlili onların paklığıdır. Müsəlmanların Peyğəmbəri oxumamış hesab etməsinin dəlili yalnız və yalnız Qur’anda " o kəslər ki, ümmi (oxumamış) Peyğəmbərə tabe olurlar" buyurulmasıdır. Bu (ifadələr İslam Peyğəmbərinə aiddir.(۲



---

Ənkəbut surəsi, ayə ۴۹[۲۳]-۱

Bax: "Ə`raf", ۱۵۷[۲۵]-۲

Həmin hind alimi "ümmi" kəlməsinin izahında iki səhvə yol vermişdir. Əvvəla, Peyğəmbərin oxumamış sayılması, onun iddia etdiyi kimi, Qur'anın toxunulmazlığını sübuta yetirmək məqsədi ilə olmamışdır. İkincisi "ümmi" kəlməsi savadsız yox, oxumamış, məktəb görməmiş .adama aiddir

Alim bildirir ki, Qur'anda Peyğəmbər elm və hikmət sahibi kimi tanıtdırılır.(١) Onun . ٢ nəzərincə, ilahi bir kitabı xalqa çatdırmalı olan insan qələmlə yazmağı bacarmalı və .yazdığını oxuya bilməli idi

Cavab: Kimsə iddia edə bilər ki, İslam Peyğəmbəri yazmağı və oxumağı bacarmışdır. Hətta bunu e'tiraf etmiş olsaq da, bu o demək deyildir ki, Peyğəmbər hökmən əlinə qələm götürüb yazı yazmışdır. Çünki Peyğəmbərlər adi müəllimlər kimi öyrətmirlər. Onlar ilahi ayələri oxumaqla, şirin bəyanlarla, elmi göstərişlərlə öz çətin vəzifələrini yerinə .yetirirlər. Belə bir təhsil üsulunda yazıb-oxumağı bacarmağa ehtiyac olmur

Səhvə o zaman yol verilmişdir ki, alim tə'lim-tərbiyəni yalnız yazıb-oxumaqla təsəvvür etmişdir. Hansı ki, həzrət Peyğəmbər (s) yazıb-oxumadan da xalqı maarifləndirə .bilmişdir

Alimin nəzərincə elm, mütaliə, yazı tərəfdarı olan Qur'ani-kərim yazıb-oxumağı . ٣ bacarmayan şəxs vasitəsi ilə göndərilməzdi. Alim bildirir ki, Qur'anda qələmə and içildiyi, hətta ١١۴ surədən biri "Qələm" adlandırıldığı halda necə ola bilər ki, Peyğəmbər yazıb-!?oxumağı bacarmaya

Cavab: Qeyd etdiyimiz kimi, yazıb-oxumaq özü bir iste'daddır. Demək, iste'dad bir işi hökmən yerinə yetirmək yox, onu bacarmaqdır. Peyğəmbər (s) öz missiyasını kağız-qələmsiz yerinə yetirə bilirdisə, o bu iste'dadından (yazıb-oxumaqdan) istifadə etməyə də bilərdi. Bunun başqa səbəbləri də var. Əgər Peyğəmbər (s) də başqaları kimi təhsillə məşğul olsaydı, Peyğəmbərliyə qarşı çıxanlar iddia edərdilər ki, onun dedikləri əvvəlki kitablardan öyrəndiyi mə'lumatlardır. Dediyimiz bu məsələ Qur'anın toxunulmazlığını sübuta yetirmək məqsədi ilə bəyan olunmur. Qur'anda uyğun məsələ ilə bağlı buyurulur: "Sən bu vaxtadək kitab

oxumurdun və əlinlə bir şey yazmırdın. Məbada, səni inkar etmək istəyənlər şübhəyə düşsünlər."(۱) Bu alimlərin uydurması yox, Qur'an ayəsidir. Uyğun məsələdə alimləri .ittiham etməyə dəyməz

Peyğəmbərin (s) həyat tarixçəsi dərs oxumadığına sübut olsa da, yəhudilərdən bir qrupu həzrəti ittiham edirdilər ki, bildiklərini əvvəlki ilahi kitablardan götürmüşdür. Qur'ani-kərimdə bu barədə belə nəql olunur: "Onlar dedilər ki, bu qədimlərin əfsanələri və yalan sözləridir, Məhəmməd (s) onları yazdırmışdır... səhər-axşam özünə oxunur; De ki, onu göylərin və yerin sirrini bilən nazil etmişdir. Həqiqətən, o bağışlayan və rəhm edəndir."(۲)Həzrət Peyğəmbər (s) yazıb-oxumaqdan bir bu qədər uzaq olsa da, hansısa mənbələrdən qidalanmaqda ittiham olunurdu. Əgər o əlinə kitab almış, bir neçə səhifə .yazı yazmış olsaydı, düşmənlərin əlinə bəhanə düşərdi

Peyğəmbər (s) on iki yaşında olarkən Qüreyş karvanı ilə birlikdə bir neçə dəqiqə Şam yolundakı rahiblə görüşdü. Bə'zi şərqşünaslar bu bir neçə dəqiqəlik görüşü əldə əsas !götürərək iddia edirlər ki, Məhəmməd (s) bütün dediklərini həmin rahibdən öyrənmişdir

Alim bildirir ki, Qur'an Peyğəmbəri (s) belə tanıtdırır: "Allah tərəfindən pak səhifələri .۴ oxuyan Peyğəmbər göndərilmişdir."(۳) Onun zənnincə, Peyğəmbər Qur'anı hansısa .səhifələrdən oxumuşdur

Cavab: Şübhəsiz ki, Allahın mələyi (Cəbrəil) Qur'anı yazı üzündən oxumurdu. Ayələr həzrət Peyğəmbərin ruhuna, bir növ pak qəlbinə nazil edilirdi. Qur'anda buyurulur: "Onu Ruhul-əmin nazil etdi: Sənin qəlbinə, qorxudan Peyğəmbərlərdən olasan deyə."(۴)Demək araşdırmaq lazımdır ki, Peyğəmbər (s) hansı yazını oxumuşdur? Məgər Cəbrəil onun əlinə hansısa bir yazı vermişdirmi? Bu fikirlər yuxarıdakı ayə ilə ziddir. Çünki Qur'anın nazil olma yeri həzrət Peyğəmbərin (s) ruhu və mübarək qəlbidir. Hətta .deyilənlər yazıya köçürülmüş olsaydı da, Peyğəmbər Qur'anı yazı üzündən oxumurdu

Aydındır ki, Allahın əmri və istəyi ilə həzrət Peyğəmbər (s) Qur'an ayələrini əzbər bilirdi. Bir şeyi əzbər bilən şəxs isə onu yazıdan

oxumağa ehtiyac duymur. Unutmamalıyıq ki, Qur’anı yazıya köçürənlər özləri və başqa .müsəlmanlar üçün bu işi görürdülər. Peyğəmbərin (s) isə buna ehtiyacı yox idi

Heç bir tarixi mənbədə göstərilmir ki, Peyğəmbər (s) Qur’anı yazırdı və ya yazdırırdı. Pak .səhifələrdən oxumaq dedikdə isə hifzdən, yaddaşdan oxumaq nəzərdə tutulur

Gündəlik danışığımızda da “oxumaq” dedikdə bunu həm yazı üzündən, həm də .yaddaşdan oxumaq” nəzərdə tutula bilər

Ona görə də “tilavət” kəlməsi bir şeyin üzdən oxunması dəlili deyil. Bir şəxs əzbərdən bir neçə səhifə şe’ri oxuduqda biz deyirik ki, filan kəs filan səhifə şe’r oxudu. Bu oxumaq həm yaddaşdan ola bilər, həm də üzünə! Məgər komandanın əmri əzbərdən deyildikdə !?qeyd edilmirmi ki, filankəs komandanın əmrini oxudu

Xatırladığımız ayə Peyğəmbər (s) haqqındakı bir çox ayələrin oxşarıdır. Digər ayələrin birində belə buyurulur: “Allahın ayələrini onlara oxusun”(۱)Peyğəmbərin Qur’anı .əzbərdən deməsi onun həyatını nəzərdən keçirərkən daha aşkar görünür

۵. Alim Peyğəmbərin müəllim olması haqqında bir sıra rəvayətləri misal göstərir. Həmin rəvayətlərdə İslam və Peyğəmbərin elm və bilik tərəfdarı olması nəql olunur. Məsələn, həzrət Peyğəmbər (s) elm öyrənməyin bütün müsəlman kişi və qadınlara vacib olduğunu bildirir. Həzrət (s) elm öyrənməyi müstəhəb ibadətlərdən üstün tutur, məscidin kənarında təhsil mərkəzi yaradır. Həzrət (s) özü bu mərkəzdə gedən dərsləri izləyir. Bədr döyüşündə əsirlərə təklif edir ki, hansı əsir on müsəlmana yazmağı öyrətsə, azad .ediləcək

Alim bu rəvayətləri nəzərə çatdırdıqdan sonra belə bir nəticə alır ki, belə bir rəhbər .yazmağı və oxumağı bacarmaya bilməzdi

Cavab: Alimin tarixdən və dini mənbələrdən gətirdiyi misallar həqiqətdir. Amma bütün bu mə’lumatlar onun iddialarını isbat etmir. İslamın və Peyğəmbərin (s) elm və bilik tərəfdarı olması aşkar bir həqiqətdir. Amma söhbət bundan gedir ki, İslam Peyğəmbəri (s) be’sətdən qabaq və

sonra yazı yazmış, üzünə oxumuşdurmu? “Ənkəbut surəsinin ۴۸-ci ayəsinin ziddinə olaraq, onun yazıb-oxuduğunu demək olarmı? Hansı əsasla deyə bilərik ki, Peyğəmbər (s) bu günkü müəllimlər kimi tədris etmişdir? Bu barədə daha ətraflı mə’lumat almaq üçün Peyğəmbərin “Ümmi” olması məsələsini daha geniş şəkildə izah edən “Vəhy məktəbində” .kitabına müraciət edin

**?Peyğəmbərİn (s) me’rac etməsİnİn səbəbİ nə olmuşdur .۵**

Sual: Qur’ani-kərimdə “İsra” surəsinin əvvəlində oxuyuruq: “Bə’zi ayələrini göstərmək üçün bəndəsini bir gecə Məscidül-Həramdan ətrafını mübarək etdiyimiz Məscidül-Əqsaya aparan Allah pak və müqəddəsdir. O, doğrudan da, eşidən və biləndir”(۱) Peyğəmbərin bu səfərində məqsəd nə olmuşdur? Axı deyə bilmərik ki, Allah öz yerini Peyğəmbərə göstərmək istəmişdir. Yox əgər məqsəd kəhkəşanları, kainatı göstərmək olmuşdursa, belə bir fikir də bizim əqidəmizə zidd olar. Çünki bizim əqidəmizcə, .Peyğəmbər (s) və mə’sum imamlar (ə) hər şeydən xəbərdar olmuşlar

Cavab: Əvvəla diqqət etməliyik ki, uyğun ayədə həzrət Peyğəmbərin (s) yalnız Məscidül-həramdan Məscidül-Əqsaya aparılması bildirilir. Amma başqa bir ayədə uyğun bir məsələ daha dəqiq bəyan olunur: “Onu çox qüvvətli olan öyrətdi; O qüvvə sahibi göründü; O ən uca üfüqdə idi; sonra yaxınlaşdı və aşağı endi...” (۲) Bu ayələr həzrət Peyğəmbərin (s) ərşə səfəri haqqında danışır. “İsra” surəsindəki ayə isə həzrətin (s) yer üzündəki səfərinə işarədir. Amma hər iki ayədə Allahın böyük ayətlərinin müşahidə .edilməsi məqsədi önə çəkilir

Heç şübhəsiz ki, söhbət əyani müşahidədən gedir. Gözü olan bir varlığın əyani müşahidəsi onun iştirakı ilə baş tuta bilər. Həzrət Peyğəmbər (s) hər şeydən xəbərdar olmuş olsaydı da, görməklə eşitmək arasında fərq böyükdür. Bir şəhərdə baş vermiş hadisə haqqında eşitmək ayrı şeydir, bu hadisəni görmək isə tamam başqa bir şey. İnsanın bir hadisəni



---

İsra, ۱[۳۲] -۱

Nəcm, ۵-۸[۳۳] -۲

gözlə görməsi onun ruhunda daha böyük tə’sir buraxır. Qiyabi mə’lumatların isə bir o .qədər də tə’siri olmur

Beləcə, Allah-təala İslam Peyğəmbərinin hər şeyi öz gözləri ilə görməsini istədi. Əgər bir şəxs belə düşünsə ki, Peyğəmbər (s) elə yer üzündə qalmaqla da həmin mənzərələri görə bilərdi, bu düzgün olmaz. Çünki Peyğəmbər (s) insan idi və insanın görmə imkanları .məhduddur. O bəzi gerçəklikləri görmək üçün həmin səhnələrə yaxınlaşmalıdır

**?Şeytan Peyğəmbərlərə qalİb gələ bİlərmİ .۶**

Sual: Qur’ani-kərimdə açıq şəkildə bəyan olunur ki, Şeytan həqiqi Allah bəndələrinə yaxınlaşa bilməz. Bəs necə olub ki, şeytan həzrət Adəmə yol tapa bilib? Hansı ki, həzrət Adəm həqiqi bəndə olmaqla yanaşı həm də Allahın Peyğəmbəri idi. “Səfiyyullah” (“Allahın !?seçilmişi”) ləqəbini qazanmış bir şəxs adi bəndələr kimi ola bilərmi

Cavab: Allah-təala şeytanın nəzərinə çatdırdı ki, o həqiqi bəndələri aldada bilməyəcək, çirkin işləri onların nəzərində gözəlləşdirməyə gücü çatmayacaq və nəticədə, onları günah yola çəkməyə müvəffəq olmayacaq. Behiştdə Adəmin başına gəlmiş əhvalat isə şeytan əməli deyildi. Adəmin başına gələn hadisə “tərke-ovla” adlanır. Bu o deməkdir ki, Adəm günaha yol verməmiş, sadəcə, yaxşı bir işi tərk etmişdir. Əslində hər bir şəxs öz iradəsi ilə qəlb yolunu şeytanın üzünə açır. İnsanın icazəsi olmadan şeytan onun .qəlbinə daxil ola bilmir. Şübhəsiz ki, Peyğəmbərlər şeytana belə bir icazə verməmişlər

Bir qədər də aydınlaşdırsaq, şeytanın yol tapması o deməkdir ki, insanın imanının zəifliyi və səhlənkarlığı onun qəlbini şeytana təslim edir. Bu yolla günah insanın gözündə adiləşir. Amma şeytan Peyğəmbərlərin ruhuna nüfuz etmək imkanından məhrumdur. Əgər şeytanın təhriki ilə Adəm qadağan olmuş meyvədən yedisə, bu günah yox, “tərke-.ovladır”. Meyvə yemək haram iş sayılmamalıdır

Böyük şiə alimləri Peyğəmbərlərin paklığını əqli dəlillərlə aydınlaşdırmışlar. Adəmin əhvalatı və Peyğəmbərlərin paklığı haqqında daha müfəssəl mə’lumat əldə etmək üçün .“Böyük rəhbərlər” kitabına müraciət edin

### Peyğəmbərlərİn paklığının əsası .٧

Sual: Peyğəmbərlərin mə’sum, pak olmasının səbəbi nədir? Bu mə’sumluq Allahdandır, ?yoxsa onlar öz əməllərinin sayəsində bu mə’sumluğu əldə etmişlər

Cavab: Peyğəmbərlərin mə’sumluğu, paklığı (günahdan, xətadan, səhvdən uzaq olması) onların mə’nəvi və ruhi kamilliyindən qaynaqlanır. İnsanların yaxşı və pis əməllərinin onların ruhi və mə’nəvi halından doğması şübhə doğurmur. Cəhalət, yaradılış və məada inamsızlıq, azğınlıq meyllərinin tüğyanı kimi çirkin hallar çaşqınlıq, günah, fəsadın mənşəsi olur. Elm və bilik, iman və meyllərin tarazlığı, pəhrizkarlıq gücü insanı günahdan .çəkindirib, saleh əməllərə sövq etdiyi kimi, ruhi çirkinliklər də insanı günaha yönəldir

Peyğəmbərlər ruhi və mə’nəvi cəhətdən fövqəl’adə iman gücü, geniş elm və biliyə malik olmuşlar. Bütün səbəblərdən daha çox bu iki amil onların vücudunda günah və azğınlığın qarşısını almışdır. Günahın çirkinliyindən və onun acı nəticəsindən tam şəkildə agah olan, eləcə də günah amillərinin qarşısında dayana biləcək iman və pəhrizkarlığı .olan insan heç vəchlə günaha bata bilməz

İndi sual oluna bilər ki, insan mə’sumluğunun, günahsızlığının tə’minatçısı olan bu ruhi hal Peyğəmbərlərin vücudunda haradan və necə peyda olmuşdur? Nəzərdən :qaçırmamalıyıq ki, belə bir ruhani kamilliyin peyda olmasında bir neçə amil var

;İrsiyyət .١

Biologiya elmində sübut olunmuşdur ki, bir çox fəzilət və kamillikləri əldə etmək iste’dadı və hazırlığı, hətta xüsusiyyətlərin də bir çoxu insana irsiyyət yolu ilə, nəsildən nəsilə ötürülür. Ümumiyyətlə, Peyğəmbərlər pak və saf nəsildən olan ailələrdə doğulmuşlar. Bu nəsillərdə kamillik və fəzilətlər zaman ötdükcə möhkəmlənmiş və irsiyyət qanununa əsasən nəsildən nəsilə verilmişdir. Bu mühüm gerçəkliyə bir çox hallarda tarix özü şahiddir. Tarixdən bəllidir ki, həzrət

Peyğəmbər (s) köklü bir ərəb tayfası olan, qüreyş tayfasının ən şərəfli qolu olan Bəni-Haşim qolunda anadan oldu. Bu nəsil öz doğruluğu və düzlüyü, şücaəti, qonaqpərvərliyi, qeyrəti, ədaləti, paklığı və əmanətdarlığı ilə məşhur idi. Ona görə də ərəb qəbilələri arasında bu qəbiləyə xüsusi bir hörmət göstərilirdi. Həzrət Peyğəmbərin tarixdə adı qeyd olunmuş babaları ümumiyyətlə, hörmətli, şərif və imanlı insanlar olmuşlar. Bəli, irsiyyət məsələsi peyğəmbərlərin ruhi kamillik əldə etməsi üçün xüsusi bir hazırlıq və ite’dad şəraiti yaratmışdır. Fəzilətlərin əldə olunmasında ali və ruhani kimi .səbəblərlərlə bir sırada dayanan irsiyyət səbəbi çox mühüm bir yer tutur

;Ruhi fəzilət və kamilliyin tərbiyə yolu ilə ötürülməsi .٢

Peyğəmbərlərdə ruhi kamilliyin peyda olmasının ikinci amili tərbiyədir. Peyğəmbərlər sülaləsindəki bir çox kamillik və fəzilətlər tərbiyə yolu ilə ötürülmüşdür. Bu amil irsiyyət iste’dadını daha da təkmilləşdirir və onlar öz nəsillərində kamil, imanlı, huşlu, şücaətli .fərdlər yetişdirirlər

.Bir sıra qeyri-müəyyən amillər .٣

Psixologiya və biologiya elmləri insanın ruhi şəxsiyyətinin formalaşmasının təhqiqində ünsiyyət və tərbiyədən əlavə, bir sıra qeyri-müəyyən amillər silsiləsi ilə rastlaşmışlar. Bu amillər bə’zən nütfə zərrələrindəki genlərə xüsusi tə’sir göstərir və onlarda bir çox fövqəl’adə ruhi hal və qüvvələr hərəkətə gətirir. Bir qrup psixoloq və bioloq bu fikirdədir ki, bu amillər nütfədə baş verən sıçrayışlardan ibarətdir və bu sıçrayışlar .fövqəl’adə bir haldır. Bu hal onlara ruhi baxımdan xüsusi imtiyazlar verir

.Allahın xüsusi bəxşişi .۴

Yuxarıda qeyd olunmuş üç amildən əlavə, digər bir mühüm amil də vardır. Bu amil Allahın Peyğəmbərlərə xüsusi bəxşiş və ətasıdır. Əvvəldə qeyd olunmuş amillər mə’sum şəxsə Allahın xüsusi diqqətini qazanmaq imkanı verir. Bu ilahi bəxşiş sayəsində insan .vücudunun ruhi qüvvələri güclənir və daha tə’sirli olur

Bu bəxşiş insanın ruhi kamilliyini gücləndirir və ona yeni kamilliklər əlavə edir. Allahın bu xüsusi lütfü Peyğəmbərlərin imanını, elmini və bəsirətini gücləndirir. Mə’sumların

vücudunda günahın qarşısını alan əsas səbəblər güclü iман və fövqəladə bilikdir. Beləcə, мüxtəlif aмillərin cəм olмası səbəbindən мə'suм şəxs günaha batмaqdan və azğınlıqdan aмanda qalır. Çox мaraqlıdır ki, мə'suм şəxs bütün

mərhələlərdə iradə azadlığına malik olur və onun mə’sumluğu, paklığı tam öz .ixtiyarındadır

Bu hissənin əhatəli izahını növbəti sualın cavabında oxuyacaqsınız. Onu da qeyd edək .ki, yuxarıda deyilənlər imamlara münasibətdə də qüvvədədir

### ?Mə’sumluq İftİxardırmı .٨

Sual: İsmət elə bir əsrarəngiz qüvvədir ki, insana günah qarşısında paklıq verir. Belə bir qüvvəyə malik olan insanlar günah etməyə qadir deyillər. Beləcə, onların paklığı iftixar ?deyil. Bu fikirlər nə dərəcədə düzdür

Cavab: Peyğəmbərlərin günah qarşısında paklığı qeyri-iradi, qeyri-ixtiyari bir iş deyil. .Onların isməti iradi bir haldır və onların elmindən, imanından qaynaqlanır

İzah: Günah qarşısında ismət və paklıq elmin və imanın tələblərindən, əsərlərindəndir. Əlbəttə, hər elm insanı günahdan qoruya bilmir. Elmin həqiqəti göstərmə gücü o qədər çox olmalıdır ki, günahın nəticələrindən insanı xəbərdar etsin, insanın təsəvvüründə qarşısındakı günahın acı nəticələri canlansın. Bu halda günah insan üçün “əqlən mümkünsüz” yox, “adi mümkünsüz” şəklinə düşür. Bu həqiqəti aydınlaşdırmaq üçün bir misal çəkək: Həyatımız bahasına başa gələcək, bizi məhv edəcək elə əməllər var ki, biz bu əməllərin acı nəticələrini gördüyümüz üçün onlardan çəkinirik. Belə bir çəkinmə, pak qalma həmin əməllərə münasibətdə malik olduğumuz elmin nəticəsidir. Məsələn, iki düşmən dövlət qonşuluqda yerləşirsə, hər iki tərəfin sərhədçiləri sərhəd zolağının ətrafında güclü binokllarla, işıqlandırıcılarla, tə’lim görmüş itlərlə keşik çəkirlər. Onlar sərhəd zonasına nəzarət etdiyindən qadağan zonasına atılan hər addım insanın ölümünə səbəb ola bilər. Belə bir halda heç bir ağıllı insan sərhədi pozmaq fikrinə düşmür. Ona görə də işin acı nəticəsini düşünən insan amanda qalır. Ağıl və düşüncə sahibi olan hər kəs öldürücü zəhəri içməkdən, elektrik məftilinə toxunmaqdan, keçici xəstəliyi olan şəxslə təmasdan çəkinir. İnsan heç vəchlə belə bir addım atmır və onun qorunması “adi qeyri-mümkündür”. Belə bir qorunma amili işin sonunun təsəvvür edilməsidir. İnsan işin aqibətini o qədər aydın təsəvvür edir ki, bu təsəvvür onu uyğun .əməllərdən çəkindirir

Bə’zən şahidi oluruq ki, мüəyyən adaмlar yetiмin мalını haqsızlıqla yeмəkdən zərrəcə çəkinмirlər. Aмма elələri də var ki, dilinə bir tikə haraм vurмur. Nə üçün

səh:۶۷

biri yetimin malını yeməkdən qorxmadığı halda, o biri haram tikədən imtina edir? İnsanın haramdan çəkinməməsinin bir səbəbi onun imansızlığıdır. Amma imanlı insanın itaətsizliyinin səbəbi onun maddiyyata vurğunluğu və bu vurğunluğun bəsirət gözünü bağlamaqla itaətsizliyin pis aqibətini kiçik göstərməsidir. Günahın pis sonluğuna elə dərin inananlar da var ki, yetimin malından bir tikə yeməyi od yeməklə bərabər tuturlar. Ağıllı insan isə heç vaxt od yemək istəməz. Çünki o, haram malın oda çevrildiyini elm və bəsirət gözü ilə görür. Buna görə də həmin əməllərdən çəkinərək pak qalır. Qur'ani-Kərim xəzinə halında qızıl-gümüş toplayıb, başqalarının bu xəzinədə olan haqqını ödəməyənlər haqqında buyurur: "Yığdıqları qızıl-gümüş o gün (qiyamət günü) cəhənnəm (odunda qızdırılıb alınlarına, çiyinlərinə və kürəklərinə dağ basılacaq..."(١

Əgər bə'zi xəzinə sahibləri bu səhnəni öz gözləri ilə müşahidə etsələr və görsələr ki, başqa xəzinə sahibləri necə cəzalandırılır, onlara da belə xəbərdarlıq edilsə, öz mövqelərini dəyişərlər. Bə'ziləri bu səhnələri gözləri ilə görmədən, yalnız ayələr əsasında elə iman gətirirlər ki, onların rəftarı bu səhnəni gözlə görmək qədər tə'sirli olur. Onların imanı o qədər güclüdür ki, hətta gözlərindən dünya pərdələri götürülsə belə, imanlarında dəyişiklik yaranmır. Belə bir vəziyyətdə insan günah qarşısında bir .növ mə'sumluq, ismət əldə edir

Demək, insan bütün günahların cəzasından bu sayaq xəbərdar olsa, Allahın qəzəbini yetərincə dərk etsə, onun əzab səhnələrini görüb-götürməsinin fərqi yoxdur. Belə insan dünya həyatında uyğun gerçəkliklərə belə bir səviyyədə inanır ki, hətta əzab səhnələrini gördükdə də onun imanında dəyişiklik olmur. Beləcə, bu sayaq insanlar bütün günahlardan qorunub pak qala bilirlər. Onlar nəinki günah etmir, hətta günah .haqqında düşünmürlər

Deyilənlərdən mə'lum olur ki, bu sahədə paklığın tə'minatçısı iman və əməllərin cəzasından xəbərdarlıqdır. Elə bir insan yoxdur ki, hansısa bir işdə mə'sum, ismət sahibi olmasın. Bu adamlar məhz çəkindikləri günahla bağlı agahlığa malikdirlər. Peyğəmbərlərin elmi isə əhatəli, malik olduqları elmin tə'siri isə böyükdür. Onlar bütün günahların acı nəticəsindən və Allahın əzəmətindən xəbərdardırlar. Ona görə də bütün günahlar qarşısında ismətlərini qoruyub saxlaya bilirlər. Həmin bu əhatəli elm

sayəsində insanın bütün azğın istəkləri cilovlanır və işin sonunu görən insan Allah .tərəfindən tə’yin olunmuş sərhədi pozmur

Peyğəmbərlərin və imamların günahdan mə’sumluq məqamı da belədir. Bu mə’sumluğun, paklığın əsası iman, elm və bilik, nəfsə nəzarət, ciddi himmət və iti düşüncədir. Məgər belə bir mə’sumluq, ismət fəzilət deyildirmi? Məgər azad insan günaha yol verə bilməzmi? Bəli, onların günah etməyə gücü çatır, amma heç vaxt bu gücdən istifadə etmirlər. Uca şəxsiyyətə malik olan hər bir insan xalqın divarını aşıb, nə isə oğurlaya bilər. Amma onlar heç vaxt bu işi görmürlər. Hər bir həkim öz xəstəsinə mikroba yoluxmuş su içirə bilər. Amma onlar belə etmirlər. Bu o demək deyil ki, pisliyi və pis işləri .bacarmırlar

### ?Tövbə və İstİğfar mə’sumluq və paklıqla bİr araya sığırmı .۹

Sual: Bilirik ki, Peyğəmbərlər və imamlar günahdan pak, mə’sumdurlar. Bununla onların bə’zi dualarında görürük ki, zahirən günahlarını e’tiraf edir və Allah dərgahından bağışlanmaq diləyirlər. Məsələn, məşhur “Kumeyl” duasında həzrət Əli (ə) Allah dərgahına belə ərz edir: “Pərvərdigara, Səninlə olan rabitəmi qıran günahlarımı ”...bağışla... Pərvərdigara, mənim günah və xətamı əfv et

Günahdan pak olan insanlar nə üçün belə dua etməlidirlər? Onlar xalqa dua etməyi ?öyrədirlər, yoxsa bu dualarda başqa bir mə’na var

Cavab: Hələ qədim zamanlarda İslam alimlərinə bu sayaq suallar ünvanlanmışdır. Alimlərin verdiyi cavablar zahirən fərqli olsa da, onların mahiyyəti eynidir. Uyğun .dualarda günah tə’biri arxasında bizim düşündüyümüz günah nəzərdə tutulmur

İzah: Bilməliyik ki, ictimai, əxlaqi, elmi, tərbiyəvi, dini işlərdə insanlar eyni dərəcədə vəzifəli deyillər. Hər bir insandan onun gücü həddində əməllər gözlənilir. Bu mövzunu aydınlaşdırmaq üçün saysız-hesabsız misallar göstərə bilərik. Onlardan birinə nəzər salaq: Bir qrup şəxs ictimai işlərdə irəli düşərək, məsələn imkansızlar üçün xəstəxana tikmək istəyirlər. Əgər adi bir fəhlə öz maaşından cüz’i bir məbləğ bu yolda yardım göstərərsə, onun bu işi hamı tərəfindən bəyənilər. Amma varlı-dövlətli bir insan həmin fəhlənin göstərdiyi yardım qədər pul təqdim etdikdə nəinki bu iş xoşa gəlmir, hətta

məbləği fəhlə ehsan etdikdə bu iş bəyənilir, varlı adam ehsan etdikdə qınaqlarla üzləşir. .Hansı ki, varlı adamın az məbləğ yardım göstərməsi onun üçün günah deyil

Demək, hər kəsə qarşı onun ağıl, bilik, iman, qüvvə imkanları həddində tələblər irəli sürülmüşdür. Bir adam üçün ədəb, xidmət, məhəbbət və ibadət sayılan bir iş digər bir .insan üçün ədəbsizlik, xəyanət, riyakarlıq, itaətsizlik hesab oluna bilər

Deyilənləri nəzərə alaraq, Peyğəmbərlərin və imamların mövqeyinə baxaq və onların əməllərini fövqəl'adə mövqeləri ilə tutuşduraq. Peyğəmbərlər və imamlar varlıq aləminin yaradıcısı ilə bilavasitə bağlıdırlar. Yaradanın sonsuz elm və bilik şüası birbaşa onların qəlblərinə yönəlir. Başqaları üçün məxfi olan bir çox məsələlər Peyğəmbərlər və imamlar üçün aşkardır. Onların elm və biliyi iman və təqvası ən ali dərəcədədir. Bir sözlə, onlar .Allaha o qədər yaxındırlar ki, bir an Allaha diqqətsizlik onlar üçün büdrəmə sayılır

Böyük şiə filosofu mərhum Xacə Nəsirəddin Tusi öz kitablarından birində yuxarıdakı sualı belə cavablandırır: "Haram iş görən və ya vacib əmri tərk edən kəs günahkardır və tövbə etməlidir. Bu günah və tövbə bütün adi insanlara aiddir. Eləcə də müstəhəb (bəyənilmiş) işləri tərk etmək və məkruh işləri görmək bir növ günah sayılır və bundan da tövbə etmək lazımdır. Bu sayaq günah və tövbə isə nisbətən pak adamlara aiddir... Amma Qur'anda və rəvayətlərdə Adəm, Musa, Yunus və sair Peyğəmbərlərə aid edilən günahlar əvvəl qeyd etdiyimiz günahlardan deyil. Allahdan qeyrisinə ülfət bağlamaq, dünya işlərinə məşğul olub Allahdan qəflətdə qalmaq həqiqət əhli üçün bir növ günah sayılır. Həqiqət əhli bu sayaq günahlardan tövbə etməli və Allahdan bağışlanmalarını diləməlidirlər... İslam Peyğəmbəri və din öncüllərimiz öz dualarında günahlarını e'tiraf edib, Allahdan bağışlanma qiləsələr də, onların günahı əvvəldə xatırlatdığımız (günahlardan deyil."(١



---

.Ovsafil-Əşraf", s. ١٧"[٣۶] -١

Yaxşı olardı ki, qarşımızdakı suala daha dolğun cavab verмək üçün böyük şiə aliмi Əliyy ibn İsa Ərdəbilininin nəfis “Kəşful-ğəммə fi мərifətil-əiммə” kitabının ٣-cü cildində həzrət Musa ibn Cə’fərin həyat tarixçəsinin bəyanına nəzər salaq: “Yeddinci iмaм (ə) şükür səcdəsi zaмanı oxuduğu bir duasında мüxtəlif günahlarını e’tiraf edir və Allahdan bağışlanмa diləyir... Həмin bu dua ilə rastlaşdıqda onun мə’naları haqqında çox düşündüм. Təəccübləndiм ki, şiənin мə’suм, pak hesab etdiyi bir şəxs necə ola bilər ki, günahlarını e’tiraf etsin və bağışlanмa diləsin?! Aммa bir nəticəyə gələ bilмədiм. Nəhayət, bir gün ibn Tavusla bir мəclisdə olduм və ondan bu мəsələ haqqında soruşduм. O buyurdu: “Bu növ dualar xalqı öyrətмək üçündür.” Mən onun cavabı barədə düşünüb öz-özüмə dediм: “Axı həzrət Musa ibn Cə’fər (ə) bu duanı gecə yarı səcdə halında oxuмuşdur və həмin vaxt yanında kiмsə olмaмışdır. Axı o kiмi öyrədirdi?! Bu görüşdən bir мüddət sonra Məhəммəd ibn Əlqəмi Vəzir мənə həмin sualla мüraciət etdi. Mən həмin əvvəlki cavabı ona dediм və öz iradıмı bildirdiм. Əlavə etdiм, olsun ki, həzrət bu duanı təvazö baxıмından oxuмuşdur. Bir sözlə, ibn Tavusun cavabı мəni qane etмədi. O, dünyadan köçənədək мən bu fikirdə qaldıм. Zaмan ötdü və мən uyğun sualın düzgün cavabını tapdıм: Peyğəмbərlərin və iмaмların öмrü Allahın zikri ilə keçмişdir. Onların könlü daiм uca aləмin seyrindədir. Onlar daiм “Allaha elə ibadət et ki, sanki onu görürsən; əgər sən onu görмürsənsə, O səni görür.” buyruğunu əsas götürмüşlər. Onlar daiм Allaha üz tutмuş və Onun haqqında düşünмüşlər. Əgər bir an fikirləri Allahdan yayınмışsa, yeмək-içмək və sair halal işlərlə мəşğul olмuşlarsa, bunu özləri üçün günah və xəta hesab etмişlər. Bu səbəbdən də Allah dərgahına tövbə etмiş və bağışlanмa diləмişlər. Həzrət Peyğəмbərin “yaxşıların saleh işi Allaha yaxın olanlar üçün günahdır.” buyruğu da bu gerçəkliyə işarədir.(١)

## ١٠. Peyğəмbərlər və İмaмlar sahİb olduqları elмİ alİмlər kİмİ İctİhad yolu İləмİ əldə etмİşlər?

Sual: İslaм aliмləri həzrət Peyğəмbər və onun мə’suм canişinlərinin buyurduğu höküмlərin əldə olunмası yolu haqqında nə düşünürlər? Onlar da İslaм aliмləri kiмi bə’zi dini höküмləri ictihad (Qur’an və rəvayətləri araşdırмa) yolu ilə iləмi əldə etмişlər? Qur’anda və ya Peyğəмbərdən nəql olunмuş

rəvayətlərdə bir hökм aşkar şəkildə bəyan olunмuşdursa, мə’luм мəsələdir ki, ictihada ehtiyac qalмır. Ona görə də sualda “hökümlər” haqqında yox, “bə’zi hökümlər” .haqqında sorşulur

Cavab: Bu sual kəlaм elмinə aiddir. Kəlaм elмində nübüvvət və iмaмət fəslində Peyğəмbərlərin və iмaмların мalik olduğu elмlər haqqında geniş şəkildə danışılмışdır. :Biz həмin мə’luмatları xülasə şəkildə nəzərinizə çatdırırıq

Şiə aliмləri Peyğəмbər və iмaмları dini hökümlərin bəyanında мüctəhid bilмirlər. Onların nəzərincə, ilahi hökümlər Peyğəмbərlərə və iмaмlara ictihad yolu ilə yox, daha üstün .bir yolla çatdırılмışdır

Qur’anın “Nəcм” surəsində Peyğəмbər buyruqlarının мənbəsi ilahi vəhy hesab olunur. Vəhylər мələklər yolu ilə Peyğəмbərlərə çatdırılır. Müxtəlif elм və bilikləri vəhy yolu ilə əldə edən insanın ictihada, araşdırмalarla bilik əldə etмəyə ehtiyacı qalмır. Deyilənlər həzrət Peyğəмbərin мə’suм canişinlərinə, iмaмlara da aiddir. Onlara vəhy gəlмəsə də, bu ilahi insanlar мalik olduqları elмləri qeybi şəkildə əldə etмişlər. Peyğəмbərin мüəyyən səbəblərdən açıqlaмadığı мə’luмatlar canişinlər tərəfindən tədricən .açıqlanмışdır

Onlara bu sahədə böyük bir elм əta olunмuşdur və onlarla ilahi hökümlər arasında heç bir pərdə yoxdur. Bəşiriyyətin qiyaмət gününədək ehtiyac duyduğu hökümləri Allah-.təala öz lütfü ilə onlara əta etмiş və onları digər vasitələrdən ehtiyacsız buyurмuşdur

Bəli, Peyğəмbərlərin və iмaмların ictihada ehtiyacı olмaмışdır. İctihad əziyyətsiz, araşdırмasız, ilahi мənbələrsiz elм əldə edə bilмəyənlərin işidir. Onlar bə’zən ictihadla, мüxtəlif təlaşlar göstərмəklə də zəruri elмləri əldə edə bilмirlər. Bəşəriyyətin ehtiyaclı olduğu əhkaм və мaarifi olduğu şəkildə insanlara çatdıra bilən, bu barədə vəhy yolu ilə мə’luмatlandırılan Peyğəмbərdir. Peyğəмbərin ictihada, hansısa мənbələrə мüraciətə, .külli мəsələlərdən cüz’i мəsələlər çıxarмağa ehtiyacı yoxdur

Peyğəмbərlərin canişinləri də ilahi halal-haraмı, hökмləri yetərli şəkildə bilмişlər. Dini hökümlərdən bütün incəlikləri ilə xəbərdar olan şəxslər ictihada

ehtiyac duyмurlar. Bir qədər də aydın desək, ictihad ilahi hökümləri vəhy və .Peyğəмbərlərdən irsiyyət yolu ilə əldə edə bilмəyənlər üçündür

Aмма sünni aliмləri xəlifələri bir çox мəsələlərdə мüctəhid kiмi qəbul edirlər. Onlar öz əqidə kitablarında xəlifələrin dediklərini geniş və izahlı şəkildə verirlər. Bunun səbəbi xəlifələrin мüctəhid bilinмəsidir. Onların nəzərincə xəlifələrin səhvi onların ictihadından qaynaqlanır. Bə’ziləri bu fikri əsaslandırмaq üçün hətta Peyğəмbərin də bə’zən ictihad .etdiyini bildirirlər

Əqidə və мəzhəb kitablarından uyğun мələsə ilə bağlı daha əhatəli мə’luмat əldə etмək .olar

### ?Peyğəмbərİn "Ülul–əzм" olмası nə deмəkdİr .۱۱

?Sual: Ülul-əzм Peyğəмbərləri neçə nəfərdir və onların kitabları necə adlanır

Cavab: Şiə aliмlərinin nəzərincə, bəşər tarixində ۱۲۴۰۰۰ Peyğəмbər olмuşdur. Onlardan ۱۱۳-ü nübüvvət мəqaмından əlavə, risalət, yə’ni fövqəl’adə мə’мuriyyətə də мalik olмuşlar. Peyğəмbərlər arasında ۵ nəfərin xüsusi iмtiyazı və üstünlüyü vardır. Onlara "ülul-əzм" deyirlər. Ülul-əzм Peyğəмbərlərin ayinləri bütün dünyaya aid olмuşdur. Həzrət Nuh, İbrahiм, Musa, İsa, Məhəммəd ülul-əzм Peyğəмbərlərdir. İlahi kitablar sırasında isə "suhufe-Nuh", "suhufe- İbrahiм", "Tövrat", "İncil", "Qur’an" dayanır. İlk dörd kitab zaмan keçdikcə dəyişikliklərə мə’ruz qalıb мüqəddəsliyini itirsə də, Qur’ani-Kəriм həzrət Peyğəмbərə vəhy olunduğu zaмan onun göstərişi ilə yazıya alınмış və .dövrüмüzədək artırılıb-əskildilмədən qorunмuşdur

### ?Qur’anda neçə Peyğəмbərİn adı çəkİlİr .۱۲

?Sual: Qur’anda hansı Peyğəмbərlərin adı çəkilмişdir

Cavab: Qur’anda İslaм Peyğəмbəri həzrət Məhəммəddən (s) əlavə, ۲۵ Peyğəмbərin adı çəkilмişdir: Adəм, İbrahiм, İdris, İshaq, İsмail, İlyas, Əyyub, Davud, Zul-Kəfl, Zəkəriyya, Süleyмan, Şüeyb, Saleh, Üzeyir, İsa, Lut, Musa, Nuh, Harun, Hud, Əlyəf, .Yəhya, Yə’qub, Yusuf, Yunus

## ?İsa Allahın oğludurmu .۱۳

Sual: Amerikada bazar günləri televiziyada katolik kilsələrinin proqramı verilir. Xəstəlik səbəbindən kilsədə iştirak edə bilməyənlər üçün nəzərdə tutulmuş bu proqramda keşişlər belə dua edirlər: "Pərvərdigara, biz sənə iman gətirmişik; İsadan başqa sənə mənsub bir kəs tanımırıq; Biz sənin oğlun İsaya e'tiqad edirik." Bəli, məsihilərin İsa ilə ?bağlı e'tiqadları belədir. Bəs biz müsəlmanlar nə üçün İsanı Allahın oğlu hesab etmirik

Cavab: Bu sual allahşünaslıq mövzusunda İslam məntiqindən xəbərdar olanlar üçün təəccüblü görünə bilər. Amma qeyri-islami mühitdə, adətən, məsihilərlə təmasda olanlar üçün "Üç Üqnum", yə'ni ata Allah, oğul Allah, Ruhul-qüds məsələsi sual olaraq qalır. Adətən, ata və oğul Allah haqqında danışılır. Qeyri-islami mühitdə bu mövzu ilə bağlı suallar təbiidir. Suala cavab vermək üçün əvvəlcə müsəlmanların "Allah" dedikdə nə başa düşdüklərini aydınlaşdırmalıyıq. İslam üsulundan xəbərdar olanlar yaxşı bilirlər ki, Allah bütün kamal sifətlərinin mənbəyidir və onda heç bir eyb, möhtaclıq, məhdudiyyət yoxdur. Varlıq aləmindəki bütün mövcudları Allah yaratmışdır və o heç bir mövcuda .möhtac deyil

Aydın məsələdir ki, Allah kimsəyə ehtiyac duymaz, onun zehni və xarici üzvləri olmaz, nə doğular, nə də doğar. Beləcə, gözlə görünməz, zövcə sahibi olmaz, zamanla və məkanla məhdudlaşmaz. Çünki bu sayaq sifətlər Allahın məqamını aşağı salar və Onu öz yaratdığı məxluqlara oxşadar. Məsələn, əgər Allah-təala yaratdığı maddi mövcudlar kimi mürəkkəb tərkibə malik olmuş olsa, Onun varlığı tərkibindəki hissələrə ehtiyaclı olar. Məsələn, su oksigen və hidrogen atomlarından təşkil olunmuşdur. Onun varlığı bu iki ünsürün varlığına ehtiyaclıdır. Oksigen və hidrogen olmadan suyun yaranması qeyri-mümkündür. Allah isə mürəkkəb yox, bəsit varlıqdır. Varlıq aləminin yaradıcısı, aləmlərin .rəbbi mürəkkəb ola bilməz

Demək, məsihilər İsanı Allahın oğlu bilməklə Allahı öz ilahilik məqamından endirirlər, belə .bir sifət yaranmışlara xas ola bilər

Allahın tərkibi olmayan varlıqdan nə isə ayrılıb, insan şəklinə necə düşə bilər?! Axı İsa da başqa insanlar kimi maddi varlıqdır. Necə ola bilər ki, Allah onu Öz oğlu və Özünü !?onun atası adlandırsın

Rütbəli məsihilər İsanın Allahın oğlu olması fikrinin əql və elmlə uyuşmadığını gördükləri üçün məcbur qalaraq, dedikləri sözü, yə'ni İsanın Allah oğlu olmasını başqa cür :yozmağa çalışırlar. Onların uyğun yozumlarına nəzər salaq

İsanın yaradılışı adi qaydada olmadığından, o, dünyaya atasız gəldiyindən, eləcə də, .١ onun həyatı bir çox mö'cüzələr və qeyri-adi hadisələrlə müşayiət olunduğundan İsanın Allahın zühur yeri, təcəlla aynası hesab etmişlər. Guya bu səbəbə görə Allah onu öz oğlu adlandırmışdır. Bə'zən də deyirlər ki, Allah-təala İsanı fövqəl'adə sevdiyindən onu .öz oğlu kimi təqdim etmişdir

:Bu yozuma qarşı iki irad var

a) "Əhde-cədidin" ayələrində aşkar şəkildə bildirilir: "Zaman tamam olduqda Allah qadından doğulmuş oğlunu göndərdi". Eləcə də, məsihilər ümumi e'tiqad mənbələrində bildirirlər ki, onlar vahid ata Allaha, mütləq qüdrət sahibinə, görünən və görünməyən bütün şeylərin xaliqinə, İsa məsihə, Allahın oğluna, atadan doğulana, ata zatından yeganə doğulmuşa inanırlar. Onlar deyirlər: "Allah Allahdan, nur nurdan, həqiqi Allah həqiqi Allahdan, atası ilə eyni zatda olan məxluq yox, doğulmuş..." bu iki fikir bir-biri ilə qətiyyən uyuşmur. Çünki əvvəlki baxışa görə, İsa məsih Allahın oğludur. Nur nurdan ayrıldığı kimi, İsa da Allahdan ayrılmış və Məryəmin bətnində qərar tutmuşdur. Sonra isə .dünyaya qədəm qoyaraq xalqın hidayəti və səadəti yolunda çalışmışdır

b) Əgər İsanın Allahın oğlu sayılması üçün atasız yaranışı, həyatının müxtəlif mö'cüzələrlə müşayiət olunması, bu şəxsdən fövqəl'adə işlərin baş verməsi kifayət sayılarsa, onda İsadan başqaları da Allahın oğlu sayılmalıdır. Çünki həzrət Adəm ata-anasız dünyaya gəlmiş, İbrahim, Musa, Nuh və bir çox digər Peyğəmbərlərin mö'cüzələri !?olmuşdur. Allah oğlu sayılması üçün əsas ola bilərmi

Başqa bir yozumda "Allah İsanın vücudunda təcəlla etmişdir" deyə onu Allah sayırlar. .٢ Guya hərarət özünü suda göstərdiyi kimi, Allah da özünü İsanın vücudunda göstərmişdir. Bu yozumla iradlardan yaxa qurtarmaq olmaz. Belə bir yozum çuxurdan çıxıb, uçuruma yuvarlanmaq kimidir. Söhbətimizin əvvəlində qeyd etdiyimiz kimi, Allah cism deyil və zaman-məkana sığmır. Zaman və məkan baxımından qeyri-məhdud olan bir varlıq insan bədənində aşkarlana bilərmi?! Axı İsa da başqaları kimi bir insandır və hamı

Axı sonsuz olmayan okean da kasaya yerləşə bilməz. Bəs necə ola bilər ki, qeyri-məhdud olan bir vücud İsa kimi məhdud bir vücuda sığışa?! İsanın Allahın oğlu olması əqli və məntiqi olmamaqla yanaşı, Allahın yeməməsi, yatmamasını təəccüblə qarşılayan .avam adamda da suallar doğurur

## Məsİhilİkdə üç fİrqənİn, qolun yaranması .۱۴

Sual: Məsihilik dinində çoxsaylı firqələr mövcuddur. Amma bu firqələrdən üçü - katolik, ortodoks, protestant firqələri daha çox tanınmışdır. Bu firqələr nə vaxt yaranmışdır və ?onlar arasında hansı fərqlər vardır

Cavab: Ərəbcə "Casiliq" adlanan katolik papanı dini rəhbər kimi qəbul edən məsihi .firqəsinə deyilir

Məsihilikdə keşişdən yuxarı dini rütbəyə malik olan yepiskoplar bir vaxt bir-birindən fərqlənmirdilər. Amma zaman keçdikcə isgəndəriyyə, antakiyyə, kanistant və rum yepiskopları gücləndilər və ilk üç kilsənin yepiskopları "Patriarx" və rum yepiskopu ."papa", yə'ni ata ləqəbini aldılar

Puls öz risaləsini yazdıqdan sonra rum kilsəsi bütün xristian, məsihi dünyasında şöhrət qazandı. Rum (Roma) papaları dünyanın ən böyük kilsəsi rütbəsi ilə kifayətlənməyib, yavaş-yavaş bütün dünya kilsələrinə hakim olmağa çalışdılar. Onlar bildirirdilər ki, həzrət İsa Petrisi özünə canişin tə'yin etdiyindən və Petris Roma şəhərinin ilk yepiskopu olduğundan Roma yepiskopları Petrisin canişinləri kimi yer üzünün bütün .kilsələrinə hakim olmalıdırlar

Beşinci əsrdə Lui bütün xristian kilsələrinə başçılıq iddiasına düşdü. Qərbin bir çox yepiskopları onu dəstəklədilər. Amma şərqdə konstantiyyə, antakiyyə patriarxlara və İran kilsələrinin yepiskopları onun hakimiyyətini tanımaqdan imtina etdilər. Bu imtinalar səbəbindən qərbin latın dilli kilsələri ilə şərqin yunan və suriya dilli kilsələri arasında .parçalanma baş verdi

Xristian kilsənin bu iki kilsəsi bu günədək bir-birindən ayrıdır. Yunan Ortodoks kilsəsi Yunanıstan və Rusiyada fəaliyyət göstərir. Roma katolik kilsəsi isə Avropa və Amerikada hakimdir. Bu iki kilsə əqidə baxımından bir o qədər fərqlənməsələr də, Roma

papasının hakimiyyəti onlar arasında ixtilafa səbəb olmuşdur. Əlbəttə, ikinci dərəcəli məsələlərdə də fikir ayrılıqları mövcuddur.

Protestantlıq (lüğət mə’nası “e’tiraz”) çox saylı ardıcılları olan məsihi firqəsidir. Bu firqənin yaranmasının əsas səbəbi papa üsul-idarəsi, məsihi ruhanilərinin dünyapərəstliyi, günahkarlara bağışlanma kağızı satılması, xalq üçün artıq əzab-əziyyət yaradılması, elm adamlarının sıxıntıya salınması olmuşdur. Əslində protestantlıq xristian islahatçılığıdır. Protestantların rəhbəri Martin Lüter olmuşdur. O, xristian dünyasının ən böyük islahatçısıdır. Martin Lüter ۱۵۱۷-ci il oktyabr ayının ۳۱-də Vitenburq kilsəsinin divarına e’lan yapışdırmaqla mərhəmət satanlara, keşişlərin özbaşınalığına e’tirazını bildirmişdir. Bu hadisədən xəbər tutan Roma papası onu Romada saxlatdırmışdır. Amma Martin Lüter Roma papasına itaətdən boyun qaçırmış, öz mövqeyindən çəkinməmişdir. Onun sərt inadkarlığı ilə rastlaşan papa ۱۰-cu Lui ۱۵۲۰-ci ildə ona kafir damğası vurmuşdur. Lüter böyük şücaətlə papanın onu kafirlikdə ittiham edən fərmanını yandırmışdır. Avropa xalqları Martin Lüterin çağırışlarını müsbət qarşılamışdır. O, müqəddəs “Əhde-cədid” kitabını alman dilinə tərcümə etmiş və ömrünün qalan hissəsini yazmağa və ona tabe olan kilsələri qaydaya salmağa sərf .etmişdir

Protestantlıq firqəsi xristianlıqda bir çox islahatlar aparıb, behişt alverinə, günahların bağışlanmasına, tərkidünyalığa qarşı çıxıb, Roma papasının hakimiyyətini tanımasa da, .bir çox məsələlərdə, eləcə də üç üqnüm məsələsində öz sələflərindən fərqlənməmişdir

### ?Xaç qüslü nədİr .۱۵

?Sual: Xaç qüslü dedikdə nəzərdə nə tutulur və o necə yerinə yetirilir

Cavab: Xaç qüslü məsihiliyin dini ayinlərindən biridir. Onlar iddia edirlər ki, bu ayin Həzrət İsadan qabaq da mövcud olmuşdur. Məsihilərin fikrincə, xaç qüslü verən kəs günahlardan təmizlənir və özünü Allah yolunda xidmətə vəqf edir. Bununla belə, “Qamuse-müqəddəs” kitabının müəllifi yazır ki, həzrət Məsih kimsəyə xaç qüslü .verməmişdir

Xaç qüslü ayininin yerinə yetirilməsi qaydasına münasibətdə məsihilər arasında ixtilaf vardır. Bə’zilərinin fikrincə, xaç qüslü verilən şəxs suya batmalıdır. Bə’ziləri isə bu işin üç dəfə yerinə yetirilməsini zəruri sayırlar. Belə bir fikir də var ki, xaç qüslü günahını keşiş qarşısında e’tiraf edənlərə aiddir. Ona görə də uşaqlara xaç qüslünün verilməsini

düzgün saymırlar. Bə’ziləri isə uşaqlara xaç qüslü verilməsini, onların xaç suyuna salınmasını vacib bilirlər. Onlar deyirlər ki, uşağa xaç qüslü verərkən suyu onun üstünə səpmək kifayətdir.

Suyun uşağın üstünə səpilməsi ruhul-qüds ilə yaxınlığa işarədir. Onlar ata-oğul və ruhul-qüdsün adı ilə bir miqdar su səpilməsini kifayət sayırlar. Demək, əvvəlcədən məsihi olanların xaç qüslü verməsi onların günahdan təmizlənməsi sayılır. Körpələrin və xristianlığı yenicə qəbul edənlərin xaç qüslü verməsi isə onların məsihi ayinlərini qəbul .etməsinə bir işarədir

Bugünki kilsələrdə xaç qüslü eyni qaydada yerinə yetirilir. Keşiş böyük bir qabı su ilə doldurub, ona bir qədər balzam və duz qatır. Sonra camaatın qarşısında qüsl verəcəyi şəxsə xitab edir: "Məsihiliyin Allahı ata, oğul və ruhul qüdsdən ibarət bildiyinə inan: İsa Allah və Allah oğludur, anası Məryəmin bətnində bəşər şəklinə gəlmişdir; o atasının cövhərindən Allah, anasının bətnində insan olmuşdur; o dara çəkildi və üç gün sonra dirildi (qırx gün xalqın arasında oldu) Səmaya qalxdı və atasının sağ tərəfində oturdu. ".Qətlə yetirilmiş bu Allah qiyamət günü şəhadət verəcək ki, sən iman gətirdin

Keşiş bu sözləri dedikdən sonra qüsl verilən şəxs "bəli" deməli və keşiş dərhal sudan götürüb həmin şəxsin üstünə tökməlidir. Keşiş qüsl verən vaxt deyir ki, mən sənə ata, oğul və ruhul-qüds adı ilə qüsl verirəm. Sonra keşiş onun üzünü qurulayır. Bu vaxt qüsl .verilən şəxsin günahları bağışlanır, ya da o rəsmi şəkildə məsihi (xristian) olur

Yeni doğulmuş körpəyə səkkizinci gün xaç qüslü verilir. Ata və ana öz körpəsini kilsəyə gətirir və keşiş yuxarıda qeyd olunmuş sözlərlə körpəyə müraciət edir. Ata və ana .körpənin yerinə "bəli" deyərək, razılıq verirlər

Təəssübdən uzaq olan hər bir şəxs xaç qüslü ayinini diqqətlə nəzərdən keçirsə, onun :bir silsilə xürafatdan ibarət olduğunu görər. Xaç qüslü ilə bağlı bə'zi iradlarımızı bildirək

Günah ruhi və əxlaqi bir büdrəmədir. Ruhu paka çıxarmadan, həqiqi tövbə etmədən, .١ əxlaqı tərbiyələndirmədən, səmimi qəlbdən Allaha doğru qayıtmadan günahın tə'sirləri aradan qalxmır. Balzam yağı və duz qatılmış su ilə yuyunmaqla insanın qəlbi və ruhu təmizlənməz. Əgər bir şəxs günahdan peşiman olub, həqiqi tövbə edə bilərsə, bu xürafi .ayinlərə yer qalmaz

İslam ayinləri insanın öz günahına görə peşimanlığını və tövbəsini onun təmizlənməsi kimi qəbul edir və lazım bilmir ki, günahkar şəxs öz sirrini başqalarına açıqlasın. İnsanın

.٢ Üçlü Allaha e’tiqad aşkar bir şirkdir və bu e’tiqad nəinki insanı paka çıxarmır, hətta həqiqi tövhiddən uzaqlaşdırır. İnsanın e’tiqadı bu sayaq mövhumatlara əsaslanarsa, o heç vaxt tərbiyələnib nicat tapa bilməz. Əksinə, belə mövhumatlar insanı doğru yoldan azdırır və onu bədbəxt edir. Məsihilərin bu sayaq küfürlü sözləri günahdan paklanma səbəbi bilməsi insanı heyrətə gətirir.

Amma bu araşdırmalar müqəddəs İslam ayinlərinin realistliyini daha da işıqlandırır. İslam dinini qəbul etmək üçün məsihilikdə olan xürafi mərasimlərdən keçmək lazım gəlmir. Dünyanın istənilən bir nöqtəsində, istənilən bir vaxt Allahın birliyini və həzrət Məhəmmədin (s) Peyğəmbərliyini qəbul edən şəxs həqiqi müsəlman olur. Həmin şəxs hüquqi baxımdan digər müsəlmanlardan fərqlənmir. İslamı qəbul etmək üçün cəmiyyətin gözü qarşısında kiminsə təlqinlərini dinləmək, yanlış sözlərini təsdiq etmək lazım gəlmir.

### ١۶. İslam Peyğəmbərİnİn (s) gəlİşİ haqqında həzrət İsanın müjdəsİ

Sual: Qur’ani-kərimdə oxuyuruq ki, həzrət məsih (İsa) özündən sonra Əhməd adlı bir Peyğəmbərin gələcəyini xəbər vermişdir. Uyğun mə’lumat bugünkü İncildə mövcuddurmu?

Cavab: Qur’anda həzrət İsadan sonra gələcək Peyğəmbər haqqında oxuyuruq: “(həzrət İsa buyurur) Həqiqətən, mən özümdən əvvəl nazil olmuş tövratı təsdiq edən və məndən sonra gələcək Əhməd adlı bir Peyğəmbərlə müjdə verən Allahın elçisiyəm. Onlara aşkar mö’cüzə gəldikdə deyəcəklər ki, bu açıq-aydın bir sehrdir. İslam alimləri bildirirlər ki, həzrət Məsihdən danışan bu ayə Yuhanna incilinin ١۴,١۵,١۶-cı fəsillərində bəyan olunmuşdur. Yuhanna incilində İsadan sonra gələcək Peyğəmbərin adı “Farqlit” kimi ifadə olunmuşdur. Çoxsaylı dəlillərə əsasən incilin bu ifadələrində İslam Peyğəmbəri (s) nəzərdə tutulur. Məsələni bir qədər də aydınlaşdırmaq üçün incildəki buyuruqları olduğu kimi diqqətinizə çatdırırıq: “Əgər məni sevsəniz və əhkamımı qorusanız, atamdan sizə digər bir Farqlit göndərməsini istəyəcəyəm. O, əbədilik sizinlə qalacaq. O, bəşəriyyətin qəbul edə bilmədiyi haqq və doğru bir ruhdur. Çünki onu görmür və tanımırlar. Amma o sizi tanıyır. Çünki sizinlə qalır və sizinlə qalacaq.”(١)

.Yuhanna İncili" ۱۴:۱۵-۱۷, ۱۸۳۷-ci ildə Londonda çap olunмuşdur"[۳۸] -۱

“Mən sizinlə olduğum vaxt bu sözləri sizə demişəm. Amma atamın mənim adımla göndərəcəyi farqlit sizə hər şeyi öyrədəcək və mənim sizə öyrətdiyimi xatırladacaq.”(1)

“Bu iş olmamış sizə xəbər verdim ki, olanadək iman gətirəsiniz.”(2)

“Atam tərəfindən sizə göndərəcəyim farqlit, atam tərəfindən gələcək doğru ruh mənim haqqımda şəhadət verəcək.”(3)

“Mən düz deyirəm ki, mənim getməyim sizin üçün faydalıdır. Əgər mən getməsəm, farqlit gəlməyəcək. Amma getsəm, onu göndərəcəyəm. O gələndən sonra bəşəriyyəti günaha, sədaqətə, insafa vadar edəcək. Mənə inanmadıqları üçün günaha, atamın yanına getdiyim üçün sədaqətə və siz məni bir daha görməyəcəksiniz. Aləmin rəisi üçün hökm verilmişdir. Sizə deyiləsi çox söz var. Amma indi deyə bilmirəm. O gəldikdən sonra sizi doğru yola yönəldər. O özündən heç bir söz deməz. Yalnız eşitdiklərini deyər. O sizi gələcəkdən xəbərdar edəcək, məni möhtərəm tutacaq. Çünki o məndə olanları tapacaq və sizə xəbər verəcək. Atamın olan mənimdir, ona görə deyirəm ki, məndə olanları alacaq və sizə xəbər verəcək.”(4)

İncildəki “farqlit” kəlməsinin İslam Peyğəmbərinə aid olması haqqında yetərli dəlillərimiz var. Həmin söz heç də məsihilərin dediyi kimi ruhul-qüdsə aid deyil. Məsələni araşdıraq:

1. Əvvəlcə, diqqət yetirməliyik ki, İslamdan qabaq incil alimləri və təfsirçiləri arasında və’d edilmiş son Peyğəmbər olduğu yekdilliklə qəbul olunurdu. Hətta bu fikirdən sui-istifadə edən bə’zi adamlar özünü farqlit e’lan edirdi. Məsələn, bir abid 187-ci ildə (kiçik asiyada) özünü Peyğəmbər e’lan edib dedi: “Mən həmin farqlitəm ki, İsa onun haqqında xəbər vermişdir.” O özünə bir qrup ardıcıl da toplaya bilmişdi.

2. İslami mənbələrdə bildirilir ki, xristian dünyasının siyasi və dini rəhbərləri İslam Peyğəmbəri mə’bus edildiyi günlərdə incilin və’d etdiyi Peyğəmbərin intizarında idilər. Həzrət Peyğəmbərin səfiri Həbəşə hakiminə Peyğəmbərin naməsini təqdim etdikdə o, naməni oxuyub səfirə dedi: “Mən şəhadət verirəm ki, o, kitab əhlinin gözlədiyi Peyğəmbərdir. Həzrət İsanın Peyğəmbərliyini xəbər verdiyi kimi, o da son Peyğəmbərin gəlişini müjdə vermiş, onun nişanələrini bildirmişdir.”(5)

---

۱- [۳۹]۱۴:۲۵,۲۶ ,Həmin mənbə.

۲- [۴۰]۱۴:۲۹ ,Həmin mənbə.

۳- [۴۱]۱۵:۲۶ ,Həmin mənbə.

۴- [۴۲]۱۶:۵-۱۵ ,Həmin mənbə.

۵- [۴۳]“Təbəqate-kubra”, c.۱, s.۲۵۹.

İslaм Peyğəмbərinin gətirdiyi мəktub Ruм qeysərinə çatdığı vaxt o bu мəktubu oxuyub, İslaм Peyğəмbəri haqqında araşdırмalara başladı. Qeysər cavab мəktubunda yazdı: "Sizin мəktubunuzu oxuduм, də'vətinizdən agah olduм və bilirdiм ki, Peyğəмbər gələcək. Aммa güмan edirdiм ki, həмin Peyğəмbər Şaмdan çıxacaq..."(۱)Bu tarixi sənədlərdən bəlli olur ki, мəsihilər və'd olunмuş Peyğəмbərin yolunu gözləyirdilər və .bu intizar İncilə əsaslanırdı

Həzrət Məsihin farqlit üçün sadaladığı iмtiyazlar, onun zühur şəraiti və bu gelişin .۳ nəticələri haqqında bildirdikləri açıq-aşkar göstərir ki, farqlit və'd ediliмiş Peyğəмbərdir .və göstərilən əlaмətlər onun ruhul-qüds olмası ehtiмalını aradan qaldırır

:Məsələni araşdıraq

a) Həzrət Məsih sözə belə başladı: "Əgər siz мəni sevərsinizsə, əhkaмıмı ".qoruyarsınızsa, мən ataмdan digər bir farqlitin göndərilмəsini istəyəcəм

Çünki ruhul-qüds qəlb və ruhlar üzərində elə böyük tə'sirə мalikdir ki, onun şübhə ilə qarşılanмası ehtiмalı yoxdur. Yalnız və'd olunмuş Peyğəмbərin gəlişinə şərait yaratмaq lazıм gələ bilər. Çünki Peyğəмbərin yeganə tə'sir vasitəsi onun bəyanı və təbliğidir. Təbliğ isə kiмinə tə'sir edə bilər, kiмinə isə yox. Həzrət İsa əvvəlki xatırlaмaları ilə kifayətlənмəyib buyurur: "İndi həмin iş olмaмış sizə deyirəм ki, olanda iмan gətirəsiniz." .Ruhul-qüdsə iмan gətirмək üçün isə tövsiyyə və мəcburiyyətə ehtiyac yoxdur

Həzrət Məsih buyurur: "Sizə digər bir farqlit veriləcək." Əgər həzrət İsa ruhul-qüdsü .۲ nəzərdə tutмuş olsaydı "başqa bir" kəlмəsini işlətмəzdi. Çünki ruhul-qüds yeganədir və .onun haqqında "başqa bir" sözünü işlətмəyə ehtiyac yoxdur

b) Həzrət İsa buyurur: "Sizə dedikləriмi sizə xatırladacaq" (۱۴:۲۶) "Ataм tərəfindən (gələn doğru ruh мəniм haqqıмda şəhadət verəcək."(۱۵:۲۶

Bildirirlər ki, həzrət İsa dara çəkiləndən ۵۰ gün sonra ruhul-qüds həvarilərə nazil oldu. Sual olunur ki, həvarilər ۵۰ gün ərzində həzrət İsanın buyurduqlarını unutмuşdularмı

ki, ruhul-qüds onları öyrətməyə gəldi? Məgər həzrət Məsihin şagirdlərinin ruhul-qüdsün şəhadətinə ehtiyacı vardımı?! Amma farqlit kəlməsini və’d olunmuş peyğəmbərə aid etsək, bütün deyilənlər tərəddüdsüz qəbul oluna bilər. Çünki Məsih ümməti ondan sonrakı uzun müddət ərzində incilin bir çox göstərişlərini unutmuş, hətta incildə öz nəfs istəklərinə uyğun dəyişikliklər aparanlar da olmuşdu. Həzrət Məhəmməd (s) unudulmuşları xatırlatdı və İsanın Peyğəmbərliyinə şəhadət verərək dedi: “O da mənim kimi Peyğəmbər olub.” Həzrət Məhəmməd (s) Məsihin anası haqqında deyilən yersiz .sözlərə qarşı çıxdı və həzrət İsanın Allahın oğlu olması iddiasını rədd etdi

v) Həzrət İsa dedi: “Əgər mən getməsəm, farqlit yanınıza gəlməz. (۱۵:۷) O farqlitin gəlişi üçün öz gedişini şərt bilir. Əgər farqlit ruhul-qüds olsaydı, onun gəlişi üçün məsihin gedişi zəruri olmazdı. Məsihilərin əqidəsinə görə, ruhul-qüds həzrət məsihin təbliğ üçün ətrafa göndərdiyi həvarilərə nazil olurdu. Ona görə də ruhul-qüdsün nazil olması üçün məsihin gedişinə ehtiyac yoxdur. Amma farqlit kəlməsi və’d olunmuş Peyğəmbər kimi .qəbul edilərsə, bu halda həzrət İsanın gedişi onun gəlişi üçün şərt sayıla bilər

d) Üç şey farqlitin nazil olması əlaməti kimi təqdim olunur: Dünyanı günaha, sədaqətə və insafa vadar edər; Günaha, çünki mənə iman gətirməzlər;(۱۶:۸) bilirik ki, Məsihilərin əqidəsinə görə, ruhul-qüds İsa dara çəkiləndən sonra həvarilərə nazil oldu. O heç kimi günaha, sədaqətə və insafa vadar etmədi. Ayədən mə’lum olur ki, və’d olunmuş şəxs həvarilərə yox, günahkarlara zahir oldu. Qeyd etdik ki, günaha vadar dedikdə insanların inkar edəcəyi bir haqqın ortaya qoyulması nəzərdə tutulur. Əgər ruhul-qüds həvarilərə nazil olmuşdursa, həvarilər nəyi inkar edib günaha batdılar? Amma nəzərdə tutsaq ki, göndərilən İslam Peyğəmbəridir, onda deyilənlər yerini tapar. Yə’ni İslam Peyğəmbəri gəldi, haqqı bəyan etdi və bə’ziləri bu haqqı qəbul etməyib günaha .düşdülər

q) İsa buyurur: “Farqlit mənim haqqımda şəhadət verəcək;(۱۵:۲۶) “Sizə gələcəkdən (xəbər verəcək və mənə ehtiram göstərəcək.” (۱۶:۱۳

Həzrət Məsihə şəhadət verilməsi bir daha göstərir ki, və’d olunan şəxs ruhul-qüds deyil. Çünki həvarilər belə bir şəhadətə ehtiyac duymurdular. Həzrət İsaya

ehtiramla yanaşılması, onun tə’rif edilməsi isə sırf İslam Peyğəmbərinin buyruqlarına uyğun gələn həqiqətdir.

Yuxarıdakı dəlillərə diqqətlə yanaşsaq, İslam alimlərinin qeyd etdiyi həqiqətləri dərk edə bilərik. Əlbəttə ki, yuxarıda sadalanan dəlillərdən əlavə də dəlillər vardır.

Sonda Fransa böyük ensiklopediyasından söhbətimizlə əlaqəli bir hissəni oxucuların nəzərinə çatdırırıq: “Məhəmməd (s) İslam dininin tə’sisçisi, Allahın Peyğəmbəri və Peyğəmbərlərin sonuncusudur; Məhəmməd (s) sözü “çox həmd olunmuş” deməkdir. Bu sözün kökü “həmd” məsdəridir. “Həmd” isə tə’rif etmək deməkdir. Maraqlıdır ki, eyni kökdən düzəlmiş başqa bir söz Əhməddir. Böyük ehtimala görə, Ərəbistan xristianları farqlit sözünü Əhməd kimi tələffüz edirdilər. Əhməd də çox bəyənilmiş, tə’rifə layiq deməkdir... Beləcə, müsəlman yazıçıları təkrar-təkrar xatırladırdılar ki, Farqlit kəlməsi İslam Peyğəmbərinin (s) zühuruna işarədir. Qur’anın “Səff” surəsində də bu məsələyə aşkar şəkildə toxunulmuşdur.(١)

Bu hissənin tənzilində Fəxrul-İslamın tərtib etdiyi nəfis “Ənisul-Ə’lam” kitabından istifadə olunmuşdur.

### ١٧. Məryəmİn bakİrə halda doğuşu

Sual: Həyat vahidi hüceyrəsinin tərkibi iki şeydən – spermatozoid və ovuldan ibarətdir. Dişi hüceyrə, qamet təklikdə həyat prosesini tə’min etməyə qadir olmadığından belə bir tərkib zəruridir. Ciddi elmi əsasa malik bu şərt ödənmədiyi halda həzrət Məryəm kimsə ilə təmasda olmadan necə hamilə ola bilərdi? Hansı ki, dişi hüceyrə, qamet təklikdə həyatın davamını tə’min etməyə qadir deyil.

Cavab: Həzrət Məryəmin hamiləlik məsələsini araşdırmazdan qabaq diqqətinizi belə bir məsələyə yönəldirik ki, həyat vahidinin yaranması üçün həm spermatozoid, həm də ovulun olması mütləq şərt deyil. Həyat vahidi, adətən, erkək və dişi qametlərdən təşkil olunsa da, təcrübədə sübut olmuşdur ki, dişi toxumu parçalamağa qadir olan başqa mühərriklər də vardır. Yə’ni ovulun mayalanması üçün spermatozoidin olması mütləq şərt deyil. Bu həqiqəti bir çox canlıların həyatında müşahidə edə bilərik.

Təbiətşünas alimlər bildirirlər ki, bə’zi canlıların toxumları qamet olmadan da həyat fəaliyyətinə başlaya bilirlər. Məsələn, mənənə adlı həşərat yumurta qoyaraq erkək qametsiz çoxala bilir. Təcrübələrdə mə’lum olmuşdur ki, bu həşərat münasib mühitdə təkbaşına arta bilir. Qeyri-münasib şəraitdə, yumurta qoyan mənənədən törəyən həşəratların böyük yumurtalarından dişi həşəratlar vücuda gəlir. Bu proses başqa canlılarda da müşahidə olunur. Məsələn, ipək qurdu bə’zən kənar tə’sir olmadan öz .toxumlarını canlandıra bilir

Bal arısının həyatına nəzər salaq. Bal arısı bütün ömrü boyu bircə dəfə kənardan mayalanır. Onun erkək hüceyrələrlə mayalanan yumurtalarından dişi işçi arılar, mayalanmamış yumurtalardan isə erkək arılar yaranır. Bir qrup alim yumurtaların artımında spermatozoiddən əlavə başqa bir mühərrikin olduğunu iddia edirlər. Bunu da nəzərdən qaçırmayaq ki, mikrob, bakteriya, virus kimi mikroskopik canlılar mayalanmasız .artırlar. Məsələn, amöb ilkin hüceyrələrin parçalanması ilə artır

Bə’zi alimlər müəyyən qadınların kişi ilə təmasda olmadan hamilə olmasını mümkün sayırlar. Bə’zi qadınlarda mayalanma olmadan hamilə qalmaq qabiliyyəti vardır. Deməli, .bakirə qadının mayalanma olmadan hamilə qalması qeyri-mümkün sayılmır

Beləcə, həzrət Məryəmin kimsə ilə təmasda olmadan hamilə qalması imkandan xaric bir iş deyil. Qur’ani-kərimdə onun ilkin hamiləlik dövrü haqqında belə buyurulur: “(Məryəm) ailə üzvlərindən gizlənmək üçün pərdə tutmuşdu. Biz ruhumuzu Məryəmin yanına göndərdik. O, Məryəmə kamil bir insan qiyafəsində göründü; Məryəm dedi: Mən səndən Rəhmana pənah aparıram. Əgər qorxursansa, mənə toxunma.” Mələk dedi: “Mən sənə yalnız təmiz, mə’sum bir oğlan bağışlamaq üçün Rəbbinin elçisiyəm.” Məryəm dedi: “Mənim necə oğlum ola bilər ki, indiyədək mənə bir insan əli toxunmamışdır? Mən zinakar da deyiləm.” Mələk dedi: “Elədir. Lakin Rəbbin buyurdu ki, bu Onun üçün asandır...”(١)Bəli, həzrət Məryəmin qeyri-mə’lum amildən hamilə olması mümkünsüz bir iş deyil. Ətrafımızda bu sayaq mayalanmanı müşahidə etdiyimiz halda, Məryəmin hamilə !?olmasını nə üçün şübhə altına almalıyıq

Həzrət Məsihin doğulması əhvalatını nəzərdən keçirək. Allah bu yaranışla öz qüdrətini nümayişə qoymuşdur. İsanın yaranışı doğuş baxımından mö’cüzəli

olmuşdur. Bu yolla inadkar Bəni-İsrail qövmünə İsanın, doğrudan da, Allah tərəfindən .göndərilmiş Peyğəmbər olduğu sübuta yetirilmişdir

İlk həyat cövhərini, ilk diri hüceyrəsi və ilk insanı heç bir mayalanma olmadan yaratmış Allah növbəti dəfə belə bir iş görmüş və kamil bir insan, böyük Peyğəmbər vücuda .gətirmişdir. Onun bu sayaq doğuluşu inadkar müxaliflər üçün aşkar bir dəlil olmuşdur

Başqa sözlə, dişi hüceyrənin ana bətnində inkişaf etməsi spermatozoidsiz də mümkündür. Bəli, adətən, artım mayalanma yolu ilə baş tutur. Amma istisna halların .mövcudluğuna qarşı heç bir dəlilimiz yoxdur

Dişi hüceyrəni canlandıran müxtəlif mühərriklər ola bilər və bu mühərriklər mayalanma olmadan dişi qamətə həyat verər. Əgər bu sayaq səbəblər bizim üçün qaranlıqsa da, .böyük alim, qadir Allah üçün aşkar və mümkündür

### ?Məryəmİn anası öz övladını rahİb edəcəyİnİ nəzİr etmİşdİmİ .۱۸

Sual: Bilirik ki, röhbaniyyət, yə’ni rahiblik həmişə, xüsusi ilə də həzrət Məryəmin dövründə haram olmuşdur. Bəs nə üçün İmranın arvadı (Məryəmin anası) hamilə olduğu ?vaxt nəzir etmişdi ki, əgər Allah ona bir övlad əta etsə, bu övladı rahib edəcək

Cavab: Məryəmin anası heç vaxt belə bir nəzir etməmişdir. O, nəzir etmişdi ki, əgər Allah ona bir övlad əta etsə, onu Beytül-müqəddəsə xidmətçi verəcək. Qadın qərara gəlmişdi .ki, övladını ata-anaya xidmətdən azad edib, məsciddə xidmətə göndərsin

Qur’ani-kərimdə bu əhvalat belə nəql olunur: “İmranın zövcəsinin belə dediyini xatırla: “Ey Rəbbim, bətnimdəkini sənə xidmətçi olmaq üçün nəzir edirəm. Məndən qəbul et. Əlbəttə, Sən eşidən və bilənsən.”(۱) Təfsirçilər bildirirlər ki, ayədə “mə’bəd xidmətçisi” sözü işlədilmişdir. Əslində mə’bədə xidmətçi verilən insanlar digər vəzifələrdən, eləcə .də, ata-anaya xidmətdən azad olunurdular

Demək, Məryəmin rahib yox, məscidə xidmətçi verilməsi nəzir edilmişdi. Röhbaniyyət, rahiblik tərki-dünyalıq deməkdir və bu yolu seçən insanlar ailə qurmaqdan və

digər ictimai vəzifələrdən kənarlaşırlar. Belə bir hərəkət isə yaranış qanunlarına ziddir .və heç bir dində bu işə icazə verilmir

**"Şəqqül–qəmər".١٩**

Sual: Deyirlər ki, İslam Peyğəmbərinin mö'cüzələrindən biri ayın parçalanması ("şəqqül-qəmər") olmuşdur. Bu doğrudurmu?

Cavab: Bu məsələni tam aydınlaşdırmaq üçün bə'zi digər məsələlərə nəzər salmaq lazım :gəlir

Kifayət qədər böyük həcmə malik olan ay kimi bir səma cismi parçalanıb yenidən .١ ?birləşə bilərmi

Ayın parçalanma imkanı aydınlaşdırıldıqdan sonra, bu hadisənin həzrət Peyğəmbər (s) .٢ ?dövründə bir mö'cüzə kimi baş verməsinə dəlil varmı

?Əgər belə bir mö'cüzənin baş verməsi sübuta yetərsə, bu proses necə baş vermişdir .٣

Şəqqül-qəmər, ayın parçalanması hadisəsinin mümkün bir iş olduğunu qəbul etmək .١ üçün günəş daxilində baş verən partlayışları, parçalanmaları nəzərdən keçirmək :kifayətdir

a) Asteroidlər günəş sistemi ətrafında dövr edən böyük daş parçalarıdır. Bə'zən onları planetə oxşar kiçik kürə də adlandırırlar. Onlardan bə'zilərinin diametri ٣٥ kilometrə çatır. Alimlərin fikrincə, bu səma cisimləri bir zaman günəş sistemində hərəkət etmiş, sonradan parçalanmış planetin hissələridir. Bu planetin parçalanma səbəbləri hələ ki kəşf olunmamışdır. Hər halda bu hadisə səma cisimlərinin parçalana bilməsinə bir .nümunədir

b) Günəş ətrafında xüsusi bir orbitdə böyük sür'ətlə dövr edən metiorlar mövcuddur. .Bə'zən onların orbiti yerin orbitinə yaxınlaşdığından yer tərəfindən cəzb olunurlar

Alimlərin fikrincə, bu böyük daş parçaları namə'lum səbəbdən parçalanmış quyruqlu .ulduzların hissələridir. Səma cisimlərinin parçalana bilməsinə bu da bir nümunədir

۷) Laplas və bir çox başqa alimlərin fikrincə, günəş sistemi günəşdə baş vermiş böyük partlayış nəticəsində yaranmışdır. Bildirilir ki, günəş sistemindəki planetlər və günəş əvvəlcə vahid bir kütlə olmuşdur. Sonra hər bir planet tədricən

günəşdən ayrılmışdır. Amma bu partlayışın da səbəbi qaranlıq qalır. Parçalanmanın səbəblərinə münasibətdə alimlər arasında fikir ayrılığı olsa da, belə bir partlayışın baş .verməsini bütün alimlər yekdilliklə qəbul edirlər

yuxarıda deyilənlərdən belə bir nəticə əldə edirik ki, səma cisimlərində parçalanma baş verə bilər və elm bunu inkar etmir. Əlbəttə ki, belə bir hadisənin baş verməsi üçün parçalanan kütlədə böyük enerji yaranmalıdır. Bə'zi səma partlayışlarının səbəbləri .müəyyən olunsa da, bir çox partlayışların səbəbi hələ də qaranlıq qalır

Şübhəsiz ki, Şəqqül-qəmər hadisəsinin də səbəbi olmuşdur. Bu hadisə haqqında danışan əksər alimlər bildirirlər ki, bu işin səbəbi həzrət Peyğəmbərin fövqəltəbii bir gücdən faydalanması olmuşdur. Kimsə iddia etmir ki, həzrət Peyğəmbər (s) öz vücudunun enerjisi ilə belə bir işi görmüşdür. Əgər belə bir iddia olmuş olsaydı, uyğun .hadisəni şübhə altına almağa dəyərdi

Amma başqa bir sualı da cavablandırmaq lazım gəlir ki, ayın yenidən birləşməsi mümkündürmü? Qeyd etməliyik ki, əgər parçalama amili şiddətli olmazsa, parçalanan kütlənin hissələri ətrafa səpilməz. Parçalanmış ayın yenidən birləşməsi həmin parçalanmış hissələrin cazibəsinin tə'sirindən də baş verə bilər. Nyutonun məşhur cazibə qanununa əsasən, cismlər bir-birlərini cəzb edirlər. Onların arasındakı fasilə azaldıqca aralarındakı cazibə qüvvəsi də çoxalır. Ona görə də ayın parçalanmış hissələrinin arasında məsafənin az olması onun tez bir vaxtda yenidən birləşməsini tə'min edə bilər. Deyilənlərdən belə bir nəticə əldə olunur ki, Şəqqül-qəmər hadisəsində .elmin qəbul etmədiyi heç bir nöqtə yoxdur

Şəqqül-qəmər hadisəsinin baş verməsinin əsas dəlillərindən biri Qur'ani-kərimin . ۲ "Qəmər" surəsinin ilk ayələridir: "Qiyamət yaxınlaşdı, ay parçalandı; əgər müşriklər bir mö'cüzə görsələr üz döndərib deyərlər: "Bu uzun müddət davam edən bir sehrdir." Onlar (ayın parçalanmasını) təkzib etdilər və nəfs istəklərinə uydular. Halbuki, hər bir iş ".qərarlaşdırılmışdır

Şiə və sünni təfsirçiləri qəti şəkildə bildirirlər ki, yuxarıdakı ayələr Şəqqül-qəmər hadisəsinə işarədir. "Təfsire-bəyan", "Məcməul-bəyan", "Əbul-Futuh Razi", "Minhacus-Sadiqin", "Safi", "Bürhan", "Nurus-səqələyn" kimi şiə, "Təfsire-Təbəri", "Dürrül-mənsur",

“Fəxre-razi”, kiмi sünni təfsirlərində həzrət Peyğəмbərin мö’cüzə olaraq ayı .parçalaмası təsdiq edilir

Mərhum Təbərsi uyğun ayələr haqqında buyurur: “Bütün təfsirçilər bu ayəni həzrət Peyğəmbərin dövründə Şəqqül-qəmər möʼcüzəsinə aid bilirlər.” Sünni təfsirçisi Fəxri Razi uyğun ayələr haqqında deyir: “Bütün təfsirçilər bu əqidədədirlər ki, ayələrdə Peyğəmbər dövründə ayın parçalanması hadisəsindən danışılır.” Bundan əlavə, şiə və sünni rəvayət kitablarında qırxdan çox rəvayətdə Şəqqül-qəmər hadisəsi haqqında danışılır. Bu rəvayətlərin əksəriyyətində bildirilir ki, yuxarıdakı ayələr Şəqqül-qəmər hadisəsi ilə bağlı nazil olmuşdur. Deмək, yuxarıdakı ayələr belə bir möʼcüzənin baş .verdiyini təsdiq etdiyindən şübhəyə yer qalmır

Zikr olunmuş ayə və rəvayətlərdən məʼlum olur ki, həzrət Peyğəmbərin dövründə .٣ müşriklərin istəyi ilə belə bir möʼcüzə baş vermişdir. Yəʼni Allahın qüdrəti ilə ay .parçalanmış və yenidən əvvəlki halına qayıtmışdır

Bu hadisənin necə baş verməsi bəʼzi kitablarda nəql olunsa da, bu barədə geniş araşdırmalara ehtiyac var. Amma hadisənin necə baş verməsi bir o qədər də zəruri .olmadığından, deyilənlərlə kifayətlənirik

İndi isə bu məsələ ilə bağlı bəʼzilərində şübhə yaradan məqama aydınlıq gətirək: Bəʼziləri iddia edirlər ki, əgər Şəqqül-qəmər hadisəsi həqiqət olsaydı, o, dünya tarixində .qeyd olunmalı idi. Hansı ki, tarixi nəzərdən keçirərkən belə bir hadisə ilə rastlaşmırıq

Bu iradın cavabını yetərincə aydınlaşdırmaq üçün aşağıdakı məsələni nəzərdən :keçirmək lazımdır

Nəzərdən qaçırmamalıyıq ki, ay bütün yer üzündə görünmür. Onu yalnız yerin yarı .١ .hissəsində görmək mümkündür

Yerin ay görünən yarımkürəsində də səmada baş verən hadisələri bütün insanlar .٢ izləyə bilmir. Çünki gecə keçəndən sonra əksəriyyət yuxuda olur. Belə ki, yer kürəsinin .dörd bir hissəsində uyğun hadisə müşahidə oluna bilər

Belə də ola bilər ki, hadisə baş verən zaman yarımkürənin bir çox hissəsində səma .٣ .buludlu olsun və ay buludların arxasında qalsın

Səmadakı hadisələr yalnız o vaxt insanların diqqətini cəlb edir ki, ya şimşək kimi .۴

gurultulu olsun, ya da günəş tutulмası kiмi, hadisə işığın azalмası ilə мüşayiət edilsin. Hətta belə vaxtlarda da hadisə uzun мüddət davaм etdikdə insanların diqqətini cəlb .edir

səh:۸۸

Amma ayın heç bir gurultu, işığın azalması olmadan parçalanması, sonra isə birləşməsi az adamın diqqətini cəlb edə bilər. Özünüz düşünün, adi vaxtlarda hətta aydın bir gecədə !?göydə bədrlənmiş aya nəzər salıb onun vəziyyətini izləyirikmi

Hadisə baş verən dövrdə tarixi hadisələr indiki kimi dəqiq izlənilmirdi. Qədim . ۵ .dövrlərdə, təbii ki, informasiya bugünkü sür'ətlə ötürülmürdü

Qədim tarixdə qaranlıq nöqtələr çoxdur və keçmişdə baş verən hadisələrin heç də .۶ hamısı qeydə alınmamışdır. Məsələn, Zərdüşt böyük tarixi şəxsiyyət olmasına, dünyanın əhəmiyyətli bir hissəsində tanınmasına baxmayaraq, bu gün onun anadan olduğu tarix .və yer mə'lum deyil

O dövrün inkişaf etmiş ölkələrində mühüm tarixi hadisələrin qeydə alınmaması təəccüb doğurmamalıdır. Bu hadisənin də bir çox başqa hadisələr kimi tarixə düşməməsi normal .sayılmalıdır

Eləcə də, tarixçilər bütün hadisələri qeyd etmək fikrində olmamışlar. Bəşər tarixində baş vermiş dəhşətli zəlzələlərin, tufanların, quraqlıqların yaşayış məntəqələrini viran .qoyması tarixdə qeyd edilməsə də, inkarolunmaz bir gerçəklikdir

Əgər Təbərinin təfsirinə müraciət etsəniz, görərsiniz ki, təqribən ۳۰ rəvayətdə "Şəqqül-qəmər" hadisəsi yad edilmişdir. Amma həmin bu təfsiri yazan Təbəri öz tarixi əsərlərində Şəqqül-qəmər hadisəsini qeyd etməmişdir. Bütün bunları nəzərə alaraq, uyğun hadisənin tarixdə qeyd edilməməsinə təəccüblənməməliyik. Hər hansı hadisənin tarixdə .qeydə alınmaması onu baş verməməsi demək deyil

Bununla belə, bə'zi alimlər bildirirlər ki, Şəqqül-qəmər hadisəsi bə'zi tarixi mənbələrdə qeyd olunmuşdur. Məsələn, "Tarixe-fereşte" əsərinin ۱۱-ci məqaləsində qeyd olunur ki, Hindistanın Milbar əhli şəqqül-qəmər hadisəsini müşahidə etmişdir və yazılı olaraq qeydə almışdır. Mənbədə verilən mə'lumata görə həmin şəhərin hakimi bu hadisə ilə bağlı araşdırma aparmış və əmin olmuşdur ki, uyğun hadisə son Peyğəmbərin mö'cüzəsidir. Həmin hakim İslam dinini qəbul etmişdir. Deyilənləri nəzərə alaraq, .Şəqqül-qəmər hadisəsinin tarixə düşməməsi fikrindən daşınmalıyıq

## ?Həzrət Əlİ (ə) namazda olduğu vaxt saİlİ (dİlənçİnİ) necə gördü .۱

Sual: Həzrət Əli (ə) ilə bağlı rəvayətlərdə oxuyuruq ki, onun ayağına batmış oxu yalnız namazda olduğu vaxt çıxara bildilər. Namaz qıldığı vaxt həzrətin diqqəti Allaha elə cəlb olunardı ki, vücudunu hiss etməzdi. Amma başqa rəvayətlərdə bildirilir ki, bir gün həzrət Əli (ə) namazda olduğu vaxt məscidə daxil olan fəqiri və barmağındakı üzüyü ona bağışladı. Necə ola bilər ki, ayağına batmış oxun namaz vaxtı çıxarılmasından xəbər ?tutmayan həzrət məscidə girən fəqiri görür

Cavab: Bilməliyik ki, oxun ayaqdan çıxarılması ilə üzüyü fəqirə bağışlamaq arasında bir çox fərqlər vardır. Çünki oxun ayaqdan çıxarılması sırf fiziki vücudla bağlı bir işdir. Bu işin insanın imanına, Allahla bağlılığına heç bir dəxli yoxdur. Amma fəqirin, yoxsulun halına diqqət ilahi bir işdir və insanın Allaha diqqətindən asılıdır. Doğrudan da, imam namaz zamanı özündən xəbərsiz olurdu. Amma fəqirin halına diqqət insanın özünə .diqqəti deyil. Belə bir diqqəti Allaha diqqət hesab etmək olar

Başqa sözlə, Allahın bəndəsinə, fəqirə yardım etmək özü bir ibadətdir. Bu iş mühüm ibadət olan namazla vəhdət təşkil edir. Ona görə də təəccüb etməyə dəyməz ki, fəqirin acı naləsi həzrət Əlinin (ə) agah qəlbini narahat edir və onun diqqətindən kənarda qalmır. Namaz ibadətdirsə, yoxsula yardım da bir ibadətdir. Hər iki iş Allaha görə, Allahın razılığını qazanmaq məqsədi ilə yerinə yetirilir. Həzrət Əlinin (ə) bu əməli o qədər dəyərli (olmuşdur ki, bu əməl haqqında Qur’an ayəsi nazil olmuşdur.(۱

## ?Maİdə” surəsİnİn üçüncü ayəsİ HƏZRƏT Əlİ (ə) haqqındadırmı“ .۲

Sual: Əksər şiə və bir çox sünni alimlərinin fikrincə, “bu gün sizin dininizi kamilləşdirdik, sizə olan ne’mətimizi tamamladıq və İslamı sizin üçün bir ayin olaraq qəbul etdik” ayəsi Qədir günü nazil olmuşdur. Axı ayənin əvvəli və sonu halal-haram



---

.Maidə”, ۵۵“[۴۸] -۱

ətlərin bəyan etdiyi halda onun orta hissəsində bu mövzu ilə qətiyyən uyğun olmayan ?bir məsələ bəyan edilə bilərmi

Cavab: Ayənin Qədir günü nazil olmasını Təbəri, ibn Mərdəviyyə, Əbu-Nəim İsfəhani, Xətib Bəğdadi, Əbül-Qasim Əl-Həkim Əl-Həsəkani, İbn-Əsakir Dəməşqi, Xətib Xarəzmi, İbn-Kəsir Şami və bir çox başqa hədis və tarix ustadları təsdiq etmişlər. Əgər bu alimlərin mövqeylərinə, Peyğəmbər Əhli-beytinin rəvayətlərinə əsaslansaq, bu ayənin .Qədr günü nazil olması şübhə doğurmaz

Ayələrin bir çox mövzularda təfsirçilər üçün çətinlik yaradan tərtibi uyğun suala aydınlıq gətirir. Çünki ayələrin nazilolma tərtibi onların Qur'andakı ardıcıllığından fərqlənir. Məsələn, Mədinədə nazil olmuş bir çox surələr Məkkədə nazil olmuş müəyyən surələrdən qabaq gəlmişdir. Elə surələr var ki, onun ayələrinin bir hissəsi Məkkədə, digər bir hissəsi isə Mədinədə nazil olmuşdur. Belə ayələr arasında illərcə zaman .fasiləsinin olması aşkar bir həqiqətdir

Əgər ayələrin nazilolma şəraitini diqqətlə nəzərdən keçirsək, bir çox məsələlər aydınlaşar. Mədinə surəsi adlandırılan bə'zi surələrin müəyyən ayələri Məkkədə nazil olmuşdur. Məsələn, əksər ayələri Mədinədə nazil olmuş "Ənfal" surəsinin ۲۰-۲۶-cı ayələri Məkkədə vəhy edilmişdir. Belə hallara "Şüəra", "Kəhf" və bə'zi digər surələrdə .də rast gəlmək olar

Deмək, ayələrin bugünkü tərtibi onlar haqqında rəvayətdə deyilənləri gücdən sala bilməz. Onların hansı ardıcıllıqla nazil olması mö'təbər rəvayətlərdə dəqiq göstərilmişdir .və İslam alimləri Qur'an təfsirində bunu əsas götürürlər

İnsanlar kitab tərtib edərkən adətən onu mövzulara görə tənzimləyirlər. Bir mövzu başa çatdırılmamış o biri mövzuya keçilmir. Qur'an isə müxtəlif hadisələrlə bağlı tədricən nazil edilmiş bir kitabdır. Ona görə də eyni bir surədə müxtəlif məqsədlər və mövzular izlənilə bilər. Buna əsasən də, Qur'andakı ayələrin mövzu baxımından uyğun gəlməməsi bizi şübhəyə salmamalıdır. Qur'anda ayələr bə'zən zəncir kimi bir-birlərinə bağlı halda .nazil olur, bə'zən isə mövzu baxımından bir-birindən fərqlənirlər

Əgər deyilənləri nəzərə alsaq, qarşımıza çıxan bir çox problemlər həll olar. Bilməliyik ki,

bir çox ayələr surələrin ortasında gəlмişdir və onların əvvəlki və sonrakı ayələrlə heç bir əlaqəsi yoxdur. Bə’zi təfsirçilər ayələr arasında hansısa bir

bağlılıq tapмağa çalışsalar da, olsun ki, boş yerə zəhмət çəkirlər. Çünki, bir surənin bütün ayələri eyni bir şəhərdə nazil olsalar da, bir dəfəyə nazil olмaмışdır. Hər ayə hansısa мünasibətlə, hansısa bir şəraitdə vəhy edilмişdir. Hər bir ayənin özünəмəxsus .nazilolмa səbəbi var. Buna görə də ayələr arasında əlaqə axtarмaq yersiz bir işdir

Bura qədər dediklərimiz surələr və ayələr arasındakı əlaqə haqqında idi və haqqında sual verilən ayə elə bir xüsusiyyətə мalikdir ki, ötən izahlar мəsələni aydınlaşdırмır. Yuxarıda deyilənlərdən aydın oldu ki, bir surədə olan ayələr bir-birləri ilə əlaqəli olмaya da bilər. Bəs bir ayənin tərkibində olan surələr necə? Ola bilərмi ki, ayənin bir ?cüмləsində bir мövzu, digər cüмləsində başqa мövzu bəyan olsun

Əgər "Maidə" surəsinin uyğun ayəsində "Bu gün sizin dininizi kaмil etdik cüмləsi özündən əvvəlki və sonrakı cüмlələrlə uyğun gəlмirsə, bu uyğunsuzluğun səbəbini yuxarıdakı izahlar açıqlaya bilirмi? Bütün bu sualları cavablandırмaq üçün əvvəlcə .ayənin мətnini yazıb, sonra şərh verмəyə мəcburuq

Ayənin birinci hissəsində oxuyuruq: "(kəsilмədən) ölмüş heyvan, qan, donuz əti, . ١ Allahdan başqasının adı ilə kəsilмiş, boğulмuş, vurulмuş, yıxılıb ölмüş, başqa bir heyvanın buynuzundan ölмüş, vəhşi heyvanlar tərəfindən parçalanıb yeyilмiş, dikinə qoyulмuş daşın üzərində kəsilмiş heyvanlar və fal oxları ilə pay bölмək sizə haraм ".edildi. Bunlar günahdır. Canı çıxмaмış kəsdiyiniz heyvanlar istisnadır

Bu gün kafirlər sizin dininizdən əllərini üzdülər. Onlardan qorxмayın, мəndən qorxun; .٢ Bu gün dininizi kaмilləşdirdiм, sizə olan ne'мətiмi taмaмladıм və bir din kiмi sizin üçün ".İslaмı seçdiм

Əgər ayənin мətninə diqqət yetirsəniz görərsiniz ki, onun ikinci hissəsi ayədən . ١ çıxarılsa, birinci və üçüncü hissə arasındakı əlaqə qətiyyən pozulмur. Bəli, ayənin ikinci hissəsinin oradan çıxarılması ilə onun мövzusuna qətiyyən zərər toxunмur. Bu bir daha .göstərir ki, ayənin ikinci hissəsi taмaмilə мüstəqil bir мövzudur

۲. Uyğun ayənin məzmunu “Bəqərə”, “Ən’am”, “Nəhl” surələrində təkrarlanmışdır. Amma ayənin təkrarlandığı surələrdə onun ikinci hissəsi qeyd olunmamışdır. Nümunə üçün həmin ayələrdən birinə nəzər salaq: “Allah sizə ölmüş heyvanı, qanı, donuz ətini və Allahdan başqasının adı ilə kəsilənləri yeməyi qəti haram etmişdir. Lakin əlacsız qaldıqda zorla mənimsəmədən və həddi aşmadan bunlardan yeməyə məcbur olan kimsə üçün günah yoxdur. Allah bağışlayan və mehribandır.” Göründüyü kimi, bu ayədə əsas mövzumuz olan ayənin birinci və üçüncü hissələri təkrarlanmışdır. Amma onun ikinci hissəsi ilə bağlı heç bir mə’lumat verilmir.

۳. Ayələrin nazil olma səbəbi və şəraiti haqqında danışan rəvayətlərdə onun ikinci hissəsi müstəqil şəkildə araşdırılır. Məsələn, deyilir ki, ayənin uyğun hissəsi Qədir və ya Ərəfə günü nazil olmuşdur. Rəvayətlərdən göründüyü kimi, ayənin ikinci hissəsi müstəqil bir mövzudur və hansısa səbəblərdən birinci və üçüncü hissənin arasında yerləşmişdir.

Ona görə də şiə və sünni mənbələrində ayənin ikinci hissəsinin Qədir günü nazil olduğu və həzrət Əlinin (ə) vilayəti məsələsini bəyan etdiyi şübhə doğurmamalıdır. Ayənin birinci və üçüncü hissəsində fərqli mövzularda danışılması onun ikinci hissəsindəki həqiqəti aradan qaldıra bilməz.

Ayənin məzmununu diqqətlə nəzərdən keçirdikdə onun vilayət haqqında olmasına şübhə qalmır. Ayənin ikinci hissəsindəki cümlələr arasındakı bağlılıq yalnız onun imamət məsələsini bəyan etməsi ilə izah oluna bilər.

Ayənin ikinci hissəsində iki məsələdən danışılır: Müəyyən bir gündə kafirlər müsəlmanlara qələbə çalacaqlarından ümidlərini üzdülər, həm də Allah dini kamilləşdirdi. Bu iki hadisənin eyni vaxtda baş verdiyi günü müəyyənləşdirmək lazım gəlir. İndi isə həmin gün barədə deyilənləri nəzərdən keçirək:

۱. Be’sət günü: Hadisənin be’sət günü baş verMədiyi açıq-aşkar görünür. Çünki həmin gün nə kafirlər mə’yus olmuşdu, nə də din bəyan edilmişdi.

۲. Məkkənin fəthi günü: Bu ehtimal da əsassızdır. Çünki Məkkənin fəthi hicrətin ٨-ci ili baş tutdu. Həmin vaxt müsəlmanlarla kafirlər arasında bir çox müqavilələr qüvvədə idi.

Müşriklərə cahiliyyət dövründəki kimi həcc ziyarəti etmək icazəsi verilmişdi. Həmin gün kafirlərin mə’yus olması ehtimal edilmir. Eyni vaxtda din də kamilləşə bilməzdi. Çünki dinin .bir çox hökmləri Məkkənin fəthindən sonra bəyan olundu

Bəraət (kafirlərlə barışmazlığı e’lan) günü: Həmin gün həzrət Əli (ə) “Bəraət” surəsini .٣ müşriklərə oxudu. Əgər həmin gün müşriklər qələbədən ümidlərini üzmüşdülərsə də, dinin hökmləri bəyan olunub qurtarmamışdı. Olsun ki, hədd və qisas kimi hökmlər .sonralar nazil olmuşdur. Hər iki şərtin ödəndiyi günü göstərməliyik

Ərəfə günü: Bir çox sünni alimləri belə bir ehtimal üzərində dayanmışlar. Amma ayədə .۴ qeyd olunan iki hadisənin Ərəfə günü baş verməsi inandırıcı deyil. Müəyyənləşdirmək lazımdır ki, hansı kafirlər qələbədən əllərini üzdülər. Əgər qüreyş kafirlərinin və bütün bütpərəstlərin mə’yus olduğunu ehtimal etsək, bilməliyik ki, bu zümrə tamamilə başqa bir gün mə’yus olmuşdur. Qüreyş kafirləri Məkkənin fəthi günü, qalanlar isə “Bəraət” surəsi oxunduğu gün ümidlərini itirmişdilər. Əgər bütün yer üzündəki kafirlərin mə’yus olduğunu ehtimal versək, bu da həqiqətə uyğun olmaz. Çünki həzrət Peyğəmbər (s) .dünyasını dəyişən günədək belə bir ümumi mə’yusluq olmamışdır

Bundan əlavə, dinin kamilləşməsi nə deməkdir? Məqsəd həcc tə’limi və onunla bağlı vəzifələrdirmi? Bilməliyik ki, bir vacib əməlin öyrədilməsi ilə din kamil olmur. Bəlkə, halal-haramın bəyan olunması dinin kamilləşməsidir? Bu ehtimal da həqiqətdən uzaqdır. Sünni alimlərinin bildirdiyinə əsasən, irs və sələm kimi bir çox hökmlər Ərəfə günündən sonra .bəyan olunmuşdur

Buna görə də e’tiraf etməliyik ki, ümidsizlik dedikdə dinin kamilləşməsi ilə müşayiət olunan ümidsizlik nəzərdə tutulmalıdır. Kafirlərin mə’yus olması və dinin kamilləşməsi kimi iki məsələ eyni zamanda baş verməlidir. Qur’anın bir çox ayələrində şəhadət verilir ki, kafirlər müsəlmanların dininə daim tamah gözü ilə baxmışlar. Onlar həmişə müsəlmanların İslam ayinlərindən uzaqlaşdırmaq fikri ilə yaşamışlar. Qur’anda oxuyuruq: “Kitab əhlindən bir çoxu həqiqət onlara bəlli olduqdan sonra belə, təbiətlərindəki həsəd ucbatından iman gətirmiş olduğunuz halda sizi yenidən küfrə (sövq etmək istəyirlər.”(١

Amma müsəlmanlar günbəgün inkişaf edirdi və müşriklər səngərlərini tədricən itirirdilər. Kafirlərin ümid dairəsi saatbasaat daralırdı. Onların axır ümidi bu idi ki, ilahi ayinləri gətirmiş şəxsin övladı yoxdur və ondan sonra müsəlmanlara rəhbərlik edən tapılmayacaq. Onların ehtimalına görə, həzrət Peyğəmbər dünyasını dəyişdikdən sonra

çox keçməmiş İslam ayinləri sarsılacaq və kafirlər müsəlmanlar üzərində qələbə çalaraq .əvvəlki imtiyazlarını geri alacaqlar

Qur’an aşağıdakı ayədə müşriklərin dilindən bu həqiqəti belə bəyan edir: “O bir şairdir (ki, biz onun ölümü intizarındayıq.”(١)

Bəli, kafirlərin son ümidi həzrət Peyğəmbərin (s) vəfatı idi. Amma həzrət Peyğəmbər özündən sonra müsəlmanlara rəhbər tə’yin etdiyi gün müşriklərin qəlbini ümidsizlik bürüdü və onların arzusu gözündə qaldı. Həmin gün həm kafirlər ümidsizliyə qapıldılar həm də İslam ayinləri möhkəm bir din şəklinə düşdü. Peyğəmbər (s) özünə canişin, müsəlmanlara rəhbər tə’yin etməklə dini kamilləşdirdi. Bu mə’nanı əsas götürdükdə .ikinci hissədəki cümlələr bir-biri ilə uyuşur

### ?Doğrudanmı Əli (ə) Mədinədən Mədainə bir gecədə gəlmişdir .٣

Sual: Bə’zi kitablarda nəql olunur ki, Əmirəlmö’minin Səlman vəfat etdiyi vaxt bir gecə ərzində Mədinədən Mədainə gəldi. Səlmana Mədaində qüsl verdi, onu dəfn etdi və sübh Mədinəyə qayıtdı. Mədinə ilə Mədain arasındakı uzun məsafəni bir gecədə qət ?etmək necə mümkün oldu

Cavab: Hərəkətli cisimlərin eyni sür’ətdə olmadığını bilirik. Məsələn, atlı süvarinin sür’əti avtomobil və qatarın sür’ətindən aşağıdır. Təyyarə isə avtomobil və qatardan daha sür’ətlidir. Təyyəranin sür’əti isə yerin günəş ətrafında hərəkət sür’əti ilə müqayisədə çox kiçikdir. Qeyd edək ki, yer günəş ətrafında saniyədə ٣٠ km yol gedir. Yerin bu sür’əti isə saniyədə ٣٠٠ min km sür’ətə malik olan işığın sür’ətindən çox-çox kiçikdir. İşıq .bir saniyə ərzində yeri yeddi dəfə dövr edə bilər

Əlbəttə ki, təyyarə, qatar və avtomobil ixtira edilməmiş insanlar üçün saatda ٥٠-١٠٠ km yol gedilməsi ağlasığmaz bir iş idi. Amma bu qeyri-mümkünlük əqli yox, adi “qeyri-mümkünlükdür”. Gələcəkdə elə cihazlar ixtira oluna bilər ki, onların sür’əti elektronun .atom mərkəzi ətrafında hərəkətindən daha böyük ola

Bir halda ki, ağıl böyük sür’əti inkar etmir, deməк, Allah-təala bir insanı bir gecədə Mədinədən Mədainə aparmaq qüdrətinə malikdir. Biz məhz Allah-təalanın qeyri-məhdud qüdrətini əsas götürərək, həzrət Peyğəmbərin me’rac səfərinin cismani şəkildə

Qur'ani-kərimdə, bizim müqəddəs səmavi kitabımızda elə məsələlər var ki, biz onları yalnız Allahın qüdrətini əsas götürərək qəbul edirik. Səba mələkəsi Bilqeys Süleymanın hüzuruna gəlib çıxmamış Süleyman onun qəlbini Allaha cəzb etmək üçün onu mö'cüzə ilə qarşılamaq qərarına gəldi. Qur'anda bu əhvalat belə bəyan olunur: "Süleyman dedi: "Ey əyanlar, onlar yanıma müt'i vəziyyətdə gəlməmiş hansınız onun taxtını mənə gətirə bilər?" Cinlərdən olan bir ifrit dedi: "Sən yerindən qalxmamış mən onu sənə gətirərəm. Mən bu işi görməyə çox qüvvəli və e'tibarlıyam." Kitabdan xəbərdar olan birisi dedi: "Mən onu sənə bir göz qırpımında gətirərəm." Süleyman taxtı yanında hazır durmuş görüb dedi: "Bu, Rəbbimin lütfündən və Onun mərhəmətindəndir..."(١) Ümumiyyətlə, mö'cüzələri və kəramətləri təhlil edərkən bəşərə xas maddi miqyaslardan istifadə etmək olmaz. Mö'cüzə qeyri-adi bir şeydir və Allahın qeyri-məhdud qüdrətindən qaynaqlanır. Uzun məsafənin qısa zamanda qət olunması Allaha yaxın, böyük iman sahiblərinə məxsus bir kəramətdir və belə bir səfər "teyyul-ərz" adlanır.

### ۴. Doğrudanmı həzrət Əlinin (ə) evinin damına ulduz düşmüşdür?

Sual: Dəfələrlə həzrət Peyğəmbərin (s) belə bir xəbər verdiyini eşitmişik ki, müəyyən bir gecə səmadan yerə bir ulduz enər; Həmin ulduz kimin evinin damına düşərsə, həmin şəxs həzrətin qızı Zəhranın əridir. Bildirilir ki, müəyyən bir gecədə həmin ulduz həzrət Əlinin (ə) evinin damına düşmüşdür. Əgər ulduzlar hər biri yer kürəsindən böyükdürsə, yuxarıdakı rəvayəti doğru saymaq olarmı?

Cavab: Rəvayət doğru olacağı təqdirdə rəvayətdə ulduz adlandırılan səma cismi kiçik bir metoir də ola bilər. Əlbəttə ki, ulduzun yerə düşməsi elmi əsası olmayan bir xəbərdir.

### ۵. İmam Həsənin (ə) sülhünün və İmam Hüseynin (ə) savaşının fəlsəfəsi nədir?

Sual: Mə'sum imamlar və din başçıları bizə göstəriş vermişlər ki, gücümüz çatan təqdirdə öz haqqımızı müdafiə edək. Yə'ni müsəlman şəxs zülmə boyun əyməməli və azad yaşamalıdır. İmam Hüseyn (ə) öz xütbələrindən birində



---

١- [۵١] "Nəml", ٣٨-۴٠.

buyurur: “Ey insanlar, agah olun, məni ya savaş, ya da zillətə boyun əymək seçimi qarşısında qoyublar. Amma zillətin qəbulu bizdən uzaq bir işdir və biz heç vaxt zillətə ”.boyun əymərik

Aydındır ki, həzrət “biz” dedikdə bütün əhli-beytdən olanların yolunu göstərir. Bəs necə olur ki, imamın qardaşı imam Həsən (ə) Yezid kimi alçaq bir şəxs olan Müaviyənin ?qarşısında səbr edir

Cavab: Uyğun sülh və savaşın əsrarını araşdırmaq üçün imam Hüseynin (ə) qiyamının və imam Həsənin (ə) sülhünün tarixi xüsusiyyətləri, hər iki şəxsin yaşadığı dövrün şəraiti nəzərə alınmalıdır. Müaviyə ilə oğlu Yezid arasında elə bir əhəmiyyətli fərq var olmasa da, tarix şahiddir ki, Müaviyə mühafizəkar bir şəxs olmuş və öz çirkin işlərini hiyləgərliklə xoşagəlimli şəkilə salmışdır. Siffeyn döyüşündə Qur’anların nizəyə taxılması və bu hiylə ilə labüd məğlubiyyətin qarşısının alınması Müaviyənin hiyləgərliyinin bir nümunəsidir. Amma onun səriştəsiz canişini Yezid İslam üsulunda əqidəsiz olmaqla yanaşı siyasət və idarəçilik qabiliyyətindən də tamamilə məhrum olmuşdur. Ona görə də Yezid zahirən də olsa, hansısa çərçivəni gözləməmiş, İslam qanunlarını açıq-aşkar ayaq .altına almış, İslam müqəddəslikləri ilə düşmənçilik etmiş, bir sözlə, həddini aşmışdı

Belə bir şəraitdə müsəlmanlar Bəni-Üməyyə hakimiyyətinə qarşı qiyam qaldırmaq və bu zalım rejimi devirmək fikrində idilər. Belə bir məqamda imam Hüseynin (ə) qiyamı son zərbə kimi öz işini gördü və Bəni-Üməyyə ailəsinin iç üzü açıldı. Nəticədə, ümumi ictimai fikirdə İslam qəti qələbə çaldı və Bəni-Üməyyə öz mövqeyini itirdi. Müaviyənin dövrü isə belə deyildi. Alimlər bildirirlər ki, imam Həsən (ə) Yezidin dövründə yaşasaydı, o da qiyam edərdi. Eləcə də, imam Hüseyn (ə) Müaviyənin dövründə olsaydı, sülh bağlayardı. İmam Hüseynin (ə) öz qardaşı imam Həsəndən (ə) sonra Müaviyə qarşısında on il səbr etməsi deyilənlərə aşkar sübutdur. İmam Hüseyn (ə) həmin on ildə müharibədən çəkindi və yalnız Müaviyə öldükdən sonra mübarizəyə qalxdı. İmam Hüseyn (ə) Yezidə bey’ət etməkdən imtina edərək ona savaş e’lan etdi. Həzrət Kərbəla meydanında son damla qanı tökülənədək İslamın əzəməti, çirkin əllərin kəsilməsi yolunda cihad etdi. Deyilənlərdən aydın olur ki, zahiri ölçülərə riayət edən Müaviyə qarşısındakı səbr də günahsız müsəlmanların həyatını

qorumaq məqsədi daşımışdır. Həmin bu on ildə imam Həsən (ə) və imam Hüseynin (ə) səbr etməsi acizlik deyildi.

Deyilənlərdən əlavə edilməsi digər bir mövzu Müaviyə dövründə aparılan xarici siyasətin imamları sülhə vadar etməsi idi. Həmin dövrdə şərqi rum imperatoru müsəlmanlar arasındakı daxili çəkişmələri çox diqqətlə izləyir və İslam məmləkətinə hücum etmək üçün fürsət axtarırdı. İmam Həsənin (ə) Müaviyə ilə müharibə aparması Rum imperatoru üçün gözəl fürsət ola bilərdi. Belə bir hadisə baş versəydi, İslama ağır zərbə vurulacağı labüd idi. Belə bir şəraitdə imam Həsənin (ə) Müaviyə ilə sülh bağlaması və düşməni əməldə yerinə oturtması zəruri idi.

**۶. İmam Həsənin (ə) neçə zövcəsi var idi?**

Sual: Tarixçilər və mühəddislər yazırlar ki, imam Həsənin (ə) xeyli zövcəsi olmuşdur. Bu mə'lumat doğrudurmu?

Cavab: Hər bir şəxsin həyatındakı qaranlıq nöqtələri aydınlaşdırmaq üçün onun həyatını və şəxsiyyətini araşdırmaq lazım gəlir. Uyğun suala cavab verməzdən əvvəl, imam Həsənin (ə) həyatı və əxlaqi keyfiyyətləri ilə tanış olmaq yerinə düşər. Müxtəsər şəkildə də olsa, həzrətin şəxsiyyətinin həqiqi çöhrəsi üzərindən pərdəni qaldırıb məsələnin mahiyyəti ilə tanış olaq.

İkinci imam bəşər tarixinin ən pak və üstün bir ailəsində dünyaya göz açmış, həzrət Əmirəl-mö'minin (ə) və həzrət Fatimədən (s) tərbiyə almışdır. Həzrət Müctəbanın (imam Həsənin (ə)) müxtəlif cəhətlərdən üstün bir şəxsiyyəti olmuşdur. İlahi bir mə'nəviyyata malik olan bir insan bütün imkanlarından dünya ləzzətlərindən faydalanmaq üçün yox, Allahın razılığını qazanmaq, məhrumların əlindən tutmaq yolunda istifadə etmişdir.

İmam Həsən (ə) iyirmi beş dəfə Allah evini ziyarət etmişdir. İxtiyarında minik olduğu halda, Allah hüzurunda ədəb və təvazö göstərərək həmin yolu piyada və ayaqyalın adlamışdır.(۱)

İbadət, dua, Allaha diqqət baxımından əsrində onun misli olmamışdır. Allah adı çəkiləndə, qiyamət günü və ölümdən sonrakı həyat xatırlananda həzrətin halı dəyişərdi. Dəstəmaz aldığı vaxt, dua etdiyi məqam onda yalnız ilahi insanlara məxsus hal

yaranardı. Allahla raz-niyaz məqsədi ilə məscidə gəldikdə yanıqlı bir qəlblə münacat edərdi. Bu insan heç vaxt Allahı unutmazdı.(١)

Həzrətin şəxsiyyətinin böyüklüyü və paklığı haqqında əlaqədar mənbələrdən yetərincə mə'lumatlanmaq olar. Onun şəxsiyyəti ilə dərindən tanış olduqdan, bütün həyatının ibadətdə keçdiyini bildikdən sonra tarixçilərin şişirdilmiş mə'lumatları insana qərəzli görünür.

İncə bir məsələyə toxunmaq lazım gəlir ki, həmin dövrün müsəlmanları Peyğəmbər (s) və onun Əhli-beytini xüsusi bir məhəbbətlə sevdiklərindən onlarla qohum olmağı özləri üçün iftixar bilirdilər. Həmin dövrdə "iftixari zövcə" deyilən bir məfhum var idi. Bə'ziləri sevdikləri insanlara yaxın olmaq üçün iftixar olaraq öz qızlarının əqdini həmin ailə üzvünə oxutdurardılar. Belə qadınlar bugünkü anlamdakı "zövcə" yox, "iftixari zövcə" sayılardı. Belə əqdlərdə nikah kəsilər, evlənənlər arasında yaxınlıq olmazdı.

Bundan əlavə həzrətin arvadları siyahısına salınmış qadınlar imamla əqd oxutdurmaqla onun himayəsini qazanırdılar.

### ٧. Fəsadla nə üçün mübarİzə aparılmalıdır?

#### Əgər həzrət Mehdİnİn (ə) zühuru üçün yer üzündə fəsadın yayılması şərtdİrsə, fəsadla mübarİzə aparmağın nə faydası?

Sual: Mütəvatir (mö'təbər sayılacaq sayda olan) hədislərdə deyilir: yer üzünü zülm-sitəm bürüdüyü vaxt Allahın son höccəti həzrət Mehdi (ə) qeyb pərdəsindən çıxıb, dünyada ədaləti bərqərar edəcəkdir. Demək, həzrət o zaman zühur edəcək ki, yer üzünü fəsad bürüsün. Bir halda ki, hər bir müsəlman son imamın zühuru intizarında olmalıdır, onda biz fəsadla mübarizə aparmalı yox, onun daha da yayılması üçün çalışmalıyıq. Yer üzündə fəsad nə qədər çox yayılarsa, zühur üçün şərait də tez yaranar. Məgər biz fəsadla mübarizə aparmaqla imamın zühurunu tə'xirə salmırıqmı?

Cavab: Bilməliyik ki, imamın zühur şərti yalnız ictimai fəsadların artması deyil. Əgər bəşəriyyət düşüncə və mə'nəviyyat baxımından inkişaf edib, imamın dəyərini anlayacaq bir həddə çatarsa, həmin vaxt imam qeyd-şərtsiz zühur edər.

.İmamın zühuru üçün əsas şərtlərdən biri bəşəriyyətin belə bir rəhbərə layiq olmasıdır

Əqidə və din kitablarında geniş şəkildə araşdırılmışdır ki, imamın qeybdə qalmasının əsas səbəbi bəşəriyyətin iman, əxlaq və əməl baxımından bu zühura hazır olmamasıdır. .Əgər bu maneə aradan qaldırılsa, qeybət dövrü başa çatar

Böyük filosof mərhum Xacə Nəsrəddin Tusi “Təcridul-əqaid” kitabında bu barədə üç :qısa və dəyərli cümlə buyurmuşdur. Bu cümlələri qısa izahla təqdim edirik

a) “Vucuduhu lutfun”: İmamın istər aşkar, istərsə də gizli varlığı bəşəriyyət üçün böyük mə’nəvi ne’mət və Allaha yaxınlaşma vasitəsidir. Çünki Allahla xalq arasındakı əlaqə imam vasitəsi ilə bərqərar olur. Bir çox mə’nəvi və maddi ne’mətlər imama xatir insanlara əta olunur. Hətta imamı görməyib-tanımayan layiqli insanlar imam vasitəsi ilə mə’nəvi .hidayət edilir

b) “Və təsərrufihi lutfun axər”: Əgər imam qeyb pərdəsi arxasından çıxıb, aşkar yol göstərərək, hakimiyyəti ələ alsa, bu da növbəti bir ne’mət olacaq. Bu halda nəinki kiçik bir qrup, bütün bəşəriyyət imamın vücudundan bəhrələnəcək. Çünki imamın vücudu .ədalət və ilahi göstərişlər məzhəridir

v) “Və ədəmihi minna”: Əgər imam qeyb pərdəsi arxasında qalıb, xalqın işlərinə müdaxilə etməsə, bəşəriyyət üçün çox faydalı bir iş həyata keçməmiş qalacaq. Amma bu maneəni yalnız və yalnız xalq özü yarada bilir. Bu ne’mətin əta edilməməsinin səbəbkarı xalq özüdür. Əgər xalq fəzilət, əxlaq, ədalət üzərində qurulmuş dünyəvi bir hakimiyyət istəyirsə və buna hazır olarsa, sözsüz ki, bu iş baş tutacaq. Bu iş, heç şübhəsiz, Allah tərəfindən yubadılmır və zühura maneçilik törədən xalq özüdür.(١) Bəli, yer üzündə fəsadın yayılması imamın zühuruna xas şərt deyil. Zühur üçün ən yaxın yol xalqın .ləyaqətli olmasıdır

:Başqa sözlə imamın rəhbərliyinin iki şərti var

.Rəhbərin vücudu; ٢. Rəhbərin qəbulu üçün xalqın hazırlığı .١

.Əgər xalqdan asılı olan ikinci şərt ödənərsə, birinci şərti Allah-təala dərhal ödəyəsidir

Əsl məqsəd fəsadın yayılması, cəmiyyətin pozulması deyil. Belə bir təzahür imamın .٢ zühuru üçün yalnız şərait yaradır. Çünki yer üzünü zülm-sitəm bürüdükdə, üzücü problemlər insanı hədələdikdə, insan bu vəziyyətdən təkbaşına çıxa bilmir. Belə bir



---

.Kəşful-Murad", s.٢٢۶"[۵۴] -١

məqamda o ilahi rəhbərin zəruriliyi haqqında düşünür və buna hazırlaşır. İnsan anlayır ki, onun xəstəliyinin yeganə dərmanı ilahi dərgahdadır və cəmiyyəti bürümüş .azğınlıqlara yalnız ilahi inqilab son qoya bilər

Heç bir islahedici inqilab düşüncə hazırlığı olmadan gerçəkləşmir. “Tələbat və tə’minat” iqtisadiyyatın əsas məsələsi olduğu kimi ictimai dirçəlişin də əsasını təşkil edir. Xalqın .tələbatı olmadığı şəraitdə istənilən bir maddi və mə’nəvi tə’minat səmərəsizdir

Belə bir sual yaranır ki, islahedici bir inqilab üçün fikri və ruhi hazırlıq kifayət edirmi? ?Yoxsa pərakəndə düşüncələri həqiqi inqilaba çevirən başqa bir şeyə də ehtiyac var

Belə bir inqilabın təkcə düşüncə hazırlığına yox, həm də yetərli qüvvəyə ehtiyaclı olduğunu təkcə təcrübə yox, islahedici inqilab haqqında nəql olunmuş çoxsaylı hədislər də təsdiq edir. Yalnız belə bir qüvvə inqilabın qarşısında dayanmış maneələri aradan qaldıra bilər. İslami rəvayətlərdə yardımçıların, onların sayı haqqında ətraflı mə’lumat .verilmişdir

Biz ikinci şərti ödəmək, fədakar mücahidlər yetişdirmək üçün çalışmalıyıq. Dünyanı bürüyəcək inqilab üçün elə insanlar hazırlanmalıdır ki, həzrətin ümumbəşəri məramları bütün yer üzündə gerçəkləşə bilsin. Belə bir müqəddəs hədəf o zaman həqiqətə çevrilir ki, ədalətsevər insanlar əlini əlinin üstünə qoyub oturmasın və imanlı insanlar tərbiyə .etmək üçün zəhmət çəksin

Bütün bunlardan əlavə, biz həzrət Mehdi (ə) inqilabına münasibətdə öz mövqeyimizi .٣ müəyyənləşdirməliyik. Əgər biz yer üzündə fəsadın yayılmasına kömək etsək, şübhəsiz ki, həzrət Mehdi (ə) inqilabının hədəfinə çevrilərik. Yox əgər cəmiyyətin islahına çalışsaq, həzrət Mehdinin (ə) inqilabına yardım edənlərdən olarıq. Demək, yer üzündə fəsadın artmasına kömək etməklə həzrət Mehdinin (ə) zühurunu tezləşdirmiş olsaq belə, özümüzü təhlükəyə atmış oluruq. Məgər həzrət Mehdi (ə) fəsada rəvac verənlərin əllərini kəsmək üçün zühur etməyəcəkmi? Yer üzündə fəsadın yayılmasına kömək ?etdiyimiz halda Mehdi (ə) inqilabından necə faydalana bilərik

Belə ki, zühurun tezləşməsi üçün fəsad qarşısında sakit dayanmaq və ya fəsadın yayılmasına kömək etmək düzgün deyil. Çox güman ki, belə bir yanlış münasibətin

.Müəllifi məs’uliyyətdən boyun qaçırmaq istəyənlər və ya fəsada aludə olanlardır

## ?Üçüncü dünya müharİbəsİ ehtİmalı həzrət Mehdİ (ə) zühuru İlə bİr araya sığırmı .٨

Sual: Bir müddətdir ki, dünyada üçüncü dünya müharibəsi haqqında söhbətlər gedir. Deyirlər ki, əgər yer üzündə nüvə müharibəsi baş versə, dünyadakı bütün canlı aləm məhv olub gedəcək. Şərq və qərb dövlət başçılarının da çıxışlarında da bu məsələyə .toxunulur

Belə bir sual yaranır ki, varlıq aləminə qadir və qəhhar Allah hakim olduğu halda, bir neçə imansız hoqqabaz dünyanın külünü göyə sovura bilərmi? Dünyanın nüvə müharibəsi ilə məhv olması fikri müsəlmanların, xüsusi ilə də, həzrətin zühurunu gözləyən şiələrin əqidəsi ilə uyuşurmu? Üçüncü dünya müharibəsinin fikri əsrin imamının ?zühuru ilə zidd deyilmi

Cavab: Qeyd edək ki, yer üzündə nüvə müharibəsinin başlaması fikri ehtimallar üzərində qurulmuşdur. Dünyada baş verən siyasi hadisələr heç bir dəqiq proqrama, qanuna əsaslanmadığından gələcəkdə nə baş verəcəyini demək çətindir. Bir şey aydındır ki, hazırkı şəraitdə üçüncü dünya müharibəsi gözlənilir. Bəli, bu müharibə nüvə müharibəsi də ola bilər. Amma kimsə deyə bilməz ki, üçüncü dünya müharibəsi labüddür. Eləcə də, bu müharibənin nüvə müharibəsi olacağı bir ehtimaldır. Allah-təala dünya ölkələri başçılarına daha artıq ağıl payı verəcəyi təqdirdə onlar nüvə müharibəsinin aqibətini daha yaxşı dərk edə bilərlər. Bəli, yer üzünü üçüncü dünya müharibəsindən yalnız və yalnız dünya ölkələri başçılarının düşüncəsi xilas edə bilər. Ən azı bu .müharibədə nüvə silahından istifadə olunmaz

Demək, üçüncü dünya müharibəsi ehtimalı müsəlmanların, eləcə də dünyada ədaləti bərpa edəcək imamın zühuruna inanan şiələrin əqidəsi ilə zidd deyil. Müharibə haqqındakı proqnozlar yalnız ehtimallar üzərində qurulmuşdur və hansısa qanunauyğunluğa əsaslanmır. Müharibə ehtimalı bu gün mövcud olan şəraitdən yaranmışdır. Biz əlbəttə qeyd etmişdik ki, bəşəriyyətin bugünkü narahatçılığı və pərişanlığı onu ilahi hökumətin qəbuluna da hazırlaya bilər. Bir gün zülm-sitəmə düşmüş bəşəriyyət vəziyyətdən çıxa bilmədiyini dərk etsə ilahi hökuməti qəbul etməyə məcbur olacaqdır. Əgər biz də nə vaxtsa üçüncü dünya müharibəsinin baş verəcəyini ehtimal etmişiksə, məqsəd bu olub ki, əgər bəşəriyyət materialist

düşüncələrdən çəkinməsə, onu belə bir aqibət gözləyir. Bəli, bəşəriyyət bu gün tutduğu .yolu dəyişməyə məcburdur

Cavab: Uyğun ayədə(١)ilahi bir qayda, təbiət qanunu açıqlanılır. Yə’ni fiziki yetkinliyə çatmış hər bir insan tədricən öz qüvvələrini itirməyə başlayır. Beləcə, o öz körpəliyindəki zəiflik halına qayıdır. Belə bir qayda bütün canlı aləmə münasibətdə qüvvədədir. Bütün canlıları belə bir aqibət gözləyir. Əvvəlcə, onu qeyd edək ki, təbiət elmlərinə əsasən əsrin imamının uzun ömrü mümkün sayılmışdır. Bunu da qeyd etməliyik .ki, imama məxsus olan ömür istisna bir ömrüdür

Başqa sözlə, elm min illik və daha uzun ömrü mümkün sayır. Bu iş mümkün sayılmasaydı, məşhur təbiətşünas alimlər insan ömrünü uzatmaq üçün ciddi araşdırmalarla məşğul olmazdılar. Onlar insanlara ümid verirlər ki, bir gün uzun ömrün sirri açılacaq. Bunu da inkar etmək olmaz ki, hazırda belə bir ömür istisna sayılmalıdır. Hələ ki bəşəriyyət uzun ömür yaşamağın sirrini tapmamışdır. Allah seçilmiş bir bəndəsinə ona görə belə uzun ömür vermişdir ki, müəyyən bir məqamda həmin şəxs qiyam etsin və yer üzündə ədalət bərqərar olsun. Qeyd olunan Qur’an ayəsi isə adi insanlar haqqındadır və müstəsna bir .şəxsə aid edilməyə bilər

Bir sözlə, istisna olaraq bir şəxsə belə uzun ömür verən Allah onu istənilən zəiflikdən də qoruyar. Bu məsələ nəzərdə tutulmuş Quran ayəsinə qətiyyən zidd deyil. Çünki ayə .əksər adi insanlara aiddir

**Sual: ٩. Əsrin imamının ömrünün uzunluğu “kimə uzun ömür versək, onu xilqətcə dəyişib ?tərsinə çevirərik (uşaq kimi olar)” ayəsinə uyuşurmu**

Sual: Dini çıxışlarda eşidir və dini kitablarda oxuyuruq ki, əsrin imamının iki qeyb dövrü olmuşdur: Kiçik qeyb və böyük qeyb. Nə üçün bu qeyb dövrləri kiçik və böyük ?adlandırılmışdır

Cavab: On birinci şiə imamı həzrət Həsən Əskəri (ə) hicri-qəməri iki yüz altmışıncı ildə dünyasını dəyişdi və imamət məqamı Allahın əmri ilə onun övladı həzrət Mehdiyə (ə) keçdi. Atası dünyasını dəyişdiyi gün o həzrətin yaşı altıdan çox

deyildi. İslam düşmənləri daim onu izləyir və istənilən bir qiymətə onun həyatına son .qoymaq istəyirdilər. Beləcə, Allahın əmri ilə imam xalqın gözündən qeybə çəkildi

Bu qeyb dövründə həzrətin həqiqi şiələri dörd xüsusi nümayəndə vasitəsi ilə həzrətə sual verib ondan yazılı cavab ala bilirdilər. Bu vəziyyət üç yüz iyirmi doqquzuncu ilədək davam etdi. Dördüncü nümayəndə vəfat etdikdən sonra xüsusi nümayəndəlik başa çatdı və şiələrin işinin idarəçiliyi, halal-haramın bəyanı, ixtilafların həlli böyük şiə fəqihlərinə həvalə olundu. İmamın nümayəndəliyi fərdi şəkildə başa çatdı və bu iş ümumi .şəkildə şiə alimlərinə tapşırıldı

İmamın kiçik qeyb dövrü hicri-qəməri iki yüz altmışıncı ildə başlayıb üç yüz iyirmi doqquzuncu ildə başa çatmışdı. Kiçik qeyb dövrü imam Həsən Əskəri (ə) vəfatından son nümayəndənin vəfatınadək olan dövrü əhatə edirdi. Hicri-qəməri üç yüz iyirmi doqquzuncu ildə başlamış böyük qeyb dövrü bu günədək davam etməkdədir. Birinci dövr ona görə kiçik adlandırılmışdır ki, həmin dövrdə əksəriyyət imamla görüşdən məhrum olsa da, nümayəndələr həzrətlə görüşə bilirdilər. Həmin dövr vaxt e’tibarı ilə də qısa idi. Amma son nümayəndənin vəfatından sonra artıq imamla görüş mümkünsüz oldu. İmamla bütün ünsiyyət vasitələri aradan qalxdığından və bu dövr uzun olduğundan onu .böyük qeyb adlandırırlar

### ?İmamın xüsusİ nümayəndələrİ kİmlər İdİ .١٠

Sual: Bildirilir ki, kiçik qeyb dövründə həzrət Mehdinin (ə) xüsusi səfirləri olmuşdur. ?Onlar zəruri məsələləri imamın nəzərinə çatdırırdılar. Bu şəxslər kimlər idi

Cavab: Əsrin imamı kiçik qeyb dövründə dörd səfir vasitəsi ilə müsəlman xalqla təmasda olmuşdur. Xalqın bir çox ehtiyacları həmin nümayəndələr vasitəsi ilə ödənmişdir. Xüsusi :nümayəndələr dörd nəfər olmuşdur

Osman ibn Səid Əmri: bu şəxs Bəni-Əmr ibn Amir qəbiləsindən idi. O on bir yaşından .١ başlayaraq Peyğəmbər ailəsinin xidmətində durmuşdu. Osman imam Hadi və həzrət Əskərinin (ə) səhabəsi sayılırdı. O həm də imam Əskərinin (ə) xüsusi vəkili idi. Osman o qədər e’tibar qazanmışdı ki, həzrət Əskəri (ə) onun haqqında onun oğlu Məhəmməd ibn Osmana belə buyurmuşdur: “Əmr və onun övladı mənim e’tibarımı qazanmışdır. Mənim

eşitmişlər və nəql edirlər. Onların hər ikisinə e'timadım var. Hər ikisini dinləyin və ".dediklərini icra edin

Həzrət imam Həsən Əskəri (ə) öz övladını ciddi nəzarət altında saxladığından az adamlar onu görə bilirdilər. Osman imam Əskərinin (ə) həyatı dövründə həzrət Mehdini (ə) onun evində ziyarət edə bilən xüsusi şəxslərdən idi. Onun həyatı rical kitablarında (əhatəli şəkildə bəyan olunmuşdur.(١

Məhəmməd ibn Osman ibn Səid: Bu şəxs əvvəlki nümayəndə Osmanın oğludur. O, .٢ həzrət imamın ikinci səfiri və vəkili olmuşdur. Bu şəxs imam Əskərinin (ə) həyatı dövründə yaşamış və imam onun haqqında xoş sözlər demişdir. Onun nümayəndəlik dövrü uzun çəkmiş və o daim şiələrin məktubunu həzrətə çatdırmışdır. Məktublara verilən yazılı cavablar Məhəmməd vasitəsi ilə ünvana göndərilərdi. Məhəmməd üç yüz (dörd və ya üç yüz beşinci ildə vəfat etmişdir.(٢

Hüseyn ibn Ruh: Bu şəxs həmin dövrdə şiə aləmində ağlı və agahlığı ilə tanınmışdır. O, .٣ Məhəmməd ibn Osmanın, imamın ikinci səfirinin sirdaşı idi. Məhəmməd əsrin imamının göstərişi ilə səfirliyi Hüseyn ibn Ruha həvalə etdi. Özü hicri-qəməri ٣٢۶-cı ildə dünyasını (dəyişdi.(٣

Əli ibn Məhəmməd Səməri: Bu şəxs həzrət Mehdinin (ə) sonuncu səfiri olmuşdur. İmam .۴ özü ona məktubla müraciət edərək, onu son səfir tə'yin etmiş və tapşırmışdır ki, nə badə öz yerinə başqasını tanıtdırsın. Son səfir ٣٢٩-cu ilin Şəban ayının ١۵-də vəfat etmişdir. Dördüncü nümayəndənin vəfatı ilə səfirlik qapısı bağlanmış və böyük qeyb dövrü .başlanmışdır. Həmin dövrdən başlayaraq, nümayəndəliklə bağlı iddialar rədd edilmişdir

### Həzrət Mehdİnİn (ə) qeybİnİn fəlsəfəsİ .١١

Sual: Bilirik ki, Həzrət Mehdi (ə) hicri-qəməri ٢۶٠-cı ildə insanların nəzərindən qeybə çəkilmişdir. Artıq o min ildən çoxdur ki qeyb pərdəsi arxasındadır. Bu qeybin fəlsəfəsi ?nədir

Cavab: Bilməliyik ki, imamın nəzərlərdən qeybdə olması onun başqa bir dünyada yaşaması demək deyil. Onun maddi vücudunda heç bir dəyişiklik baş

---

.Tənqihul-Məqal”, c. ۱, s. ۲۴۵“[۵۶] -۱

.İbn Əsir, “Kamil” ۳۰۵-ci ilin hadisələri[۵۷] -۲

.Tənqihul-Məqal”, c. ۲, s. ۳۰۸“[۵۸] -۳

verməmişdir. İmam xalq arasında yaşayır, xalq onu görür, amma tanımır. İmamın həyatı .təbii bir həyatdır

Bəs nə üçün bu qeyb bir belə uzundur və onun fəlsəfəsi nədir? Sualın cavabında deməliyik ki, həzrət Mehdinin (ə) işi Peyğəmbərlərin və sair imamların işindən fərqlənir. Onun işi qanunları hazırlamaq yox, bütün yer üzündə müəyyən qanunları həyata keçirməkdir. Ona bütün dünyada İslam tə'limlərini gerçəkləşdirmək əmr olunmuşdur. .Həzrət bütün yer üzündə haqq-ədaləti bərqərar etməlidir

Peyğəmbərlər və digər imamlar da bu istiqamətdə fəaliyyət göstərmişdir. Amma onların dövründə bütün bəşəriyyətin haqqı qəbul etmək hazırlığı olmamışdır. Əvvəlki ilahi .rəhbərlərin nüfuzu dünyanın yalnız müəyyən hissəsini əhatə etmişdir

Mə'lum məsələdir ki, bütün yer üzündə ədaləti bərpa edəcək inqilabın həyata keçirilməsi üçün münasib şərait və müqəddiməyə ehtiyac duyulur. Bu şəraitlər isə yalnız :ictimai təkamül nəticəsində ödənəsidir. Bu şərtlərə nəzər salaq

Ruhi hazırlıq: İlk pillədə bütün bəşəriyyət uyğun üsulun icrası üçün təşnə və hazır .١ olmalıdır. Nə qədər ki, belə bir tələbat yoxdur, tə'minat da olası deyil. Qeyd etmişdik ki, tələbat və tə'minat" qanunu yalnız iqtisadi sferada hakim deyil. Uyğun qanun mə'nəvi sferada da qüvvədə qalır. Nə qədər ki bəşəriyyətin ədalət, əxlaq, mə'nəviyyat istəyi .yoxdur, bu ne'mətlərin onlara verilməsi də səmərəsizdir

Bəli, zaman ötdükcə, dünyəvi qanunlar uğursuzluğa düçar olduqca, insanlar problemlər qarşısında çarəsiz qaldıqca bütün bəşəriyyətdə ümumi bir fikir güclənəsidir. Bütün yer əhli bir zaman anlayacaq ki, maddi qanunlar və beynəlmiləl təşkilatlar onların problemlərini həll etmək gücündə deyil. Bu yorğunluq və ümidsizlik nəticəsində dünya xalqları ilahi bir inqilaba ehtiyac duyacaqlar. Əlbəttə ki, belə bir ehtiyac yalnız o vaxt yarana bilər ki, insanlar bu gün dünyada hakim olan qanunların səmərəsizliyinə əmin olsunlar. Nəhayət, bu ümidsizlik nəticəsində ümumbəşəri bir inqilab üçün şərait .yaranacaq və ilahi bir inqilab rəhbərinin zühuru gerçəkləşəcək

Bəşəri elmlərin və mədəniyyətlərin təkamülü: Haqq-ədalət əsasında ümumbəşəri bir .٢ hökumətin yaranması üçün bəşəri biliklər və mədəniyyətlər inkişaf etməlidir. Belə bir

.inkişaf üçün düşüncələr dərinləşməli və zaman keçməlidir

Ümumbəşəri bir hökumətin yaranması və bütün dünya xalqlarının İslamdan bəhrələnməsi üçün inkişaf etmiş bir mədəniyyətin olması zəruridir. Bu mədəniyyət .yarananadək heç bir əməli iş görüləsi deyil. Yenə də vaxta ehtiyac duyulur

Ümumi rabitə vasitələrinin inkişafı: Belə bir hökumətin ümumi rabitə vasitəsinə ehtiyacı .۳ var. Məhz bu rabitə vasitəsi ilə bəşəri qərarlar, hökmlər müxtəlif yollarla, qısa bir .zamanda dünya əhalisinə çatdırılmalıdır. Bunun üçün isə güclü sənaye yaranmalıdır

Haqpərəst və fədakar insanların tərbiyəsi: Dünyada ədalətin bərpası kimi bir hədəfə .۴ çatmaq üçün qurucu insanlara ehtiyac duyulur. Ümumbəşəri inqilabın ordusunu məhz belə insanlar təşkil edəsidir. Haqpərəst və fədakar insanların tərbiyəsi isə böyük təlaş .və vaxt tələb edir

Bə’zi rəvayətlərdə bildirilir ki, imamın qeybdə olmasının uzun çəkməsinin fəlsəfəsi insanların sınaqdan çıxarılmasıdır. Bu mə’lumat da yuxarıda deyilənləri təsdiqləyir. Çünki İslam məntiqində imtahan və sınağın məqsədi pak ruhiyəli insanlar tərbiyə .etməkdir

Yuxarıda sadalanan dörd şərtin ödənilməsi üçün yetərincə vaxta ehtiyac duyulur. Bəşəriyyətin cəhalətdən çıxıb həqiqəti dərk etməsi üçün vaxta ehtiyac var. Müəyyən vaxt keçməlidir ki, ümumbəşəri hökumətin qəbulu üçün bütün insanlarda hazırlıq olsun. Həmin hazırlıqdan sonra xüsusi vasitə və imkanlarla uyğun proqram həzrət Mehdinin .(ə) zühuru ilə gerçəkləşər. Həzrətin qeybinin uzun çəkməsinin də fəlsəfəsi budur

Bəs nə üçün imam məxfi şəkildə yaşayır və kimsə onu tanımır? Axı o, ümumbəşəri inqilab !gerçəkləşən zamanadək aşkar şəkildə də yaşaya bilərdi

Sualın cavabında deməliyik ki, imam başqa insanlar kimi adi bir həyat tərzi sürür. Sadəcə, onun ömrü uzundur. Əgər imamın kimliyi mə’lum olarsa, dövrümüzün şər qüvvələri onu aradan götürərlər. Həzrət Mehdidən (ə) əvvəlki on bir imamın aqibəti deyilənlərə aşkar bir dəlildir. Bu gün yer üzərində ədalət carçılarına qarşı böyük bir təhlükə mövcuddur. Əgər əvvəlki imamlar şəhadətə yetirildikdən sonra başqa imam gəlirdisə, həzrət Mehdi (ə) sonuncu imamdır və onun həyatının qorunması zəruridir. Yer üzündə haqq-ədalətin bərpası məhz sonuncu imamın vasitəsi ilə

gerçəkləşməlidir. Bəli, bütün bu səbəblərə görə ilahi əmrin icra gününədək imam aşkar .olası deyil

Yuxarıda deyilənlər həzrətin qeybinin fəlsəfəsini və onun məxfi yaşamasının səbəbini açıqlayırdı. Amma belə bir sual da verilə bilər ki, imam qeybdə olduğu halda onun vücudunun bəşəriyyətə faydası nədir? Bu sualın cavabı isə müstəqil bir söhbətin .mövzusudur

### ?Nüdbə” duası keysanİyyə əqİdəsİnİ xatırlatmırmı“ .۱۲

Sual: Bir kitabda bildirilir ki, “Nüdbə” duasında şiəliklə uyuşmayan nöqtələr var. Və bu nöqtələr keysaniyyə firqəsinin əqidəsini xatırladır. Kitabda belə yazılır: “Nüdbə” duasında həzrət Mehdiyə (ə) müraciətlə soruşulur: “Bilmirəm haradasan, harada qərar tutmusan? Rəzəvi, yoxsa Zi-tuva dağındasan?” Başa düşmürəm ki, bir çox dini mərasimlərdə əsrin imamına müraciətlə oxunan bu duada nə üçün o Zi-tuva və Rəzəvi dağında axtarılır? Axı bu yerlər keysaniyyə firqəsinin əsrin imamı hesab etdiyi Məhəmməd Hənəfiyyənin yeridir? Onların əqidəsinə görə Məhəmməd Hənəfiyyə məhz bu dağda qeybə çəkilmişdir və oradan da zühur edəcəkdir. Həmin firqədən olanlar bu dağın ətəyində və ya üzü bu dağa dua edərək onun zühur edib qiyam qaldırmasını diləyirlər. Axı həzrət Mehdinin (ə) bu dağla hansı bağlılığı var? Axı o, məxsus bir yerə sığınmamışdır?! Biz inanırıq ki, o hər yerdədir və hər şeyi görür. Sadəcə, biz onu tanımırıq. Ona görə də həzrətin harada gizlənməsi barədə danışmaq on iki imamçı ”.şiələrin əqidəsi ilə uyğun deyil

Bu duanı dəqiq şəkildə mütaliə etdikdə görürük ki, duanın ortasında rabitəsiz olaraq ?qeybdə olan imama müraciət edilir. Belə bir müraciət nə dərəcədə düzgündür

Cavab: Doğrudan da, “Nüdbə” duası maraqlı və mə’nalı dualardan biridir. Bu dua olduqca məntiqli, rəvan və nizamlıdır. Mahiyyət baxımından “Nüdbə” duası elmi, inqilabi, e’tiqadi, siyasi, eləcə də həssas bir duadır. Əgər bu duadakı ifadələrin dərin məfhumuna yol tapa bilsək, onun ictimai mübarizələrdə ilham mənbəyi olduğunu .anlayarıq

Duada həzrət Peyğəmbərin (s) be’sətinin fəlsəfəsinə, onların qısa tarixçəsinə, həzrət

Peyğəmbərin (s) qiyamına Əmirəl-mö'mininin xilafətinə işarə olunur. Qur'an və ,rəvayətlərdən gətirilən canlı sübutlarla həmin xilafətin haqq olduğu sübuta yetirilir

eləcə də, imamların də’vəti növbə ilə yada salınır. Bu yolla duanı oxuyanın diqqəti həzrət Mehdinin (ə) qiyamına yönəldilir. Sonra isə aşiqanə bir tərzlə əsrin imamına xitab olunur. Onun qiyamına şövqün izharından sonra həzrətin islahedici inqilabı şərh edilir və dua bir neçə tə’sirli istəklə başa çatır. Duanın əsil mahiyyəti yuxarıda deyilənlərdir. Duanın keysaniyyə əqidəsinə oxşarlığı qətiyyətlə rədd olunmalıdır. Amma əvvəlcə həmin məzhəb haqqında bir qədər açıqlama vermək yaxşı olar. Sonra isə duanın özündən :gətirilən dəlillərlə həmin yersiz irada cavab verək

Keysaniyyə əqidə kitablarında bildirildiyi kimi, dörd imama inanan şiə firqəsidir. Onlar həzrət Əlinin (ə), imam Həsənin (ə), imam Hüseynin (ə) imamətini qəbul edir və iddia edirlər ki, Məhəmməd Hənəfiyyə də imamdır. Bu firqə ona görə keysaniyyə adlandırılmışdır ki, onun öndə gedənlərindən birinin adı Keysan olmuşdur. Bu şəxs özünü Əli (ə) aşiqi kimi tanıtdırmışdır. Bə’ziləri də Muxtar ibn Əbi Ubeydənin ləqəbinin Keysan olduğunu iddia edirlər. Qeyd edirlər ki, Muxtar da bu məzhəbin daşıyıcılarından .olmuşdur

Qeyd edək ki, keysaniyyə firqəsi bir neçə şö’bəyə parçalanmışdır, amma onların ən məşhur şö’bəsinin əqidəsinə görə Məhəmməd Hənəfiyyə hazırda diridir və Rəzəvi dağında, Mədinənin ətrafında yaşayır. Allah bu şəxsin ixtiyarında su, bal arıları . (qoymuşdur. Guya bu şəxs intizarında olduğumuz Mehdidir (ə

Bu firqənin ardıcıllarından olan məşhur Ərəb şairi Kəsir öz şe’rində imamların sayının dörd olduğunu bildirir. Sonra isə Məhəmməd Hənəfiyyənin Rəzəvi dağında qeybə .çəkilməsinə işarə olunur. Bu gün həmin firqənin ardıcılları çox azdır

Qayıdaq söhbətin əvvəlinə: Nüdbə duası qəti şəkildə keysaniyyə əqidəsini inkar edir və :bu dua on iki imamçı şiə əqidəsinə tam uyğundur. Bə’zi dəlillər göstərək

Nüdbə duasının üç cümləsində həzrət Mehdinin (ə) ata-babalarına işarə olunur və . ١ bildirilir ki, o, Xədicənin, Fatimənin övladıdır. Hansı ki, Məhəmməd Hənəfiyyəni Xədicə və Fatimənin övladı hesab etmək olmaz. Onun anası Cə’fər qızı Xəblə Hənəfiyyədir. Bəs Nüdbə duası hansı əsasla keysaniyyə əqidəsinə oxşadılır? Əgər şübhə yaradan Rəzəvi .kəlməsidirsə, duadakı üç cümlə bütün şübhələri aradan qaldırmalıdır

Duada oxuyuruq: “Haradadır imam Hüseynin (ə) övladları? Salehdən sonra saleh, .٢ doğruçudan sonra doğruçu? Haradadır Allaha doğru bir başqa yol? Bir başqa seçilmiş? Haradadır parlaq günəşlər, aylar, ulduzlar, haqq ayininin bayraqları elm və bilik sütunları? Sonra isə tək halda belə soruşulur: “Haradadır Allahın ehtiyata saxladığı...” Bu cümlələrdən aşkar şəkildə görünür ki, imam Hüseyndən sonra müxtəlif imamlar olmuşdur. Onların biri digərinin ardınca gələrək ümmətin islahı, onların Allaha doğru də’vəti, elm və bilik üçün qiyam etmişlər. Nəhayətdə isə Allahın son ehtiyatı tək şəkildə .bəyan olunur

Bütün bunları nəzərdə saxlayaraq “Nüdbə” duasına qarşı irad bildirmək yersizdir. Axı keysaniyyə əqidəsində olanlar imam Hüseynin (ə) övladlarını müqəddəs bilmirdilər. Onlar həqiqi imamları rəsmi şəkildə tanımır və Məhəmməd Hənəfiyyəni imam sayırdılar. Həzrət Əlinin (ə) vilayəti zikrindən sonra imamlara işarənin görməməzliyə vurulması təəccüb doğurur. Elə düşünürük ki, keysaniyyə əqidəsinin inkarı üçün yuxarıda zikr .olunan cümlələr kifayətdir

Duada həzrət Mehdiyə (ə) xitabən deyirik: “Canım sənə fəda olsun, gizlisən, amma .٣ bizsiz deyilsən; uzaqsan, amma ayrı deyilsən...” Bu cümlələrdə həzrət Mehdini (ə) öz yanımızda bilirik. Bu onu göstərir ki, biz həzrəti gözəgörünməz hesab etmirik. Biz .inanırıq ki, o tanınmaz şəkildə cəmiyyətdə olur və sabit bir ünvanı yoxdur

Yuxarıda deyilənlərdən mə’lum oldu ki, bu duada ardıcıl şəkildə keysaniyyə firqəsinin .٤ .xürafi əqidəsi inkar olunur. Dua on iki imamçı şiə əqidəsi ilə tam uyğundur

İndi isə Rəzəvi kəlməsini araşdıraq. Məşhur yazıçı Yaqut Həməvi Bəqdadi yazır: “Rəzəvi Mədinə ətrafında bir dağdır. Rəzəvi ona mənsub olana deyilir. Həzrət Peyğəmbər (s) bu dağ haqqında buyurmuşdur: “Rəzəvi Allahın razı olduğu bir dağdır.” Sonra müqəddəs dağların adı çəkilir və deyilir: Əram ibn Əsbəh Sələmi deyir ki, Rəzəvi dağı ilə Yənbə arasında bir günlük məsafə var. Bu da Mədinənin yeddi mənzilliyindədir. Bu dağı seyr edənlərin biri xəbər verir ki, orada bol su və ağac var. Bu həmin dağdır ki, keysaniyyə .tayfası Məhəmməd ibn Hənəfiyyənin orada olduğunu güman edir

Nüdbə” duasında Rəzəvi kəlməsindən sonra işlənmiş “Zi-tuva” kəlməsi Məkkə“ ətrafındakı dağlardandır. Onunla Məkkə arasında bir fərsəx məsafə var. Bu dağdan

İmam Baqirdən (ə) nəql olunmuş bir rəvayətdə deyilir ki, həzrət Mehdi (ə) Zi-tuva yolu ilə Məkkəyə daxil olar, əvvəlcə Bədr mücahidləri sayda mücahidlərlə Kə’bə evinin .kənarına gələr, qələbə bayrağını orada dalğalandırar

Yuxarıda deyilənlərdən mə’lum olur ki, Rəzəvi müqəddəs dağlardandır. Peyğəmbərdən .nəql olunmuş rəvayət də bunu təsdiq edir

Deməк, Rəzəvi dağı keysaniyyə əqidəsindən daha çox on iki imamçı şiələrin əqidəsi ilə bağlıdır. Olsun ki, keysaniyyə tayfası öz məqsədlərinə çatmaq üçün bu dağın müqəddəsliyindən istifadə etmişlər. Ona görə də nüdbə duasında Rəzəvi dağının adının çəkilməsini keysaniyyə əqidəsi ilə yox, bu dağın müqəddəsliyi, onun müqəddəsliyi .haqqında Peyğəmbər buyruğu ilə əlaqələndirmək lazımdır

Deyilənlərə başqa bir sübut Zi-tuva dağının adının çəkilməsidir. Çünki bu dağın keysaniyyə əqidəsi ilə heç bir əlaqəsi yoxdur. Bunu da qeyd etmək lazımdır ki, “Nüdbə” duasında həmin iki dağın adı çəkiləndən sonra “və başqaları” ifadəsi işlənmişdir. Demək, keysaniyyə düşüncəsinin əksinə olaraq, on iki imamçı şiələrin əqidəsinə görə həzrət Mehdinin (ə) xüsusi bir məkanı yoxdur. O bütün yer üzündə ola bilər. O öz babası həzrət Peyğəmbər (s) kimi həm Həra dağında, həm Kə’bədə, həm Mədinədə, həm də yer üzünün başqa nöqtələrində ola bilər. Biz ümid edirik ki, bu sayaq xırda iradı olan kəslər öz suallarını geniş müzakirəyə çıxarmazdan qabaq, mütəxəssislərlə məsləhətləşəcəklər. Mütəxəssislər onları qane etməyəcəyi təqdirdə həmin sualı azad şəkildə bildirmək olar. Qaneedici cavab olduqda isə bu sayaq suallarla insanların düşüncə rahatlığını .pozmamaq daha yaxşıdır

Qeyd etmək lazımdır ki, “Nüdbə” duası haqqında tərtib olunmuş bir kitabçada təəccüb doğuran bə’zi iradlar olunmuşdur. Bu yersiz iradların heç bir elmi əsası yoxdur. :Onlardan bə’zilərini nəzərdən keçirək

Duanın mətnində belə bir cümlə var: “Məhəmmədin (s) ailəsi ilə dostluğu onun üçün mükafat qərar verdin və Qur’anda buyurdun ki, sizdən dostluqdan savay əvəz istəmirəm” ayəsi ilə ziddiyət təşkil edir. Guya Qur’anda heç bir əvəz istənilmədiyi halda, duada belə bir istək bəyan olunmuşdur. Hansı ki, duada irad tutulan cümlənin davamında izahat verilərək deyilir: “Sizdən əvəz olaraq istədiyim mənim yox, sizin

xeyrinizədir...” Bundan əlavə, Əhli-beytlə dostluq məsələsinə Qur’anda da toxunulmuşdur. Bu dostluq bəşəriyyətə doğru yolu tapmaqda bir köməkçidir. Demək, həqiqətən də, həzrət

Peyğəmbər öz Peyğəmbərliyinin müqabilində heç bir əvəz istəməmişdir. İstədikləri isə .yalnız və yalnız xalqın xeyiri üçündür

Bir sözlə “Nüdbə” duasına münasibətdə irəli sürülən iradlar duanın mətninə .diqqətsizlikdən qaynaqlanır

## İslam və şəfaət .۱۳

Sual: İslamda şəfaət var, yoxsa yox? Əgər varsa, məgər Allahın tədbirlərinə müdaxilə etmək olarmı? Şəfaət, yə’ni mə’sumlar vasitəsi ilə günahların bağışlanması dəstəbazlıq ?deyilmi? Şəfaət nəticəsində ləyaqətsiz insanlar mövqe qazanmırmı

Cavab: İslamda şəfaət var və şəfaət İslamın aşkar üsullarından sayılır. Qur’an və islami hədislərlə müxtəsər şəkildə tanış olan kəs bilir ki, şəfaət yalnız ləyaqəti olan insanların .halına şamildir və bu məsələdə şəkk-şübhəyə yer yoxdur

Şəfaət haqqında nəqli dəlilləri araşdırmazdan qabaq şəfaət məfhumunun mahiyyətini araşdırmaq yaxşı olar. Şəfaətlə dəstəbazlıq arasındakı fərqi müəyyənləşdirmək .zəruridir

Dini terminologiyada “şəfaət” dedikdə Allah övliyalarının büdrəmələrə yol vermiş insanlara köməyi nəzərdə tutulur. Günahkarlara yardım iki şəkildə ola bilər: Biri dəstəbazlıq xatirinə zülm-sitəm yolu ilə yardım, digəri isə tərbiyəvi, ümidverici, təkamül .vasitəsi olan yardım

Əgər heç bir ləyaqəti olmayan insanlara səbəbsiz yerə yardım edilərsə, bu yardım insanları günaha və cinayətə daha çox təşviq edər. Belə bir şəfaət əlbəttə ki, yersiz və yanlışdır. Şübhəsiz ki, Qur’an ayələrində belə bir şəfaətdən danışılmır. Amma əgər bə’zi günahkarlara onların Allaha bağlılığı səbəbindən yardım göstərilərsə, bu yardım .günahkarı günah yolundan qaytarar, onun tərbiyəsinə tə’sir göstərər

Qur’ani-kərimdə bəyan olunur ki, Allah övliyalarının şəfaəti Allahın izni ilə baş tutur. Allahın izni olmasa, kimsəyə şəfaət verilə bilməz. Şübhəsiz ki, Allah əsassız yerə kimsəyə şəfaət izni verməz. Demək, Allah-təala yalnız bağışlanma ləyaqəti olanlar üçün şəfaət izni verir. İnsan Allahla rabitəsini tamami ilə qırmışsa, haqq və ədalətə bağlılığı varsa, o

batanlara bir xəbərdarlıqdır. Bütün pərdələri yırtmış, bütün bağları qırmış insan üçünsə qurtuluş yolu yoxdur. Şəfaətə inam günahkar insanların doğru yola qayıtmasında, yeni bir həyat qurmasında çox tə'sirlidir. Bu inam paklanmağa, haqq yola qayıtmağa səbəb .sayılır

Təcrübə göstərir ki, günahkarların üzünə ümid qapısı açıldıqda, onlar yanlış yoldan qayıtmağın mümkünlüyünü hiss etdikdə aralarında doğru yola qayıdan çox olur. Dünyada məhkumların, böyük cinayətkarların, əbədi həbsə məhkum edilənlərin əfvi adlı bir qanun var. Bu qanun həmin insanlara yeni bir həyata başlamaq üçün ümid verir. Belə bir ümid olmasaydı, həmin insanlar həbsxanada rahat otura bilməzdilər. Axı qaradan .(ömürlük həbsdən) tünd rəng yoxdur

Bəli, ləyaqətini itirməmiş insanlar üçün şəfaət yeni bir həyata qayıtmaq üçün ümid qapısıdır. Şəfaət yalnız o günahkarlara aiddir ki, Allah və din övliyaları ilə rabitəni qırmamışlar. Amma imanı və saleh əməli olmayan, günah meydanında bir ömür tər axıtmış .insan şəfaətə nail olası deyil

Bu iki qrup arasındakı fərqi bir misalla aydınlaşdırmağa çalışaq: Təsəvvür edin ki, bir dəstə döyüşçü ölkənin təhlükəsizliyi üçün çox mühüm olan qalanı tutmalıdır. Mahir komanda qalaya qalxmaq üçün zəruri olan vasitələri əsgərlərə vermiş və qalanın tutulmasını əmr etmişdir. Bu əmrdən sonra fədakar əsgərlər qalaya doğru hərəkət edir, qorxaqlar isə yerindən tərpənmir. Komandanın diqqəti irəli gedənlərdədir. O öndə gedənlərin müvəffəq olması üçün əlindən gələni edir. Əgər qalaya hücum edənlər arasında bir nəfər büdrəyərsə, onun əlindən tutub qaldırırlar. Amma komandanın əmrinə tabe olmayıb, yerindən tərpənməyənlər diqqətdən kənarda qalmışlar. Fədakarlıqla hücuma keçən dəstədə büdrəyənin əlindən tutmaq bir növ şəfaətdir. Dəstədən geridə qalıb qorxaqlıq göstərənlərə heç bir kömək yoxdur. Amma hədəfə doğru hərəkət zamanı büdrəyənlərə yardım əli uzadılır. Əgər komandan əvvəlcədən e'lan etsəydi ki, mən geridə qalanlara yox, yalnız irəlidə gedənlərə kömək edəcəyəm, bu və'd insanları hücuma həvəsləndirərdi. Belə bir və'din böyük tərbiyəvi əhəmiyyəti də .var

Əgər şəfaət edilərkən insanların ləyaqəti yox, başqa xüsusiyyətləri nəzərdə

!tutulsaydı, onda bu iş dəstəbazlıq kiмi yozula bilərdi

:Bəs Qur’anda şəfaət мəsələsi necə açıqlanır? Şəfaətlə bağlı üç hissəyə ayırмaq olar

۱. Şəfaəti inkar edən ayələr: Qorxun o gündən ki, heç kəs heç kəsin karına gələ bilməsin, heç kəsdən şəfaət qəbul olunmasın, heç kəsdən fidyə alınmasın və onlara heç bir kömək göstərilməsin."(۱)

۲. Şəfaəti Allaha məxsus bilən ayələr: "Sizin Ondan (Allahdan) başqa heç bir haminiz və şəfaətçiniz yoxdur."(۲)

۳. Allahın izni ilə şəfaət verənlər və bu şəfaətlərin Allahın izni ilə qəbul olunması haqqındakı ayələr: "Allahın izni olmadan Onun yanında kim şəfaət edə bilər?!"(۳)Başqa bir ayədə isə belə buyurulur: "O gün Rəhmanın izn verdiyi və söz danışmağına razı olduğu kəslərdən başqa heç kimin şəfaəti fayda verməz."(۴)

Bu və digər ayələrlə sübuta yetir ki, qiyamət günü Allahın izni ilə günahkarlara şəfaət verilə bilər. Şəfaət haqqında Qur'anda bu qədər açıq-aydın ayələr olduğu halda, uyğun məsələyə şəkk-şübhə ilə yanaşanların inadkarlığı qərəzli görünür.

Belə bir irad yəhudilərə də ünvanlanmışdır. Onlar təsəvvür edirdilər ki, onların babaları Peyğəmbər olduğundan istədikləri qədər günaha bata bilərlər. Onlar əcdadları olmuş Peyğəmbərlərin şəfaətinə bel bağlayaraq, heç bir günahdan çəkinmirdilər. Belə bir şəfaət dünyamızdakı rüşvətə oxşadıla bilər. Qur'anda məhz belə bir şəfaət rədd edilərək deyilir: "Qorxun o gündən ki, heç kəs heç kəsin karına gələ bilməsin, heç kəsin şəfaəti qəbul olunmasın, heç kəsdən fidyə alınmasın..."(۵) Demək, şəfaəti inkar edən ayələrdə batil əqidəyə malik olan cahil ərəblər və yəhudilər nəzərdə tutulmuşdur.



---

۱- [۵۹]"Bəqərə", ۴۸.

۲- [۶۰]"Səcdə", ۴.

۳- [۶۱]"Bəqərə", ۲۵۵.

۴- [۶۲]"Ta-ha", ۱۰۹.

۵- [۶۵]"Bəqərə", ۴۸.

Şəfaət haqqında buyurulan əvvəlki ayələrlə şəfaətin yalnız Allaha aid olmasını bildirən ayələr arasında heç bir ziddiyyət yoxdur. Çünki şəfaət, həqiqətən də, Allaha .məxsusdur və başqaları yalnız Onun izni ilə şəfaət verə bilərlər

## ?Əmirəl–mö'minin Əli (ə) öz xilafətini "Qədir" hədisi iləmi sübuta yetirdi .۱۴

Sual: Bilirik ki, İslam Peyğəmbəri (s) Əmirəl-mö'mininin (ə) xilafət və canişinliyini Qədir günü e'lan etmiş, ona itaəti bütün müsəlmanlara vacib saymışdır. Belə bir sual yaranır: Əgər Əmirəl-mö'mininin (ə) canişinliyi belə bir gündə e'lan olunmuşdursa, nə üçün imam ?həyatı boyu öz imamətinin isbatı üçün bu hədisi dəlil göstərməmişdir

Cavab: Əslində imam (ə) öz xilafətinin və canişinliyinin sübutu üçün müxtəlif məqamlarda Qədir hədisini sübut göstərmişdir. O bütün münasib fürsətlərdə öz müxaliflərinə bu .hədisi xatırlatmış və bu yolla xalqın qəlbindəki mövqeyini möhkəmləndirmişdir

Təkcə imam özü yox, eləcə də Peyğəmbərin qızı həzrət Fatimə (s), onun girami övladları imam Həsən (ə) və imam Hüseyn (ə), eləcə də bir çox böyük şəxsiyyətlər (Əbdullah ibn Cə'fər, Əmmar Yasər, Əsbəğ ibn Nəbatə, Qeys ibn Sə'd, Ömər ibn Əbdül-Əziz, Əbbasi xəlifəsi Mə'mun və hətta bə'zi müxaliflər) Qədir hədisini həzrət Əlinin (ə) xilafətinə dəlil .olaraq göstərmişlər

Demək, hələ həzrətin öz dövründə Qədir hədisi imamın canişinliyinə sübut kimi məşhur :idi. Bə'zi nümunələr göstərək

Əmirəl-mö'minin (ə) ikinci xəlifənin göstərişi ilə üzvləri tə'yin olunmuş Şura günü . ۱ şuranın rəisinə qarşı çıxaraq buyurmuşdur: "Mən sizə elə bir dəlil gətirəcəyəm ki, kimsə onu inkar edə bilməsin. Sizi Allaha and verirəm, aranızda elə bir adam varmı ki, həzrət onun haqqında belə buyursun: "Mən kimin mövlasıyamsa, Əli (ə) də onun mövlasıdır. Pərvərdigara, Əlini (ə) dost tutanı dost tut, Əliyə (ə) yardım edənə yardım et..." (Şuradakılar hamısı bir ağızdan dedilər: "Bu fəzilət səndən başqa kimsədə yoxdur."(۱

.Qeyd edək ki, imam yalnız bu məclisdə Qədir hədisini dəlil göstərməmişdir

Bir gün həzrət Əmirəl-möʼminin (ə) Kufədə çıxış edərkən üzünü cəmiyyətə tutub belə .۲ buyurdu: “Sizi Allaha and verirəm, Qədirdə olub öz qulağı ilə Peyğəmbərin məni canişin təʼyin etdiyini eşidən dursun və şəhadət versin. Mən başqalarından bu barədə eşidənləri yox, yalnız öz qulağı ilə eşidənləri deyirəm.” Həzrətin bu sözündən sonra .otuz nəfər ayağa qalxdı və Qədir hədisinin doğruluğuna şəhadət verdi

Diqqət yetirmək lazımdır ki, həmin vaxt Qədir hadisəsindən iyirmi beş ildən çox ötmüşdü. Bundan əlavə, bir çox Peyğəmbər səhabələri Kufədə deyildilər. Kimi o vaxtadək dünyasını dəyişmişdi, kimi də həmin məclisdə hansısa səbəbdən şəhadət vermək .istəmədi. Yoxsa şəhadət verənlərin sayı daha artıq olardı

Mərhum Əllamə Əmini öz nəfis “Əl-qədir” kitabında uyğun hədis haqqında ətraflı (məʼlumat vermişdir. Maraqlananlar həmin kitaba müraciət edə bilərlər.۱)

Osmanın xəlifəliyi dövründə mühacirlərdən və ənsardan olan iki yüz nəfərdən çox .۳ şəxs Peyğəmbər məscidində toplanıb müxtəlif mövzularda söhbət edirdilər. Nəhayət, Qüreyşin fəzilətləri haqqında söhbət düşür. Bu məclisdə iştirak edən Əmirəl-möʼminin (ə) danışanları dinləyir və susurdu. Nəhayət, məclisdəkilər ona üz tutub bir söz deməsini istədilər. İmam xalqın israrı ilə qalxdı və Peyğəmbər (s) ailəsinə yaxınlığı haqqında danışaraq dedi: “Yadınızdadırmı ki, Qədir günü Allah öz Peyğəmbərinə əmr etdi ki, namaz, zəkat, həcc mərasimini aşkar etdiyi kimi mənim xalqa rəhbərliyimi də iqrar etsin? Bu işi yerinə yetirmək üçün Peyğəmbər belə bir xütbə oxudu: “Allah mənə bir iş tapşırmışdır. Mən bəʼzilərinin bu ilahi göstərişi təkzib edəcəyindən qorxuram. Amma Allah əmr etmişdir ki, bu tapşırığı çatdırım və məni xalqın şərindən qoruyacağını vəʼd etmişdir. Ey xalq! Allah mənim mövlam və mən möʼminlərin mövlasıyam. Mən möʼminlərə onların özlərindən yaxın deyiləmmi?” Hamı dedi: “Bəli.” Sonra Peyğəmbər buyurdu: “Əli (ə), qalx. Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır...” Bu vaxt Səlman həzrət Peyğəmbərdən soruşdu: “Əlinin bizim üzərimizdə hansı vilayəti var?” Həzrət buyurdu: “Əlinin (ə) sizin üzərinizdə vilayəti mənim sizin üzərinizdə vilayətim kimidir. Mən hər kəsin ”...mövlasıyamsa, Əli də onun mövlasıdır

Uyğun hədisi təkcə həzrət Əli (ə) dəlil göstərməmişdir. Bir gün Peyğəmbərin girami qızı .۴ üzünü Peyğəmbər tərəfdarlarına tutaraq buyurdu: “Məgər

Peyğəmbərin Əliyə “Mən kimin mövlasıyamsa, Əli də onun mövlasıdır” dediyi Qədir ”?gününü unutmusunuz

İmam Həsən (ə) Müaviyə ilə sülh bağlamaq qərarına gəldiyi vaxt ayağa qalxdı və belə bir xütbə oxudu: “Allah Peyğəmbər Əhli-beytini İslam vasitəsi ilə girami tutdu. Bizi seçdi və hər növ çirkinlikdən bizi pak etdi. Hamı Peyğəmbərin Əliyə “sən mənim üçün Harun Musa üçün olduğu kimisən” dediyini eşitmişdir. Hamı gördü və eşitdi ki, Peyğəmbər Qədire-xumda Əlinin əlini tutub xalqa müraciətlə buyurdu: “Mən kimin mövlasıyamsa, Əli ”...də onun mövlasıdır

İmam Hüseyn (ə) Məkkədə bir çox Peyğəmbər səhabələrinin qatıldığı cəmiyyət içərisində belə buyurdu: “Sizi Allaha and verirəm, Qədire-xumda Peyğəmbərin Əlini ”.xəlifə və canişin seçdiyini bilirsinizmi?” Oradakılar dedilər: “Bəli, buna şəhadət veririk

Bundan əlavə, Peyğəmbərin yaxın səhabələrindən olan Əmmar Yasir, Zeyd ibn Ərqəm, Əbdullah ibn Cə’fər, Əsbəğ ibn Nəbatə və başqaları uyğun hədisi həzrət Əlinin (ə) .canişinliyinə dəlil olaraq göstərmişlər

## Dördüncü hİssə. QİyamƏt və ölümdən sonrakı həyat

### ?Allah öz bəndələrİnİ nə üçün cəzalandırır .١

?Sual: Mütləq ehtiyacsız olan Allah nə üçün günahkarları cəhənnəmdə oda çəkir

Cavab: ١. Bir çox ayə və rəvayətlərin bildirdiyi kimi, qiyamət gününün mükafat və cəzaları insanların dünyadakı əməllərinin nəticəsidir. İnsan öz əməllərinin cəzasını .çəkməyə borcludur

Yaşadığımız dünyada əməllərimizin təbii və zəruri sonluğu var. Məsələn, narkotik maddələrə aludə olmuş bir şəxs təbii olaraq ağrı-acıya, xəstəliklərə məhkumdur. Bir müddət spirtli içkilərə aludə olmuş insanın ömrünün qalan hissəsini xəstəliklər içində keçirməsi qaçılmaz bir sonluqdur. Amma elə əməllər də var ki, onların nəticəsi qiyamət günü ortaya çıxır. Özü öz aqibətini tə’yin edən insanın düşdüyü vəziyyətə görə e’tiraz etməyə haqqı yoxdur. Həyatını düzgün proqramla yaşayan insan öz

xoşbəxtliyini tə’min edir. Bizim dünyadakı əməllərimizin Allaha bir tə’siri olmadığı kimi, bu .əməllər qiyamətdə də Allaha tə’sirsizdir

Qiyamət günü insana verilən mükafat və cəza ilahi göstərişlərin icrasından asılıdır. .٢ Axirət mühakiməsinin böyük tərbiyəvi əhəmiyyəti var. Allah öz qəti və’dləri ilə bəndələrini yaxşılığa də’vət edir, onları pis işdən çəkindirir. Bu və’dlər qəti olduğu üçün həvəsləndirici və çəkindirici rol oynayır. Əgər bu və’dlər dəyişkən olsaydı, öz tərbiyəvi əhəmiyyətini itirərdi. Həmin vəziyyətdə ağır vəzifələri öhdəyə götürmək əhəmiyyətsiz olardı. Bəli, ilahi mükafatlar və cəzalar o zaman səmərə verib ki, sabit və dəyişməz .olsun. Allah öz və’dinə əməl etməmək sifətindən uzaqdır

### ?Bütün qövmlər üçün qİyamət günü eynİ gündür .٢

Sual: Bəşər tarixinin əsrlərlə yaşa malik olduğunu bilirik? Yer üzündə bir çox mədəniyyətlər gəlib-getmişdir. Qiyamət günü bütün millətlər üçün eyni bir gündür, ?yoxsa hər bir millət üçün ayrıca bir qiyamət günü var

Cavab: Qur’ani-kərimdəki bə’zi ayələr şəhadət verir ki, bütün qövmlər üçün “yəvmul-qiyamə” adlı bir qiyamət günü var. Nümunə üçün bə’zi ayələri nəzərdən keçirək: “Göylərdə və yerdə olan bütün məxluqlardan elə biri yoxdur ki, Rəhmanın hüzuruna qul kimi gəlməsin; And olsun ki, Allah onları hesablamış və təkrar-təkrar saymışdır; Onların hamısı qiyamət günü Onun hüzuruna tək-tənha gələcəklər.”(١)Digər bir ayədə belə buyurulur: “O gün biz müttəqiləri Rəhmanın hüzuruna möhtərəm elçilər kimi cəm edərik; (Günahkarları isə cəhənnəmə susuz vəziyyətdə sürükləyib gətirərik.”(٢

### ?Qİyamətdə bİxəbərlərİn vəzİyyətİ necə olacaq .٣

Sual: Avropa, Afrika, Amerika və dünyanın digər nöqtələrində dünyaya göz açıb, ata-babasının dinindən başqa bir din görməyən, kənar mühitlərdən bixəbər olanların ?qiyamətdə vəziyyəti necə olacaq

Cavab: Əgər bu şəxslər həqiqi dini müəyyənləşdirmək üçün imkanlara malik olduqları təqdirdə axtarış aparmamışsa, üzürlü sayılmayacaqdır. Yox əgər həqiqi dini müəyyənləşdirmək üçün heç bir imkanları olmamışsa, Allah hüzurunda üzürlüdürlər. Belə insanları aləmlərin Rəbbi cəzalandırmayacaq. Amma bütün bəşəriyyət dərk etdiyi

bilir ki, Allah var, ədalət yaxşıdır, zülм pisdir, fəsad və azğınlıq alçaqlıqdır. Deмək, insan başa düşdüklərinə əмəl etмəlidir. Belə insanlar Qur’anda “мüstəz’əf” adı ilə yad olunur. Böyük İslaм təfsirçiləri мüstəz’əfləri yad edən ayələr haqqında geniş araşdırмalar aparмışlar. İмaмlardan nəql olunмuş rəvayətlərdə мaraqlı nöqtələr bəyan olunur. Uyğun мövzuda daha artıq мə’luмat əldə etмək üçün aşağıdakı мənbələrə мüraciət (edin.(١

### ?Əllİ мİn İllİk gün ola bİlərмİ .۴

?Sual: Deyirlər ki, qiyaмət günü əlli мin il davaм edəcək. Bir gün əlli мin il ola bilərмi

Cavab: Unutмaмalıyıq ki, gecə-gündüz, ilin uzunluğu biziм planetdəkindən fərqli də ola bilər. Əgər bir sutka biziм planetdə ٢۴ saatdırsa, başqa planetlərdə bu rəqəм fərqli də ola bilər. Məsələn, günəşə ən yaxın olan planet Merkuridə bir il biziм səksən səkkiz sutkaмıza bərabərdir. Yə’ni həмin planet səksən səkkiz gün ərzində günəş ətrafında bir dövrə vurur. Günəş sisteмinin səkkizinci planeti olon Neptunda bir il təqribən biziм yüz altмış dörd iliмizə bərabərdir. Günəş sisteмinin ən uzaq planeti olan Plutonda bir il biziм iki yüz qırx doqquz iliмizə bərabərdir. Hələ biziм öz planetiмizdə şiмal və cənub qütblərində gecə və gündüzün uzunluğu başqa yerdəkindən fərqlənir. Orada altı ay gecə, altı ay gündüz olur. Ayda isə həм gecə, həм də gündüz təqribən biziм on beş gün .uzunluqda çəkir

Ona görə də təəccüb etмəyə dəyмəz ki, qiyaмət günü biziм əlli iliмizə bərabər olacaq. Çünki qiyaмət günü Qur’an ayələrindən мə’luм olduğu kiмi, varlıq aləмindəki vəziyyət dəyişəcək və günəş sisteмi əvvəlki nizaмını itirəcəkdir. Deмək, həмin gün bu günki gündən taмaмilə fərqlənəsidir. Qur’ani-kəriмdə bu мəsələyə belə işarə olunur: “(Qiyaмət günü) elə bir gündür ki, yer başqa bir yerlə, göylər də başqa göylərlə əvəz (olunacaq…”(٢

### ?Məad cİsмanİdİr, yoxsa ruhanİ .۵

Sual: Nə üçün fəqihlər мəad və мe’racın ruhani olduğunu rədd edirlər? Axı bə’zi qədiм ?filosoflar мəadın ruhani olacağını qeyd etмiş və dəlillər də gətirмişlər

۱- [۷۰]"Biharül-ənvar", c. ۷۲, s.۱۵۷; "Təfsirəl-мizan", c. ۵, s. ۴۵-۶۱.

۲- [۷۱]"İbrahiм", ۴۸.

Cavab: Şübhəsiz ki, ruhani məadı inkar edənlər onu təkcə cismani bilmirlər. Onlar məadın həm cismani, həm də ruhani olması fikrindədirlər. Yə’ni qiyamətdə həm ruh, həm də cism yenidən qaytarılasıdır. İnsan həm cismən, həm də ruhən dirilir və əməllərinin mükafatını, ya da cəzasını görür. Bu məsələ müasir dövr filosofları tərəfindən də bir həqiqət kimi qəbul olunmuşdur. Qur’ani-məciddə də məadın cismani olduğunu bildirən ayələr vardır. Bu məsələ əqidə kitablarında geniş şəkildə bəyan olunmuşdur. Bu məsələ “Yasin” surəsinin son ayəsində də təsdiqlənir. “Hər şeyin hökmü, ixtiyarı əlində olan ”.Allah pak və müqəddəsdir. Siz də Onun hüzuruna qaytarılacaqsınız

Onu da qeyd etməliyik ki, cismani me’rac atmosfer qatları haqqındakı yanlış bir nəzəriyyəyə əsasən inkar edilirdi. Bir zaman alimlər düşünürdülər ki, atmosfer qatının deşilməsi mümkünsüzdür və bu qatı heç vəchlə keçmək olmaz. Amma sonralar bu .nəzəriyyə inkar olundu və təcrübədə sübuta yetdi ki, atmosfer qatı keçilməz deyil

**?Elmİ kəşf və İxtİra müəllİflərİ qİyamət günü mükafatlandırılacaqmı .۶**

Sual: Nəzərə alsaq ki, Edissonun elektriki, Qalileyin teleskopu ixtira etməsi bəşəriyyət üçün xidmətdir, qiyamət günü onlar bu xidmətlərinə görə mükafatlandırılacaqlarmı? Yoxsa bu alimlər müsəlman olmadıqları, son dinə iman gətirmədikləri üçün əliboş ?qalacaqlar

Cavab: Bu mövzuda İslamın məntiqini açıqlamazdan qabaq, uyğun mövzu ilə bağlı bə’zi :baxışlara nəzər salaq

Bə’ziləri təsəvvür edirlər ki, cəmiyyət üçün faydalı olan bütün əməllər Allah qarşısında .۱ dəyərləndiriləcək. Onların nəzərincə, cəmiyyətə xidmət baxımından müsəlmanlarla qeyri-müsəlmanlar arasında heç bir fərq yoxdur. Allah ədalətli olduğu üçün bəndələrinin xidməti arasında fərq qoymur. Onlar deyirlər ki, Allaha imanın, son Peyğəmbərə e’tiqadın yaxşı əmələ heç bir dəxli yoxdur. Bir iş cəmiyyətə xeyirlidirsə, onun mükafatı var. Bu işi görənin müsəlman və ya qeyri-müsəlman olması əhəmiyyətli .deyil

Başqa bir qrupun fikrincə, iman gətirməmiş insanın əməlləri puçdur və bu əməllər üçün .٢ mükafat nəzərdə tutulmur. Onlar belə düşünürlər ki, düzgün əqidədə olmayan insanın .yaxşı əməlləri puç olasıdır

Əslində isə bir-biri ilə ziddiyyət təşkil edən bu iki baxışın hər ikisi yanlışdır. Üçüncü bir baxış daha məntiqli görünür. Üçüncü baxışa əsasən bütün yaxşı işlərin iki yönümü var: .١. İnsanın özünə aid olan fərdi mənafe; ٢. Bütün bəşəriyyətə aid olan ictimai mənafe

Əgər alim və ixtiraçı üzücü zəhmətlərə dözüb, yenilik yaradarkən, məqsədi bu olarsa ki, şan-şöhrət qazansın və ya öz kəşfindən böyük gəlir götürsün, onun qiyamətdə heç bir mükafatı yoxdur. Çünki bu insanların məqsədi Allah və cəmiyyəti razı salmaq olmamışdır. Onlar yalnız şan-şöhrət və var-dövlət haqqında düşünmüş, gecə-gündüz tər axıdaraq, bu yolda çalışmışlar. Yox əgər alimin məqsədi bəşəriyyətə xidmət göstərmək, onlara xeyir vermək olmuşsa, onun Allah qarşısında mükafatı vardır. Allah adildir və bütün .yaxşı işləri mükafatlandırır

İslami hədislərdə oxuyuruq ki, heç bir səmavi dinə inanmamış, bütpərəst olmuş Hatəm Tai məhrumlara daim əl tutduğu üçün qiyamət günü münasib bir mükafat alacaqdır.(١)Demək, alimin mükafatlandırılmasında onun niyyəti mühüm rol oynayır. Əgər o öz şəxsi mənafelərinə görə çalışmısa, qiyamətdə heç bir mükafatı yoxdur. Əgər alimi üzücü zəhmətlərə vadar edən, bəşəriyyətə xeyir vermək amalıdırsa, onun Allah dərgahında mükafatı var. Elə alimlər var ki, bəşəriyyətə qarşı təhlükəli silah hazırlamaq üçün onlara yaxşı pul verilsə, əvvəlki işlərini buraxıb uyğun cinayətə qatılarlar. Elə alimlərin Allahdan əvəz istəməyə haqqı yoxdur. Hətta pis niyyətlərinə görə onların cəzası daha da şiddətli ola bilər. Amma bə'zi insanlar bəşəriyyətin xoşbəxtliyi xatirinə öz maddi mənafeyindən keçir. Şübhəsiz ki, cəmiyyətə xidmət üçün üzücü zəhmətlərə .qatlaşan insanlar öz zəhmətlərinin mükafatını alasıdır



---

.Səfinətul-bihar", c. ١, s. ۶٠٧"[٧٢] -١

## ?Dİnİ hökmlərİn fəlsəfəsİ haqqında sual verməyə haqqımız varmı .١

Sual: Biz ilahi hökmlərin nə üçünlüyü barədə sual verə bilərikmi? Əgər belə bir haqqımız ?varsa, bu haqq qeyri-məhduddurmu

Cavab: İslam hökmlərinin, qanunlarının, göstərişlərinin fəlsəfəsi mövzusu çox aktual bir mövzudur. Bizim kitabımızdakı sual-cavabların da böyük bir hissəsi həmin mövzu ilə .bağlıdır

Belə bir sual yarana bilər ki, nə üçün namaz qılmalıyıq, Allah evinin ziyarətinə getməliyik, sələmçilik haramdır, donuz əti yemək olmaz, qızıl-gümüş qablardan istifadə ?edilməməlidir

Bu mövzu haqqında "İslam məktəbi" jurnalında ətraflı şəkildə danışılmışdır. Həmin jurnalda bir neçə tanınmış alim çox faydalı və maraqlı mövzularla çıxış etmişlər. Onların hər biri məsələnin bir tərəfini işıqlandırmışdır. Bə'zi alimlərin fikrincə, biz dini hökmlərin fəlsəfəsini araşdırmamalıyıq. Digər bir qurup alim isə belə düşünür ki, İslam hökmlərinin .fəlsəfəsini dərk etmək zəruridir

Biz də bu kitabda öz fikrimizi bildirmək istədik. Bizim fikrimizcə, təəccüblü də görünsə, hər iki qrup alimin mövqeyi düzgündür. Bizim dini məsələlərin fəlsəfəsi haqqında sual verməyə həm haqqımız var, həm də yoxdur. Hər iki baxış tərəfdarlarının gətirdiyi dəlillər .müəyyən sferada qəbul oluna bilər

İzah: İslami mətnlərin, Qur'an və hədislərin mütaliəsindən mə'lum olur ki, Peyğəmbər səhabələri arasında bu mövzuda söhbətlər olmuşdur. Çünki İslam elmlərinin mənimsənilməsi üsulu dəlillərə istinad edən məntiqi bir üsuldur. Ona görə də Peyğəmbər .səhabələri dini hökmlər haqqında sual verməyi öz hüquqları bilmişlər

İslamda Allah-təala belə tanıtdırılır: O elm və qüdrət baxımından nəhayətsiz, hər şeydən ehtiyacsız və bütün işləri hikmət üzərində qurulmuş Allahdır. Onun işində bihudəliyə yer yoxdur. Peyğəmbərləri bəşəriyyətin tə'lim-tərbiyəsi, haqq və ədalətə də'vət üçün .göndərmişdir

Allahın bu sayaq tanıtdırılması bizi xoşbəxtliyimizlə bağlı məsələlərin fəlsəfəsi haqqında maraqlanmağa təşviq edir. Əgər düşünsək ki, Qur'an yalnız üsul (e'tiqad əsasları) məsələlərində dəlillərə istinad edir və əməli hökmlərdə dəlillərdən vaz keçir, bu səhv olar. Görürük ki, Qur'an qisas haqqında hökmünü bəyan etdikdən sonra belə buyurur: "Olsun ki, bu yolla pis əməllərdən çəkinəsiniz." Beləcə, uyğun hökmün fəlsəfəsi insanların günahdan çəkinməsi kimi zikr olunur. Yə'ni uyğun hökmə riayət edilməsi səbəbindən insanlar öz azğın nəfslərini cilovlaya bilərlər.(۱)Qur'anda səfərdə olanlar və xəstələrin oruc tutmaması hökmü verildikdən sonra bunun fəlsəfəsi belə açıqlanır: "Allah sizin üçün ağırlıq deyil, yüngüllük istər..."(۲)

Qumar və şərabın qadağan olunması haqqında belə buyurulur: "Şübhəsiz ki, şeytan içki və qumarla aranızda ədavət və kin salmaq, sizi Allahı yada salmaqdan və namaz qılmaqdan ayırmaq istər..."(۳)Uyğun ayədə aşkar şəkildə şərab və qumarın nə üçün qadağan edildiyi bildirilir. Göz günahı haqqında isə belə buyurulur: "Mö'min kişilərə de ki, gözlərini haram edilmiş şeylərdən çevirsinlər... Bu onlar üçün daha yaxşıdır..."(۴)Başqa bir ayədə müşriklər haqqında buyurulur: "Müşriklər napakdırlar. Bu ildən Məscidül-harama yaxınlaşmasınlar."(۵)Qənimətin bölgü fəlsəfəsi isə belə açıqlanır: "Allahın öz Peyğəmbərinə məmləkət əhalisindən verdiyi qənimət qohum-əqrəbaya, yetimlərə, yoxsullara və müsafirlərə məxsusdur. Bu ona görədir ki, içərinizdəki zənginlər arasında əldən-ələ düşən bir sərvət olmasın."(۶)

Peyğəmbər və mə'sum imamlardan nəql olunmuş rəvayətlərdə də birbaşa və ya xalqın sorğusundan sonra bir çox hökmlərin fəlsəfəsi açıqlanır. Böyük mühəddis mərhum şeyx Səduqun "İləlüş-şəraye" kitabında dini hökmlərin fəlsəfəsini açıqlayan mə'lumatlar verilir.

Bəli, Qur'ani-məciddə və mə'sumların buyuruqlarında dini hökmlərin açıqlanması göstərir ki, bizim bu barədə soruşmaq haqqımız var. Əgər bu sayaq mə'lumatlar olmasaydı, uyğun mövzuda araşdırmalardan çəkinmək lazım gələrdi.

Deyilənlərdən belə bir nəticə alınır ki, dini məsələlərlə bağlı dəlillərin araşdırması İslami bir üsuldur. Peyğəmbər səhabələrinin bu məsələ ilə bağlı rəftarları belə bir haqqa malik olduğumuzu bir daha təsdiqləyir. Dini məsələlərin fəlsəfəsinin açıqlanmasının bu

.Məsələlərin əhəmiyyətini azaltması fikri yanlışdır



---

.Bəqərə”, ۱۷۹“[۷۳] -۱

.Bəqərə”, ۱۸۵“[۷۴] -۲

.Maidə, ۹۱[۷۵] -۳

.Nur”, ۳۰“[۷۶] -۴

.Tövbə”, ۲“[۷۷] -۵

.Həşr ۷[۷۸] -۶

Əksinə, məsələlərin mahiyyəti açıqlandıqda insan anlayır ki, bu hökmlər onun ehtiyaclarını tə'min etmək üçündür. Dini hökmlərə itaəti öz xoşbəxtlik səbəbi bilən insan .onları həvəslə yerinə yetirir

Eləcə də, zaman keçdikcə mə'lumatlarımız nə qədər artsa, yenə də məhduddur. Əgər insan bütün mövcud bilikləri əxz edə bilsəydi, artıq elm yolunda dayanmaq lazım gələrdi. .Demək, insan üçün həmişə məchul və qaranlıq nöqtələr mövcuddur

Bəşəriyyətin bildikləri onun bilmədikləri ilə müqayisədə çox cüz'idir. Bəşəriyyətin bilmədikləri arasında elə məchullar var ki, əgər səmadan bir müəllim enmiş olsa da, insan həmin məchulların həqiqətini dərk edə bilməz. Məsələn, bugünki insanın bildiyi bir çox mə'lumatları min il qabaqkı insan dərk edə bilməzdi. Onu da bilməliyik ki, səmavi hökmlər və göstərişlər Allah-təalanın sonsuz elmindən qaynaqlanır. Varlıq aləmindəki bütün həqiqətlər Allah üçün aşkardır. O gələcəkdən, qeybdən xəbərdardır. Bütün bu nöqtələri nəzərə alaraq, qəbul etməliyik ki, fəlsəfəsini anlaya bilməyəcəyimiz hökmlər də var. Əgər insan hər şeyi anlamaq gücündə olsaydı, Peyğəmbərlərə ehtiyac qalmazdı. İnsan səma bilikləri olmadan həyat yolundakı maneələri adlaya bilmir. Məgər biz varlıq aləmindəki sirləri, bütün mövcudların yaranış fəlsəfəsini bilirikmi? Şər'i hökmlər də varlıq aləmindəki həqiqətlərin bir hissəsidir. Deyilənlərdən belə bir nəticə alırıq ki, insan öz dövrünün bilikləri həddində ilahi hökmlərin fəlsəfəsini dərk edə bilər. İstisnasız olaraq, bütün ilahi hökmlərin fəlsəfəsini anlamaq istəyi sadəlövhlükdür. İnsan yalnız öz elmi .həddində açıqlamaları dərk edə bilir

Yuxarıda deyilənlərdən bəlli olur ki, insanın yalnız fəlsəfəsini bildiyi hökmlərə itaət etməsi düzgün deyil. İnsan belə bir münasibəti ilə sonsuz elmə malik olduğunu iddia etmiş olur. Dini hökmlər bəşəriyyətin səadəti üçündür. Onların fəlsəfəsini bilib-bilməməyinizdən asılı olmayaraq, öz xoşbəxtliyiniz naminə həmin hökmlərə əməl etməlisiniz. Bu gün bütün bəşəriyyət elektrik enerjisindən istifadə edir. Amma çox az adamlar elektrikin nə olduğunu anlayır. Elektrikin nə olduğunu bilmirik deyə, onun .faydalarından imtina etməyimiz axmaqlıq olardı

Bir sözlə, dini hökmlərin fəlsəfəsini bilmək bir məsələdir, həmin hökmlərə itaət etmək başqa bir məsələ. Bir işin fəlsəfəsini bilməmək həmin işə arxa çevirmək üçün dəlil ola .bilməz

Biz ilahi hökmlərin fəlsəfəsi haqqında araşdırmalar aparırıq ki, onların əhəmiyyətini daha çox dərk edək. Məqsəd bu olmamalıdır ki, onların faydalı olub-olmadığını .müəyyənləşdirək

Bir misal çəkək: Həkimin yazdığı nüsxədəki dərmanların faydası haqqında ona görə soruşulur ki, bu barədə daha çox mə'lumat toplayaq. Həkimin verdiyi cavablar bizi qane etmədikdə və ya həmin cavabları dərk etmədiyimiz təqdirdə dərmanların qəbulundan .imtina etmək olmaz. Əgər xəstə hər şeyi dərk edə bilsəydi, o özü həkim olardı

Demək, dini hökmlərin fəlsəfəsini öyrənməkdə məqsəd onların faydalı olub-olmadığını bilmək yox, daha çox mə'lumat toplamaqdır. Hər bir dini hökmə tələsik izah verməyə ehtiyac yoxdur. Namazın idman hərəkətləri, orucun arıqlama vasitəsi kimi təqdim olunması kökündən yanlış bir işdir. Rüku və səcdənin yalnız fəqərə sütununa və sinir sisteminə faydalı olduğunu iddia etmək əsassızdır. Bu sayaq qondarma izah nəinki .insanları dini hökmlərin icrasına təşviq etmir, hətta onların dəyərini aşağı salır

**?Hökmlərİn fəlsəfəsİ necə araşdırılmalıdır .۲**

Cavab: Qur'an məntiqi və mə'sumların buyuruqlarından aydın olur ki, hər bir müsəlman dini hökmlərin fəlsəfəsi ilə maraqlana bilər. Bu barədə düşünmək, suallar vermək qadağan olunmamışdır. Amma bu o demək deyil ki, hər kəs dini hökmlərin fəlsəfəsini öz bildiyi kimi izah etsin. Bu sayaq yanlış izahlar səbəbindən uyğun mövzudakı ?araşdırmalar zərərli də ola bilər. Bəs bu araşdırmalar hansı proqramla aparılmalıdır

Əvvəlcə qeyd etməliyik ki, dini göstərişlərə əməl edib-etməməyimizin Allah üçün heç bir fərqi yoxdur. Əmirəlmöminin Əli (ə) buyurur: "Günahkarlar ona (Allaha) ziyan vurmaz, itaət edənlər isə fayda verməz." Allah-təala varlığın sonsuz dəryasıdır. Yaranmışların nəyi varsa, Ondandır. Allahın bir şeydən ehtiyacı yoxdur ki, biz o ehtiyacı ödəyək. Əldə etdiyimiz hər bir nemətin əsil xəzinəsi Onun əlindədir. Allah hər bir bəndəyə məsləhət bildiyi qədər əta edir. Qurani-kərimdə oxuyuruq: "Elə bir şey yoxdur ki, onun xəzinələri

bizdə olмasın. Lakin biz ondan ancaq мüəyyən qədər nazil

edərik.”Özünüz düşünün, günəşin qabağında qoyulmuş ayna onun işığını artıra bilərmi? İnsan nə qədər qüdrətli olsa da, həmin ayna kimidir. Onun nəyi varsa, Allahdandır. Dini hökmlərə əməl edən hər bir insan özü üçün çalışır. Digər bir tərəfdən, insan təkcə cism deyil ki, ilahi hökmlər bu cismi təkamülə çatdıra. İnsan təkcə ruh da deyil ki, yalnız onun mənəvi inkişafı nəzərdə tutula. İnsan cism və ruhun məcmusudur və asimani göstərişlər bu məcmunun təkamülünə xidmət edir. Ona görə də dini göstərişlərdə yalnız dünyəvi faydalar axtaranlar, namazı idman, orucu pəhriz, duanı ruhi təskinlik sayanlar yanılırlar. Pak libas geyməyin, dırnağı tutmağın, hörümçək torunu təmizləməyin sınıq kuzədən su içməməyin müstəhəb olması kimi hökmlər təkcə fizioloji və psixoloji faydalarla izah olunmamalıdır. Etiraf edək ki, bu gün bəşəriyyətin malik olduğu elm bütün gerçəkliklərin fəlsəfəsini izah etmək gücündə deyil. Dini göstərişlərin bir hissəsi insanın əxlaqı, bir hissəsi onun mənəviyyatı, bir hissəsi onun imanı, bir hissəsi onun maddi həyatı, bir .hissəsi isə ümumi təkamülü üçün faydalıdır

İndi isə dini hökmlərin fəlsəfəsinin araşdırılma şəraiti ilə tanış olaq. Qeyd edək ki, dini :qanunlar və hökmlər dörd qrupa bölünə bilər

Həzrəti Peyğəmbərin be’səti günündən fəlsəfəsi mə’lum olan hökmlər: həmin vaxt .١ insanlar öz düşüncə və mə’lumatları səviyyəsində uyğun məsələləri dərk edirdilər. Amma xalqın bu göstərişlərə ümumi şəkildə əməl etməsi üçün həmin göstərişlər qanun şəklinə salındı. Məsələn: yalanın, xəyanətin, böhtanın, qətlin, oğurluğun, zülmün, əskik satmağın, saxtakarlığın qadağan edilməsi bu qəbildəndir. Eyni məqsədlə insanlara ədalətə riayət, paklıq, düzlük, məzluma yardım, çalışma, ata-anaya yaxşılıq, qohum-əqrəba ilə yaxınlıq əmr olunmuşdur. Bu hökmlərin fəlsəfəsi insanlara ona görə .açıqlanılırdı ki, onlar bu əmrlərin faydasını daha çox dərk etsinlər

Fəlsəfəsi bir çox insanlara, bə’zən isə dövrün alimlərinə aydın olmayan hökmlər: .٢ Qur’anda və mə’sumların buyuruqlarında bu sayaq hökmlərin fəlsəfəsinə işarə olunmuşdur. Olsun ki, o dövrün insanları orucun üç əsas faydasından mə’lumatsız olduğu üçün Qur’anda bu faydalar sadalanır. Müxtəlif ayələrdə orucun əxlaqi, ictimai və tibbi faydaları önə çəkilir. Bir rəvayətdə imam Sadiq (ə) orucun ictimai əhəmiyyətini önə çəkərək buyurur: “(Oruc ona görə əmr olunub ki) varlılar yoxsulların halından xəbər tutsun və onların

köməyinə gəlsin.” Başqa bir rəvayətdə həzrət Peyğəmbər (s) buyurur: “(Oruc ona ”.görədir ki) cisminiz sağlam olsun

Bir çox başqa ayə və hədislərdə də dini hökmlərin fəlsəfəsi açıqlanır. Əvvəldə qeyd etdiyimiz kimi bu sayaq izahlar “İləlüş-şəraye” kitabında toplanmışdır. Mühəddis mərhum şeyx Hürr Amili “Vəsailuş-şiə” kitabında hər fəslin başlanğıcında dini hökmlərin fəlsəfəsi haqqında mə’lumat vermişdir. Bir nöqtəyə də diqqət yetirmək lazımdır ki, dini hökmlərin fəlsəfəsi hər dövrdə insanların düşüncə səviyyəsinə uyğun şəkildə açıqlanmışdır. .Əslində həmin hökmlərin fəlsəfəsi daha genişdir

Zaman ötdükcə, bəşəriyyətin mə’lumatı artdıqca dini hökmlərin fəlsəfəsi daha dərin .٣ şəkildə aydınlaşdırılır. Məsələn, spirtli içkilərin fizioloji, psixoloji, ictimai zərərləri, hətta onların genlərə tə’siri bugünki insan üçün tam aydındır. Bu gün bəşəriyyətin əlində spirtli içkilərin zərərini sübuta yetirən statistik rəqəmlər var. Əsrimizdə kazinoların timsalında qumarın, xalqı üzüntülü günə salan sələmçiliyin zərərləri kimsədə şübhə doğurmur. Bugünki insan uyğun mövzularla bağlı keçmişdəki insandan daha çox .mə’lumatlıdır

Amma bir mövzuya da diqqət yetirilməsi çox zəruridir. İfratçılıq, vaxtsız və yanlış mühakimələr, tələskənlik, yanlış baxışlar, ən əsası elmi əsası olmayan fərziyyələr bizi həqiqətdən daha da uzaqlaşdırır. Əsassız izahlar səbəbindən ilahi hökmlərin fəlsəfəsi ilə tanışlıq əvəzinə təhlükəli azğınlığa düçar oluruq. Ona görə də elmi əsası olmayan .istənilən mülahizə ilahi hökmlərin fəlsəfəsi kimi qəbul olunmamalıdır

Əgər bir hökmün fəlsəfəsi haqqında əsaslı dəlillərimiz yoxdursa, “bilmirəm” demək daha faydalıdır. Hətta bir hökmün düzgün fəlsəfəsini əldə etmişiksə, unutmamalıyıq ki, bizim .əldə etdiyimizdən də ətraflı və əsaslı izahatlar mövcuddur

İlkin İslam dövründə fəlsəfəsi açıqlanmamış və sonrakı islami mətnlərdə də izahı .۴ verilməmiş hökmlər: Bəli, elə ilahi hökmlər var ki, bu gün də onun fəlsəfəsi haqqında mə’lumatsızıq. Məsələn, namazın rə’kətlərinin sayı, ayrı-ayrı şeylər üçün zəkat ölçüləri (nisab), bə’zi həcc əməlləri bu qəbildəndir. Görən gələcəkdə elmi inkişaf yolu ilə bu məsələlərin sirri açılacaqmı? Həzrət Mehdi (ə) hökmlərin fəlsəfəsindən mə’lumat ?verəcəkmi

Mümkündürmü ki, gələcəkdə də inkişaf etmiş elm qaranlıq nöqtələrin üzərindən pərdəni qaldıra bilməsin? Bu suallara qəti cavab verə bilmərik. Bildiyimiz budur ki, fəlsəfəsini bilmədiyimiz dördüncü qrup dini hökmlərə də əvvəlki kimi ehtiram göstərib, əməl etmək lazımdır. Çünki bütün hökmlər eyni bir mənbədən gəlmişdir və onu gətirən şəxs möhkəm .dəlillərə malik olmuşdur

**?Nə üçün dİnİ hökmlərdə təqlİd etmək vacİbdİr .۳**

Cavab: İnsan dünyaya göz açdığı vaxt heç nə bilmir. Və müxtəlif işlərdə başqalarının təcrübəsindən istifadə etməyə məcbur olur. İnsan öz istəyindən asılı olmayaraq, başqalarının elmi nəaliyyətindən bəhrələnir. Çünki həyatın dolambaclı yollarını adlamaq .üçün hər addımda elm və biliyə ehtiyac var

Həyatımız əsasən iki əsas üzərində qərar tutmuşdur. Əsasların biri bilmək, digəri isə həmin bilikdən istifadə etməkdir. İkinci əsas da birinci əsasa ehtiyaclıdır. Demək, .həyatda ilk addım bilikdən başlayır

Məhz bu məqamda daxilimizdəki bir meyl bizim köməyimizə çatır və səadət qapılarını bizim üzümüzə açır. Bu meyl iqtibas və təqliddir. Bilirik ki, körpə həmin bu meyllər əsasında danışmağa başlayır, oturub-durmağı öyrənir, hər gün mərhələ-mərhələ həyat pillələri ilə yuxarı qalxır. O, yaşa dolduqca başqalarının biliklərinə daha diqqətli olur, .varlıq aləmindəki mövcudlardan xəbər tutur və öz insanlıq vəzifələrini anlayır

Amma burada əsas bir nöqtəyə diqqət yetirmək lazım gəlir. Bütün işlərdə başqalarına :təqlid etmək düzgün deyil. Təqlidin bir neçə növü var

:(Cahilin cahilə təqlidi (bilməyənin bilməyənə təqlidi .١

Mə’lum məsələdir ki, bu növ təqlid insanı nəinki xoşbəxt etmir, hətta onu süquta uğradır. Təəssüf ki, bizim cəmiyyətimizdə bir çox insanlar kor-koranə şəkildə müxtəlif məsələlərdə başqalarına təqlid edirlər. Onlar müxtəlif həyat məsələlərində, eləcə də, geyim, yemək, ad qoyma və digər işlərdə başqalarını yamsılamağa çalışırlar. Bə’zən insanlar heç bir əsas olmadan iman və əxlaq baxımından da başqalarına təqlid edirlər. :Məhz həmin bu cür təqlid haqqında məşhur bir şe’rdə deyilir

.Min bir lə’nət olsun belə təqlidə

Qur’ani-kərimdə də bu növ təqlidi məzəmmət edən ayələr nazil olmuşdur. Məsələn, bütpərəstlər həzrət Peyğəmbərin (s) e’tirazları müqabilində deyirdilər: “Biz atalarımızı bir dində gördük və onların yolu ilə gedəcəyik.”(١) Qur’an belə bir məntiqi şiddətlə .məzəmmət etmişdir

Alimin cahilə təqlidi: Şübhəsiz ki, belə bir təqlid əvvəlki təqliddən də pisdir. Çünki alim .٢ öz elm və biliyi əsasında hərəkət etməlidir. Elm və biliyə sahib bir insanın öz elmindən .faydalanmayıb, kor-koranə nadan bir şəxsə təqlid etməsi ən çirkin təqliddir

Alimin alimə təqlidi: Alim mütəxəssis və nəzər sahibi olduğu sahədə öz həmkarına .٣ təqlid etməməlidir. Və öz elmi biliklərinə əsaslanaraq vəzifəsini müəyyənləşdirməlidir. Fəqihlər buyururlar ki, ictihad mərhələsinə çatmış şəxs öz ictihadına əməl etməlidir. Bu cəhətdən də ictihad icazəsində adətən yazılır: “Bu şəxsin təqlid etməsi haramdır.” İctihada çatmış şəxs öz nəzərinə əsasən əməl etməlidir. Əlbəttə ki, elmi məsələlərdə başqa alimlərlə məsləhətləşməyin eybi yoxdur. Nəzərdə tutulan budur ki, alim qərar .çıxararkən araşdırma aparmamış başqalarının nəzərinə təslim olmamalıdır

Cahilin alimə təqlidi: Belə bir təqlid ağıl və fitrətin tələbidir. Həmin bu məntiqə əsasən, .٤ biz bina tikmək üçün me’mara, bənnaya müraciət edirik. Libas tikdirərkən dərziyə, xəstələnərkən həkimə müraciət edilməsi təbii bir işdir. Biz sözlə, ağıl və fitrət bizi .mütəxəssis ardınca göndərir

Elə bu məntiqlə də dini tə’limlərdə, ilahi qanunlarda hökmləri ayırd etməkdə mütəxəssis olan fəqihlərə müraciət olunması tapşırılır. Fəqihlər öz iste’dadları ilə illər uzunu elm və bilik sorağınca gəzmiş və uca ictihad məqamına çatmışlar. Müctəhid ilkin qanunu ilahi mənbədən çıxarıb, sübuta yetirən və xalqa təqdim edən alimdir. Bu uca mənsəb fəqihlərə mə’sumlar tərəfindən əta olunmuşdur. Məqsəd insanların səadət yoluna .istiqamətləndirilməsidir

Belə bir nöqtəni nəzərdən qaçırmaq olmaz ki, dünyəvi elmlərin müxtəlif sahələri var. Bir şəxs müəyyən elm sahəsində fövqəl’adə iste’dada malik olduğu halda, digər bir sahədən tamamilə xəbərsiz qala bilər. Ona görə də o bilmədiyi sahədə mütəxəssisə

Məsələn, böyük məharət sahibi olan bir alim tanımadığı bir şəhərdə lazım olan ünvanı tapmaq üçün şəhəri tanıyan adamlardan həmin ünvan haqqında soruşmağa məcburdur. Məsələn, astronomiya sahəsində böyük kəşfləri olan alim xəstələndiyi vaxt onun həkimə müraciət etməsi zəruridir. Bu şəxs astronomiyanı gözəl bilsə də, xəstəliklər və xəstəliklərin müalicəsi ilə tanış deyil. Həkim öz elminə əsaslanaraq astronomun xəstəliyini müəyyənləşdirir və onun üçün nüsxə yazır. Astronom heç bir sorğu-suala .tutmadan onun dediklərinə əməl edir

Bu iki misaldan aydın olur ki, dini məsələlərdə xalqın müctəhidə müraciət etməsi zəruridir. Həkim tibbdə mütəxəssisdirsə, müctəhid də ilahiyyatda mütəxəssisdir. Müctəhid bir ömür sərf edərək, sərf, nəhv, lüğət, kəlam, məntiq, təfsir, rical, dirayə, .hədis, fiqh üsulu elmlərini oxumuşdur

Bizim tez-tez müraciət etdiyimiz risalə fəqihin bir ömür zəhmətinin məhsuludur. Həmin risalələr alimlərin üzücü zəhmətləri hesabına başa gəlmişdir. İctihad asan iş deyil. İctihad dedikdə fərdi və ictimai həyatımızı əhatə edən ilahi qanunlar külliyatının .öyrənilməsi nəzərdə tutulur

İslam məktəbinin fəxri olan ali məqamlı müctəhid Şeyx Mürtəza Ənsari “Rəsail” kitabında yazır: “Allah bizə ictihad tovfiqi versin. Elə bir ictihad ki, daimi cihaddan ağır və rəhmətli ”.olsun

Bunu da qeyd etməliyik ki, müctəhidin göstərişlərinə e’tiqadi yox, təkcə əməli məsələlərdə təqlid olunmalıdır. Başqa sözlə, təqlid fürue-dinə aiddir, usule-dinə yox! Allahı və Peyğəmbərləri tanımaq kimi üsul mə’sələləri İslam məktəbinin əsasını təşkil edir. Bu məsələləri möhkəm dəlillər əsasında qəbul etmək zəruridir. E’tiqad məsələləri ilə elm və agahlıq yolu ilə tanış olan insan əməli hökmlərdə bu sahədə mütəxəssis olan .müctəhidlərə müraciət etməlidir

Namazın, həccin, əmr be mə’rufun və nəhy əz munkərin və bir sıra digər əməli hökmlərin vacibliyini insan özü dərk etməlidir. Yə’ni müctəhiddən öyrənilən namazın vacibliyi yox, namazın necəliyidir. İnsan əvvəlcə öz ağıl və düşüncəsi ilə namazın vacibliyini dərk etməli, sonra isə namazı necə yerinə yetirmək barədə müctəhiddən mə’lumat almalıdır. .Bir sözlə, təqlid yalnız əməli hökmlərə aiddir

## ?Allaha nə üçün İbadət edİlməlİdİr? Namazın, orucun, və həccİn fəlsəfəsİ nədİr .۴

Sual: Allah ehtiyacsız olduğu halda, ona nə üçün ibadət etməliyik? Allahın bizim ?ibadətimizə ehtiyaclı olması Onun uca məqamı ilə bir araya sığırmı

.Cavab: Bu suala iki şəkildə – icmali və təfsili şəkildə cavab vermək olar

İcmali cavab: Əgər düşünsək ki, Allah bizim ibadətimizə ehtiyaclıdır, onda belə bir sual yaranır ki, məhdud olmayan Allah məhdud varlığa necə möhtac ola bilər? Yə'ni Allahın insanın ibadətinə möhtac olmaması aşkar bir məsələdir. Bilməliyik ki, Allaha pərəstişdə məqsəd insanın özünün kamala çatmasıdır. Yə'ni ibadəti əmr etməsi Onun bizə qarşı lütfü, mərhəməti kimi başa düşülməlidir. Allah öz bəndəsini ibadət vasitəsi ilə kamala .çatdırmaq istəyir

Təfsili Cavab: Allahın razılığı üçün yerinə yetirilən hər bir əməl, eləcə də, ibadət bir sıra fərdi və ictimai tə'sirlərə malikdir. İbadət çox ali tərbiyəvi və əxlaqi bir məktəbdir. Onun :bə'zi tə'sirlərini nəzərdən keçirək

Allaha pərəstiş və ona ibadət insanda qədirbilmə, şükretmə hisslərini dirçəldir. . ۱ İnsanın ixtiyarında misilsiz ne'mətlər qoymuş varlığın qarşısında təşəkkür, ləyaqət nişanəsidir. İnsan öz ibadəti ilə ona əta olunmuş ne'mətlərə layiq olduğunu bildirir. .İnsan Allaha həmd oxuyub, təşəkkür edərək nankor olmadığını aşkarlayır

İbadət və Allaha pərəstiş insan ruhunun təkamülünün əsasıdır. İnsan ruhunu Allahın .۲ mütləq kamal dünyası ilə əlaqələndirən təkamüldən üstün təkamül ola bilərmi? İnsan öz bəndəlik vəzifələrinin, həyati işlərinin icrasında Allahın sonsuz qüdrətindən yardım .diləyir və öz ləyaqəti həddində mə'budu ilə danışır

İxtisar şəkildə bəyan edilən bu xüsusiyyətlər düzgün yerinə yetirilən bütün ibadətlərə xasdır. Həm də namaz, oruc, həcc kimi ibadətlərin özünəməxsus məziyyətləri vardır. İslamda böyük ibadətlərdən sayılan namaz, oruc və həcc haqqında müxtəsər şəkildə .danışaq ki, Allahın bu ibadətlərə ehtiyacsız olduğu mə'lum olsun

:Namaz və onun tərbiyəvi əsrarı

Namaz Allahın xatırlanması səbəbidir: Allahın xatırlanması, zikri insanın öz meyllərini .۱
.nəzarətə alması və ruhun tüğyanını cilovlaması üçün ən yaxşı vasitədir

Namaz qılan şəxs daim bütün işlərimizdən xəbərdar, düşüncələrimizdən agah olan Allahı yad edir. Allah zikri ən azı insanın arzu-istəklərini tənzimləyir. Çünki Allahdan, onun .mükafat və cəzasından qəflətdə olan insanın ağıl və düşüncəsi zülmətə qərq olur

Allahdan qafil insan öz əməl və rəftarlarının nəticəsi haqqında düşünmür, öz azğın istəklərini həyata keçirmək üçün hədd tanımır. Gün uzunu insana beş dəfə Allahı .xatırladan, onu qəflət yuxusundan ayıldıb təmizləyən namazdır

Qur’ani-kərimdə bu məsələyə belə işarə olunur: “Namaz insanı günah və çirkin işlərdən (uzaqlaşdırar.”(۱

Namaz qılan şəxs bilsə ki, qıldığı namaz qə’bul olunması üçün zəkat ödəməlidir, qeybət etməməlidir, təkəbbür və həsəddən çəkinməlidir, spirtli içkilər içməməlidir, Allaha diqqətlə namaz qılmalıdır, bütün bu şərtləri ödəməyə çalışar. Ona görə də həzrət Peyğəmbər (s) buyurur: “Namaz saf su arxı kimidir. İnsan bu arxda yuyunur. Gün uzunu beş dəfə namaz qılan şəxsin qəlbi bu pak mə’nəvi çeşmədə yuyulur, onun qəlbində və ”.ruhunda günah tozu qalmır

Təmizlik: Bə’zi məqamlarda bütün bədəni yumaqla qüsl verməli olan, gündə beş dəfə .۳ dəstəmaz alan, qüsl və dəstəmazdan qabaq bütün bədənini paklayan insan, şübhəsiz .ki, təmiz olacaq. Bu baxımdan namaz təmizliyi tə’min edir

Dəqiqlik və vaxtşünaslıq: İslamda hər bir namazın özünəməxsus vaxtı var. İnsan .۴ namaz vaxtlarına riayət etməklə dəqiqliyə, vaxta diqqətli olur. Namaz qılan şəxs sübh namazını qılmaq üçün tüludan qabaq yuxudan oyanmalıdır. O, sübhün pak havasını .duymaqla yanaşı, gündəlik həyat fəaliyyətlərinə də vaxtında başlayır

Namazın tərbiyəvi əhəmiyyəti təkcə yuxarıda deyilənlərdən ibarət deyil. Biz sadəcə bu .böyük ibadətin bə’zi faydalarını sadaladıq

:Namazın ictimai əhəmiyyəti

Müəyyən vaxtlarda qılınan namaz əzəmətli İslam ümmətinin vəhdət nümayişidir. Çünki bütün müsəlmanlar müəyyən vaxtlarda üzüqibləyə dayanır və xüsusi bir ədəblə Allaha pərəstiş edirlər. Belə bir təzahür müsəlman ümmətin birliyinə bariz nümunədir. İslam dini

.ibadət vasitəsi ilə öz ardıcıllarını birləşdirir

Naмaz cəмiyyət halında qılındıqda vəhdət, bərabərlik ruhu dəqiq və sıx cərgələrdə özünü göstərir. Uyğun birliyin əhəмiyyətini izah etмəyə ehtiyac yoxdur. Əlbəttə ki, .naмazın başqa ictiмai və tərbiyəvi əhəмiyyətləri vardır



---

.Ənkəbut", ۴۵"[۸۱] -۱

:Orucun bə’zi əhəмiyyətləri

İslaмi ibadətlərdən biri də orucdur. Orucun tərbiyəvi əhəмiyyətlərindən biri insana .adət və şəhvətin hakiмliyinə son qoyulмasıdır. Oruc insanı nəfsin əsarətindən qurtarır

İnsan üçün ən təhlükəli hakiмiyyət pis adət və azğın nəfsin hakiмiyyətidir. Adicə siqaretə adətin insana nə qədər zərərli olduğu inkarolunмazdır. Aмма oruc tutan insan .bir çox başqa pis adətlərdən də əl çəkir

Azad o kəsdir ki, heç bir pis adətə təsliм olмasın. Oruc insanda elə bir мüqaviмət ruhu .yaradır ki, o adi vaxtlarda мüмkünsüz saydığı adətləri tərk edir

Bundan əlavə, oruc insanlıq hisslərini canlandırır. Adətən, il boyu rəngbərəng süfrələr arxasında oturan varlı insanlar gün uzunu aclıq çəkən yoxsullardan xəbərsiz olurlar. Aмма onlar oruc tutduqda gün uzunu ac qalмaqla yoxsulları yada salır, onların dərdinə şərik olurlar. Nəticədə varlı adaмların insani hissləri canlanır və yoxsul təbəqənin ehtiyaclarının tə’мini üçün şərait yaranır. Varlı təbəqənin belə bir ibadət vasitəsi ilə aclığı dadıb, ehtiyaclıların halına yanмası cəмiyyət üçün təhlükəli olan yoxsulluq qəzəbini sakitləşdirir. Raмazan ayının orucu bərabərlik və birlik təzahürüdür. Çünki bu ayda cəмiyyətin bütün təbəqələri nəfs istəkləri ilə мübarizəyə qalxaraq, bir cərgədə .dayanırlar

:Həccin fəlsəfəsi

İslaмın böyük ibadətlərindən biri də həccdir. Həcc ilin мüəyyən günündə tarixi bir мəkanda cəм forмada yerinə yetirilən ibadətdir. Bu ibadət bəndə ilə Allah arasında мöhkəм bağlılıq yaratмaqla yanaşı, cəмiyyət üçün də bir çox faydalara мalikdir. :Məsələn

Yalnız iki hissə parçaya bürünмəklə libassız v azad şəkildə yerinə yetirilən bu ibadət .١ bəndələrin Allah qarşısında bərabərlik nişanəsidir. Bir gün insanların мillət, dil, rəng, sərvət və мəqaмdan asılı olмayaraq bərabər şəkildə yaşaмası bəşəriyyətin ən böyük aмalıdır. Həcc мərasiмində мüqəddəs мəkana toplaşanlar bir neçə günlük də olsa bu hissi yaşayırlar; həcc ibadəti bəşəriyyətin birlik aмalını gerçəkləşdirir və həмin

.мərasiмdə olanlar öz ictiмai iмtiyazlarını unudurlar

Dünya мüsəlмanlarının həqiqi nüмayəndələrindən təşkil olunмuş bu əzəмətli topluм .۲ .мüsəlмanların illik konqresi hesab olunur

İslaм ayinləri təkcə əxlaqi və tərbiyəvi qanunlardan ibarət deyil. Müsəlмan topluмlarının il boyu мütəмadi şəkildə toplanıb, öz əxlaqi, ictiмai, siyasi, iqtisadi, hərbi probleмlərini мüzakirə etмələrinə ehtiyac var. Ona görə də İslaмda siyasi qanunlar tənziмlənмi; Məkkə torpağında illik konqres təşkil olunмuşdur və bu yolla İslaм ayinlərinin əbədiyyət və paklığı tə’мin olunмuşdur. Təbii ki, ilahi dəyərlərin keşiyində durмuş konqres dünyəvi, siyasi мəqsədlərlə təşkil olunмuş мüxtəlif konqreslərdən .çox-çox üstündür

Əgər dünyada мövcud olan siyasi cərəyanlar yalnız son əsrlərdə öz konqreslərini keçirмək qərarına gəlмişlərsə, İslaм on dörd əsrdir ki, belə bir toplantıdan faydalanır. Bu мərasiмə toplanмış мüsəlмan мütəfəkkirləri dünyada мövcud olan son ictiмai-siyasi duruмu araşdırır və üмuмi bir qərara gələrək, fəaliyət istiqaмətlərini мüəyyənləşdirirlər. Əgər мüxtəlif səbəblərdən bugünki həcc мərasiмində dünya мüsəlмanlarının probleмləri istənilən səviyyədə həll olunмursa da, həcc мərasiмi dünya мüsəlмanlarına belə bir iмkan verмişdir. Hər halda мüsəlмan rəhbərlərinin bir araya .gəlмəsi üçün bundan мünasib bir fürsət təsəvvür olunмur

Bu konqres мüsəlмanların iqtisadi və мədəni duruмuna əhəмiyyətli tə’sir göstərə bilər. Çünki dünyanın мüxtəlif ölkələrindən gəlмiş мütəfəkkirlər və nəzər sahibləri həcc əмəllərini yerinə yetirdikdən sonra araм bir мühitdə мüzakirələr aparıb, üмuмi bir fikirə .gələ bilərlər

Həcc konqresi мüxtəlif мüsəlмan ölkələrində zülм-sitəм zəncirlərinin qırılмası üçün azadlıq hərəkatlarına ilhaм verə bilər. İslaм tarixinə nəzər saldıqda bu nöqtə daha da aydın olur. Bir çox zülм-sitəм rejiмlərinin taleyi мəhz həcc əyyaмında həll olunмuşdur. .Bu мüqəddəs torpaq мüsəlмanların azadlıq hissini gücləndirir

Bəli, həcc мərasiмinin belə iмkanları var. Təəssüf ki, dünya мüsəlмanları onun .əhəмiyyətini hələ ki lazıмınca dərk etмəмişlər

Yuxarıda deyilənlərdən belə bir nəticə alınır ki, bütün islaмi ibadətlərin ibadət edən .şəxsə və cəмiyyətə мüstəsna faydaları vardır

## ?Nə üçün ə’ləm (daha alİm) müctəhİdə təqlİd olunmalıdır .۵

Sual: Risalələrdə qeyd olunur ki, müsəlmanların ə’ləm müctəhidə təqlid etməsi vacibdir. ?Bu hökmün əsası nədir

Cavab: Ə’ləm müctəhidə təqlid mövzusu fəqihlər arasında məşhur mövzulardandır. Bu :hökmlə bağlı bir sıra dəlillər göstərilmişdir. Onlardan birini nəzərdən keçirək

Təqlidin, cahilin alimə müraciətinin əsasını dünyada mövcud olan bir prinsip təşkil edir: İstisnasız olaraq, bütün cəmiyyətlərdə insanlar ehtiyac duyduqları məsələdə mütəxəssisə müraciət edirlər. Xəstələr həkimə, ev tikmək istəyənlər mühəndisə üz tuturlar. İki müxtəlif həkim eyni bir xəstəyə fərqli diaqnoz qoyursa, xəstə təbii olaraq daha təcrübəli və mahir həkimin diaqnozunu əsas götürəcəkdir. Hər hansı bir sahədə həmkarlarından təcrübəli, mahir, elmli olan mütəxəssis ə’ləm hesab olunur. Mütəxəssisin .ə’ləminə müraciət edilməsi dünyada qəbul olunmuş məntiqi bir üsuldur

Biz ə’ləmə təqlidin bir dəlilini göstərdik. Başqa dəlillər də var. Sadəcə, biz bir dəlillə .kifayətlənirik

## ?Nə üçün namaz ərəb dİlİndə qılınmalıdır .۶

Sual: Axı nə üçün hamı namazı ərəb dilində qılmalıdır? Məgər hərə öz dilində namaz qılsa, ?İslam dini daha sür’ətlə yayılmazmı

Cavab: Əslində namazın ərəb dilində qılınması onun ümumbəşəri olması əlamətidir. Çünki bir cərgədə dayanmış, bir cəbhədə fəaliyyət göstərən cəmiyyət eyni bir dildə danışmağa məcburdur. Hər bir insanın ana dilindən əlavə ümumdünyəvi bir dilə də .ehtiyacı var. Belə bir dil olmadan cəmiyyətdə kamil birliyi tə’min etmək mümkünsüzdür

Bu gün dünyanın bir çox mütəfəkkirləri belə bir əqidədədirlər ki, dünya vahid dövlət halına gələnədək bəşəriyyət həqiqi xoşbəxtliyə çatası deyil. Bu məqsədlə müxtəlif .proqramlar hazırlanmışdır. Həmin proqramın bir maddəsi də beynəlmiləl dildir

Bir sözlə, bütün dünya müsəlmanlarının vahid bir dildə ibadət etməsi birlik nişanəsidir. Mütəxəssislərin fikrincə, ərəb dili dünyanın ən geniş və imkanlı dillərindəndir. Bütün müsəlmanlar ərəb dilindən beynəlmiləl bir dil kimi istifadə etməklə islami birliyi tə’min edə .bilərlər

Bundan əlavə, namazın vahid bir dildə qılınması onu təhriflərdən, xürafatdan qoruyur. Mə’lum məsələdir ki, müxtəlif səviyyəli tərcümələr ilkin mətni dəqiq şəkildə ifadə edə bilmir. Namazın ərəb dilində qılınması ilə onun ruhu qorunur. Ona görə də hər bir müsəlman imkan daxilində ərəb dilini öyrənməlidir. İstənilən bir millətin nümayəndəsi .namazın bir səhifəlik tərcüməsini qısa bir zamanda öyrənə bilər

Bir sözlə, İslamın bütün e’tiqadi və əməli məsələlərinin əsasını tövhid təşkil edir. Namaz vahid qibləyə doğru, müəyyən vaxtda, vahid bir dildə qılınır. Bütün bunlar vəhdət .nişanəsidir

Əgər həcc mərasimi zamanı Məkkədə olsaq, ayrı-ayrı millətlərin bir cərgədə duraraq eyni bir dildə “Əllahu Əkbər” sədasını eşitsək, bu vəhdətin əzəmətini duyarıq. Əgər həmin mərasimdə eyni bir cümləni hərə öz dilində deyərdisə, uyğun əzəmətdən əsər-.əlamət qalmazdı

### ?Namazda nə üçün üzü qİbləyə durmalıyıq .۷

Sual: Əgər Allah hər yerdədirsə və məkana sığmırsa, nə üçün namazda üzümüzü qibləyə ?tutmalıyıq

Cavab: Namazın üzüqibləyə qılınması o demək deyil ki, Allahın qiblə istiqamətində məkanı var. Qur’anda qiblə məsələsi ilə bağlı buyurulur: “Şərq də, qərb də Allahındır. Hansı tərəfə üz tutsanız, Allah oradadır...”[۱] Digər bir ayədə isə belə buyurulur: “Şərq də, qərb də Allahındır.”[۲] Unutmamalıyıq ki, insan maddi bir varlıq olduğundan üzünü hansısa bir istiqamətə tutmağa məcburdur. Əgər qiblə göstərişi olmasaydı, təbii ki, ibadət zamanı hərə üzünü bir tərəfə tutacaqdı. Amma İslamda bu məsələ yetərincə həll olunmuşdur. Kə’bə evi ən qədim tövhid mərkəzidir. Bu ev tövhid qəhrəmanı həzrət İbrahim tərəfindən bərpa edilmiş və bütün Peyğəmbərlərin diqqət mərkəzində olmuşdur. Bu tövhid mərkəzinə diqqət Allaha diqqətdir. Belə bir mərkəzə üz tutmuş

Bundan əlavə, dünya müsəlmanlarının gün ərzində beş dəfə bu müqəddəs mərkəzə üz tutması vəhdət, birlik nişanəsidir. Vahid qiblə İslami birliyə yardım göstərir və dünya .müsəlmanları eyni bir cəhətə üz tutmaqla İslamın əzəmətini nümayişə qoyurlar

### ?Nə üçün beş vaxtın namazını üç vaxtda qılırıq .۸

Sual: Nə üçün zöhr və əsr, eləcə də məğrib və işa namazları fasilə verilmədən ardıcıl ?qılınır? Məgər mə’sum rəhbərlər bu namazları beş vaxtda qılmamışlarmı

Cavab: Hər bir namazı öz fəzilətli vaxtında qılmaq həzrət Peyğəmbər (s) və digər mə’sum imamlara məxsus xüsusiyyətdir. Onlar adətən beş namazı beş vaxtda qılmışlar. Söhbət ondan gedir ki, namazlar arasında fasilə qoymaq vacibdir, yoxsa müstəhəb? Sünni .alimləri bu fikirdədirlər ki, namazlar arasında fasilə qoyulması vacibdir

?Namazların ardıcıl qılınmasına əsas varmı

Şiə fəqihləri bu məsələdə İmam Sadiqdən (ə) nəql olunmuş hədisləri əsas götürürlər. (Mərhum şeyx Hürr Amili öz hədis kitabında uyğun rəvayətləri nəql etmişdir.(۱



---

”.Bax: “Vəsailüş-şiə, kitabe-səlat, babe-vəqte-namaz[۸۴] -۱

Onu da qeyd edək ki, uyğun hədisləri təkcə şiə alimləri nəql etməmişdir. Sünni mənbələrində də uyğun mövzu ilə bağlı hədislər nəql olunmuşdur. Onlardan bir neçəsini :nəzərdən keçirək

Tanınmış sünni alimi Əhməd Hənbəl öz kitabında İbn Əbbasdan belə nəql etmişdir: .١ "Həzrət Peyğəmbər heç bir üzür olmadan zöhr və əsr, məğrib və işa namazlarını bir (yerdə qıldı.."(١

Həmin alim Cabir ibn Zeyd vasitəsi ilə İnb Əbbasdan belə nəql edir: "Mən həzrət .٢ Peyğəmbərlə səkkiz rək'ət zöhr və əsr, yeddi rək'ət məğrib və işa namazlarını bir yerdə ".qılmışam

Əbdüllah Şəqiqdən belə nəql olunur: "Bir gün İbn-Əbbas xalq üçün xütbə oxuyurdu. .٣ Onun söhbəti o qədər uzandı ki, səmada ulduzlar göründü. Bəni-Təmim qəbiləsindən olan bir kişi qalxdı və e'tirazını bildirdi ki, məğrib namazının vaxtı ötür. İbn Əbbas ona dedi: "Mən Peyğəmbərin sünnəsi ilə daha yaxından tanışam. Görmüşəm ki, Peyğəmbər zöhr və əsr, məğrib və işa namazlarını bir yerdə qıldı." Rəvayətçi deyir ki, mən bu məsələdə şübhəyə düşdüm və əhvalatı Əbu Hüreyrəyə dedim. O, İbn Əbbasın (dediklərini təsdiqlədi."(٢

Mötəbər sünni mənbələrindən hesab olunan "Səhihe-Müslim"də uyğun mövzuda İbn .۴ Əbbasdan üç, Məaz ibn Cəbəldən bir rəvayət nəql olunmuşdur. Hər dörd hədisdə eyni fikirlər ifadə olunur. Adətən, bu əlavə olunur ki, uyğun məsələ ilə bağlı sual verildikdə belə bir cavab aldı: "Həzrət öz ümmətinin əziyyətə düşməsini istəmirdi."(٣) Deyilənlər şiə rəvayətlərində də mövcuddur və İmam Sadiqdən (ə) nəql olunmuş rəvayətdə həmin .nöqtə də qeyd olunmuşdur

Uyğun məsələni təkcə İbn Əbbas və Məaz ibn Cəbəl nəql etməmişdir. Təbərani, .۵ Əbdullah ibn Məs'uddan belə nəql edir ki, həzrət Peyğəmbər öz ümmətinin əziyyətə düşməməsi üçün zöhr və əsr, məğrib və işa namazlarının ardıcıl qılınmasına icazə (vermişdir.(۴

Eyni mətn Əbdüllah ibn Ömər tərəfindən də nəql olunmuşdur. O deyir: "Peyğəmbər (müsafir olmadığı halda iki namazı ardıcıl qıldı ki, ümməti məşəqqətə düşməsin."(۵

---

.Müsnəd”, c. ۱, s. ۲۲۱“[۸۵] -۱

.Müsnəd”, c. ۱, s. ۲۵۱“[۸۶] -۲

.Səhih-Müslüм”, c, ۲,s. ۱۵۱“[۸۷] -۳

.Şərhe-Məvta Zərqani,” s. ۲۶۳“[۸۸] -۴

.Kənzül-ə`мal, s. ۲۴۲[۸۹] -۵

Sünni mənbələrindən göstərdiyimiz nümunələr bir daha təsdiq edir ki, namazların fəzilətli vaxtda qılınması müstəhəb bir işdir. İnsan şəraitdən asılı olaraq namazlarını həm .fəzilətli vaxt, həm də ardıcıl qıla bilər

Bu gün dünyanın bir çox məntəqələrində həmin müstəhəb əmrə itaət edilməsi insanlar üçün məşəqqət yaradır. Namazın beş vaxtda qılınmasından əziyyət çəkənlər bu ibadətdən uzaqlaşa da bilər. Belə məqamlarda insanları məşəqqətdən qurtarmaq üçün namazın bir yerdə qılınması mümkün sayılmışdır. Bu gün əksər sünni alimləri namazların .ardıcıl qılınmasını mümkün saysalar da, öz fikirlərini bildirməkdən çəkinirlər

### ?Namaz İnsanı günahdan necə uzaqlaşdırır .۹

Sual: Qur'ani-məcid nəzərincə, namazın tə'sirlərindən biri insanı pis işlərdən uzaqlaşdırmasıdır. Qur'anda oxuyuruq: "Namazı bərpa et ki, namaz (insanı) günahdan və çirkin işlərdən uzaqlaşdırır."(۱)Amma həyatda görürük ki, bir çox namaz qılanlar günah və pis işlərini davam etdirirlər, namaz onların rəftarına tə'sir etmir. Bəs nə üçün ?ayədə belə buyurulmuşdur

Cavab: Bilməliyik ki, insanı pis işlərdən çəkindirən əsas amil iman və Allahın xatırlanmasıdır. Allahdan xəbərsiz insan əməl və rəftarlarının nəticəsi haqqında .düşünmür. O, nəfs istəklərinin tə'minində heç bir hədd tanımır

Əksinə, bütün kiçik və böyük işlərimizdən agah olan Allahın xatırlanması insanı həddi aşmaqdan qoruyur. Nəfs istəklərinə nəzarət üçün təbii, tə'sirli və davamlı yol Allahın, .Allah övliyalarının, günahkarlara veriləcək cəzanın yada salınmasıdır

Qur'an ilahi insanları belə tanıtdırır: "O insanlar ki, nə ticarət, nə müamilə onları Allahın zikrindən, namaz qılmaqdan və zəkat verməkdən yayındırmır."(۲)Allahdan xəbərsizliyin .insan ağlını və vicdanın zülmətə qərq etməsi aşkar bir həqiqətdir

Əmirəl-mö'minin (ə) Allah zikrini çox əhəmiyyətli saymış və bu barədə buyurmuşdur: "Allah öz zikrini bəndələrin qəlbinə cila və işıq qərar

vermişdir ki, bu işıqda onların qulaqları eşitsin, gözləri görsün və düşmənçilik yerinə itaətkar olsunlar."(١)Həzrət Əli (ə) qəfləti qəlb üçün karlıq və korluq sayır. Bildirir ki, qəflət insanı haqq və həqiqətə qarşı qaldırır. Həm də Allah zikrinin insan qəlbi üçün cila və işıq olduğu bildirilir. Allah zikri azğın istəkləri cilovlayır, onu düşmənçilikdən .çəkindirir

Həzrətin bəyanına görə Allahdan xəbərsiz insan dəlisov ata minmiş kar və kor süvari kimidir. Atın onu yerə çırpacağı şübhə doğurmur. Ayıq və diqqətli qəlbi olanlar isə əməllərinin nəticəsini yaxından müşahidə edir, haqq sözü eşidir və azğın nəfsini Allah .zikri ilə cilovlayır

İmam Baqir (ə) dostlarından birinə sifariş edərək buyurur: "Daim Allahı xatırla. Çünki (Allah zikri insanla günah iş arasında pərdədir."(٢

Əsbəğ ibn Nəbatə Əmirəl-mö'mininin (ə) belə buyurduğunu nəql edir: "İki məqamda Allahı yadda saxla: bir müsibət zamanı, bir də günahla üzbəüz duranda. Günahla üzbəüz durarkən Allahı yada salmaq daha mühümdür. Çünki Allahın zikri insanla günah ".arasında pərdədir

Əlbəttə ki, Allaha diqqətin də dərəcələri var. Bə'zən bu diqqət elə bir dərəcəyə çatır ki, insanı istənilən günahdan qoruyur. Belə insanlar Allah zikri sayəsində aram və oyaq .qəlb, bəsirətli göz, eşidən qulaq, itaətkar nəfs əldə etmişlər

Əksər insanlarda Allaha diqqət, Onun zikri orta dərəcədədir. Məsələn, əksər insanlar bə'zi günahlara yol versələr də, heç vəchlə qan tökməyə razı olmurlar. Onlar kiçik günahları adi qarşıladıqları halda, yetimin malını yemir, başqasının namusuna təcavüz etmirlər. Onlar yaxşı bilirlər ki, bu günahların cəzası çox ağırdır. Orta diqqətli insanların .vicdanı günaha müqavimət göstərir

Bə'zən isə Allaha diqqət elə zəif olur ki, qarşıya çıxan güclü amil onu bir anda aradan qaldırır. Amma zəif imanı gücləndirmək olar və bir qədər əvvəl zəif olmuş, sonradan .güclənmiş iman insanı bir çox günahlardan uzaqlaşdıra bilər

Namaz Allahın zikri vasitəsidir. Namazın tə'sirlərindən biri insana Allahı xatırlatmasıdır.

tanıtdırılır və buyurulur: “Namazı mənim zikrim üçün bərpa et.”(١)Namaz ibadət .olduğundan və Allahın razılığı üçün yerinə yetirildiyindən, təbii ki, Allahı yada salasıdır

Bundan əlavə, namazın bütün mətni diqqəti Allaha yönəldir. Məsələn, namazda oxunan “həmd” surəsi Allaha sitayişi, onun sifətlərinin və fellərinin bəyanı, bəndələrin müxtəlif istəkləri haqqında danışır. Namazın digər zikrləri də belədir. Namaz insanın imanını və Allaha diqqətini gücləndirmək xüsusiyyətinə malikdir. Qeyd etdiyimiz kimi, bu diqqətin dərəcələri vardır. Bir çox günahlara batmaqdan çəkinməyən insanlar üçün Allah zikri .şərti olaraq mövcuddur

Başqa sözlə, Qur’an “namaz insanı günahdan və çirkin işlərdən çəkindirir” deyərkən hər namaz qılanın mə’sum olduğunu iddia etmir. Sadəcə, bildirir ki, namaz insanın diqqətini Allaha yönəldir və belə bir diqqətin nəticəsi günahların tərkidir. Amma belə də .ola bilər ki, Allaha diqqət zəif olduğundan hər hansı bir amil onu tə’sirsizləşdirsin

Bir sözlə, namaz həqiqi namaz olsa, insanı günahdan çəkindirər. Bə’zən onun tə’siri güclü, bə’zən isə zəif olur. Bu, günahların və namazda diqqətin dərəcəsindən asılıdır. .Namaz kamil olduqca onun tərbiyəvi tə’siri də böyük olur

Bundan əlavə, insanların qıldığı namaz onları bir çox günahlardan əməli olaraq uzaqlaşdırır və onları digər günahların da tərkinə hazırlayır. Çünki namaz qılan şəxs qıldığı namazın qəbul olması üçün bir çox günahlardan çəkinməyə razıdır. Məsələn, namazın qəbul olma şərtlərindən biri namaz libasının, namaz yerinin halal olmasıdır. Bu məsələ insanı tədricən bir çox günahlardan uzaqlaşdırır. Necə ola bilər ki, insan !?namazda halal-haramı gözləyə, başqa vaxtlarda yox

Deyilənlərə başqa bir sübut budur ki, namazı tərk edənlər oruc, həcc, zəkat xums kimi bir çox digər vacib işləri də tərk edirlər. Namaz qılmayan şəxsin halal-harama diqqətli olması zəif bir ehtimaldır. Amma bir şəxs yetərsiz də olsa namaz qılırsa, bu namaza görə bir çox günahları tərk edir. Namazı kamil şəkildə qılanlar isə bütün günahları tərk etməyə

çalışırlar.(١)Bir sözlə, namaz bütün namaz qılanlara tərbiyəvi tə’sir göstərir. Bu tə’sir zəif .də ola bilər, güclü də. Onun tə’siri namazda diqqətin dərəcəsindən asılıdır

### ?Ayət namazı nə üçündür .١٠

Sual: Nə üçün günəş və ay tutularkən, zəlzələ olarkən, güclü şimşək çaxarkən, tufan ?baş verərkən, ayət namazı qılınmalıdır

:Cavab: Sadalanan hallarda qılınan namazla bağlı iki xüsusi nöqtə var

Günəşin, ayın, bütün günəş sisteminin insanların nəzərində heyranedici bir nizamı .١ var. Günəş öz qızılı şəfəqləri ilə təbiətə həyat verir, ay öz dəqiq hərəkəti ilə zaman .ölçüsünü müəyyənləşdirir və gümüşü nuru ilə gecənin qaranlığını parçalayır

Qədim zamanlarda bu mühüm əlamətlər öz əzəməti ilə insanların zehnində iz qoymuş və onlar zahirən dünyaya hakimlik edən bu səma cisimlərinə pərəstiş etmişlər. Səma cisimlərinin əzəməti onlarda elə bir təsəvvür yaratmışdı ki, varlıq aləminə hakim olan .Allah günəşdir və ya aydır

Tövhid qəhrəmanı həzrət İbrahim (ə) səma cisimlərinin varlıq aləmindəki qanunlara tabe olduğunu önə çəkməklə həmin insanların əqidələrinə böyük bir zərbə vurdu. Həzrət İbrahim sübut etdi ki, şərqdən çıxıb qərbdə batan günəş və digər səma cisimləri varlıq .aləmini yaradanın qanunlarına tabedirlər

Səma cisimlərinin qürub etməsi onların məhdud bir varlıq olmasının ən böyük nişanəsidir. Onlar hətta varlıq aləmini işıqlandırmaqda da azad deyillər. Bütün bunlar onların .yaradılmış olduğunu göstərir

Günəş və ay tutulması da onların məxluq olmasının digər bir nişanəsidir. Uyğun hadisələrdən aydın olur ki, onlar öz işıqlarını yamaqda belə ixtiyar sahibi deyillər. Məsələn, ay günəşin qarşısını kəsərək, onu pərdə arxasında qoyur. Günəş və ay tutulması da onların yaradılmış

.olmasının aydın nişanələrindəndir. Onlar mütləq bir iradə qarşısında məhkumdurlar

Günəş və ay tutulması hadisəsi insanın qəlbində varlıq aləmini yaratmış Allaha iman doğurur. İnsan açıq-aşkar görür ki, günəş də, ay da böyük qüdrət sahibinə tabedirlər. Belə bir məqamda qəlbdə şölələnən imanı əməl meydanına çıxarıb, ayət namazı qılmaqla .batini əqidəmizi izhar etməliyik

Tövhid qəhrəmanı həzrət İbrahim günəşin batmasından müdrik bir nəticəyə gəldi və belə dedi: “Mən üzümü göyləri və yeri yaratmış kəsə tutmuşam. Mən öz imanımda ”.xalisəm və müşriklərdən deyiləm

Eləcə də, səmada yeni, qeyri-adi, qorxunc hallar yarandığı vaxt insanlar bə’zi xürafi .٢ işlər görməklə həmin hadisələrin tə’sirini azaltmağa çalışırdılar. İslam ayət namazını tə’yin etməklə insanları xürafatdan çəkindirdi və onların düşüncəsini bütün hadisələrin mənbəyinə yönəltdi. Ayət namazı həm də qorxunc hadisələr qarşısında insana rahatlıq .verir

### ?Nə üçün qadınlar namaz zamanı örtünməlİdİrlər .١١

Sual: Allah həm aşkardan, həm də gizlindən agah olduğu halda, nə üçün qadınlar namaz ?zamanı örtünməlidirlər

Cavab: Şübhəsiz ki, Allah-təala bütün hallarda hər şeydən xəbərdardır. O həm də öz bəndələrinə naməhrəm deyil. İbadətə dayanmış insan özünü Allah hüzurunda bilir. Onunla danışır, onunla raz-niyaz edir. Belə bir görüşdə ən münasib libası geymək lazımdır. Əlbəttə ki, qadın üçün ən münasib libas tam örtünməkdir. Qadının örtünməsi .iffət və paklıq nişanəsidir. İbadət halına yalnız belə bir libas uyğun gələ bilər

Namazda örtünmək təkcə qadınlara aid deyil. Kişilərin çılpaq bədənlə qıldığı namaz batildir. Çünki belə bir vəziyyət namazın ruhuna uyğun gəlir və Allah-təalaya qarşı hörmətsizlikdir. Daha yaxşı olar ki, kişilər vacib həddə örtünməkdən əlavə, kamil libasla namaz qılsınlar. Təkcə alt

paltarda namaz qılmaq yaxşı deyil. Yetərincə örtünüb namaz qılmaq Allah hüzuruna .ehtiram nişanəsidir

## ?Spİrtlİ İçkİlər nə üçün murdardır .۱۲

Sual: Nə üçün alimlər öz risalətlərində spirtli içkiləri murdar sayırlar? Anti-mikrob tə’sirə ?malik olan spirtli içkilər nə üçün murdar sayılmalıdır

Cavab: İslamda bir şeyin murdar sayılmasının səbəbləri var: Əvvəla, zatən pak olmayan şeylər müxtəlif xəstəliklər üçün mənbə olur. Məsələn, nəcis, qan, sidik bu baxımdan İslamda murdar sayılır. İkincisi, zahirən çirkin görünməyən və mə’nəvi baxımdan pak sayılmayan şeylər var. İslam, məsələn, kafirləri bu baxımında murdar sayır. Belə bir murdarlıq yuyunmaqla, təmizliyi qorumaqla aradan qalxmır. İslam həmin insanları murdar saymaqla müsəlmanları onlarla ünsiyyətdən çəkindirir. Çünki e’tiqadsız insanlarla ünsiyyət insanın ruhi paklığına zərbə vurur. Əgər murdar kafirlərlə ünsiyyətə icazə .verilsəydi, bir çox nadan insanlar onların tə’siri altına düşə bilərdi

Kafirlərlə ünsiyyət onların İslam cəmiyyətinə nüfuz etməsinə səbəb olur. Onlar bu yolla istismarçı planlarını həyata keçirirlər. Amma elmi və iqtisadi mübadilələr üçün məhdud ünsiyyətə icazə verilir. Üçüncüsü, fərdi və ictimai fəsadlar törətdiyi üçün murdar sayılan şeylərdir. Spirtli içkilər bu qəbildəndir. Spirtli içkilər anti-mikrob tə’sirə malik olsalar da, onların içilməsi bir çox fəsadlara gətirib çıxarır. İslam həmin fəsadların qarşısını almaq .üçün spirtli içkiləri murdar sayır

Şübhəsiz ki, hər bir müsəlman murdar sayılan şeydən uzaqlaşmağa çalışır. Aydındır ki, belə bir çəkinmə spirtli içkilərə aludəçiliyə ciddi tə’sir göstərir. Bu da spirtli içkilərlə bir .növ mübarizədir

## ?Bədənİn tərİ İlə sİdİk arasında nə fərq var .۱۳

Sual: Bədən təri və sidik hər ikisi artıq maddələr kimi bədəndən xaric olursa və hər ikisi ?oxşar kimyəvi tərkibə malikdirsə, nə üçün onlardan biri pak, o biri isə murdar sayılır

Cavab: Qeyd etməliyik ki, sidik və tərin kimyəvi tərkib baxımından həm oxşar, həm də fərqli cəhətləri vardır. Olsun ki, həmin bu fərqə görə onlardan biri pak, digəri murdar sayılmışdır. Sidiyin tərkibində olan bə'zi zəhərli maddələr tərin tərkibində yoxdur. Sidiyi tərdən fərqləndirən onun tərkibində iki zəhərli maddənin – boya maddəsinin və "hiporik" turşusunun olmasıdır. Bu iki maddə tərin tərkibində yoxdur. Sidiyin tərkibində sidik turşusunun miqdarı da tərin tərkibində olduğundan qat-qat çoxdur. Sidiyin tərkibi tərin tərkibindən təqribən on dəfə qatıdır. Bu isə mikrobların fəaliyyəti üçün çox .münasib şərait yaradır

Daha bir amil var. Nəzərə almalıyıq ki, tərdən qorunmaq olduqca çətindir. Sidikdən .qorunmaq isə insan üçün problem yaratmır

### ?Ölüyə verİlən qüslün və ölüyə toxunanın verdİyİ qüslün fəlsəfəsİ nədİr .۱۴

Sual: Ölünün və ölüyə toxunan şəxsin qüsl verməsi nə üçündür? Həyatını itirmiş canlının yuyulması nəyə lazımdır? Eləcə də, ölüyə toxunan şəxs təkcə əlini yusa kifayət ?etməzmi

Cavab: Əvvəldə qeyd etdiyimiz kimi, bə'zi dini hökmlərin fəlsəfəsi bizə aydın deyil. Amma .insan düşüncəsi və elm inkişaf etdikcə bir çox məsələlər aydınlaşa bilər

Verilmiş suala cavab olaraq deyə bilərik ki, bütün dünya xalqları canlı insanın hörmətini saxladığı kimi, ölüyə də ehtiramla yanaşırlar. İslam dini bir çox xürafi adət-ən'ənələri .inkar etsə də, qüsl, kəfən, dəfn kimi işləri ölüyə ehtiram göstərilməsini lazım bilir

İslam insana o qədər yüksək qiymət verir ki, hətta ölünün də təhqirini qadağan edir. Ölüyə, onun qəbrinə qarşı hörmətsizlik İslamda haram sayılır. Qüsl, kəfən və dəfn də .insanın məqamına hörmət xarakteri daşıyır

Bundan əlavə, ölüm insan üçün son deyil. Bu dünyaya gözünü qapayan insan başqa bir həyata qədəm qoyur. Ona görə də ölüləri pak vəziyyətdə, sadə libasla torpağa tapşırmaq göstərişi verilmişdir. Meyyit qüslünün fəlsəfəsini də əbədi və həqiqi həyata .inam təşkil edir

Bəs ölüyə toxunan şəxs nə üçün qüsl verməlidir? Bu suala cavab vermək üçün bəzi :nöqtələri aydınlaşdırmaq lazım gəlir

Dünyasını dəyişmiş şəxsin yaxınları öz əzizlərini əldən verdikləri üçün hiss və .١ həyəcan onları dərhal tərk etmir. Onlar hətta ruhu canından çıxmış əzizlərini öpmək, .qucaqlamaq istəyirlər

Aydın bir məsələdir ki, ruhu canından çıxmış orqanizm öz müdafiə qabiliyyətini itirir və .٢ .müxtəlif mikroblara asanlıqla yoluxur. Ölüyə toxunmaq gigiyenik baxımdan təhlükəlidir

İslam insanın təbii hisslərinə qarşı zor göstərmir, onları nəzərə alır və doğru yola .٣ .yönəldir

Yuxarıda deyilənləri nəzərə alaraq belə bir nəticə çıxara bilərik ki, İslam, dünyasını dəyişmiş şəxsin yaxınlarını müxtəlif xəstəliklərdən və mikroblara yoluxmaqdan qorumaq istəyir. İnsanların təbii hisslərinə hörmət göstərilərək, onlara ölü ilə təmas qadağan edilmir, sadəcə bu təmasdan yarana biləcək fəsadların qarşısını almaq üçün meyit qüslü vermək əmr olunur. Bəli, meyitə toxunan hər bir şəxs büsbütün bədənini yumalı, qüsl verməlidir. Şübhəsiz ki, belə bir göstəriş insanların ölü ilə təmasını məhdudlaşdırır. Yə’ni həm insanların hissləri nəzərə alınır, həm də onlar təhlükədən hifz edilir. Belə bir dini göstərişi insanların meyitlə təmasının qarşısını almasa da, onları mikroba yoluxmadan .qoruyur

Sual oluna bilər ki, əgər meyitə toxunma qüslü mikrobdan qorunmaq üçündürsə, nə üçün meyitə qüsl verildikdən sonra ona toxunan şəxsə növbəti dəfə qüsl vacib olmur? Nəzərə almalıyıq ki, meyitə sidr və kamfora (kafur) qatılmış su ilə qüsl verildikdə mikroba yoluxmanın qarşısı bir müddət alınır. Təbii ki, sidr və kamfora qatqılı su ilə qüsl verilmiş .meyit qısa bir müddətdə torpağa tapşırılır

Uyğun iki qüsl haqqında deyilənlər onların fəlsəfəsinin bir hissəsi idi. Şübhəsiz ki, uyğun .hökmlərin daha geniş və dərin fəlsəfəsi mövcuddur

## ?Qanunsuz doğulmuş övladlar nə üçün bə’zİ mənsəblərdən məhrumdurlar .۱۵

Sual: Qeyri-qanuni cinsi yaxınlıqda heç bir günahı olmayan qanunsuz doğulmuş uşaqların hakimlik, cəmiyyət namazında imamlıq, fitva vermək kimi mənsəblərdən məhrum edilməsinin səbəbi nədir? Axı nə üçün qanunsuz nikahdan doğulmuş övlad ata-anasının günahlarına şərik olmalı, başqalarının günahından əziyyət çəkməlidir? Bə’ziləri də deyirlər ki, qanunsuz doğulmuş övladlar heç vaxt behiştə getmir. Ədalətli, hikmət sahibi ?olan Allahın günahsız bir insanla belə rəftar etməsi mümkündürmü

.Cavab: Uyğun sualı cavablandırmaq üçün bə’zi məsələləri açıqlamaq lazım gəlir

Qanunsuz nikah cəmiyyətin əsasını təşkil edən ailə qurumunu hədələdiyindən belə bir .۱ nikah qadağan olunmuşdur. Zinakar qadın övladının atasını, övlad isə qohum-əqrəbasını tanımır. Qanunsuz nikahın əxlaqi, psixoloji, ictimai, tərbiyəvi zərərlərini sadalayıb qurtarmaq çətindir. Belə bir nikah insanı sair canlılardan fərqləndirən iffət .dəyərini təhlükə altına alır

Bütün cəmiyyətlərdə qanuni nikahı müdafiə edən qanunlar mövcuddur. Ona görə də .۲ qanunsuz nikah cəmiyyətdə olan qanunların pozulması kimi hesab olunur. Bu qanunu pozan insanda daxili bir nigarançılıq yaranır. Günah təkrarlandıqca həmin nigarançılıq .hissi zəifləyir və adi hal alır

Ata-ananın psixoloji xüsusiyyətləri irsiyyət qanununa əsasən övlada ötürülür. Övlad .۳ xarici görünüşcə valideynlərinə oxşadığı kimi, xasiyyətcə də onlara oxşayır. Saçın, gözün rəngi ata-anadan övlada keçdiyi kimi, lovğalıq, sadəlik, tündməcazlıq, mülayimlik kimi xüsusiyyətlər də övlada ötürülür. Yə’ni insanın formalaşmasında irsiyyət qanunu bütün sahələri əhatə edir. Əlbəttə ki, hansısa digər amillərdən bu oxşarlıq olmaya da .bilər. Amma irsiyyət qanunu inkarolunmaz bir faktdır

Deyilənlərdən belə bir nəticə əldə olunur ki, qeyri-qanuni doğulmuş övladlarda üsyankarlıq, qanunu pozmaq hissləri irsi olaraq meydana çıxır. Onlar başqalarına nisbətən günaha daha meyilli olurlar. Belələri pozğun mühitə düşdükdə heç bir .müqavimət göstərmədən təslim olurlar

Gəlin razılaşaq ki, milli və ictimai mənafelərin qorunmasında bütün ehtiyat tədbirlərini görmək zəruridir. Qeyri-qanuni doğulmuş insanların mühüm ictimai mənsəblərdən məhrum edilməsi həm cəmiyyətin sağlamlığını qoruyur, həm də diqqəti belə bir işin pisliyinə yönəldir. Şübhəsiz ki, millətin, cəmiyyətin taleyini istənilən bir cəhətdən pak .insanlara tapşırmaq olar

Amma deyilənlərdən belə görünməsin ki, insanın yolunu azması üçün yeganə amil onun qeyri-qanuni doğulmasıdır. Qanunsuz doğulmuş övladlar da başqaları kimi həyat yolunu seçməkdə azaddırlar. Onlar da öz istək və iradələri ilə fəzilət yolunu seçə bilərlər. Qanunsuz doğulmuş övladların mütləq günahkar olub, cəhənnəmə getməsi fikri doğru deyil. Onlar da başqaları kimi təqva sahibi olub behişt əhlinə qatıla bilərlər. Həzrət Sadiq (ə) buyurmuşdur: "Qanunsuz doğulmuş övlad tərbiyə yolu ilə vəzifələrinin icrasına vadar olunur. Əgər saleh işlər görsə, yaxşı mükafat alır, əgər pis işlər görsə, ".cəzasına çatır

Azğın xarakter günaha daha çox meyilli olan qanunsuz doğulmuş övladların işini çətinləşdirsə də, onlar daxili meyillərinə qalib gələrək, Allaha itaət göstərdikləri .təqdirdə daha üstün və daha dəyərli mükafat alırlar

Qanunsuz doğulmuş övladlar ona görə məzəmmət olunur ki, onlar təhlükəli vəziyyətdə olduqlarını dərk etsinlər. Onlar irsiyyətdən gəlmiş günah çağırışını boğa bilsələr, behişt əhli olurlar. Belə bir fikir düzgün deyil ki, qanunsuz doğulmuş uşağa heç bir tərbiyə .tə’sir etmir və o cəhənnəm əhli olmalıdır

Başqa sözlə, qanunsuz yolla doğulmuş uşaqlar xəstə anaların doğduğu uşaq kimidir. Xəstə ananın doğduğu körpə xəstəliyə asanlıqla yoluxduğu kimi, qanunsuz nikahdan doğulan uşaqlar da günaha tez aludə olur. Xəstə ananın doğduğu körpənin sağlamlığına xüsusi diqqət yetirildiyi kimi, günahkar ananın doğduğu uşağın tərbiyəsinə .də xüsusi diqqət yetirilməlidir

Amma qanusuz doğulmuş uşaqların xoşbəxt ola bilməməsi fikri kökündən yanlışdır. Onlar da başqaları kimi doğru yol seçib səadətə çata

bilərlər. Sadəcə, qanunsuz doğulmuş övlad öz irsi meyllərini nəzərə alaraq çox diqqətli olmalıdar. Bəzən anadan zəif doğulmuş uşaq yaxşı himayə və fiziki hazırlıq tədbirləri nəticəsində sağlam doğulmuş uşaqdan da güclü olur. Demək, hazırlığın müstəsna əhəmiyyəti vardır. Güclü iradəyə malik olan insan öz nəfs azğınlıqlarının qarşısını ala bilir. Bundan əlavə, qanunsuz doğulmuş övlad günahdan qorunmaqla başqalarına nisbətən daha üstün məqam qazanır. Çünki bu qorunma ona daha böyük mücahidələr .bahasına başa gəlir

## DONUZDAN TÖRƏNMİŞ TƏHLÜKƏLİ BİR XƏSTƏLİK

Sual: Məsihilər donuz ətini həvəslə yedikləri halda, nə üçün İslamda bu ət qadağan ?olunmuşdur

Cavab: Əgər bir zaman donuz ətinin haram edilməsini bə’ziləri şübhə ilə qarşılayırdısa, bu gün mə’lum olmuşdur ki, donuz ətinin zərəri təsəvvür edildiyindən də böyükdür. Donuz əti insanın həm əxlaqı, həm də sağlamlığı üçün böyük təhlükələr yaradır. Söhbətimizdə bu ətin insan sağlamlığı üçün zərərlərindən birini nəzərdən keçirəcəyik. Söhbətimizin davamından oxuyacağınız, Amerika mətbuatında çap olunmuş bir elmi .məqalənin tərcüməsidir. Məqalədə trixinoz xəstəliyindən danışılır

### Donuzdan törənmİş təhlükəlİ bİr xəstəlİk .۱۶

Bir çox səhiyyə təşkilatlarında trixinoz xəstəliyi ilə bağlı dünyanın müxtəlif tibbi mərkəzlərindən göndərilmiş mə’lumatlar toplanmışdır. Uyğun mə’lumatların sayı bu xəstəliyin epidemiya şəkli aldığını göstərir. Yə’ni trixinoz xəstəliyinə yoluxma halları .həddindən artıq çoxalmışdır

Trixinozun törədicisi kiçik tük formalı yumru trixin qurdudur. Bu qurd həyatının bir dövrünü donuz və digər heyvanların orqanizmində keçirir. Trixin qurdu donuz əti vasitəsilə insan orqanizminə daxil olur. İnsan orqanizmi bu xəstəliyə digər canlılardan .daha həssasdır

İnsan, adətən kifayət qədər qaynadılmamış donuz ətini yeməklə trixinoz xəstəliyinə yoluxur. Hətta ən müasir aşpazxana qazanlarında

da donuz əti nəzərdə tutulan səviyyədə qaynadılmır. Uyğun istiqamətdə aparılan araşdırmalardan birində mə’lum olmuşdur ki, bu xəstəliyin daşıyıcısı olan iyirmi beş milyon nəfərdən kiçik bir hissəsi yatağa düşmüşdür. Xəstəlik öz işini görsə də, bu xəstəlik həkimlər tərəfindən çətinliklə üzə çıxarılır. Həmin iyirmi beş milyon nəfərdən on .altı min nəfəri sonradan yatağa düşmüş və onlardan beşdə biri dünyasını dəyişmişdir

## ?Kafİr nə üçün murdar sayılır .۱۷

Sual: İslam kafirləri murdar saydığından müsəlmanlar onlarla ünsiyyət zamanı çətinlik çəkirlər. Hansı ki, onların çoxu öz təmizliklərinə müsəlmanlardan da çox fikir verirlər. Bəs uyğun hökmün fəlsəfəsi nədir? Müsəlmanları düşüncə azğınlığından qorumaq, yoxsa qeyri-müsəlmanların diqqətini İslama cəlb etmək? Düşüncə dini olan İslam belə ?bir məqsədlə kafiri murdar saya bilərmi

Cavab: Bəli, İslam dini düşüncə dinidir. Amma bu din bir qrup insana məxsus deyil. İslam bütün bəşəriyyət üçün göndərilmiş bir dindir. Düşüncəli insanların İslamdan daha çox bəhrələnməsi bir faktdır. Amma nadan, savadsız insanlar da İslamdan bəhrələnməlidirlər. Əvvəldə də qeyd etdiyimiz kimi, kafirlər mə’nəvi, batini çirkinliyə görə murdar sayılırlar. Həmin batini çirkinlik onların zahirində də hiss olunur. Təbii ki, nadan insanlar kafirlərlə ünsiyyətdə olmaqla doğru yoldan çəkinirlər. Uyğun hökmün səbəblərindən biri də nadanların e’tiqadını qorumaqdır. Əksər dinlərdə xalqa azğın insanlardan çəkinmək tapşırılır. İslamda isə bu məsələ kafiri murdar bildirməklə həll .olunur

Onu da nəzərə almalıyıq ki, İslam kafirlərlə iqtisadi, ticari əlaqələri mümkün sayır. Amma icazə vermir ki, müsəlmanla kafir eyni bir qabdan xörək yesin. Demək, məqsəd insanları .kafirlərin zərərindən qorumaqdır

Deyilənlərdən belə bir nəticə çıxmasın ki, dinini dərindən bilən alimlər kifirlərlə ünsiyyətdə ola bilərlər. İslamda xüsusi yönümlü hökmlər yoxdur. Bir hökmün davamlı olması üçün o ümumi olmalıdır. Əgər belə olmasaydı, özünü alim sayan nadanlar da .kafirlərlə ünsiyyətə qatılardılar

Aydın məsələdir ki, əksər kafirlər qan, donuz əti, spirtli içkilərdən çəkinmirlər. İslam dini öz ardıcıllarını bu çirkinliklərdən qorumaq üçün onları murdar e’lan etmişdir. Bir sözlə, .İslam kafiri murdar bildirməklə müsəlmanı azdırıcı tə’sirlərdən qoruyur

## ?Cİzyə” (qeyrİ–müsəlmanın İslam hakİmİnə verdİyİ hİmayə ödəncİ) nə üçündür“ .۱۸

Sual: İslam Peyğəmbərinin göndərilməsində məqsəd insanların doğru yola yönəldilməsidir. Amma bə’zən İslam qanunlarında elə məsələlərlə rastlaşırıq ki, həmin məsələlər İslamın ali məqsədi ilə bir araya sığmır. Məsələn, bildirilir ki, İslam hakiminə cizyə ödəyən məsihilər və yəhudilər azaddır. Cizyə maddiyyatla bağlı olan bir məfhumdur. Necə ola bilər ki, İslam hansısa ödənc almaqla məsihilərlə və yəhudilərlə öz ?təhrif olunmuş dinlərində qalmağa icazə versin

Cavab: İslam əqidəsinin zorla qəbul etdirilməməsi onun fəxridir. Qur’ani-kərimdə (oxuyuruq: “Dində məcburiyyət yoxdur. Artıq doğru yol azğın yoldan aydın fərqləndi.”(۱

İslam ağıl və düşüncə dinidir. Onun xürafatla yeganə mübarizə yolu həqiqətlərin məntiqli şəkildə bəyanıdır. Düşüncəli insanları doğru yola hidayət edəcək belə bir silah .olan yerdə, zora ehtiyac qalmır

Həqiqi iman düşüncə və bəsirət vasitəsi ilə əldə olunur. Zorla qəbul etdirilən iman isə yalnız dildə izhar oluna bilər. Qur’anda bu sayaq iman dəyərsiz sayılır. Din son nəfəsədək müqəddəs İslam ayinlərinə bağlı qalası insanlar tərbiyə etmək istəyir. Belə .bir iman, yalnız məntiq, dəlil yolu ilə əldə oluna bilər

İslamda cihad, düşmənlə mübarizə bir mövzudur, cizyə isə başqa bir mövzu. Cizyə kitab əhlinin hər il İslam dövlətinə ödədiyi məbləğdir. Hakimiyyətdə olan müsəlmanlar ölkədə azlıqda qalmış qrupların əmin-amanlığını qorumağa məcbur idilər. Bu sayaq əmniyyət tədbirlərinin öz xərci vardı. Ona görə də İslamı qəbul etməyənlərdən onların öz asayişinin qorunması məqsədi ilə hər il cizyə alınırdı. Həmin məbləğ hesabına İslam dövləti İslamı qəbul etməyənlərin mühafizəsi üçün onların yaşadığı məntəqələrdə xüsusi qüvvə saxlayırdı. Təbii ki, bu qüvvələrin



---

.Bəqərə”, ۲۵۶“[۹۶] -۱

saxlanılması üçün müəyyən bir büdcəyə ehtiyac duyulurdu. Bu büdcənin tə'mini üçün yeganə və məntiqi yol həmin azlıqlardan cizyə tutulması idi. Bunu da qeyd edək ki, .azlıqda qalan qeyri-müsəlmanlar müharibələrdə iştirak etmirdilər

Cizyənin təzyiq vasitəsi kimi tətbiq olunduğuna heç bir sübut yoxdur. Yeganə məqsəd :azlıqların asayişinin tə'mini olmuşdur və bunu tarixi faktlar sübut edir

Ubadət ibn Samit Misir hakimlərini və sair qiptiləri İslam dininə də'vət etdiyi vaxt .١ onlara belə dedi: "İxtiyarınız özünüzdədir. İstəyirsiniz İslamı qəbul edin, istəmirsinizsə cizyə ödəyin. İslam hökumətinin qanunlarına tabe olun. Biz sizinlə həmpeyman oluruq, ".canınızı və malınızı hifz edirik, sizə təcavüz edənlərlə döyüşürük

Müsəlmanlar rumlulara qalib gəldikdən sonra Hims xalqı cizyə ödəməyə razılaşdı. .٢ Müsəlman başçılarından biri ümumi bir məclisdə məsihi Hims əhlinə belə dedi: "Bizə verdiyinizi geri alın və bizi həmpeymanlıqdan azad edin." Hims camaata dedi: "Heç vaxt sizdən ayrılmayacağıq. Sizin hakimiyyətiniz və pəhrizkarlığınız rumlularınkından çox ".üstündür. Əgər siz qəbul etsəniz, İslam qoşunu ilə birlikdə rumlulara qarşı vuruşarıq

Həzrət Peyğəmbərin (s) məsihi nəcran camaatı üçün tə'yin etdiyi cizyə miqdarı .٣ deyilənləri daha da aydınlaşdırır. Belə bir razılıq əldə olunmuşdu ki, nəcran xalqı ildə üç min hullə (bir hullə dörd dirhəmdir) ödəsinlər. Onlar bu üç min hullənin iki minini səfər ...ayında, minini isə rəcəb ayında ödəməli idilər

Əslində həmin bu məbləğ nəcran xalqının əmin-amanlığının qorunması müqabilində çox .cüzi bir məbləğ idi

### Ehram libası .١٩

?Sual: Nə üçün ehram libası adi libaslar kimi tikili ola bilməz

Cavab: Həcc mərasimi mütləq azad şəkildə yerinə yetirilən kollektiv ibadətlərdəndir. Ona görə də bu ibadət zamanı bir-birindən

fərqlənən gündəlik libaslardan yox, iki hissə parçadan istifadə olunur. Bu yolla ibadət edənlər arasında zahiri bərabərlik tə’min olunur. Eyni tərzdə geyim bəşəriyyətin böyük .amallarından olan bərabərliyin bir təcəssümüdür

Başqa sözlə, həcc insanların Allah qarşısında bərabərliyinin nümayişidir. Bu mərasimə toplanmış bütün müsəlmanlar eyni rəngdə, eyni cür libaslar geyməklə mövcud zahiri (imtiyazları aradan qaldırırlar. (Həcc mərasimində geyilən libas “ehram libası” adlanır

**?Nə üçün həcc mərasİmİndəkİ qurbanlıq ətlər tələf olunur .۲۰**

Sual: Qurban bayramı günü Mina məntəqəsindəki qurbanlıq ətlər nə üçün ehtiyaclılara ?çatdırılmadan torpağa basdırılır

Cavab: Bildiyimiz kimi, zilhiccənin onuncu günü həcc əməllərindən biri Minada qurban kəsməkdir. Bu İslamın qəti göstərişlərindəndir. Ziyarətçilər qurban kəsməklə tövhid .qəhrəmanı həzrət İbrahimin xatirəsini yad edirlər

Allah-təala İbrahimin ruhunu kamilləşdirmək, onun ləyaqətini isbat etmək üçün belə bir göstəriş verdi ki, İbrahim öz əziz oğlu İsmaili Mina məntəqəsində Allah yolunda qurban kəssin. Əlbəttə ki, bu göstəriş imtahan xarakteri daşıyırdı. Böyük Peyğəmbər, ilahi Peyğəmbər İbrahimin ləyaqəti sübuta yetirilir. Amma İbrahim bu əmri yerinə yetirmək .ərəfəsində ikən göstəriş verildi ki, İsmailin əvəzində bir qoyun qurban kəsilsin

İbrahimin uyğun əmri yerinə yetirmək əzmi sübut etdi ki, böyük fədakarlıq ruhuna malik olan bu ilahi insan iman yolunda bütün daxili istəklərinə qalib gələ bilir. İbrahim ilahi hədəf yolunda öz övladından keçməyə hazır oldu. Nəhayətdə isə imtahandan üzüağ .çıxaraq bir qoyun qurban kəsdi

Allah evinin ziyarətçiləri bir qoyun qurban kəsməklə Mina torpağında həzrət İbrahimin iman və fadakarlıq təcəssümü olan xatirəsini yad edirlər. Bu yolla insanlar bir-birlərinə ,fədakarlıq dərsi öyrədir, sanki deyirlər ki

Allah yolunda hər şeyindən keçən insan ilahi insandır. Biz uyğun əməlin fəlsəfəsinin .yalnız bir guşəsinə nəzər sala bildik

Növbəti sual odur ki, qurban kəsildikdən sonra qurbanlıq ət kimə verilməlidir və qurban kəsmiş müsəlmanın bu sahədə vəzifəsi nədir? Qur’ani-məcidə müraciət edək. Minada qurban kəsmiş insanlara belə bir göstəriş verilir: “Onlardan özünüz də yeyin, fəqirlərə də yedirdin.(١)Başqa bir ayədə oxuyuruq: “Onların ətindən özünüz də yeyin, əl (açmayana da, əl açana da yedirdin.”(٢

Risalələrdə bildirilir ki, Allah evinin ziyarətçiləri qurbanlıq əti üç hissəyə bölməlidirlər. Bir hissəsindən özləri istifadə etməli, bir hissəsini mö’minlərə, başqa bir hissəsini isə ehtiyaclılara verməlidirlər. Ayələrdən göründüyü kimi, qurbanlıq heyvan kəsildikdən .sonra onun düzgün istifadəsi də bir vəzifədir və israfçılığa heç vəchlə yol vermək olmaz

Qurban günü Minada kəsilmiş ətlərin israf olmaması üçün İslam dövlətləri və müsəlmanlar tədbir görməlidirlər. Böyük tutuma malik soyuducu kameralar hazırlanmalı və qurbanlıq ətlər tədricən təyinatı üzrə istifadə edilməlidir. Ətlərin torpağa basdırılmasının əsas səbəbi budur ki, isti havada qalmış ətlərdən xəstəliklər törəyə bilər. Qədim zamanlarda həccə gedənlərin sayı bu günkündən qat-qat az olduğundan qurbanlıq ətlərdən düzgün şəkildə istifadə olunurdu. Bu gün Allah evinin ziyarətçilərinin sayı artdığından, təbii ki, qurbanlıq heyvanların da sayı artmışdır. Bir bu qədər qurbanlıq əti tə’yinatı üzrə çatdırmaq isə hələ də problem olaraq qalır. Əlbəttə ki, İslam dövlətləri və səlahiyyətli müsəlmanlar belə bir israfın qarşısını almağa çalışmalıdırlar. Belə bir israf həmişə davam edəcəyi təqdirdə günahkar ilahi qanunlar !yox, müsəlmanlardır

### ?Nə üçün azdırıcı kİtablar oxumaq qadağandır .٢١

Sual: İslam elm və bilik dini olduğu halda, nə üçün bə’zi kitabların oxunmasını qadağan ?edir

Cavab: Bəli, İslam elm və bilik dinidir. Bu səmavi din insanları onların səadəti üçün zəruri olan elmlərin təhsilinə təşviq edir. İslam bildirir

ki, fərd və cəmiyyətin təkamülü yalnız elм sayəsində мümkündür. Aмма İslaмda bu da qeyd olunur ki, cəmiyyətin iqtisadi мənafeləri qorunduğu kiмi, onun мə’nəviyyatı da .qorunмalıdır

Maşınlaşмış əsriмizdə bir çox azadlıq carçıları мaddi, dünyəvi zərəri olмayan bütün əqidələri qəbul edirlər. İslaмda isə belə deyil. İslaмda təkcə мaddi yox, мə’nəvi zərəri olan işlər də qadağandır. İslaм мə’nəvi, əxlaqi baxıмdan təkaмül etмiş cəмiyyət arzusundadır. Bundan ötrü isə insanların мə’nəviyyatını, əxlaqını hədəfə alмış düşмənlərlə мübarizə aparılмalıdır. Unutмaмalıyıq ki, əqidəli, əxlaqlı, мə’nəviyyatlı insanları istisмar etмək çətin olur. Ona görə də dünya iмperialistləri bəşəriyyətin .мə’nəviyatını hədəfə alмışdır

Yuxarıda deyilənləri nəzərə alsaq, aydın olar ki, nə üçün İslaм azdırıcı, əqidə və əxlaqa zərərli kitabların мütaliəsini qadağan etмişdir. Əgər belə kitabların oxunмası azad olarsa, insanlar öz düşüncə və əxlaqını necə qoruya bilər? Təlqin və təbliğ böyük gücə мalikdir və bunu unutмaq olмaz. Gəlin e’tiraf edək ki, bir çox insanlar мəhz azdırıcı kitabların tə’siri nəticəsində doğru yoldan azırlar. Bir çox gənclər мəhz azdırıcı sevgi roмanlarının və dedektiv janrlarında yazılмış əsərlərin tə’siri altında fəsada sürüklənirlər. İslaм bütün bu aмilləri nəzərə alaraq azdırıcı kitabların oxunмasını qadağan etмişdir. Bu sayaq kitablar azad şəkildə nəşr olunub geniş oxucu kütlələrinin ixtiyarına verilмəмəlidir. Aмма elм və bilik tərəfdarı olan diniмiz haqqı batildən ayırмaq gücündə olan analitiklərə, düşüncə və əqidələrini qoruмaq şərti ilə, bu sayaq kitabların мütaliəsinə icazə verмişdir. Fəsad təbliğatçıları ilə мübarizə aparan aliмlərə belə kitabın мütaliəsi vacib sayılır. Onlar мüxaliflərin мəntiqi ilə tanış olмalı və onlarla düzgün мübarizə yolunu мüəyyənləşdirмəlidirlər. İslaм tarixində dini rəhbərlərlə qeyri-islaмi əqidə tərəfdarları arasında bir çox мüzakirələr aparılмışdır. “Ehticace-Təbərsi” kitabında uyğun мövzuda мüzakirələr toplanмışdır. Mə’luм olur ki, azdırıcı kitabların qadağan olunмası azad fikirə qarşı yönəlмəмişdir. Məqsəd insanların

düşüncə və əqidəsini qorumaqdır. Din rəhbərləri uyğun cərəyanları mütaliə edir, onlara .məntiqi şəkildə cavab verirlər

**?Nə üçün Qur’anı qeyrİ–müsəlmana vermək olmaz .۲۲**

Sual: Bizim səmavi kitabımız Qur’an bəşəriyyətin doğru yola çağrışçısı kimi bütün insanların ixtiyarına verilməli deyilmi? Bu kitabı oxumadan onun göstərişlərindən necə faydalanmaq olar? Amma fiqhi kitablarımızda oxuyuruq ki, Qur’anı kafirin ixtiyarına .vermək, ona bağışlamaq olmaz

Cavab: Qeyri-müsəlman bir şəxsi doğru yola hidayət etmək, ona İslamı tanıtdırmaq məqsədi ilə Qur’an tərcüməsi ilə bu işi görmək mümkün olmadıqda ona Qur’an vermək mümkündür. Amma başqa məqsədlə belə bir işin görülməsi qadağandır. Çünki Qur’an İslamın haqq olmasının ən böyük sübutu və İslam Peyğəmbərinin əbədi mö’cüzəsidir. O canlı bir sənəd tək qaranlıqları işıqlandırır. Qur’andan faydalanmağın bir yolu onun nəfis şəkildə çap olunub bütün dünyaya yayılmasıdır. Həqiqət axtaran insanlar Qur’an ayələrinin işığında Qur’an ayinləri ilə tanış olmalıdırlar. Qur’an zaman və məkandan asılı olmayaraq dünya xalqları arasında yayılmalı və insanlar onun haqqa çağırışlarını .mütaliə etməlidirlər

Qur’ani-kərim həzrət Peyğəmbərə göstəriş verir ki, hətta döyüş əsnasında bir qeyri-müsəlman Allah kəlamını eşitmək istəyərsə, Peyğəmbər ona icazə versin. Dönməyə meyl (etdikdə onu ilkin yerinə qaytarmaq tapşırılır.(۱

Beləcə, Qur’anı ona qarşı hörmətsizlikdən qorumaq hər bir müsəlmana vacibdir. Qur’ana qarşı hörmətsizlik edəcəyi ehtimal olunan qeyri-müsəlmana bu ilahi kitabı vermək olmaz. İslam fəqihlərinin də nəzəri budur ki, doğru yola çağırış məqsədi olmadıqda, Qur’anı kafirlərin ixtiyarında qoymaq olmaz. Bir sözlə, Qur’an çirkin əllərə verilməməlidir və bu iş o zaman mümkün sayılır ki, həmin şəxsin doğru yola qayıdışı .ehtimal edilsin



---

.Tövbə”, ۶“[۹۹]-۱

## ?Nə üçün bə'zİ günahların sübutunda çətİnlİk yaradılır .٢٣

Sual: Nə üçün iffətsizliklə bağlı bə'zi günahların sübutu üçün dörd şahid tələb olunur? Belə bir çətinliyin yaradılması iffətsizliyin çoxalmasına səbəb olmazmı? Nə üçün iffətsizlik ?etmiş şəxs yalnız dörd dəfə e'tiraf etdikdə onun günaha batdığı qəbul olunur

Cavab: İffətsizliklə bağlı əməllərin cəzalandırılmasında İslam xüsusi prinsiplərə əsaslanır. Bir tərəfdən bu günahlara görə sürgündən tutmuş e'damadək ağır cəzalar nəzərdə tutulur, digər tərəfdən bu günahların isbatı yolunda çətinliklər yaradılır. Başqa günahlardan fərqli olaraq, bu sayaq günahlarda ikiqat artıq şahid tələb edilir. Eləcə də .iffətsizlik etmiş şəxsin bir dəfə e'tirafı yetərsiz sayılır

Ağır cəza və çətinləşdirilmiş sübut yolu bu sayaq günahların mühakiməsinin özünəməxsus xüsusiyyətidir. İffətsizliyə qarşı ağır cəzaların müəyyənləşdirilməsində məqsəd insanları bu günahlardan çəkindirməkdir. Amma İslam imkan həddində çox adamı cəzalandırmağa da maraqlı deyil. Bu məqsədlə də günahın sübutu prosesində .çətinliklər yaradılır

Başqa sözlə, qanunların bu sayaq tənzimlənməsinin əsas məqsədi insanları e'dam etmək yox, günahdan çəkindirməkdir. Bu günahlara meyl göstərən insan daim hansı .cəzalarla üzləşə biləcəyini xatırlayır və təbii ki, qorxuya düşür

Adətən, narkotik maddələr satışı kimi böyük günahlar müqabilində e'dam kimi ağır cəzalar tə'yin olunur. Belə bir cəza, şübhəsiz ki, insanların ruhunda tə'sir qoyur və uyğun günahdan çoxları çəkinirlər. Bir sözlə, İslam qanunlarında sə'y göstərilmişdir ki, günahın qarşısı imkan daxilində alınsın. Baş verən günahlardan az bir hissəsi e'damla cəzalandırılır və bu e'dam prosesi ətrafdakılar üçün böyük ibrət olur. Günaha meyl .göstərən insan istər-istəməz gördüyü səhnələrdən nəticə çıxarır

## ?Nə üçün heyvan müəyyən şərtlər ödənməklə kəsİlməlİdİr .۲۴

Sual: İslamda heyvanların kəsilməsində müəyyən şərtlər qoyulmuşdur. Məsələn, boğazın dörd damarının kəsilməsi, “bismillah” deyilməsi və s. Bu şərtlər ödənmədikdə kəsilmiş heyvanın əti istifadəyə yararsız sayılır. Hansı ki, dünya xalqlarının bir çoxu bu şərtlərə əməl etmədən heyvanların ətindən istifadə edirlər. Bəs uyğun şərtlər nə ?üçündür

:Cavab: Belə görünür ki, İslam uyğun göstərişlərlə üç problemi həll etmək istəmişdir

Heyvanları bütlərin adına kəsən bütpərətslərin ayinlərindən uzaqlıq; heyvan . ۱ kəsilərkən Allahın adının çəkilməsi bütpərəstliyə qarşı nəzərdə tutulmuş proqramın bir .hissəsidir

Heyvanın qanının onun kəsilmiş boğazından tam axıdılması; bu günkü tibbdə heyvan .۲ orqanizmində qalmış qanın təhlükəli olduğu müəyyənləşdirilmişdir. Bundan əlavə qanda mikroba yoluxma xüsusiyyəti vardır. Təcrübədə sübuta yetirilmişdir ki, qanla qidalanma insan ruhiyyəsində mənfi hallar yaradır. İnsanlıq hisslərinin zəifləməsi, zalımlıq, qəlbin .bərkiməsi qandan törənmiş mənfi xüsusiyyətlərə misal göstərilə bilər

Heyvanın iti alətlə, ona çox əziyyət vermədən kəsilməsi insanlıq ruhuna uyğun bir .۳ .qərardır. Dörd damarı kəsilmiş heyvan qısa bir müddətdə əziyyətdən qurtarır

## ?Xətnənİn (cİnsİyyət üzvünün sünnət olunmasının) sağlamlıq üçün faydası varmı .۲۵

Cavab: Əvvəla, cinsiyyət üzvünün mikroba yoluxması xətnə olunmayan insanlar .arasında çox yayılmış bir xəstəlikdir

İkincisi, statistik göstəricilərə görə cinsiyyət üzvünün xərçəng xəstəliyi xətnə .olunmamış insanlarda daha çox müşahidə olunur

Amma bir məsələdə çox diqqətli olmaq lazımdır. Bə’zən dini bir vəzifə olan xətnə düzgün şəkildə yerinə yetirilmədiyindən müəyyən

.fəsadlar da yaranır. Buna görə də bu işi мütəxəssisə həvalə etмək lazıмdır

**Muhəllİl”İn fəlsəfəsİ“ .۲۶**

Sual: Nə üçün öz arvadını üçüncü dəfə boşaмış şəxs onu yenidən ala bilмəz? Nə üçün üçüncü təlaqdan sonra yenidən əri ilə nikaha girмək istəyən qadın əvvəlcə başqa biri ?ilə izdivacda olмalıdır

Cavab: Bəli, İslaм aliмlərinin nəzərincə, əgər bir şəxs öz arvadını üç dəfə boşaмışsa, həмin qadınla dördüncü dəfə evlənмəzdən qabaq o qadın başqa kişi ilə izdivacda .olмalıdır. İkinci kişi həмin qadını boşadıqdan sonra qadın əvvəlki əri ilə ailə qura bilər

Bu мəsələ də bir çox İslaм hökмləri kiмi tərbiyəvi xarakterə мalikdir. İslaм belə bir qanun vasitəsi ilə boşanмanı oyuncağa çevirənlərin, eləcə də, boşanмanın qarşısını alмaq istəyir. Arvadını üçüncü dəfə boşaмaq qərarına gəlмiş insan onunla yenidən evlənмəyin çətinliyini nəzərə alaraq, bu boşanмanı tə’xirə də sala bilər. Üçüncü boşanмadan sonra yenidən evlənмək üçün probleм yarandığından, adətən, insanlar üçüncü boşanмadan vaz keçirlər. Arvadını üçüncü dəfə boşaмaq istəyən kişi istər-istəмəz düşünür ki, əgər yenidən nikaha girмək istəsə, çox böyük probleмlərlə üzləşəcək. Əvvəla, onun qadını başqa biri ilə izdivacda olмalıdır, ikincisi həмin şəxs .qadını boşaмağa razılaşмalıdır

Uyğun qanun kişilərdə qeyrət hissi oyandırır. Üçüncü təlaqdan sonra qadının başqa kişi ilə izdivac edəcəyini düşünən kişi bunu özünə sığışdırмır. İslaм bu yolla kişilərin .qeyrət hissini hərəkətə gətirir və bu yolla мövcud nikahı qoruyur

**İstİмnAnın (özündən SPERMA xarİc etмənİn) fİzİolojİ və psİxolojİ təhlükələrİ .۲۷**

?Sual: İstiмna nə üçün haraм buyurulмuşdur

Cavab: İnsanın cinsi tərbiyəsi ümumi tərbiyə kompleksində mühüm yer tutur. Cinsi istəklərin formalaşdığı dövrdə hər bir yeniyetmədə şəhvət hissi güclənir. Keçmiş dövrlərdə, əsaslı dini tərbiyə almamış yeniyetmələr təbii şəhvətin söndürülməsi üçün adətən, qanuni nikah haqqında düşünürlər. Amma bu gün küçə və xiyabanlardakı, müxtəlif təbliğat vasitələrindəki əxlaqsızlıq təbliğ edən mənzərələr gənclərin diqqətini bütün təkamül istiqamətlərindən yayındıraraq, cinsi ehtirasa sövq etmişdir. Belə bir təbliğatın nəticəsində təbii cinsi meyl istimna və bu kimi başqa zərərli təzahürlərə gətirib çıxarır. Qeyri-qanuni yolla, eləcə də istimna vasitəsi ilə cinsi ehtirasın söndürülməsi .gənc nəslin normal təkamülü qarşısında ciddi maneələr yaradır

İstimnanın (insanın özündən sperma xaric etməsi) acı nəticələri son dövrdə aparılmış sosioloji sorğular nəticəsində açıq-aşkar şəkildə özünü büruzə verir. İnsan yetkinlik yaşına çatdıqca onun orqanizmində toplanan sperma iki istiqamətdə sərf olunur. Bunun bir hissəsi orqanizmin inkişafına sərf olunur, digər bir hissəsi cinsiyyət orqanından xaric edilir. Orqanizmdə toplanmış spermanın onun təkamülünə sərf olunmayan hissəsi .yeniyetmə yuxuda olarkən ondan təbii şəkildə xaric olur

Cinsi tərbiyəsində nöqsanlar olan yeniyetmə isə istimna edərkən öz orqanizmindəki sperma tarazlığını pozur. Nəticədə orqanizmdə fizioluji və psixoloji nöqsanlar üzə çıxır. Spermanın orqanizmdən sün'i şəkildə çıxarılması insan vücudunda ciddi fəsadlar yaradır. Şəhvətin hansı mərkəzdən hərəkətə gətrilməsi çox mühüm bir amildir. Əgər şəhvət təbii şəkildə müxtəlif hiss üzüvləri vasitəsi ilə təhrik olunursa, bu normal prosesdir. Təsəvvürdə hansısa mənzərələri canlandırmaqla təhrik olunan şəhvət müxtəlif fəsadlarla müşayiət olunur. Aparılan sorğulardan mə'lum olmuşdur ki, istimna etməklə şəhvətini təsəvvür yolu ilə təhrik etməyə adət edənlər ailə qurduqları vaxt normal cinsi akt yerinə yetirə bilmirlər. Təsəvvür yolu ilə təhrik adəti normal ehtirasın .yaranmasına mane olur

İstimna edən şəxs adətən hər istimnadan sonra peşiman olur və bu işi təkrarlamamaq qərarına gəlir. Amma vaxt keçdikdən sonra yenə

təhrik edici təsəvvürlər xəyalında canlanır və iradə zəifliyi səbəbindən bu istimna təkrarlanır. “Peşimançılıq davam” düzümü bir-birini əvəz etdikcə, insan şəxsiyyətində iradə zəifliyi peyda olur. Bir sözlə, istimna cinsi ehtirasın normal həyəcanlanma qurumunu dağıdır. Təsəvvürdən ləzzət almağa vərdiş vermiş insan gerçəklikdən .lazımınca ləzzət ala bilmir

İstimnanın həm dini, həm tibbi cəhətdən pisliyi kimsədə şübhə doğurmasa da, bu pis .vərdişin qarşısını almaq üçün zəruri tədbirlər görülməmiş qalır

Yeniyetmələr bu pis vərdişdən çəkinmək üçün əxlaqsız filmlərdən, iffətsiz mənzərələrdən, pozğun sevgi romanlarından pəhriz etməlidirlər. Yaxşı dost, yaxşı əyləncə, idman, hansısa peşəyə maraq insanın istimnadan çəkinməsində mühüm rol oynayır. E’tiqadlı gənclər bunu da unutmamalıdırlar ki, İslamda istimna haram .buyrulmuşdur və haram buyrulan hər bir iş səadət yolunda ciddi bir maneədir

### ?Eynİ qan qrupuna malİk olanlar evlənə bİlərlərmİ .۲۸

?Sual: Eyni qan qrupuna malik olanların ailə qurması bütün hallardamı zərərlidir

Cavab: Avstriya təbiətşünası Qreqor İohanni Mendel (۱۸۲۲-۱۸۸۴) ۸ illik təhqiqatdan sonra irsiyyət haqqında qanunlardan birini kəşf etmişdir. Uyğun kəşfi sadə bir dillə :oxucuların nəzərinə çatdırırıq

Əgər bir ağ, bir kül rəngli siçovul cütləşdirilərsə, onların balası istisnasız olaraq kül rəngdə olasıdır. Nəsil davam etdikdə onların balalarının bir hissəsi kül rəngli, bir hissəsi isə ağ olur. Deyildiyi kimi, bu siçovulların ilk nəsil balaları yalnız kül rəngdə ola bilər. Növbəti nəsillərdə isə həm ağ, həm də kül rəngli balalar doğulur. İki nəsildə üzə çıxan sifət (kül rəng) qalib, gizli qalan sifət isə məğlub adlandırılır. Doğulmuş balaların necəliyini müəyyənləşdirən amil gen adlandırılmışdır. Bu gen ata siçovuldan balalara keçir. Əgər hər iki valideynin genləri eynidirsə, döl xalis olur. Yox

əgər genlər fərqlidirsə, döl qeyri-xalis hesab edilir. Təbii ki, iki xalis dölün .cütləşməsindən valideynlərə oxşar bala doğulur

Artıq təbabətdə sübut olunmuşdur ki, əgər ailədə irsi bir xəstə varsa, onlardan doğulan körpədə xəstəlik aşkarlana bilər. Eyni qan qrupundan olanlar ailə qurduqda irsi xəstəliyin ortaya çıxma ehtimalı daha böyük olur. Əgər ailə quranların hər ikisi irsi xəstəliyə malikdirsə və onlar eyni qan qrupundandırlarsa, onlardan doğulan övladda xəstəlik daha güclü şəkildə təzahür edəsidir. Hətta belə uşaqlar doğuşdan qabaq və .ya qısa bir müddət sonra həlak ola bilər

Amma valideynlərdən birinin genində irsi xəstəlik yoxdursa, övladlar ya sağlam olacaq, .ya da xəstəlik valideyndə olduğundan yüngül şəkildə təzahür edəcək

İrsi xəstəliyə malik olan məğlub gen hər iki valideyndə olarsa, onların övladlarından dörddə biri xəstə olasıdır. Amma valideynlərdən birində irsi xəstəlik olmasa, bütün .övladlar sağlam ola bilər

Yuxarıda deyilənləri nəzərə alsaq, eyni qan qrupundan olanların izdivacını münasib saymamalıyıq. Amma bilməliyik ki, valideynlərin heç birində irsi xəstəlik yoxdursa, uyğun izdivac təhlükəsizdir. İstənilən bir halda eyni qan qrupunda olanların izdivacını təhlükəli saymağa əsas yoxdur. Qorxulu odur ki, valideynlərdə eyni növ irsi xəstəlik olsun. Olsun ki, bütün bu deyilənlər nəzərə alındığından islami rəvayətlərdə əmioğlu iə .əmiqızının izdivacı yalnız istisna hallarda mümkün sayılmışdır

## İslamda mUsİqİyə münasİbət .۲۹

?Sual: İslam musiqini hansı əsasla haram buyurmuşdur

Cavab: Musiqinin cəmiyyətdə fövqəl’adə şəkildə yayılması insanların onu düzgün qiymətləndirməsinə mane olur. Hətta pisliyini hiss edə bilmir. Həyat tərzinə çevrilmiş bir işin yaxşı-pisliyini dəyərləndirmək üçün böyük diqqət və ağıl tələb olunur. Amma həqiqətpərəst və bəsirətli insanlar ətraflarındakı gerçəklikləri daim dəqiq .dəyərləndirməyə çalışmışlar. Musiqi bir neçə baxımdan araşdırılmalıdır

Kolumbiya universitetinin professoru doktor Volf Adler musiqinin insan orqanizminə .١ və sinir sisteminə zərərləri haqqında deyir: “Ən könül oxşayan musiqilər belə insanın sinir sisteminə mənfi tə’sir edir. İsti havada dinlənilən musiqinin xüsusi ilə mənfi tə’siri var.” Məşhur fransa fizioluqu doktor Aleksis Karl yazır: “Əyləncə ilə ötüşən ömürdən məntiqsiz bir şey yoxdur. İnsanın ağıl və düşüncəsi spirtli içkilərin tə’sirindən, bir sözlə, ölçü-biçisiz adətlərin tə’siri səbəbindən zəifləyir. Düşüncə böhranında televiziya və ”.radionun öz payı var

Narkotik maddələrin qadağan olunmasının əsas səbəbi bu maddələrin insanı təbii .٢ halından çıxarmasıdır. Musiqidə də belə bir xüsusiyyət vardır. Musiqi dinləyən insan təbii halından çıxır, onda ətrafa diqqətsizlik yaranır. Kimi əsəblərini narkotik maddələrlə .sakitləşdirir, kimi də musiqi ilə” hər iki halda insanın sinir sistemindəki tarazlıq pozulur

Spirtli içkilər də məhz insanı təbii halından çıxardığı üçün pislənilmişdir. Bir başa insanın sinir sisteminə tə’sir edən bu içkilər insanın ağıl və düşüncəsini zəiflədir. İnsanın təbii haldan çıxmasında burun da vasitə ola bilər. Məsələn, burunla qoxulanan heroin .insanın əsəblərinə tə’sir gösərir, onu uydurur

Məntiqi baxımdan insanın yalnız tibbi məqsədlə, cərrahiyə əməliyyatları zamanı uydurulması müsbət sayılmışdır. Bu məqsədlə insan orqanizmi nə müxtəlif uyudurucular yeridilir. İnsanın uydurulmasında qulaq da bir vasitə ola bilər. Musiqi məhz qulaq vasitəsi ilə insanın sinir sisteminə tə’sir göstərib, onu təbii halından çıxardır. Musiqiyə .aludə olan insan onun tə’siri altında ətraf mühitdən təcrid olur

Yuxarıda deyilənlərdən mə’lum olur ki, hər bir hiss üzvünün öz uydurucusu var. Orqanizmə spirtli içkilər ağız, heroin burun, musiqi isə qulaq vasitəsi ilə öz tə’sirini göstərir. Əsrimizdə böyük konsert salonlarında müşahidə etdiyimiz mənzərələr musiqinin uydurucu tə’sirini təsdiq edir. Yəqin ki, hər birimiz konsert salonlarında ağlı başından çıxan, huşunu itirən gənclər görmüşük. Musiqiyə ifrat aludəçilik səbəbindən bə’zi gənclər öz hərəkətlərini nəzarət altına ala bilmir, eynən narkotik maddənin tə’siri .altında olanlar kimi davranırlar

səh:١۶۴

Bir müqayisə aparaq: Mahir bir riyaziyyatçı adi vəziyyətdə hər hansı bir məsələni asanlıqla həl edir. Bu insan istər spirtli içki qəbul etdikdə, istər heroin iylədikdə, istərsə də hansısa musiqiyə aludə olduqda həmin məsələni həll etməkdə çətinlik çəkir. Demək, istər narkotik maddələr, istərsə spirtli içkilər istərsə də musiqi insanın düşüncə qabiliyyətini zəiflədir. Musiqinin taktı şiddətləndikcə insanların hissləri daha çox təhrik olur. Böyük rəqs salonlarında qulaq batırıcı oynaq musiqinin tə'siri altına düşəndə insaniyyətə sığışmayan hərəkətlərə yol verirlər. İnsanları kollektiv şəkildə heyvani hərəkətlərə sövq edən musiqi deyilmi?! Məgər hansı narkotik maddədə belə güc var?! Zərb alətlərinin diksindirici sədaları altında insanda yalnız və yalnız şəhvət və ehtiras hissləri oyanır. Belə insanlarda mərhəmət, iffət, həya, vətənpərvərlik, iman kimi hislər axtarmağa dəyməz. Şəhvətpərəst kişi və qadınların spirtli içkilərə, narkotik maddələrə və musiqiyə marağı deyilənləri bir daha təsdiq edir. İslam insan səadəti üçün faydalı heç bir dünya ləzzətini faydalı buyurmur. Amma insanı təbii halından çıxarmaqla, onun .hisslərini həyəcanlandıran işlər məzəmmət olunur

Musiqinin insanlarda əxlaqi nöqsan yaratması aşkar bir həqiqətdir. Əksər nəğmələrin mətnini qadın gözəlliyini iffətsiz şəkildə təsvir edən şe'rlər təşkil edir. E'tiraf etməliyik ki, şəhvət dolu nəğmələrə adət etmiş qəlbdə Allah zikrinə yer qalmır. Bir çox nəğmələrdə qadın əndamı elə hayasızlıqla təsvir olunur ki, onu dinləyənlər şəhvətdən başqa heç bir şey haqqında düşünmürlər. İnsanda bir belə mənfi emosiya yaradan şey ilahi dində halal sayıla bilərmi?! Qeyd etməliyik ki, İslam musiqini yox, ğinanı haram buyurmuşdur. Ğina insanı şəhvətə təhrik edən, onu təbii haldan çıxaran musiqilərə deyirlər. Amma musiqi üçün belə bir sərhədin tə'yin olunması asan iş deyil. Vətənpərvərlik hisslərini alovlandıran hərbi marşları və bu kimi digər musiqiləri şəhvət doğuran musiqilərə qatmaq fikrində deyilik. Amma özünüz düşünün, hansı eyş-işrət məclisindən hərbi marş !?dinlənilir

## ?İlahİ İmtahanın fəlsəfəsİ nədİr .٣٠

Sual: Allah-təala Qur’ani-məciddə buyurur: “Hansınızın əməlcə gözəl olduğunu sınamaq üçün ölümü və həyatı yaradan odur.”(١)Belə bir sual yaranır: Yer üzündə baş verən bütün aşkar və gizli işlərdən xəbərdar olan Allahın öz bəndələrini imtahana çəkməsinə !?nə ehtiyac var

Cavab: Əslində ilahi imtahanın məqsəd və mənası başqadır. İnsan məhdud biliyə malik olduğundan həqiqətlərin kəşfi üçün imtahan qapısından keçməyə məcburdur. Amma qeyri-məhdud elmə malik olan Allahın belə bir imtahana ehtiyacı yoxdur. Demək, insan :tamamilə başqa məqsədlərlə imtahana çəkilir. Onlardan bə’zilərini nəzərdən keçirək

İmtahan məqsədlərindən biri bəndələrin tərbiyəsi, onlardakı iste’dadların üzə .١ çıxarılmasıdır. İnsan dünyaya göz açdığı gün onun vücudunda bir çox iste’dadlar gizlənir. Bəli, bütün insani kamilliklər, əxlaqi fəzilətlər insanın cövhərinə qatılmışdır. Amma bu iste’dadlar xüsusi vasitələr olmadan aşkarlanmır. Qüvvə mərhələsində olan iste’dadın fəallaşması üçün səbəblər lazımdır. Nə qədər ki, insandakı bu ləyaqətlər üzə .çıxmamışdır, onun təkamül və fəziləti, eləcə də, mükafat və savabı gerçəkləşəsi deyil

Uyğun imtahanlar insanın vücudunda ali sifətlər tərbiyə edir. İmtahandan keçməmiş insanda fəzilətlərin zahir olması qeyri-mümkündür. İmtahana çəkilməmiş bir insanı .mükafatlandırmaq və cəzalandırmaq da düzgün olmazdı

Əmirəl-mö’minin Əli (ə) bu həqiqəti “Nəhcül-bəlağə”də qısa bir cümlə ilə bəyan etmişdir: “Heç vaxt deməyin ki, Pərvərdigara, imtahan və sınaqdan sənə pənah aparıram! Çünki bu dünyada imtahan olunmayan kəs yoxdur. Duada belə deməyiniz yaxşı olar: Pərvərdigara, azdırıcı imtahanlardan sənə pənah aparıram. (Yə’ni öhdəsindən gələ bilməyəcəyim və məni yoldan çıxaracaq imtahanlardan)” Sonra imam izah verir ki, insanın imtahana çəkilməsində məqsəd mə’lumat əldə



---

.Mulk”, ٢“[١٠٠]-١

etmək deyil. Çünki yer üzündə Allah üçün məxfi bir iş yoxdur. Məqsəd budur ki, insanın daxilindəki razılıq, qəzəb kimi hisslər aşkarlansın və batində olan sifətlər əmələ çevrilsin. Qabiliyyət əmələ çevrilmədən insan nə mükafatlandırılır, nə də cəzalandırılar."(۱)

Nəzərinizə çatdırıldığı kimi, İmam (ə) batini sifətlərin, iste'dadların üzə çıxarılmasını imtahan məqsədi bilir. Batini sifətlər əmələ çevrildikdən sonra insan ya mükafatlandırılır, ya da cəzalandırılır. Batini sifətlər açıqlanmamış qaldıqca təkamül prosesi də fəaliyyətə başlamır.

Məsələn, Allah-təala həzrət İbrahimi (ə) oğlu İsmailin qurban kəsilməsi göstərişi ilə sınağa çəkdiyi zaman İbrahimin müt'i olub-olmadığını yoxlamır. Məqsəd İbrahimin Allah qarşısında itaətkarlığını inkişaf etdirmək və onu işə çevirməkdir. Məhz bu yolla İbrahim təkamül yolunda addım atır.

Buna görə də Allah-təala çətinliklər vasitəsi ilə bəşəriyyəti sınağa çəkir. Qur'ani-kərimdə buyurulur: "Əlbəttə ki, sizi qorxu, aclıq, mal, can və məhsul qıtlığı ilə imtahana çəkərik. Səbr edənlərə müjdə ver."(۲)Həyat problemləri dəmiri qızdırıb, onun tərkibini saflaşdıran, ona forma verən kürə kimidir. İnsa da hadisələr kürəsində möhkəmlənir, səadət yolundakı maneələri aradan qaldırmağa qadir olur. Allahın insanları tərbiyələndirmək məqsədi ilə imtahana çəkməsi o demək deyil ki, imtahan nəticəsində bütün insanlar inkişaf edirlər. İmtahan sadəcə tərbiyə üçün şərait yaradır. Kimi bu şəraitdən istifadə edərək kamala çatır, kimi də uyğun imtahanlardan üzü qara çıxır.

۲. İmtahanın digər bir məqsədi salehlərlə fəsad əhlinin, mö'minlərlə münafiqlərin, yaxşılarla pislərin bir-birindən fərqləndirilməsidir. Qur'ani-kərimdə bu məsələyə işarə ilə buyurulur: "(İnsan imtahana çəkilir ki) Allah-təala imanlı insanları saflaşdırsın və kafirləri tədricən məhv etsin."(۳)

۳. İlahi imtahanın başqa bir məqsədi dildə bir söz deyib əməldə başqa cür hərəkət edən yalançıların bəhanəsini kəsmək, höccəti tamamlamaqdır. İmtahan vasitəsi ilə mə'lum olur ki, bu insanlar əməl

١- [١٠١]“Nəhcül-bəlağə”, h. ٩٣.

٢- [١٠٢]“Bəqərə”, ١٥٥.

٣- [١٠٣]“Ali-İмran”, ١٤١.

yox, dil pəhləvanıdırlar. Əgər belə inanlar imtəhana çəkilməsələr, həm özlərini aldadarlar, həm də başqalarını. Dünyalarını dəyişdikdə belələri Allahı mərhəmətsizlikdə qınaya bilərlər. Amma imtahan vasitəsi ilə bu insanların çirkin əməlləri açıqlanır, gərəksiz .dəmirin üstündən qızıl suyu yuyulur və heç bir şəxs öz kimliyini inkar edə bilmir

,Çəksən də dəmiri qızıl suyuna

.Kürəyə düşəndə sirri açılır

,Onu qızıl bilən donur yerində

.İbadət etdiyi bütlər uçulur

Bəli, imtahan nəticəsində zahiri bərbəzəklər silinib gedir, insan vücudunun həqiqi .mahiyyəti aşkarlanır. Bu da ilahi imtahanın fəlsəfələrindən biridir

### ?Mİkrob dolu torpağa təyəmmum etmək nəyə əsaslanır .۳۱

Sual: İslam ayinlərində göstəriş verilmişdir ki, su tapılmadıqda qüsl və dəstəmaz əvəzinə torpağa təyəmmüm edilsin. Torpaq mikrobdaşıyıcı bir maddə olduğu halda, hansı əsasla ?ona təyəmmüm etməliyik

Cavab: Bu gün təbiət elmlərində sübut olunmuşdur ki, mikroblar təmiz və pak torpaqda həyatını davam etdirə bilmir. Torpağı mikroblara yoluxmadan onun tərkibindəki mikroskopik canlılar qoruyur. Bu canlılar mikrobların qatı düşmənidir. Məsələn, milyonlarla mikrobun nüfuz etdiyi bir leş, torpağa basdırılarsa, həmin mikroskopik .canlılar dərhal mikrobları məhv edərlər

Beləcə, təsəvvür edildiyinin əksinə olaraq, pak torpaq nəinki mikroblardan qoruna bilir, hətta mikrobları məhv edir. Buna görə də mikroba qarşı sudan sonra ən tə'sirli vasitə torpaq hesab edilir. Deyilənlərdən mə'lum olur ki, İslamın su tapılmadığı təqdirdə .torpağa təyəmmüm göstərişi elmi əsaslara malikdir

Onu da qeyd etməliyik ki, Qur’ani-kərimdə təyəmmümlə bağlı ayədə torpağın təmizliyi xüsusi ilə qeyd edilmişdir: “Pak torpağa təyəmmüm edin.”(1)

Bu dini göstəriş haqqında nəql olunmuş xəbərlərdə torpağın paklığı və təmizliyi xüsusi ciddiliklə tapşırılır. İmam Sadiq (ə) buyurmuşdur: “Təyəmmüm üçün insanların ayağı altda qalan torpaqdan istifadə etməyin.”(2)

## 32. Kəbirə (böyük) və sağirə (kiçik) günah nədir?

Sual: Kiçik və böyük günahları bir-birindən necə fərqləndirmək olar?

Cavab: Səğirə və kəbirə günahlar Qur’an ayələrində fərqləndirilmişdir: “Əgər böyük günahlardan çəkinsəniz, kiçik günahlarınızı örtərik.”(3) Bəs günahın böyüklüyü hansı ölçü ilə tə’yin olunur?

Fəqihlərimiz deyirlər ki, istər kiçik olsun, istər böyük, Allahın əmri ilə müxalifətçilik böyük günahdır. Bununla belə günahlar iki dəstəyə bölünmüşdür: kəbirə günahlar, səğirə günahlar. Bu günahları bir-birindən fərqləndirmək yolu çoxdur. Əgər bir günaha görə Qur’anda və rəvayətlərdə əzab və’d olunmuşsa, bu günah böyük günahdır. Məsələn, günahsız insanın öldürülməsi böyük günahdır. Qur’an bu barədə buyurur: “İmanlı şəxsi biləərəkdən öldürənin cəzası cəhənnəmdir.”(4)

Başqa bir qrup alimin fikrincə, ciddi şəkildə qadağan olunan günahlar da kəbirə günahlardır. Bu əsasla da Qur’anda əzab və’d edilməmiş bə’zi günahları da böyük günahlar cərgəsinə daxil etmişlər.

Məsələn, sələm haqqında Qur’anda belə buyurulur: “Bilin ki, Allah və Onun rəsulu sizinlə (bu işə görə) savaşa qalxacaqdır.” İslam şəriətində sələmçiliyin böyük günah sayılması üçün belə bir ifadə kifayət sayılmışdır. Hətta rəvayətlərdə də bu günaha görə əzab və’d edilməmiş olsaydı, ayədəki sərt bəyanat sələmin haram sayılması üçün yetərdi. Demək, eyni bir günah həm böyük, həm də kiçik ola bilməz. Əgər günah müqabilində əzab

۱- [۱۰۴]“Nisa”, ۴۳.

۲- [۱۰۵]“Vəsailüş-şiə, c təharət, b təyəммuм.

۳- [۱۰۶]“Nisa”, ۳۱.

۴- [۱۰۷]“Nisa”, ۹۳.

və’d olunmuşsa və ya bu günah sərt şəkildə qadağan edilmişsə, onu kəbirə günah .saymalıyıq

**?Kəbİrə və səğİrə günahlar nİsbİdİrmİ .۳۳**

Sual: Bə’ziləri deyirlər ki, günahın səğirə və ya kəbirə olması nisbidir. Yə’ni kəbirə bir günah hansısa günaha nisbətdə səğirə sayıla bilər. Məsələn, oğurluq böyük günahdır. .Amma günahsız öldürmək günahına nisbətdə kiçik sayılmalıdır

Belə bir prinsipə əsaslansaq, onda bütün günahlar bağışlanası olar. Qur’anda isə belə buyurulur: “Sizə qadağan olunmuş böyük günahlardan çəkinsəniz, sizin kiçik günahlarınızı örtərik.”(۱) Deməli, hər bir günahdan pəhriz etdikdə günah bağışlana bilər. Amma ən böyük günah sayılan şirk heç vəchlə bağışlanası deyil. Belə çıxmırmı ki, ?şirkdən savay bütün günahlar bağışlanılasıdır

Cavab: ۳۲-ci sualın cavabı bu suala bir qədər aydınlıq gətirir. Qeyd etdik ki, günahlar səğirə və kəbirə olmaqla gerçək şəkildə ikiyə bölünmüşdür. Günahları bir-birinə nisbətdə dəyərləndirmək düzgün deyil. Yuxarıda zikr olunmuş ayədən də həqiqət aydın olur. Əgər insan kəbirə adlandırılan bir qrup günahdan çəkinərsə, onun kiçik günahları bağışlanılar. Bu günahlar arasında konkret sərhəd vardır. Kiçik günah böyük, böyük günah isə kiçik sayıla bilməz. Demək, kiçik günahlar yalnız böyük günahlardan çəkindikdə bağışlanılır. Sadəcə, bir şeyi qeyd etməliyik ki, kiçik günahların .təkrarlanması da böyük günah sayılır

**?Neçə kəbİrə günah var .۳۴**

?Sual: İslam ayinlərində konkret neçə günah kəbirə günah sayılır

:Cavab: Kəbirə günahlar iki yolla tanına bilər

Əgər bir günaha görə Allah-təala Qur’ani-məciddə əzab və’d etmişdirsə, bu günah .۱ ;istisnasız olaraq kəbirə günahdır

Mə’sumlardan nəql olunmuş rəvayətlərdə böyük günahlar konkret şəkildə .۲ sadalanmışdır. Məsələn, imam Əli ibn Musa Riza (ə) Əbbasi xəlifəsi Mə’muna yazdığı məktubda kəbirə günahların adını çəkir. Hədis ayə və rəvayətlərə əsaslanaraq İslam ayinlərində kəbirə hesab olunan günahların siyahısını nəzərinizə çatdırırıq. Allah bu :günahlardan çəkinməkdə yardımçımız olsun

Qətl; ۲. Zina; ۳. Spirtli içkilərin qəbulu; ۴. Namazı tərk etmək; ۵. Yetimin malını zorla .۱ yemək; ۶. Cihad meydanından qaçmaq; ۷. Sələmçilik; ۸. Qumarbazlıq; ۹. Hər cür zülm; ۱۰. Livat (həmcinsbazlıq); ۱۱. Zalıma kömək; ۱۲. Zalıma sığınmaq; ۱۳. Xalqın haqqını yubatmaq; ۱۴. Yalan; ۱۵. Xəyanət; ۱۶. Allah övliyaları ilə savaş; ۱۷. Ata-ananı incitmək; ۱۸. Pak adamlara böhtan atmaq; ۱۹. Qeybət; ۲۰. Allahın qəzəbinə və cəzasına e’tinasızlıq; ۲۱. Həcc əməlinə e’tinasızlıq; ۲۲. Təkəbbür; ۲۳. İsraf və tələf etmə; ۲۴. Donuz əti yemək; ۲۵. Qan yemək; ۲۶. Murdar ət yemək; ۲۷. Allahın adı ilə kəsilməmiş heyvanın ətini yemək; ۲۸. Allahın mərhəmətindən ümidsizlik; ۲۹. Əskik satmaq; ۳۰. Kiçik günahı təkrarlamaq; ۳۱. Zəkat ödəməmək; ۳۲. Yaxınlarla əlaqəni kəsmək; ۳۳. Əhdi sındırmaq; ۳۴. ...Şəhadəti gizlətmək; ۳۵. Yalan and

Yuxarıda kəbirə günahların əhəmiyyətli bir hissəsi sadalandı. Bir çox alimlərin fikrincə, .yuxarıda sadalananlardan da başqa böyük günahlar vardır

### ?Hansı yalana İcazə verİlİr .۳۵

Sual: Bildiyimiz kimi, İslamda yalan böyük günah sayılır. Bəs İslam ayinlərində adı çəkilən icazə verilmiş, məsləhət olan yalan hansıdır? Peyğəmbərlər və imamlar belə yalan ?danışmışlarmı

Cavab: Yalan zatən fövqəl’adə pis bir işdir. Bir çox ictimai bəlaların əsasını yalan təşkil edir. Əhli-beytdən nəql olunmuş bir çox rəvayətlərdə yalan başqa günahların açarı .sayılır

Bir məsələ də var ki, müəyyən hallarda doğru söz böyük fitnə-fəsad yaradır. Bu istisna hallarda həmin doğru söz danışılmasa, əmin-amanlıq

tə’min oluna bilər. Məsələn, bir şəxs o birinin haqqında pis sözlər danışmışsa və biz bu sözləri eşitmişiksə, bizdən bu barədə soruşulduqda düz danışa bilmərik. Çünki haqqında deyilmiş pis sözlərdən xəbər tutan ikinci şəxs qəzəblənib, dava-dalaş sala bilər. Belə hallarda doğru danışmaq bəyənilməmişdir. İslam fitnə-fəsadın qarşısını almaq üçün belə hallarda yalan danışmağı mümkün sayır. Amma unutmamalıyıq ki, bu istisna bir haldır. Yalnız xüsusi hallarda yalan danışmaq mümkündür. Məsləhətli yalan halaldır deyə, belə .yalanları vərdişə çevirmək günahdır

İslamda yalan o qədər çirkin sayılmışdır ki, hətta düzgün danışmaq mümkünsüz olduqda belə, yalan danışmaq yox, “tövriyyə” etməyə icazə verilir. Fəqihlər arasında bu termin çox işlədilir. Tövriyyə odur ki, yalan danışmaq zəruri olduqda yalan əvəzində elə bir cümlə işlədilsin ki, dinləyici deyilən sözü başqa cür anlasın. Məsələn, bir şəxs başqa bir şəxsin onun haqqında pis söz deyib-demədiyini soruşduqda cavab veririk ki, yox. Dinləyici elə başa düşür ki, biz onun haqqında pis söz eşitməmişik. Bizsə bu sözü deyərkən nəzərdə tuturuq ki, yox, yə’ni mən onun dediklərini deyə bilmərəm. Demək, .İslam dinində istisna hallarda yalana yox, tövriyyəyə icazə verilmişdir

Unutmamalıyıq ki, vəzifəsi tövriyyə etmək olan insan doğru danışarsa, günah etmişdir. Qeyd edək ki, Qur’an ayələrində heç bir məsləhətli yalan və tövriyyə haqqında .xatırlatma yoxdur

### ?Qadına cİsmanİ cəza vermək düzgündürmü .۳۶

Sual: Doğrudurmu ki, Qur’ani-məciddə qadınlıq vəzifəsini yerinə yetirməyənlərin ?tənbehinə icazə verilmişdir

Cavab: Heç şübhəsiz, İslam dini bütün qadın zümrəsinə misilsiz xidmətlər göstərmiş, onlara böyük hüquqlar vermişdir. Hətta İslama qərəzli münasibətdə olan qərb alimləri də öz kitablarında İslamın qadını ucaltdığını e’tiraf etmişlər. Con Kristofer, Luyi Volf kimi -məşhur qərb yazıçıları öz kitablarında bu həqiqəti açıq-aşkar təsdiqləmişlər. Qur’ani

kərimdə uyğun mövzu ilə bağlı bir çox göstərişlər verilmişdir. Allah-təala buyurur: “Onlar sizin, siz də onların libasısınız.”(۱) Qur’ani-kərimdə qadınlara tapşırılır ki, öz ərləri ilə .mehriban, xoş rəftarlı olsunlar

Bəs qadınlıq vəzifəsini yerinə yetirməkdən imtina edən qadını necə, tənbeh etmək olarmı? Qur’anda aşkar şəkildə bildirilir ki, ər əvvəlcə qadını nəsihət etməli, sonra ondan uzaqlaşmaqla tə’sir göstərməlidir. Heç bir tədbir səmərə vermədikdə, yükgül tənbehdən istifadə etmək olar. Əslində bu məsələ cərrahın xəstəni yarması kimi istisna .bir məsələdir

Qeyd etməliyik ki, ailə hüquqlarının yerinə yetrilməməsi səbəbindən tənbeh edilməsi təkcə qadına aid deyil. Hətta bu hüquqları yerinə yetirməkdən imtina edən ər də İslam .hökuməti tərəfindən cəzalandırıla bilər

Bir nöqtəni də qeyd etmək lazımdır ki, psixoloqlar qadınlarda “mazoşizim”, yə’ni əziyyətxahlıq halının mövcud olduğunu iddia edirlər. Bu hal qadınlarda böhran vəziyyəti də yarada bilər. Belə hallarda yüngül tənbeh onlara ruhi sakitlik verir. Onu da qeyd etmək lazımdır ki, tənbeh nəticəsində bədən yaralanmamalı, qaralma və göyərmə .müşahidə edilməməlidir

### ?İslam sün’İ mayalanmaya İcazə verİrmİ .۳۷

Sual: Son dövrdə tibbi müəssisələrdə hamilə ola bilməyən və ya çətin hamilə olan ?qadınlarda sün’i mayalanma aparılır. İslam bu sahədə hansı göstərişi verir

Cavab:Heyvanlarda və bitkilərdə süni mayalanma aparılmasının böyük tarixi var. İnsanlarda isə bu sayaq nəsil artımı yeni bir hadisədir. Hazırda qərbdə və Amerikada övlad istəyən qadınlar bu sayaq mayalandırılır. Onlar bu işdə hansı kişinin nütfəsindən istifadə olunmasına bir o qədər də əhəmiyyət vermirlər. Bu həm həmən qadının əri ola .bilər, həm də başqa bir kişi

Fransada bu məsələ qanunverici orqanlarla araşdırıldıqdan sonra belə bir qərar qəbul edildi ki, qadın və kişi bu işi görməkdə azaddır. Roma

papası sün'i mayalanmanı qadağan etdi, Misirin böyük müftisi belə bir işi müsəlmanlar .üçün haram buyurdu

Qeyd etməliyik ki, sün'i mayalanma iki şəkildə baş verə bilər: ١. Qadın öz ərinin nütfəsi ilə mayalandırıla bilər; Mayalandırma üçün götrülmüş nütfə başqa bir kişiyə də aid ola bilər. Birinci hal İslamda mümkün sayılmışdır. Çünki qanuni nikahda olan ər və arvadın övlad istəyi qanuni bir istəkdir. Övladın hansı üsulla olması isə əsas sayılmır. Sadəcə .mayalandırma aparılan zaman əməliyyatda biganə kişilər iştirak etməməlidir

Amma biganə bir kişinin nütfəsi ilə hamilə olmaq istəyən qadını mayalandırmaq İslam baxımından haramdır. Bundan əlavə, bu iş əxlaqi, ictimai, insani cəhətdən də özünü :doğrultmur. Biganə kişinin nütfəsi ilə mayalanmanın üç fəsadı ola bilər

Bu iş qadındakı iffət hissini pozar və qadın qeyri-qanuni əlaqələrə meyl göstərər. Bu .١ qadın elə düşünə bilər ki, zina ilə biganənin nütfəsi ilə mayalanma arasında elə bir fərq .yoxdur. Bu yolla qadınların əxlaqsızlığa yuvarlanması ehtimalı böyükdür

İctimai baxımdan bu məsələ ailə əsaslarına zərbə vurur. Cəmiyyətin nizamını tə'min .٢ edən ailə qurumu ata, ana və övladdan ibarətdir. Əgər ailədə ata yoxdursa, bu ailəni normal hesab etmək olmaz. Doğulmuş uşaq yetkinlik yaşına çatdıqda onda təbii bir sual yarınır: Mən kimin oğluyam? Ona nə cavab verilməlidir? Atasız övladın pisixoloji .sarsıntılara düçar olması labüddür. O təbii bir ehtiyacından məhrum edilmişdir

Tərbiyədə təbii hisslərin rolu böyükdür. Həmin təbii hisslər səbəbindən ata övladının .٣ tərbiyəsi ilə məşğul olur, onun həyat ehtiyaclarını tə'min edir. İnsan övladını o zaman dərin məhəbbətlə sevə bilir ki, onu öz canparəsi bilsin. Amma mə'lum olmayan bir şəxsin nütfəsindən yaranmış övlad hansı münasibətlə üzləşəcək? Belə bir uşağın sevilməsi də .şübhə doğurur

## ?Hamİləlİyİn qarşısını almaq olarmı .۳۸

?Sual: İslam qanunları hamiləliyin qarşısının alınmasına icazə verirmi

Cavab: İslam göstərişlərində insanlar nəsil artımına təşviq olunurlar. Həzrət Peyğəmbər (s) buyurur: “Evlənin, nəslinizi artırın. Çünki mən bütün ümmətim üçün, sizin artımınızla ”!fəxr edirəm. Hətta siqt olmuş (düşmüş) körpələrinizlə

Uyğun buyuruğun məqsədi aydındır. Çünki bütün millətlərin qüdrəti ilk növbədə onların sayından asılıdır. Adətən, az cəmiyyətə malik olan millətlər zəif olur. Böyük cəmiyyətə malik olan ölkədə kimlərsə iqtisadi cəhətdən çətinlik çəksə də, hər halda çoxluq əzəmət nişanəsidir. Bu gün dünyada öz qüdrəti ilə tanınan əksər ölkələr çox cəmiyyətli ölkələrdir. Bir iş qalır ki, yer üzündə ərzaq problemi həll edilməmişdir. İslamda hamiləliyin qarşısının alınması məzəmmət olunur. Yalnız və yalnız valideyn övladını yetərincə tərbiyə edə bilmədikdə bu işə icazə verilir. İslamda belə bir iş haram edilməmişdir. Hər iki tərəfin razılığı ilə hamiləliyin qarşısı alına bilər. Demək, ictimai problemlər və tərbiyə çətinlikləri səbəbindən hamiləliyin qarşısının alınması mümkündür. Başqa problemlər də ola bilər. Məsələn, qadın fiziki cəhətdən zəif olduqda hamiləliyin qarşısının alınması .mümkündür

Amma qeyd etməliyik ki, hamiləliyin qarşısının alınmasında da məhdudiyyətlər vardır. Nütfə bağlandıqdan, bətində formalaşma getdikdən sonra bu işi görmək qəti şəkildə .haramdır. Hətta bir günlük nütfə bağlanmışdırsa hamiləliyin qarşısı alına bilməz

## ?Qeyrİ–qanunİN körpənİn sİqtİnİ (salınmasının) hökmü nədİr .۳۹

Sual: Əgər bir şəxs qeyri-qanuni körpənin siqtinə (düşməsinə) səbəb olarsa, qanuni ?körpənin siqti üçün tə’yin olunmuş diyənimi ödəməlidir

Cavab: İstər qanuni, istərsə də qeyri-qanuni körpənin salınmasına (siqtinə) icazə verilmir. Körpənin düşməsinə səbəbkar olmuş

insan diyə ödəməlidir. Qeyri-qanuni körpənin siqt diyəsi onun ata-anasına çatmır. Halal körpənin siqt diyəsi isə körpənin varislərinə çatır. Amma günahkar ata-ana özü olduqda .kimsəyə diyə ödənmir

### Qanköçürmə .۴۰

Sual: Bu gün dünyanın əksər xəstəxanalarında qan azlığından əziyyət çəkən insanlara başqalarının qanı köçürülür. Müqəddəs İslam şəriəti baxımından qadına naməhrəm ?kişinin qanı köçürülə bilərmi

Cavab: Fiqhi baxımdan bu sayaq qanköçürmənin eybi yoxdur. Amma kişinin qanından kişiyə, qadının qanından qadına köçürülsə, daha yaxşıdır. Bununla belə, qanköçürmədə .naməhrəmlik baxımından heç bir məhdudiyyət yoxdur

### ?Məcburİ şəkİldə qılınan namaz qəbuldurmu .۴۱

Sual: İslam fəqihləri bildirirlər ki, namaz qılanlar Allaha itaət məqsədi ilə namaz qılmalıdırlar. Riyakarlıqla, ad-san qazanmaq məqsədi ilə, başqalarını razı salmaq üçün qılınan namaz batildir. Çünki belə namazda xalis niyyət olmur. Deyilənlərdən belə çıxmırmı ki, başqalarının tə’kidi ilə, məcbur olub namaz qılan şəxsin ibadəti qəbul deyil? Bə’zi ölkələrdə insanları cəmiyyət namazına məcbur edirlər. Belə bir məcburiyyət ?düzgündürmü

Cavab: Dərin araşdırmalardan sonra bə’zi İslam alimləri belə bir qərara gəlmişlər ki, hətta ilk əvvəl məcburi şəkildə yerinə yetirilən ibadətlər də getdikcə məhiyyətini dəyişir və insanda ixlas halı yaranmağa başlayır. Tutaq ki, bir şəxs bir il namazını məcbur şəkildə qılmışdır. Sonradan onda ilahi hisslər oyanmış və ibadətini ixlasla yerinə yetirmişdir. Onun əvvəlki bir ildə qıldığı namaz batildir. Çünki namazda niyyət şərtdir. .Amma sonradan ilahi niyyətlə qılınan namazlar Allah dərgahında qəbuldur

İnsanların cəmiyyət namazına vadar olunması haqqında bunu deyə bilərik ki, əgər bir cəmiyyətdə insanlar məcburi şəkildə cəmiyyət namazına gətirilirsə, onlar bütün namaz boyu onları bu cərgədə durğuzanlara qarğış da edə bilərlər. Amma əgər məcburi şəkildə gətirilən insan səmimi qəlbdən niyyət edib cəmiyyət namazına qoşulursa, təbii ki, .cəmiyyət namazının savabından faydalanır

**?Zöhr və əsr (günorta və İkİndİ) namazlarını yubadıb axşama yaxın qılmaq olarmı .۴۲**

Sual: Tez-tez belə hallarla rastlaşırıq ki, bə’ziləri dünya işlərinə məşğul olub axşama ?yaxın günorta və ikindi namazlarını qılırlar. Bu düzgündürmü

Cavab: Bilməliyik ki, zöhr və əsr namazlarının həm xüsusi vaxtı var, həm də müştərək vaxtı. Xüsusi vaxt o deməkdir ki, həmin vaxtda uyğun namazdan başqa namaz qılmaq olmaz. Məsələn, günorta azanı verildikdən sonra dörd rəkətlik bir müddətdə yalnız və yalnız günorta namazı qılmaq olar. Gün batmazdan qabaqkı dörd rəkət vaxt isə əsr namazına məxsusdur. İki vaxtın arasında qalan vaxt müştərək vaxt adlanır və həmin bu müştərək vaxtda zöhr və əsr namazlarını ardıcıl qılmaq olar. Amma namazı fəzilətli vaxtında qılmaq istəyənlər bilməlidirlər ki, zöhr namazının ən fəzilətli vaxtı günortadan budağın kölgəsi özü boyda olana qədərdir. Elə ki, ağac budağının kölgəsi onun həqiqi ölçüsü boyda oldu, zöhr namazını fəzilətli vaxtı bitir və əsr namazının vaxtı başlayır. Günorta namazını axşama yaxın qılan şəxs onu müştərək vaxtında qılmış olur. Bu vaxt günorta namazının fəzilətli vaxtı deyil. Təbii ki, namazı fəzilətli vaxtında qılmağa imkan .tapmayanlar onu axır vaxtınadək qılmalıdırlar

## ?Namazın qəbul olub–olmamasının başqa əməllərİn qəbul olunmasına tə'sİrİ varmı .۴۳

Sual: Bə'ziləri İslam fiqhini tənqid edirlər ki, nə üçün namaz qəbul olmadıqda başqa əməllər də qəbul olmamalıdır? Namazın qəbul olunması üçün elə şərtlər qoyulur ki, bu şərtləri tam şəkildə yerinə yetirmək qeyri-mümkündür. Bu şərtlərə çox az adam əməl edə bilər. Elə çıxır ki, çoxlarının etdiyi saleh işlər namazları qəbul olunmadığından ?faydasız qalır. Doğrudanmı, namazı qəbul olunmayanın heç bir işi qəbul deyil

Cavab: Əvvəla, fiqh kitablarından mə'lum olur ki, namazın qəbul olma şərtləri ağır deyil. Namaza diqqətli olan hər bir insan bu şərtləri yerinə yetirə bilər. Risalələri nəzərdən .keçirsəniz, deyilənlərin həqiqət olduğunu e'tiraf edərsiniz

İkincisi namazın və digər əməllərin Allah dərgahında dərəcələri vardır. Ali dərəcədə qəbul olmayan namaz nisbətən aşağı dərəcədə qəbul oluna bilər. Əslində bütün ibadətlərin qəbul dərəcəsi vardır. Digər əməllər də namazın qəbul olduğu dərəcədə .qəbul edilir

Daha aydın desək, namaz düzgün qəbul olsa, İslam göstərişlərinə uyğun şəkildə yerinə yetirilərsə, Allah dərgahında qəbuldur. Amma insanın qəlbi və ruhu pak olduqca, o zülm-sitəmdən, günahdan çəkindikcə ibadətinin qəbul dərəcəsi də yüksəlir. Demək, hər bir .əməlin dəyəri onu yerinə yetirənin ruhiyəsindən asılıdır

## ?Yer kürəsİnİn qütblərİndə namaz və oruc İbadətlərİ necə yerİnə yetİrİlməlİdİr .۴۴

Sual: Bə'ziləri irad tuturlar ki, İslam göstərişləri yer kürəsinin bə'zi məntəqələrinin coğrafi mövqeyinə uyğun gəlmir və onu ümumbəşəri din saymaq olmaz. Onlara elə gəlir ki, yer kürəsinin şimal və cənub qütblərində gecə və gündüz hər biri bə'zən ۶ ay çəkdiyindən İslam göstərişlərinə həmin ərazidə əməl etmək mümkünsüzdür. Sualda qeyd

edilmiş məsələlər İslam hökmlərində nəzərə alınmışdırmı? İslam ayinlərinin icrası bütün ?zaman və məkanlarda mümkündürmü

Cavab: Uyğun məsələlər fiqhi kitablarda araşdırılmış və zəruri göstərişlər verilmişdir. Məsələn, mərhum Ayətullah Seyyid Məhəmməd Kazim Yəzdi “Urvətül-vüsqa” risaləsində bu məsələ barədə belə buyurur: “Həmin məntəqələrdə yaşayanlar öz namaz və oruclarını dünyanın başqa məntəqələrində mövcud olan şəraitə uyğun yerinə yetirməlidirlər.” Yə’ni qütbdə yaşayan insan dünyanın başqa nöqtələrində gecə və gündüzün orta uzunluğunu öyrənməli və həmin proqram əsasında namaz qılıb, oruc .tutmalıdır

Bəli, qütb məntəqələrində bə’zən günəş ۶ ay səmada qalır və qürub etmir. Bununla belə, o ۲۴ saatda bir dəfə üfüqü dövr edir. Günəşin üfüq ətrafında dövrləri bir-birindən fərqlənir. O bə’zi dövrəsində yuxarı qalxır, bə’zi dövrəsində isə aşağı enir. Ona görə də hava bə’zən işıqlı, bə’zən azca qaranlıq olur. Bu vəziyyət hər gün təkrarlanır. Günəşin .üfüq boyu hərəkəti dəqiq izlənilərsə, yüxarıda deyilənlər aydın olar

Qütbdə yaşayanlar günəşin yuxarıda olduğu vaxtı gündüz, aşağı düşdüyü vaxtı isə gecə sayırlar. Günəşin aşağıda olduğu vaxtlar dünyanın bə’zi yerlərində gecə olur. Bu yolla qütbdə gecə və gündüzü tə’yin etmək mümkündür. Əgər yerə bir nişangah vurulsa, bu nişangahın kölgəsi qısa həddinə çatdıqda günorta olur, uzun həddinə .çatdıqda isə gecə. Bu yolla gecə və gündüzü tə’yin etmək olur

Dünyanın başqa məntəqələrində gecə və gündüzün uzunluğunu nəzərə aldıqda çıxış yolu tapılır. Məsələn, adətən, yay aylarında gün ۱۴ saat, gecə isə ۱۰ saat olur. Qütbdə .də bu proqramla hərəkət etmək olar

Altı aylıq gecələrdə də uyğun qayda ilə hərəkət etmək olar. İyirmi dörd saat ərzində hava eyni qaranlıqda qalmır. O bə’zən işıqlaşır, bə’zən isə tamamilə qaranlıq olur. Günəş üfüqə yaxınlaşdığı vaxt havadakı qaranlıq nisbətən azalır. Həmin vaxtı gündüz saymaq .lazımdır. Tamamilə zülmət çökdüyü vaxt isə gecə sayılmalıdır

Həmin uzun gecələrdə ulduzlar arasındakı və ulduzlarla üfüq arasındakı məsafəyə əsasən günortanı və gecəyarını tə'yin etmək mümkündür. Demək, şimal və cənub qütblərində vaxt adi yerlərdə olduğu qayda üzrə müəyyənləşdirilir və ibadətlər yerinə .yetirilir

**Namazın İlkİn, fəzİlətlİ vaxtı .۴۵**

Sual: Bə'zi alimlər bildirirlər ki, əsrin imamı məhz namazı ilkin vaxtında qılır və bu məsələni həmin vaxt üçün fəzilət sayırlar. İlkin vaxtda qılınan namaz imamın namazı bərəkətindən Allah dərgahında qəbul olunasıdır. Axı yerin ayrı-ayrı məntəqələrində namaz vaxtları fərqlidir. Bəs necə olur ki, ayrı-ayrı vaxtlarda qılınan namaz imamın namazı ilə üst-üstə ?düşür

Cavab: Namazın ilkin vaxtını, imam məhz həmin vaxtda namaz qıldığı üçün fəzilətli sayanların məqsədi budur ki, istənilən bir işdə imamsayağı hərəkət edilməsi həmin işin fəzilətini artırır. Yə'ni nəzərdə tutulan hansısa dəqiq bir saat yox, namazın ilkin vaxtda qılınması məfhumudur. Bəli, hərə öz üfüqünə uyğun namazı ilk vaxtında qıldıqda imamın .yolunu getmiş olur

**SUAL: Namazda qİblə şərtdİrsə, nə üçün qİbləni tapa bİlməyən şəxs şərtİ qİbləyə .۴۶ ?doğru namaz qılmalıdır**

Cavab: Namaz dinin zəruri hökmlərindəndir və heç bir şəraitdə insanın öhdəsindən götürülmür. Bəli, namazın şərtlərindən biri qiblədir. Amma namaz ona görə qibləyə doğru qılınmır ki, Allah-təalanın qiblə istiqamətdə məkanı var. Qur'ani-kərimdə buyurulur: ("Şərq də qərb də Allahındır. Üzünüzü hara tutsanız Allah oradadır."(۱

Demək, əsas məsələ insanın ibadət etməsidir. İbadət üçün şərt bilinmiş işlər nisbi xarakter daşıyır. Məsələn, namazdan qabaq dəstəmaz almaq vacibdir. Amma su tapılmadıqda təyəmmümlə də kifayətlənmək olar. Bütün bunlar namazın zərurətindən danışır. Ona görə də namaz vaxtı çatdıqda qiblə istiqamətini tə'yin edə bilməyən şəxs .şərti qibləyə doğru namaz qılmalıdır

## ?Ərəbcə danışmaqda çətİnlİk çəkən latındİllİlər necə namaz qılsınlar .۴۷

Sual: Latın dilində danışanlar İslamı qəbul edib namaz qılmaq istəsələr və ərəb dilində ?danışmağa çətinlik çəksələr, namazı necə qılsınlar

Cavab: Əksər latın dillilərin təhsilli olduğunu bilirik. Təhsilli insanlar üçün ərəb dilində namaz qılmaq, Qur'anı öyrənmək çətin olmur. Onların əksər universitetlərində ərəb dili şərqşünaslıq məqsədi ilə öyrənilir. Həmin universitetlərin dil fakültələrində ərəb dili son .incəliklərinədək öyrədilir

Allah kimsədən gücündən artıq istəməmişdir. Savadsız latındillilər öz isde'dadları həddində çalışsalar, kifayət edər. Ümumiyyətlə, dini hökmlərin icrası insanın qüvvə və iste'dadından asılıdır. İslam kimsəyə gücü çatmayan bir göstəriş verməmişdir. Bundan əlavə, çətinliklə öyrənilən bir işin savabı daha artıq olur. Ona görə də latındillilər və başqa xalqlar namazın sözlərini imkanları həddində düzgün tələffüz etməyə .çalışmalıdırlar

## ?sual: İmamların qəbrİnə səcdə etmək olarmı .۴۸

Cavab: Əvvəlki söhbətlərimizdə qeyd etdiyimiz kimi, səcdə yalnız Allaha aiddir. Ondan qeyrisinə səcdə etmək olmaz. Mə'sum imamlara və başqa ilahi övliyalara səcdə etməyə .icazə verilmir. Hansısa müsəlman qəbirə səcdə edirsə, bu onun cəhalətini göstərir

Bunu da qeyd etməliyik ki, namaz qılınarkən alının müqəddəs yerlərdən götrülmüş torpağa qoyulması həmin torpaq sahibinə yox, Allaha səcdədir. Sadəcə, Allaha səcdə edərkən, məsələn, imam Hüseyn (ə) kimi bir mə'sumun qəbrindən götürülmüş torpağa səcdə etmək insanda xüsusi bir ruhiyyə yaradır. Kərbəla türbətinə səcdə şəhidlər ağası imam Hüseynin (ə) fədakarlığını yada salır. Səcdə edilən Kərbəla torpağının tə'siri .insanın qəlbində fədakarlıq eşqini alovlandırır

## ?SUAL: Boks kİmİ ağır İdman növlərİ halal sayılırmı .۴۹

Cavab: Haram əməllərlə müşayiət olunmayan və insan orqanizmi üçün faydalı olan bütün idman növləri halaldır. Amma hər hansı bir idman növü idmançının və ya onun rəqibinin sağlamlığı üçün təhlükəli olarsa, o, haram sayılır. Bəli, insan həyatına son qoyan idman növləri də var. Demək, bir idman növünün halal olub-olmaması onun .insana, cəmiyyətə faydası ilə ölçülür

## Amerikalı bİr müsəlmanın sualları .۵۰

Sual ۱: Amerikanın müxtəlif ştatlarında nikah hüquqları fərqlidir. Bu ölkədə izdivacı qeydə alası İslam nümayəndəsi tapmaq çətin olur. Zərurət yarandıqda bu nikahı kim ?qeydə almalıdır

Cavab: Amerikalı kişi və ya qadın evləndikləri vaxt izdivac əqdini oxuya bilən bir şəxsi vəkil tuta bilərlər. Əqd oxunduqdan sonra bu izdivac qanuni olur. Belə bir vəkil tapmaq çətin olduqda kişi və qadın izdivac əqdlərini özləri oxuya bilərlər. Hətta ərəb dilini bilmədikləri vaxt izdivac əqdini ingilis dilində də oxumaq olar. İslamda qadın üçün mehriyyə tə’yin olunması vacib deyil. Amma mehriyyə tə’yin olunmamış, nikah bağlanarsa, qadın sonradan istədiyi bir məbləği kişidən tələb edə bilər. Mehriyyə tə’yin .olunması zəruri olsa da, qadın mehriyyəni ərinə bağışlaya bilər

Sual ۲: Amerikada və bir çox qərb ölkələrində cümə günləri cümə namazına toplanmaq iş ?rejimi baxımından mümkünsüz olur. Başqa vaxtlarda cümə namazı keçirmək olarmı

Cavab: Cümə namazı üçün xüsusi vaxt tə’yin edildiyindən bu vaxta riayət etmək .lazımdır. Başqa vaxtlarda cümə namazı qılmaq olmaz

Sual ۳: Amerikalı müsəlman qadın məsciddə namaz qılmaq üçün xüsusi libas geyməlidir, ?yoxsa əynindəki libas kifayət edər

Cavab: Müsəlman qadının namaz üçün xüsusi bir geyim geyməsi zəruri deyil. Əsas məsələ odur ki, qadın namaz zamanı bütün bədənini (əlləri və ayaqlarından savayı) örtməlidir.

Sual ۴: Deyirlər ki, "Əşhədu əlla ilahə illəllah, əşhədu ənnə Məhəmmədən rəsulullah" kəlmələrini deyən şəxs müsəlman olur. Müsəlman olmağın şərti təkcə budur, yoxsa başqa şərtlər də var? Məsələn, bu sözləri dediyi halda namaz qılmayan, zəkat ödəməyən, oruc tutmayan, haramdan çəkinməyən bir insanı müsəlman saymaq olarmı?

Cavab: Müsəlmanlığın mərhələləri vardır. İlkin mərhələdə şəhadət kəlmələri deyilir. Növbəti mərhələdə ilahi göstərişlərə əməl olunmalıdır. Əlbəttə ki, əməllə müşayiət olunan iman insanı səadətə çatdıra bilər.

Şəhadət kəlmələrini söylədiyi halda ilahi göstərişlərə əməl etməyən şəxs müsəlmanlıq haqlarına malik olsa da həqiqi müsəlman sayılmır.

Sual ۵: Yetkinlik yaşına çatmış bir amerikalı İslamı qəbul edərsə, o, xətnə (sünnət) olunmalıdırmı?

Cavab: Müsəlmanın xətnə olunması vacibdir. Yetkinlik yaşına çatdıqdan sonra İslamı qəbul edən kişilər də xütnə olunmalıdır.

Sual ۶: Amerikalı müsəlman kimə və nə qədər zəkat ödəməlidir?

Cavab: Aylıq məvacibin zəkatı yoxdur. Aylıq qazanca aid olan isə xümsdür. Amerikalıların əksəri ticarət və sənətlə məşğul olduqlarından, adətən, xüms vermələri vacib olur. İllik qazanc hesablanmalı, bütün illik xərclər çıxıldıqdan sonra artıq qalan hissəsinin beşdə biri İslam "beytül-malına", xəzinəsinə verilməlidir.

Onu da qeyd edək ki, həmin beşdə birin yarı hissəsi, yə'ni ümumi xümsün onda biri fəqir seyidlərə çatır. Qalan hissə isə ədalətli müctehidin göstərişi üzrə xərclənilir. Aylıq maaş alan şəxs illik qazancını on iki hissəyə bölüb, hər ay müəyyən məbləğ xüms ödəyə bilər.

Sual ۷: Amerikada və qərbdə əksər insanlar yaşayış məskənlərini, maşını, soyuducunu və sair ehtiyac duyduqları avadanlıqları nisyə almağa məcburdurlar. Bütün bu əməliyyatlarda faiz alındığından, qorxu yaranır ki, haram iş görülmüş olar. Vəzifəmiz ?nədir

Cavab: İslamda faizlə borc almaq və ya vermək haramdır. Nisyə qiymət nağd qiymətdən .fərqlənmiş olsa, belə bir alış-verişin eybi yoxdur

Sual ۸: Amerikalı müsəlman Amerika məhkəmə orqanlarına müraciət edə bilərmi? Amerikalı müsəlman müsəlman olmayan qeyri bir amerikalını vəzifəyə tə’yin edə bilərmi? ?Əgər amerikalı müsəlman İncilə and içirsə, bu iş nə dərəcədə düzgündür

Cavab: Əgər başqa yolla haqqı tələb etmək mümkün deyilsə, amerikalı müsəlman öz haqqını almaq üçün uyğun məhkəmə orqanlarına müraciət edə bilər. Amerikalı müsəlman qeyri-müsəlman amerikalını hansısa vəzifəyə seçə bilər. bir şərtlə ki, həmin şəxs tutacağı vəzifədən İslama və müsəlmanlara qarşı istifadə etməsin, kimsənin haqqını .tapdamasın

İncilə və ya Tövrata and içən şəxs bu kitablar təhrif olunmuş olsa da andlarına əməl .etsə yaxşıdır. Amma İslam baxımından belə bir andı pozmağın kəffarəsi yoxdur

Sual ۹: Deyirlər ki, müsəlman kişi kitab əhlindən olan qadınla evlənə bilər. Amma müsəlman qadın kitab əhlindən olan kişiyə ərə gedə bilməz. Bu doğrudurmu? Nə üçün bütpərəstlərlə izdivac qadağan edildiyi halda, üç üqnuma inanan, əslində müşrik olan məsihilərlə izdivac qadağan olunmur? Deyirlər ki, kifirlərlə izdivac qadağandır. Bu halda müsəlman bir şəxs kommunist partiyasının üzvü ilə evlənə bilərmi? Allahı nəzəri bir ideya kimi qəbul edənlərlə ailə qurmaq olarmı? Amerikalı müsəlman katolik məsihi ilə evlənə bilərmi? Belə bir izdivacda katolik kilsəsində nikahı keşişə qeydə aldırmaq vacib olur. .Qeydiyyatdan sonra isə doğulan uşaq katolik tərbiyəsi almalıdır

Cavab: Müsəlman kişi kitab əhlindən olan qadınla evlənə bilər. Amma bu izdivac daimi yox, müvəqqəti izdivac olmalıdır. Adətən, ailədə qadın kişinin əqidəsinə tabe olduğundan müsəlman qadının kitab əhlindən olan kişiyə ərə getməsinə icazə verilməmişdir. İslam nəzərində məsihilərlə bütpərəst müşriklər arasında fərq vardır. İslam bütpərəsti heç vəchlə rəsmi tanımır. Çünki bütpərəstlər Allaha e’tiqaddan sonra Peyğəmbərə e’tiqadı zəruri saymır və qəbul etmirlər. Nübuvvətə e’tiqalı olmayan insanların hidayəti qeyri-mümkündür. Müşriklərin şirki aşkardır. Əgər məsihilərin .əqidəsində şirk əlamətləri varsa, bütpərəstlik başdan-ayağa şirkdir

Allaha inanmayan şəxslə evlənmək olmaz. Ona görə də müsəlman kişi allahsız qadınla ailə qurmamalıdır. Eləcə də, müsəlman qadın allahsız kişiyə ərə gedə bilməz. Ona görə də Allahı nəzəri bir ideya kimi bilənlərlə izdivaca icazə verilmir. Sonuncu suala gəldikdə .isə, heç bir müsəlman öz övladına katolik tərbiyəsi verəcəyini öhdəsinə götürə bilməz

Sual ۱۰: Amerikalı müsəlman İslam bayramlarından savayı başqa bayramlarda iştirak edə bilərmi? Müsəlmanın yeni il bayramı keçirməsi, hədiyyə qəbul edib hədiyyə verməsi necə ?qiymətləndirilir

Cavab: Müsəlmanın qeyri-islami adət-ən’ənələri genişləndirməsi düzgün deyil. Onu da qeyd edək ki, qeyri-islami bir bayramın mahiyyətində şirk və başqa xoşagəlməz .əlamətlər olur. Müsəlman şəxs İslam ən’ənələrini əsas götürməlidir

Sual ۱۱: Amerikada dəfn zamanı mikroba yoluxmanın qarşısını almaq üçün kimyəvi maddələrdən istifadə olunur. Cənazə tabuta qoyulur. İslam bu işlərə icazə

verirмi? Cənazə hökмən ağ parçaya bükülмəlidirмi? Ölünü kostyuмda dəfn etмək olмazмı? Cəsədi yandırмaq olarмı? Dəfn мərasiмi kilsədə keçrilə bilərмi? İslaмi ?cəмiyyətdən uzaqda yaşayan bir insanın vəzifəsi nədir

Cavab: Meyitin İslaм qaydalarına uyğun şəkildə kəfənə bükülмəsi vacibdir. Ona görə də ölünü adi libaslarla dəfn etмəyə icazə verilмir. Aмма vacib deyil ki, kəfən ağ parçadan olsun. İslaм baxıмından cəsədi yandırмaq haraмdır. Cəsəd torpaqda dəfn .olunмalıdır

Sual ۱۲: Əgər bir restoranda donuz ətindən və ya digər haraм qidalardan istifadə olunub-olunмadığını bilмiriksə, orada nahar edə bilərikмi? Eləcə də satışda olan ətlərin islaмi qaydada kəsildiyinə əмin deyiliksə, nə etмəliyik? Yəhudilərin kəsdiyi heyvandan ?istifadə etмək olarмı

Cavab: Qeyri-islaмi мühitlərdə ətdən o zaмan istifadə etмək olar ki, ya restoran sahibi мüsəlмan olsun, ya da əti satan kəs. Bu hallarda ehtiмal olunur ki, iş sahibi мüsəlмan .olduğundan vəzifəsinə əмəl etмişdir

Aмма ətin şər’i qaydada kəsildiyinə şübhə yoxdursa, onu satanın мüsəlмan olмası vacib deyil. İstər yəhudilərin, istər мəsihilərin kəsdiyi ətdən istifadə мüsəlмana .qadağandır

Sual ۱۳: Aмerikalı мüsəlмan həcc əмəlini yerinə yetirмək üçün nə etмəlidir, bu səfərin ?xərci nə qədərdir

Cavab: Dünyanın istənilən bir nöqtəsində yaşayan мüsəlмanın illik xərcindən artıq qalan мəbləğ həcc əмəlini yerinə yetirмəyə kifayət edirsə, bu əмəli yerinə yetirмəlidir. Səfər xərci haqında мə’luмat toplaмaq üçün Aмerikadakı hava yolları şirkətinə .мüraciət edib мə’luмat alмaq olar

Sual ۱۴: Aмerikanın мüxtəlif ştatlarında varislik hüquqları bir-birindən fərqlənir və ?adətən, İslaм qanunlarına uyuşмur. Aмerikalı мüsəlмanların bu sahədə vəzifəsi nədir

Cavab: Əgər Amerikadakı uyğun qanunlar İslam qanunları ilə uyuşmursa və müsəlmanlar İslam qanunlarına əməl etmək imkanına malik deyillərsə, mövcud qanunlara .riayət etmələri günah deyil

Sual ۱۵: İslam qanunlarında islami suğorta ticarət suğortalarından üstün tutulurmu? Az bir məbləğlə ticari suğorta müqaviləsi bağlayan müsəlmanın vəzifəsi nədir? O belə bir ?suğorta təşkilatının səhmlərini sata bilərmi

Cavab: İslam nəzərindən həm ticarət, həm də ümumi suğorta qanunidir. Müsəlman özünü ticarət suğortası ilə suğortalaya bilər və səhmlərin satışı ilə məşğul olmağa icazə .verilir

**?Qadının İctİmaİ vəzİfəsİ nədİr .۵۱**

Sual: İslam qanunlarına əsasən, qadın ev işlərini görməyə, öz övladına süd verməyə, onu saxlamağa borclu deyil. Uşağın bütün xərcləri atanın öhdəsinədir. Bu işlərin heç biri ?qadına vacib deyilsə, onun hansı ictimai vəzifəsi var

Cavab: İslam qadının şəxsiyyətini qorumaq məqsədi ilə yuxarıda sadalanan işləri ona vacib etməmişdir. Əlbəttə ki, qadın öz razılığı ilə bu işlərlə məşğul ola bilər. Bilməliyik ki, bir işin vacib olmaması onun qadağan edilməsi deyil. Bəli, İslam qadının məqamını ucaltmaq üçün onu ev işlərindən, çöl işlərindən azad etmişdir. Bu işləri görüb-görməmək qadının öz istəyindən asılıdır. Əlbəttə ki, övladını fitri bir məhəbbətlə sevən ana ona qayğı göstərəsidir. Ananın ağlına da gəlmir ki, öz körpəsinə süd vermək müqabilində ərindən pul alsın. Eləcə də, qadın ev işlərini görməyə maraqlıdır. Bir qadına ev işləri görmək qadağan edilərsə, qadın narahat olar. Eləcə də qadın heç bir məcburiyyət olmadan körpəsinə qulluq edir, həm də ev-eşiyi səliqə-səhmana salır. Müsəlman .qadınlar daim bu işləri görmüş, zəruri olduqda isə şər'i hüquqlarından bəhrələnmişlər

## ?Xümsü Peyğəmbərlİk haqqı saymaq olarmı .۵۲

Sual: Şübhəsiz ki, İslam Peyğəmbəri öz əzab-əziyyəti müqabilində heç bir əvəz istəməmişdir. Qur’anın bə’zi ayələrindən mə’lum olur ki, Həzrət, yalnız Əhli-beyti ilə dostluğu özü üçün mükafat saymışdır. Əhli-beytə məhəbbət özü də əslində xalqın ehtiyaclarına cavab verir. Belə ki, bu ailə ilə dostluq insanların tərbiyələnməsi vasitəsidir. Bununla belə, müsəlmanlar üçün vacib edilmiş xüms ödəncinin yarı hissəsinin seyidlərə məxsus olması təəccüb doğurur. Xümsün ikidə bir hissəsinin seyidlərə ?verilməsi Peyğəmbər muzdu sayıla bilərmi

Cavab: Əvvəla bilməliyik ki, xümsün yarı hissəsini fəqir, yoxsul seyidlərə vermək olar. Bundan əlavə, yoxsul seyidlərin ehtiyacını ödədikdən sonra həmin yarı hissədən artıq qalarsa, həmin artıq hissə ümumi ehtiyaclara xərclənir. Xümsün yarı hissəsi yoxsul seyidlərin ehtiyacını ödəmədikdə beytül-maldan çatışmayan hissə tə’min olunur. Amma bunu da qeyd etməliyik ki, toplanmış zəkatdan yoxsul seyidlərə pay düşmür. Yalnız varlı seyidlərin zəkatını yoxsul seyidə vermək mümkündür. Demək, zəkat bütün yoxsullara ödənir, xümsün isə yarı hissəsi yoxsul seyidlərə. Bəs seyidlərin hər hansı şəkildə başqalarından fərqləndirilməsinin səbəbi nədir? Məqsəd Peyğəmbər ailəsinə məxsus olan seyidlərin şəxsiyyətini qorumaqdır. Bu nəsildən olan yoxsullara hörmət Peyğəmbərə hörmətdir. Gəlin e’tiraf edək ki, Peyğəmbər nəslindən olanların əl açaraq dilənməsi onların dinlə bağlı adlarına nöqsan gətirərdi. Elə bu səbəbdən də seyidlərin .dilənməsi məzəmmət olunmuşdur

## ?Xüms ayrı seçkİlİK yaradırmı .۵۳

Sual: Keçmiş kommunist ideoloqlarından biri deyir: “Mən bütün dinləri mütaliə etdim ki, onlardan birinə əqidəmi bağlayam. İslam dinini bütün dinlərdən üstün gördüm. Amma təəssüf ki, bu dində də zəif bir nöqtə tapdım. Mə’lum oldu ki, İslam qanunlarında Peyğəmbər övladlarına xüsusi imtiyazlar verilmişdir. Xümsün bir hissəsinin onlara aid ?edilməsi ayrıseçkilik yaradır.” Doğrudanmı, xums ayrıseçkilik yaradır

Cavab: Əvvəlki sualın cavabında deyildiyi kimi, xüms də zəkat kimi yoxsullara verilən yardımdır. Yə'ni hər iki yardım fəqirlərə, məhrum təbəqəyə aiddir. Sadəcə, Peyğəmbər .nəslindən olan seyidilər xümsdən, başqaları isə zəkatdan pay alırlar

Seyidlər üçün başqa bir büdcənin tə'yin olunması həzrət Peyğəmbər şəxsiyyətinə göstərilən hörmətdir. Seyid olmayan yoxsulların hansı büdcədən pay almasının fərqi yoxdur. Əsas məsələ odur ki, başqa yoxsullar da tə'min olunurlar. Əgər seyid .olmayanlar xümsdən pay almırsa, seyidlər də zəkatdan pay almır

### Oğlanların və qızların büluğ (yetkİnlİk) həddİ .۵۴

Sual: Fiziologiyada sübuta yetrilmişdir ki, qadın fiziki cəhətdən kişidən zəifdir. Bununla belə, İslam qanunlarında qızların doqquz, oğlanların isə on beş yaşında yetkinliyə ?çatdığı bildirilir. Bunu necə izah etmək olar

Cavab: Qadın kişiyə nisbətən daha sür'ətlə inkişaf edir. Kişinin on beş ildə keçdiyi dövrü qadın doqquz ildə keçir. Bu xüsusiyyət təkcə insana aid deyil. Bütün heyvanlarda və bitkilərdə də uyğun xüsusiyyət müşahidə olunur. Zəif növ inkişafını daha qısa müddətdə başa çatdırır. Nilufər çinardan daha tez inkişaf edir. Bir sözlə, lətif incə, zəif olan varlıqların inkişaf dövrü də qısadır. Möhkəm, kobud varlıqların inkişafı daha uzunmüddətli olur. Ona görə də əksər qızlar on üç, on dörd yaşında analıq hazırlığına .malik olurlar. Hansı ki, oğlanlar həmin yaşda ata olmaq qabiliyyətinə malik olmurlar

### ?Dİnİ məsələlərdə araşdırma aparılmalıdır, yoxsa təqlİd edİlməlİdİr .۵۵

Sual: Bə'ziləri təqlidə qarşı çıxaraq iddia edirlər ki, insan öz dini məsələlərini Qur'andan və digər dini mənbələrdən öyrənməlidir. Onlar əsas göstərirlər ki, Qur'an təqlidçiliyi pisləyir və kor-koranə ardıcıllığı məzəmmət edir. Onların nəzərincə, təqlid dəlilsiz tabeçilik deməkdir. Və ağıl dəlilsiz tabeçiliyi qəbul etmir. Onlar düşünürlər ki, təqlid müsəlman

toplumunda pərakəndəlik yaradır. Bunun səbəbi isə çox saylı müctəhidlərin fərqli ?hökmlər verməsidir. Bəs həqiqət nədir

Cavab: Əvvəla, bilməliyik ki, təqlid sözünün iki mə'nası var. Gündəlik danışıqda işlətdiyimiz təqlid kəlməsi ilə alimlərin, fəqihlərin danışıqlarındakı təqlid kəlmələri fərqlənir. Yuxarıdakı bütün iradlar birinci növ təqlidə aiddir. Fiqh elmindəki təqliddə isə .yuxarıda sadalanan xüsusiyyətlərin heç biri yoxdur

Gündəlik anlamda təqlid dedikdə nadan insanların gözünü və qulağını qapayıb, başqalarının ardına düşməsi nəzərdə tutulur. Bu sayaq kor-koranə təqlid olduqca çirkindir və nə məntiqə, nə də İslam tə'limlərinin ruhuna sığır. Düşüncəli və şəxsiyyətli .heç bir şəxs gözübağlı halda başqalarının dalına düşüb, onların əməllərini təkrarlamaz

Bütpərəstlər də eynən bu sayaq təqlid edir və deyirdilər: "Bütpərəstlik bizim babalarımızın ayinidir və biz onlardan əl çəkəsi deyilik." Qur'ani-məcid uyğun məntiqə münsibətini bu şəkildə bildirir." (Ya Məhəmməd) Biz səndən əvvəl hər hansı bir məmləkətə qorxudan bir Peyğəmbər göndərdiksə, onun naz-ne'mət içində yaşayan başçıları sadəcə olaraq dedilər: "Biz atalarımızı bir dində gördük və biz də onların yolu ilə gedəcəyik."(١) Onlar ağac və daşa axmaqcasına səcdə edərək öz babalarının yanlış yolunu davam etdirir, onların xürafi ayinlərinə itaət edirdilər. Bu həmin təqliddir ki, müxtəlif ictimai fəsadlar, modabazlıq, qərbpərəstlik kimi təzahür edir. Bəli, mövlana Rumi .öz şe'rində məhz həmin təqlidi məzəmmət edir

Yuxarıda deyildiyi kimi, bütün iradlar kor-koranə təqlidə aiddir. Elmi terminologiyadakı təqlid isə tamamilə başqa bir mə'nadadır. Elmi təqlid qeyri-mütəxəssislərin mütəxəssisə müraciət etməsidir. Hər hansı bir elmi məsələdə qərara gəlmək üçün illər uzunu mütaliə etmək lazımdır. Ona görə də insanlar hər hansı bir məsələyə ehtiyaclı olduqda vaxt itirmədən həmin sahənin bilicilərinə müraciət edirlər. Elmdə belə bir təqlid bə'zən qeyri-alimin alimə müraciəti kimi tə'bir olunur. Tibb, sənaye, əkinçilik və bütün digər sahələrdə .insanlar mütəxəssislərin rə'yini öyrənirlər



---

.Zuxruf", ٢٣"[١١١]-١

Təqlidi pisləyənlərə qulaq asmış olsaq, onda gərək xəstələndikdə həkimə müraciət etməyək, inşaat işi apardıqda me’mar çağırmayaq, məhkəməlik işimiz olduqda vəkilə üz tutmayaq. Onda avtomobili xarab olanlar onu özləri tə’mir etməli, hamı libasını özü tikməlidir. Bəli, bütün sahələrdən daha dərin, əhatəli olan İslam dinində də mütəxəssisin rə’yinə ehtiyac var. Əlbəttə ki, əqidə məsələlərində, yə’ni Allahı tanımaqda, qiyamət gününə əmin olmaqda təqlid yoxdur. Bu kimi inancları araşdırmalar yolu ilə insan əldə etməlidir. Allahın varlığına, Peyğəmbərin haqq olmasına məntiqi dəlillərlə inanmaq olar. Amma ibadət, alış-veriş, siyasət və sair sahələrdə yeganə çıxış yolu mütəxəssisə müraciət edib, zəruri məsələləri öyrənməkdir. İctimai həyatın müxtəlif sahələrinə aid dini hökmləri mənbələrdən axtarıb tapmaq hər adamın işi deyil. Bundan ötrü bir ömür əyləşib Qur’an, hədis və sair sahələri öyrənmək lazımdır. Ən qısa və məntiqi yol isə dini hökmləri öyrənmək üçün mütəxəssisə müraciət etməkdir. Bir ömür zəhmət çəkib kamil şəkildə Qur’an, Peyğəmbər buyuruqları, mə’sumların hədisləri ilə tanış olan alimlər dini vəzifələrini öyrənmək istəyənlər üçün ne’mətdir. Deyilənlərdən tam aydın olur ki, alimə müraciət edilməsi dəlilsiz itaət sayılmamalıdır. Mütəxəssisə müraciət əqli və məntiqi bir işdir. Mütəxəssisin nəzəri həqiqətə çox yaxındır. Bəli, o da səhv edə bilər. Amma .mütəxəssisin səhvini nadanın səhvi ilə müqayisə etməyə dəyməz

Məsələn, həkim yazdığı nüsxədə hər hansı səhvlər etdikdə müalicənin tə’siri nisbətən az olur. Amma tibdən tamamilə xəbərsiz bir insan könlü istəyən dərmanları qəbul edərsə ağlagəlməz nəticələrlə üzləşər. Bir sözlə, hər hansı bir işdə mütəxəssisə müraciət edilməsi təbii və məntiqi bir işdir. Bə’ziləri təqlidi özü üçün əskiklik sayır. Əslində mütəxəssisə müraciət, ona itaət, insan şəxsiyyətinin böyüklüyüdür. Mə’lum məsələdir ki, insan bütün elmlərə yiyələnə bilməz. İstənilən bir sahədə elmlər dokturu dərəcəsinə yüksələn insanın da hansısa bir sahədə başqalarına ehtiyacı olur. Yalnız ağıllı insanlar mütəxəssisi dəyərləndirib, ona müraciət edirlər. Mütəxəssisə müraciət edilməsini özü .üçün əskiklik sayan insan nadandır

Təbii ki, xəstələnmiş mühəndis həkimə müraciət edir. Həkim isə inşaat işi gördürmək istədikdə mühəndisə üz tutur. Həm mühəndis, həm də həkim avtomobilləri xarab olduqda mexanikə müraciət edirlər. İslam hökmlərindən xəbərsiz olan insanların alimlərə .müraciət etməsi də yuxarıda sadalanan işlər kimi məntiqi və elmidir

İradlardan biri də budur ki, nə üçün mütəxəssisə müraciət edib onun göstərişini bildikdən sonra bu göstərişin dəlilləri haqqında soruşmaq olmaz. Özünüz düşünün, həkimə müraciət edən şəxs onun yazdığı nüsxədəki dərmanlar haqında birbəbir sorğu aparsa, bu işi normal saymaq olarmı?" Axı qısa bir müddətdə alimin bir ömür ərzində öyrəndiyi bilikləri əxz etmək olmaz. Həkimin yazdığı nüsxə bircə səhifə olsa da, o, bu bir səhifəni düzgün yazmaq üçün illər uzunu əzab-əziyyət çəkmişdir. Din alimi də belədir. Onun verdiyi cavabın nə üçünlüyünü soruşmaq mə'nasız bir istəkdir. Alim sualın cavabını vermək üçün bir ömür təfsir, hədis oxumuşdur. Uyğun iradları edənlər İslam elmlərinin dərinliyindən qətiyyən xəbərdar deyillər. Onlar anlamırlar ki, Qur'anın bütün incəliklərini dərk etmək üçün on minlərlə hədislər araşdırılır. Neçə on illər vaxt lazımdır ki, mö'təbər hədis az e'tibarlı hədislərdən, düzgün hədis qeyri-düzgün hədisdən fərqləndirilsin. Bə'zən, məsələn, izdivac və təlaq kimi bir İslam hökmünün dərk olunması üçün neçə-neçə Qur'an ayələri və hədislər nəzərdən keçirilir. Rical kitabları, müxtəlif lüğətlər araşdırılır ki, mö'təbər hədis tapılsın və onun həqiqi mə'nası dərk olunsun. Görən bütün insanlarda belə bir qüvvə varmı?! Uyğun iradlardan belə başa düşülür ki, xalq bütün işini buraxıb dini elmləri öyrənməlidir. Hətta belə bir iş görülsə də, hər insanda ictihada çatmaq iste'dadı yoxdur. Hansı ki, dini elmərin təhsilində bacarığı .olmayan kəs başqa bir sahədə alim ola bilər

Deyirlər ki, müctəhidlərə təqlid edilməsi səbəbindən xalq arasında ixtilaf yaranır. Çox maraqlıdır! Əvvəla, istənilən bir dövrdə bir və ya bir neçə mərceye-təqlid olur. Əgər bütün xalq təqliddən üz çevirib, özü öz məsələsini üzə çıxarmaq istəsə, pərakəndəlik daha böyük olmazmı? İkincisi hansısa əsas bir məsələdə alimlər arasında heç bir ixtilaf .yoxdur. Yalnız ikinci dərəcəli məsələlərdə fikir ayrılıqları müşahidə oluna bilər

Ona görə də müxtəlif müctəhidlərə təqlid edən insanlar cəmiyyət namazında vahid bir sırada dayanıb, heç bir ixtilafsız namaz qılırlar. Xırda məsələlərdə müctəhidlər arasında mövcud olan ixtilaflar heç bir halda xalqı parçalaya bilməz. Məsələn, hamı eyni bir vaxtda həccə gedir və eyni əməlləri yerinə yetirir. Ziyarətçilərin müxtəlif müctəhidlərə təqlid etməsi onlar üçün heç bir problem yaratmır. Bir sözlə, müctəhidlər arasında yalnız o məsələlərdə fikir ayrılığı var ki, həmin məsələlər islami vəhdətə heç bir mənfi tə'sir .göstərmir

**?Təvəlla və təbərra nə deməkdİr .۵۶**

Sual: Kimi dost, kimi düşmən bilmək haqqında İslamın verdiyi göstərişlərə bügünki ?dünyamızda əməl etmək mümkündürmü

Cavab: Adətən, İslamı əzəmətli bir ağaca bənzədirlər. Bu ağacın kökləri dinin üsuluna, əqidə məsələlərinə işarədir. Əməli göstərişlər isə bu ağacın budaqlarına oxşadılmışdır. "Furu", yə'ni budaq məsələlərinə on əməli göstəriş daxildir. İslamın əməli proqramları çox geniş olsa da, on mövzuda xülasə edilmişdir. Bu on göstəriş o qədər əhəmiyyətlidir ki, onlar əməllər cərgəsində birinci dayanırlar. Bu on göstərişdən üçü ibadətə, duaya, Allahla bağlılığa aiddir: Namaz, oruc, həcc. On göstərişdən ikisi həm iqtisadi məsələlərlə, həm də Allahla bağlılıqla, əlaqəlidir: Zəkat, Xüms. Beş göstəriş isə ictimai, hərbi və siyasi məsələlərə aiddir: Cihad, əmr be mə'ruf (yaxşılığa əmr) və nəhy əz münkər (pisliyin qadağası), təvəlla və təbərra (Allah dostu ilə dostluq və Allahın düşməninə nifrət), bəs ?kiminlə dost olaq, kimə nifrət edək

Allah dostları haqpərəst, dəyərli, haqq və ədalət hamisi olan insanlardır. Bu insanlar .zalımlara, həddi aşanlara, Allahın və xalqın düşmənlərinə nifrət edirlər

Soruşula bilər ki, nə üçün hamını dost tutmayaq, nə üçün bütün xalq ilə yaxşı keçinməyək? Hamı ilə dost olmaq fikrində olanlardan soruşmaq lazımdır ki, həm zalım, həm də onun zülm etdiyi məzlumla, həm istismarçı, həm də onun istismar etdiyi yoxsul təbəqə ilə, həm

haqpərəst, həm də haqqa təcavüz edənlə dost olmaq mümkündürmü?" Əzənləri əzilənlərdən fərqləndirməmək heç bir məntiqə sığmır. Diri vicdana malik heç bir kəs bu .sayaq sazişçiliklə barışa bilməz

Bu iki əsas İslamın əməli proqramlarında ona görə yer tutmuşdur ki, haqq və ədalət tərəfdarlarının dairəsi daha da genişlənsin, zalım və çirkin insanlar tənha qalsınlar. .Məqsəd fəsad əhlinin ictimai və əxlaqi mühasirəyə salınmasıdır

Məgər insan orqanizmi hər qidanı qəbul edirmi? İnsanın damağı dadlını dadsızdan seçmirmi? Təbii ki, orqanizmə zəhərli maddə daxil olduqda orqanizm dərhal qusmaq vasitəsi ilə bu zərəri dəf etmək istəyir. Cazibə və dəfetmə qüvvələri varlıq aləmindəki tarazlığı qoruyur. İnsan cəmiyyəti də istisna deyil. Bu cəmiyyətin də yaşaması üçün .onda cazibə və dəfetmə olmalıdır ki, bu da təvəlla və təbərra yolu ilə həyata keçirilir

Əgər cəmiyyətdə sazişçilik ruhu hakim olsa, müsbət qüvvələr mənfi qüvvələri dəf etməsələr, cəmiyyət tarazlığını itirib, məhv olub gedər. Həzrət Peyğəmbər (s) buyurur: (“İmanın ən möhkəm dəstəyi Allaha görə dost tutmaq və Allaha görə nifrət etməkdir.”(١

**Qədİm dİnlərdə oruc .٥٧**

?Sual: İslamdan qabaqkı dinlərdə oruc olmuşdurmu

Cavab: Qur'anda bildirilir ki, bu ilahi hökm digər dinlərdə də olmuşdur. Başqa dinlərdən olanların oruc tutması vacib sayılmışdır. Elə indi də "əhdi-ətiq" və "əhdi-cədid" :kitablarında oruc haqqında danışılır. Onlardan nümunələr göstərək

Bütün dövrlərdə bütün qövmlər üçün qəm-qüssə və dözülməz əziyyət üz verdikdə .١ (oruc buyurulmuşdur;(٢

(Həzrət Musa qırx gün oruc tutdu;(٣ .٢

Yəhud qövmü fürsət düşdükdə öz təvazö'lərini izhar etmək üçün oruc tutardılar ki, bu .٣ (yolla Allahın razılığını qazansınlar;(٤

Həzrət Məsih şagirdlərinə göstəriş verdi ki, o vəfat etdikdən sonra oruc .٤ (tutacaqlar.(٥

---

.Səfinətül-bihar", c. ۷"[۱۱۲] -۱

.Pavros, ۳: ۴"[۱۱۳] -۲

.Səfəri-təsniyyə, ۹: ۹"[۱۱۴] -۳

.Səfəri-bavəran", ۲۰: ۲۶"[۱۱۵] -۴

.Auqa İncili, ۵: ۳۴[۱۱۶] -۵

Yuxarıda göstərilənlər iki əhd kitabındakı buyuruqlardan parçlar idi. Daha ətraflı (məʼlumat almaq üçün qamus kitabına müraciət edin.(١)

**Ayda namaz qılanın qİbləsİ .٥٨**

?Sual: Aya endikdən sonra namaz qılmaq istəyənlər qibləni necə tapmalıdır

Cavab: Ay yer kürəsi ətrafında dövr edən səma cismidir. Onun həcmi yer kürəsinin həcminin on dörddə birinə bərabərdir. Yerdə dayananlar ayın tülu və qürub etdiyini müşahidə etdikləri kimi, ayda dayananlar da yerin tülu və qürubunu müşahidə edirlər. .Yer aydan bəʼzən bütöv, bəʼzən para görünür, bəʼzən isə görünmür

Aydan yer göründüyü vaxt bütün yer kürəsi ayda namaz qılan üçün qiblə sayılır. Yəʼni ayda dayanan şəxs üzünü yer kürəsinə tutduqda üzü qibləyə dayanmış hesab olunur. .Üzü yer kürəsinə dayanmaq üzü Kəʼbəyə dayanmaqdır

Amma ayda dayanan insan yer kürəsini müşahidə edə bilmirsə, yer kürəsinin təqribi mövqeyi təʼyin olunur. Namaz qılanın durduğu nöqtədən yerə doğru çəkilmiş xətt qiblə .istiqamətini göstərir

Onu da nəzərə almaq lazımdır ki, qiblə təkcə Kəʼbə evi deyil. Kəʼbədən keçən və ona perependikulyar olan xəttə üz tutan şəxs üzü qibləyə dayanmışdır. Bu qaydanı nəzərə .alaraq ayda olanlar qibləni tapa bilərlər

**?Günəşə əsasən qİblənİ təʼyİn etmək olarmı .٥٩**

Sual: Kompası (qiblənaməsi) olmayan şəxs günorta zamanı günəş vasitəsi ilə qibləni ?tapa bilərmi

Cavab: Qibləsi cənub nöqtəsi ilə üzbəüz olanlar günorta zamanı günəşlə qarşı-qarşıya dayansalar, üzüqibləyə dayanmış olacaqlar. Çünki günorta vaxtı günəş yarım gün dairəsinin üzərində dayanır. Demək, əgər günorta vaxtı günəşlə qarşı-qarşıya dayanılsa, onda qiblənin səh:١٩٥

---

.İmam Sadiq (ə) ۴٣٧, ۴٣٧[١١٧] -١

yerləşdiyi cənub nöqtəsi olacaqdır. Məsələn, qərbi İraqın əraziləri belədir. Amma qibləsi cənubdan şərqə doğru meylli olan yerlərdə (məsələn, bütün İran ərazisində) uyğun həddə günəşdən sağa meyilli durmaq lazımdır. Məsələn, Tehran şəhərində qiblə cənub nöqtəsindən otuz yeddi dərəcə məğribə meyllidir. Ona görə də günorta vaxtı günəşdən .otuz yeddi dərəcə sağa meyl etmək lazımdır

Deməli, belə bir qayda var ki, qiblə cənub nöqtəsi ilə üst-üstə düşürsə, üzü günəşə dayanmaq kifayətdir. Yox əgər qiblə cənub nöqtəsindən şərqə meyillidirsə, onda .günəşdən şərqə doğru meyl etmək lazımdır

**.Əlçatmaz nöqtələrdə qİblə məsələsİ .۶۰**

Sual: Hamımız bilirik ki, yer şimal və cənub yarımkürələrindən ibarətdir. Cənub ?yarımkürəsində yerləşmiş Amerika kimi ölkələrdə qiblə necə tə’yin olunur

Cavab: Əvvəla, qeyd edildiyi kimi, qiblə təkcə Kə’bə evi deyil. Kə’bə müstəvisinə perpendikulyar olan xətt qibləni tapmaq üçün kifayət edir. Kə’bə ilə üzbəüz dayanmaq kifayət etdiyi kimi, həmin perpendikulyar xətlə də üzbəüz durmaq kifayət edir. Kə’bə evindən qalxmış və yerin təkinə girən perpendikulyar xətt yer kürəsinin əks tərəfindəkilərin qibləni tapmasına kömək edir. Yerin əks tərəfində olanlar həmin .perpendikulyar xəttə üz tutmaqla namazlarını qıla bilərlər

İkincisi, insanın durduğu nöqtə ilə Kə’bə evini birləşdirən ən qısa xətt qiblənin istiqamətini göstərir. Əgər xalq bir kəsin haqqında desə ki, o, üzüqibləyə dayanmışdır, bu sözlər qiblənin düzgün tapılması üçün yetərlidir. Bir misalla məsələni daha da aydınlaşdıraq: Əgər bir şəxsdən üzü Məşhədə durması istənilsə, o təxmini bir hesablama ilə üzünü bir tərəfə tutub, deyəcək ki, Məşhəd bu tərəfdədir. Həmin şəxsin göstərdiyi istiqamətdə bir düz xətt uzatsaq, təbii ki, bu xətt Məşhəd şəhərinin üzərindən keçib, fəzaya yönələcək. Amma bu o demək deyil ki, həmin şəxs üzü Məşhədə dayanmamışdır. Bir növ uzun antenli maşının anteninə baxan şəxs maşına doğru baxmış .olur

Sual: “Rəvzatul-cənnat” kitabının müəllifi, mərhum Hilli haqında yazır: “Böyük astranom və riyaziyatçı Xacə Nəsrəddin Tusi Hillinin görüşünə gedir. Hillinin dərs keçdiyini görüb, ehtiram əlaməti olaraq, onun dərsində iştirak edir. Hilli deyir ki, namazda qiblədən sola meyl etmək İraq əhlinə müstəhəbdir. Xacə Nəsirəddin irad edərək Hillinin dediyi sözlərin məqsədini soruşur. O deyir: “Axı qiblədən dönmək haram, qibləyə üz tutmaq isə vacibdir. Qiblə hökmündə müstəhəb yoxdur.” Mərhum Hilli Xacəyə cavabında deyir: “Qiblədən azca sola dönmək qibləyə dönməkdir.” Xacə alimin dediklərindən qane olur. Maraqlıdır ki, mərhum Hillinin cavabı hansı mə’nanı daşıyırdı? Axı bütün İraq ərazisində qiblə cənub nötəsindən sağa meyllidir. Hillə şəhərində ۲۱ dərəcə, Nəcəf şəhərində ۲۱ dərəcə, Kərbəlada ۱۹ dərəcə cənub nöqtəsindən sağa meyl etmək lazımdır. Bəs Hillinin ?cavabını necə başa düşək

Cavab: Əvvəla, mərhum alim demir ki, cənub nöqtəsindən sola meyl etmək lazımdır. O .qiblədən sola meyl etməyi nəzərdə tutur. Bu iki deyiliş arasında çox fərq var

İkincisi, İraq əhli üçün qiblədən azca sola meyl etməyin müstəhəb olmasının ۲ əsası qeyd :olunmuşdur

۱. Mərhum Əllamə Məclisi “Biharül-ənvar” kitabında buyurur ki, həmin vaxt İraqda əksəri xəlifələr tərəfindən tikilmiş məscidlərin mehrabları o qədər də dəqiq qoyulmurdu. Ona görə də məsum imamlar xalqın qiblə məsələsinə diqqətli olması üçün belə bir göstəriş vermişlər. Əlbəttə ki, mehrabların qiblə ilə fərqi o qədər deyil ki, namaz batil olsun. Uyğun göstərişin məqsədi insanları qiblə məsələsində məsuliyyətli olmağa vadar etməkdir. Qiblədə sola meyl ona görə müstəhəb buyrulmuşdur ki, xalqın bu hərəkətini .xəlifələr özlərinə qarşı müxalifətçilik kimi qəbul etməsinlər

۲. Bə’zi rəvayətlərdə nəql olunur ki, Kə’bə evinin sahəsi sağ tərəfdən iki mil, sol tərəfdən isə dörd mildir. Sol tərəfdə sahə daha böyük olduğundan sola meyl edən insan daha ehtiyatlı hərəkət etmiş olur. Sağa meyldə

isə qiblədən çıxmaq mümkündür. Əlbəttə ki, yuxarıda adı çəkilən hökm ehtiyat məqsədi .ilə verilmişdir

## ?Qİblə nə üçün dəyİşdİrİldİ .۶۲

Sual: Bildiyimiz kimi həzrət Peyğəmbərin dövründə bir müddət üzü Beytül-müqəddəsə namaz qılınmışdır. Bəs hansı səbəbdən qiblə dəyişdirildi və müsəlmanlar Kə’bəyə üz ?tutdular

Cavab: Qur’an ayələrindən mə’lum olur ki, həqiqi qiblə Kə’bə evi olmuşdur. Müsəlmanlar müəyyən səbəblərə görə müvəqqəti olaraq Beytül-müqəddəsə üz tuturdular. Qur’anda oxuyuruq: “Biz sənin intizarlı baxışlarının göyə tərəf yönəldiyini görürük. Ona görə də səni razı olduğun qibləyə tərəf döndərəcəyik. İndi üzünü Məscidül-hərama (Kə’bəyə) tərəf çevir. Harada olsanız, üzünüzü oraya döndərin.”(۱) Yəhudilərin qiblə haqqındakı bə’zi sözləri həzrət Peyğəmbəri narahat edirdi. O, müvəqqəti seçilmiş qiblənin nə zaman dəyişdiriləcəyi intizarında idi. Nəhayət, Allah-təala müsəlmanlara əbədi qibləni e’lan .etdi

Bəs nə üçün elə əvvəlcədən Kə’bə qiblə seçilməmişdi? Bunun səbəbini Qur’an belə açıqlayır: “Biz əvvəlki qibləni ona görə qərar vermişdik ki, Peyğəmbərə tabe olanlarla Peyğəmbərdən üz çevirənlər bir-birlərindən seçilsilər...(۲) Qiblənin dəyişdirilməsində əsas məqsəd müsəlmanların tərbiyəsi idi. Bu yolla müsəlmanların itaətkarlıq ruhu .möhkəmləndirilirdi

Hicaz ərəbləri, xüsusi ilə Məkkə əhli öz torpaqlarını çox sevirdilər. Ona görə də ilk əvvəl bu insanların nəfsani meyllərinə qarşı çıxmaq lazım gəlirdi. Kə’bəyə sarı ibadət etməyə vərdiş vermiş bütpərəstlər, təbii ki, Beytül-müqəddəsə üz tutmadılar və bu yolla da .İslama itaət edənlər itaətdən çıxanlardan fərqləndi

Bundan əlavə, müsəlmanlar bir müddət Beytül-müqəddəsə üz tutmaqla ibrət götürməli idilər. Beytül-müqəddəs bəşəriyyətin ibrət muzeyi, Bəni-İsrailin izzət və zillət məkanıdır. Beytül-müqəddəsdə bu qövmün tərəqqi səbəbləri aşkardır. Bəni-İsrail həmin yerə Misirdən gəlmişdir. Onlar cihad

və fədakarlıqla izzətə çatdılar. Sonra Allah göstərişlərini ayaq altına almaqla süqut etdilər. Onların həyatı müsəlmanlar üçün bir ibrət idi. Müsəlmanlar unutmamalıdırlar ki, Kə’bə evinin qiblə tə’yin olunmasının heç bir milli, irqi səbəbi yoxdur. Sadəcə, Kə’bə yer üzünün tövhid mərkəzidir və bu ev tövhid qəhrəmanı həzrət İbrahim tərəfindən bərpa .edilmişdir

**SUAL: Nə üçün təzə ay (ayın başlanğıcında ) müxtəlİf məntəqələrdə müxtəlİf . ۶۳ ?vaxtlarda görünür**

Cavab: Atıq elmi şəkildə sübut olmuşdur ki, yer kürə formasındadır. Ay yer ətrafında təqribən ayda bir dövr edir. Ona görə də o bə’zən hilal, bə’zən bədr, bə’zən tərbi (dörd yerə böyünmüş), bə’zən də mühaq vəziyyətini alır. Ayın günəşə tərəf olan hissəsi daim işıqlıdır. Ayın, günəşin və yerin bir-birinə nisbətdə tutduğu mövqeyə görə bə’zən ay tamam işıqlı (bədr), bə’zən isə başqa formalarda görünür. Yer kürə formasında olduğundan qərb məntəqələrində ay daha tez görünür. Şərq məntəqələrində isə ayın .görünməsi yubanır

Deyilənləri sadə bir misalla aydınlaşdırmaq olar. Elektrik lampası ilə gözlərimiz arasında bir futbol topu asaq. Əvvəlcə bu topun bizə tərəf qalan hissəsi tam qaranlıq olur. Əgər meylli şəkildə qabağa getsək topun bir hissəsi işıqlanmağa başlayır. Demək, biz yerimizi dəyişdikcə top bir növ görünməyə başlayır. Hansı ki, o daim yerindədir, sadəcə topun .işıqlanma vəziyyəti dəyişir

**?Nə üçün hər gün saat on İkİdə günorta olmur .۶۴**

?Sual: Nə üçün şər’i günorta vaxtı bə’zən saat on ikidə, bə’zən isə başqa vaxtlarda olur

Cavab: Bildiyimiz kimi, yer günəş ətrafında yumurtavari trayektoriya üzrə hərəkət edir. Bir günəş ili müddətində günəş bu ellipsvari dairənin bir başından o biri başına hərəkət edir. Ona görə də günəşlə yer arasındakı məsafə daim dəyişir. Yerin günəşə ən yaxın məsafədə olduğu nöqtə həziz, ən uzaq məsafədə

olduğu nöqtə isə zirvə adlanır. Cazibə qanununun tə’siri ilə yer zirvədən həzizə doğru hərəkət etdikcə onun sür’əti get-gedə artır, əks istiqamətdə hərəkət zamanı isə sür’əti .azalır

Demək yerin günəş ətrafında hərəkəti bərabər sür’ətli deyil. Saat əqrəbləri isə eyni sür’ ətlə hərəkət edir. Saat əqrəblərinin hərəkət sür’əti yerin hərəkət sür’ətindən fərqləndiyi üçün arada fərq yaranır. Əgər günorta vaxtı saata baxsaq, ya on ikiyə qalır, ya da on ikini keçib. Deməli, həqiqi günorta saat günortasından fərqlənir. Bu fərq iyirmi .iki bəhmən tarixində ən böyük qiymətini alır

İl boyu həqiqi saatla rota saat arasında fərq mövcud olur. Təbii ki, bu fərq günəşin tülu .və qürubu zamanı da nəzərə alınmalıdır

**?Əlİnİn (ə) bu qəzavətİnİ necə həll etməlİyİk .۶۵**

Sual: Bir gün üç şəxs on yeddi dəvəni bölmək üstündə mübahisə edirdi. Dəvələrin yarısı birinə, üçdə biri o birinə, doqquzda biri isə üçüncü şəxsə çatmalı idi. Onlar heç vəchlə bu .bölgünü apara bilmirdilər

Həzrət Əli (ə) bu mübahisəni həll etmək üçün bu on yeddi dəvəyə bir dəvə əlavə etdi. Bu qayda ilə birinci şəxsə doqquz dəvə, ikinci şəxsə altı dəvə, üçüncü şəxsə isə iki dəvə düşdü. Həzrətin əlavə etdiyi dəvə isə yerdə qaldı. Beləcə, böyük mübahisəyə səbəb olmuş məsələ asanlıqla həll oldu. İndi sual olunur ki, artırılmış dəvə yerdə qaldığı halda ?hər üç şəxs öz payını necə aldı ki, artıqlamasıyla aldı

Cavab: Bəli, əgər on yeddi dəvə ikiyə bölünsəydi, birinci şəxsə səkkiz dəvə düşməzdi. Eyni qayda ilə on yeddi dəvənin üçdə biri altı dəvə etmirdi. Üçüncü şəxsin də payı bu sayaq artıq oldu. Mə’lum olur ki, mübahisə edən üç şəxs on yeddi yox, daha az .dəvələrin bölünməsinə çalışırmışlar

Bir mal neçə hissəyə bölünmüşsə, həmin hissələr toplandıqda bir alınmalıdır. Dəvələri bölmək istəyənlər anlamırdılar ki, onların istədikləri pay üst-üstə toplandıqda vahid alınmalıdır. İmam isə bir dəvə artırmaqla payların cəmini vahidə çatdırdı. Bu adamlar anlamırdılar ki, onların

bölgüsündən sonra on yeddi dəvədən hansısa bir hissə artıq qalasıdır. Həzrət bir dəvəni artırмaqla onların nəzərdə tutмadıqları hissəni də tələblər nisbətində böldü. Bu мəsələnin həllində ən мaraqlı nöqtə Həzrət Əlinin (ə) bir dəvə əlavə etмəklə ١٧ dəvəni .üç nəfərə qalıqsız bölмəsi oldu

**?SUAL: Adəмİn övladları kİмİnlə evləndİ .۶۶**

Cavab: İslaм aliмləri arasında bu мəsələ ilə bağlı iki baxış мövcuddur. Hər iki tərəf öz :baxışına uyğun dəlillər gətirir. Hər iki baxışı nəzərdən keçirək

Həмin dövrdə bacının qardaşla evlənмəsi qadağan edilмəмişdi. Çünki bəşər nəslinin .١ davaмı üçün başqa bir yol yox idi. Ona görə də qardaşların öz bacıları ilə evlənмəsi zəruri oldu. Nəzərə alsaq ki, yeganə hökм verən Allahdır, onda bütün iradlar yersiz .görünər

Bu nəzəriyyənin tərəfdarları Qur’andan belə bir dəlil göstərirlər: “Ey insanlar. Sizi tək bir şəxsdən xəlq edən, ondan zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın törədən Rəbbinizdən qorxun.”(١)Zahirən ayədən belə görünür ki, bəşər nəsli yalnız bu iki nəfərdən törəмişdir. Çünki ayədə bu iki nəfərin vasitə olмası bildirilмir. Uyğun fikri .мərhuм Təbərsinin nəql etdiyi rəvayət də təsdiqləyir

İkinci baxışa görə, Adəм övladlarının bir-biri ilə izdivacı мüмkün olмadığından onlar .٢ yer üzündəki başqa bir nəsildən olanlarla evləndilər. Sonrakı nəsil isə əмiuşaqlarının izdivacı nəticəsində davaм tapdı. Bu baxışı da təsdiq edən rəvayətlər var. Çünki Adəм .nəsli yer üzündəki ilk insan nəsli deyil. Ondan əvvəl bir çox insan nəsilləri olмuşdur

Nəticə olaraq deyə bilərik ki, Adəmin övladları Adəм nəslindən əvvəl мövcud olмuş insan nəslinin nüмayəndələri ilə evlənмişlər. Allah-təalanın мələklərlə söhbətindən .мə’luм olur ki, Adəм və Həvvadan qabaq yer üzündə insanlar olмuşdur



---

.Nisa”, ١“[١٢٠]-١

## ?Fəsadla mübarİzə İnsan haqlarına zİdd deyİlmİ .۶۷

Sual: İnsanın azad, ixtiyar sahibi yaradılması onun fəxridir. Bəs necə olur ki, İslam imanlı insanları yaxşı işlərə də’vət edir və pis işlərdən çəkindirir? Məgər əmr be mə’ruf və nəhy əz münkər insan azadlığına zidd deyilmi? Məgər bütün cəmiyyətlərdə belə bir ?hərəkat başlasa, hərc-mərclik düşməzmi

Cavab: Əmr be mə’ruf və nəhy əz münkər (yaxşılığa əmr və pisliyin qadağası) İslamın iki ictimai sütunudur. Bu iki göstəriş səbəbindən insanlar pis işlərdən çəkindirilir və fitnə-fəsadla mübarizə aparılır. Görən bu vəzifələrin icrası bir dam altda yaşayan bəşəriyyət üçün faydalıdır, yoxsa yox? Şübhəsiz ki, bəşəriyyətin ümumi faydaları xatirinə bə’zi azadlıqlar məhdudlaşdırılmalıdır. Bir zaman insanlar kiçik qruplar şəklində mağaralarda yaşamışlar. Bu kiçik qrupların ciddi ictimai qanunlara bir o qədər də ehtiyacları yox idi. Həmin qruplara münasibətdə fəsadla mübarizə zərərli də görünə bilər. İndiki böyük cəmiyyətlərdə isə fəsadla mübarizə xüsusi bir əhəmiyyət daşıyır. Çünki hazırki cəmiyyətlərdə hər bir insan bu cəmiyyətin ayrılmaz və tə’yinedici bir hissəsidir. Böyük toplumlarda bir şəxsin kənara çəkilib, öz qanunları ilə yaşaması mümkünsüzdür. Bəli, müasir cəmiyyətdə hər bir insan başqalarının yaxşı və pis əməllərinə şərikdir. Bir fərdin pis əməli bütün cəmiyyətə tə’sir göstərir. İndiki dövrdə bir kənara çəkilib tamaşaçı həyatı sürmək qeyri-mümkündür. Bu gün cəmiyyətdə baş verən hər hansı bir partlayışın .tüstüsü hamının gözünü yaşardır

Hər hansı bir insanın əxlaqsızlığı yoluxucu xəstəlik tək cəmiyyəti bürüyür. Təhlükəli mikrobun qarşısı alınmadıqda o, qısa bir müddətdə cəmiyyətə nüfuz edib, böyük bəlalar yaradır. Bu mikroba yoluxmuş xəstəni tə’cili şəkildə təcrid etmək, qapalı bir şəraitdə .saxlamaq lazımdır. Əks-təqdirdə bütün məmləkət məhv olub gedə bilər

Əxlaqi, ictimai, ideoloji, ruhi azğınlıqlar da belədir. Bu azğınlıqların qarşısı alınmadıqda .cəmiyyət böyük təhlükələrlə üzləşir

səh:۲۰۲

Təsəvvür edin ki, bir şəxs öz evini əxlaqsızlıq yuvasına çevirib, iyrənc-iyrənc işlərlə məşğul olur. Hər gün bu evdə baş verənlərə şahid olan gənclər, qonşular tədricən həmin evdəki ruhiyyənin tə’siri altına düşürlər. Beləcə, fəsad günbəgün artır, daha .böyük ərazini işğal edir

Bəli, əxlaqi və ictimai fəsadlarla mübarizə cəmiyyətin xoşbəxtliyinin tə’minatçısıdır. Qonşunun fəsad və günahı qarşısında sükut böyük günahdır. Kimsə övladını, ailəsini cəmiyyətdəki əxlaqsızlıqlardan qorumaq gücündə deyil. Əgər ümmətini, xalqını, ailəsini, övladını əxlaqi və ictimai bəlalardan qorumaq üçün bir şəxs ayağa qalxırsa, onu azadlığa qarşı çıxmaqda ittiham etmək olmaz. Əxlaqsızlığa e’tiraz hər bir şəxsin insanlıq borcudur. Əgər bir insanın azadlığı başqalarının azadlığına, cəmiyyətin xoşbəxtliyinə qarşı yönəlmişsə, onu məhdudlaşdırmaq zəruridir. Qur’ani-məciddə bu məsələyə belə işarə olunur: “Sizlərdən yalnız zalımlara çatmayacaq (onlar üçün fərqsiz olacaq) (fitnədən qorxun.”(١)

Bu sualla səhabələrdən biri həzrət Peyğəmbərə (s) müraciət etmişdir. Həzrət Peyğəmbər (s) onun cavabında belə bir məsəl çəkmişdir: “Cəmiyyətimiz böyük bir gəmi kimidir. Onda ticarət yükləri daşınır, çoxlu sərnişinlər var. Yol boyu bütün sərnişinlər azaddır. Amma kimsə azadlıq adı altında gəminin onun ayağının altında qalan hissəsini deşib, deyə bilməz ki, mən özümə aid olan hissəni deşirəm. Belə bir cavab ondan qəbul oluna bilməz. Çünki o təkcə özü üçün yox, bütün gəmidəki sərnişinlər və yüklər üçün təhlükə yaradır...” Bəli, cəmiyyətimiz bir gəmi kimidir. Cəmiyyətimizin üzvləri bu gəminin sərnişinləridir. Onlar bir-birlərinin zərərinə və xeyirinə şərikdirlər. Kimsə cəmiyyətdəki .fəsadlardan suğortalanmamışdır

Şəxsiyyət azadlığına münasibətdə İslam məktəbi ilə digər məktəblər arasında aşkar bir fərq vardır. Bugünki dünyada şəxsiyyət azadlığı deyildikdə cəmiyyət üçün zərərli olmayan fərdi bir azadlıq nəzərdə tutulur. Azad insan öz zərərinə olan işləri gördükdə kimsə onun qarşısını ala bilməz. Yeganə şərt hərəkət və rəftarların cəmiyyət üçün



---

.Ənfal”, ٢٥“[١٢١]-١

təhlükəli olmamasıdır. İslamda isə belə deyil. Azad insan təkcə cəmiyyətə qarşı yox, eləcə də özünə qarşı zərərli hərəkətlərə yol verə bilməz. Yə’ni İslam alimləri təkcə cəmiyyətin yox, həm də fərdin xoşbəxtliyini nəzərdə tutur. “Nə edirəm özümə edirəm” .deyə azadlıq tələb edən insanın istəkləri məntiqsizdir

Məsələn, bugünkü dünyada şəxsiyyət və e’tiqad azadlığı adı altında bütə sitayişə icazə verilir. Amma İslam bütpərəstliyi insan səadəti üçün zərərli bildiyindən uyğun əqidəyə .qarşı mübarizə aparır

Əmr be mə’ruf və nəhy əz münkərin, yə’ni insanlara yaxşılığı əmr edib, pisliyin qadğan edilməsinin müxtəlif dərəcələri vardır. Ümumi xalq kütləsi şirin dillə öz din qardaşlarına nəsihət verməli, onları günahdan çəkindirməlidir. Hər bir fərd öz ətrafındakıların islahı üçün onlarla dostluq əlaqələrini kəsmək dərəcəsində mübarizə apara bilər. Bu sayaq mübarizə cəmiyyətdə hərc-mərclik yaratmır. Cəmiyyətin ciddi şəkildə islah edilməsi isə adi fərdlərin yox, İslam hökumətinin vəzifəsidir. Peyğəmbər dövründə adi bir şəxs cəmiyyətin işlərinə təkbaşına müdaxilə edə bilməzdi. Bəli, fərd yalnız ətrafındakılara xoş .bir dillə nəsihət verə bilər, böyük günahların cəzalandırılması isə hökumətin işidir

### ?Bağışlamaq və qİsas göstərİşlərİ bİr araya sığırmı .۶۸

Sual: Qur’ani-məcid bir tərəfdən xalqı qisas almağa çağırır və qisası həyat mayası sayır. İlahi kitabda oxuyuruq: “Ey düşüncə sahibləri, bu qisas sizin üçün həyat deməkdir.”(۱) Digər bir ayədə isə xalq mərhəmətə, başqalarını bağışlamağa çağırılır: “O müttəqilər ki... qəzəblərini udar, insanların günahlarını bağışlayarlar. Allah yaxşılıq edənləri ?sevir.”(۲)Bu iki göstəriş bir-birinə zidd deyilmi

Cavab: Əvvəla, unutmamalıyıq ki, İslamdakı bir çox qanunlar ictimai və psixoloji mahiyyət daşıyır. Təsadüf hallarda icra edilən hökmlər insanları bir çox işlərdən çəkindirir. Məsələn, İslam icazə verir ki, öldürülmüş şəxsin yaxınları qatildən qisas alsınlar. Bu göstəriş qətl fəkrinə



---

.Bəqərə”, ۱۷۹“[۱۲۲]-۱

düşmüş bir çoxlarını uyğun işdən çəkindirir. Onlar bir şəxsi öldürməzdən qabaq istər-istəməz qisas haqqında düşünürlər. Dar ağacını gözləri qarşısına gətirən insan bir çox .günahlardan çəkinir

Bu baxımdan qisas hökmü cəmiyyət üçün həyati bir əhəmiyyətə malikdir. Uyğun hökm qətllərin, təcavüzlərin qarşısını alır. Əslində isə həmin hökmlər təsadüf hallarda həyata .keçirilir

Başqa sözlə, qisasın həyata keçirilməsi yox, qisas hökmünün mövcud olması cəmiyyətdə bir çox təcavüzlərin qarşısını alır. Öz həyatını əldən verəcəyini düşünən insan başqasını .qətlə yetirmək fikrindən daşınır

Uyğun qanuna əsasən, yaxın adamı qətlə yetirilmiş şəxslər intiqam ala bilərlər. Bu yolla cinayətlərin qarşısı alınır. Zorlu bir şəxs tərəfindən qətlə yetirilmiş məzlum bir insanın qanı yerdə qalmır. Bu qisasa dövlət tə'minat verir. Amma dövlət kimsəni məcbur etmir ki, .qisas alsın. Yaxın adamı qətlə yetirilən şəxs qatili bağışlaya da bilər, intiqam da ala bilər

İslam uyğun iki qanunu tənzimləməklə iki böyük hədəfinə çatmışdır. Əvvəla, qətlə yetirilənin valideynlərinə qisas hüququ verməklə nahaq qanın axıdılmasının qarşısı .alınır. Digər bir tərəfdən qətlə yetirilən şəxsin valideynlərinə bağışlamaq imkanı verilir

Əgər qisas hökmü olmasaydı, nə baş verərdi? Şübhəsiz ki, qisas olmayan yerdə cəmiyyətin əmin-amanlığı təhlükə altında qalır. Bu iki qanun bir-birlərini tamamlayır. Əgər qisas hökmü verildiyi halda, qatilin adamlarına intiqam almaq haqqı verilməsəydi, birinci hökm naqis olardı. Qətlə yetrilən şəxsin adamları azad şəkildə iki yoldan birini .seçir: Onlar ya qatildən intiqam alır, ya da onu bağışlayırlar

Üçüncüsü, diqqətli olmalıyıq ki, qisasın öz yeri var, bağışlamağın öz yeri. Əgər cani elə təhlükəlidirsə ki, onu bağışlamaqla növbəti cinayətlər törənə bilər, şübhəsiz ki, qisas zəruridir. Gəlin e'tiraf edək ki, cəmiyyətdə elə cinayətkarlar var ki, onları bir an belə azad buraxmaq mümkün deyil. Belə hallarda qətlə yetrilənlərin valideynləri öz hüquqlarından istifadə etsələr yaxşıdır. Yox əgər cinayəti törətmiş şəxs peşiman

olmuşdursa və yeni bir həyata qayıtmaq istəyirsə, şübhəsiz ki, belə insanı bağışlamaq daha yaxşıdır. Uyğun hallarda əfvi qisasdan üstün tutmaq lazımdır. Bu iki şəraiti bir-birindən fərqləndirmək bir o qədər də çətin deyil.

**?Oğlan və qızların İzdİvac yaşı artırılmalıdırmı .۶۹**

Sual: Son dövrlərdə oğlanların və qızların izdivac yaşının artırılması barədə söhbətlər gedir. Bu mövzuda seminarlar da təşkil olunur. Hətta bu seminarlarda belə bir təklif irəli sürülmüşdür ki, izdivacda oğlanlar üçün ۳۰, qızlar üçün ۲۵ yaş tə’yin edilsin. Deyilənlərə ?İslamın münasibəti necədir

Cavab: Əvvəla, oğlanların və qızların izdivac yaşının tə’yini təbii və fitri məsələdir. Bu məsələni adi bir məişət məsələsi kimi müzakirəyə çıxarmaq yanlışdır. Əgər oğlanların və qızların yetkinlik həddinə çatma prosesi heç bir qanundan asılı deyilsə, yersiz qanunlar nə üçündür? Allah-təala bəndələrini onların özündən də yaxşı tanıyır. Hələ insan yaradılmamışdan qabaq bə’zi məsələlər qəti şəkildə müəyyənləşdirilmişdir. İnsan .Qur’anın hədlərini dəyişməklə yalnız zərər görə bilər

Büluğ həddi, yetkinlik insandakı fizioloji və psixoloji dəyişikliklər səbəbindən ortaya çıxır. Zaman keçdikcə körpənin boyu ucalır, fiziki qüvvəsi artır. Onun daxilində cismi və ruhu ilə uyğunlaşan meyllər yaranır. Hansısa bir yetkinlik çağında insanda cinsi hisslər .oyanır. Yetkinlik yaşına çatmış insanın izdivac istəyi həyəcan təbili çalır

Ona görə də yaranış kitabı uyğun həddi incə bir qələmlə insan vücudunda nəqş etmişdir. Hansısa proqram və qanunlara baxmalı yox, cinsi meyllərin böhran dövrünü diqqətlə araşdırmalıyıq. İzdivac yaşı yaranış qanunlarına uyğun şəkildə tə’yin .olunmalıdır. Bu məsələdə fəlsəfəbazlıq heç bir rol oynamır

Qur’ani-kərimi diqqətlə oxuyanlar büluğ, yetkinlik məsələsi ilə bağlı bir çox incəliklərlə tanış ola bilərlər. Bə’ziləri elə düşünürlər ki, həqiqət onların düşüncəsinə tabedir. Belələri yaranış qanunları ilə vuruşaraq

özlərini məhv edirlər. Çünki yaranış qanunları özündən razı analitiklərin xəyalları ilə .razılaşmır

Körpə ana bətnində doqquz ay inkişaf yolu keçməlidir. Təsəvvür edin ki, bir qrup şəxs dəyirmi masa arxasında oturub, qanunlar tənzimləyir və körpənin təkamül müddətini bir ay qısaltmaq istəyirlər. Necə də gülünc bir iş! İnsanın yetkinlik yaşına çatması da onun .ana bətnində doqquz ay qalması kimi təbii və dəyişməz bir prosesdir

Uyğun seminarın iştirakçıları ölkədəki ət çatışmazlığını aradan qaldırmaq istəyirmiş kimi, gülünc proqramlar hazırlayırlar. Həzrət Peyğəmbər (s) buyurur: "Zamana zor göstərməyin, zamanın zoruna mə'ruz qalarsınız." Həzrət peybəmbər öz buyuruğu ilə yaranış aləmindəki toxunulmaz qanunlara işarə edir. Təbii, fitri proseslərə tə'sir .göstərmək istəyən insan, şübhəsiz ki, məğlub olasıdır

İkincisi, qanunlar tənzimlənərkən bütün incəliklər nəzərə alınmalıdır. İranda və Qafqazda orta yetkinlik yaşı qızlar üçün on dörd yaş, oğlanlar üçün on altı yaş civarındadır. Həmin bu dövrlərdə oğlanlarda və qızlarda cinsi meyllər yaranır. Əgər izdivac yaşı artırılsa, ortada yaranmış fasilədə gənclər psixoloji, fizioloji problemlərlə üzləşəsidirlər. Onlar ya qeyri-qanuni yolla öz ehtiraslarını söndürməli, ya da psixoloji .sarsıntılar keçirərək əsəb xəstəliyinə tutulmalıdırlar

Üçüncüsü, izdivac insanın iste'dadlarını üzə çıxarır. Ailəli insanlar subay insanlara nisbətən daha dərindən düşünüb nəticə çıxarmağı bacarırlar. Vücudunu şəhvət alovu bürümüş bir insan bir an olsun belə rahatlana bilmir. Bu həqiqətləri əksər psixoloqlar .e'tiraf etmişlər

Bə'ziləri isə yer kürəsində nəsil artımının qarşısını almaq üçün belə bir yolu münasib saymışlar. Onlar anlamırlar ki, yaxşı bir məqsədə doğru pis yolla getmək düzgün qərar .deyil. Bir fəsadı aradan qaldırmaq üçün o biri fəsada yol açmaq ağılsızlıqdır

## ?Sİleye–rəhм" hansı şəraİtdə vacİbdİr" .٧٠

Sual: Sileye-rəhм, yə'ni yaxınları və qohuмları yoxlaмaq İslaмda vacib sayılмışdır. Aммa biziм yaxınlarıмız arasında dini göstərişlərə əмəl etмəyənlər çoxdur. Belə adaмlarla yaxınlıq etмək olarмı? Əgər yaxınlarıмız İslaм dininə e'tinasız yanaşırlarsa, ?yenəмi sileyi-rəhм etмək vacib olur

Cavab: Bilirik ki, ailə kiçik bir cəмiyyətdir. Böyük bir cəмiyyətin inkişaf etмəsi üçün onun fərdləri arasındakı isti мünasibətlərin rolu böyükdür. Ailə bağlarının мöhkəмliyi təkaмülə böyük tə'sir göstərir. İslaм ictiмai bir din olduğundan sileyi-rəhмə böyük əhəмiyyət verмişdir. Sileye-rəhм vacib sayılмış və onun tərk edilмəsi böyük günahlardan hesab edilмişdir. Qur'ani-kəriмdə bildirilir ki, qiyaмət günü uyğun мəsələ haqqında sorğu-sual aparılacaqdır. Ayədə buyurulur: "Qohuмluq əlaqələrinizi (kəsмəkdən həzər edin. Şübhəsiz ki, Allah sizin üzərinizdə nəzarətçidir.(١)

Bir şəxs həzrət Peyğəмbərin (s) xidмətinə gəlib dedi: "Yaxınlarıм qohuмluq əlaqələrini kəsib, мəni tərk etdi. İndi vəzifəм nədir? Mən də onlarla əlaqəмi kəsiммi?" Həzrət (s) buyurur: "Əgər sən də bu işi görsən, Allah haмınızı tərk edəcək və haмınız Onun мərhəмətindən мəhruм qalacaqsınız." Sonra həzrət Peyğəмbər (s) bu şəxsə üç мühüм göstəriş verdi: "Əgər bir şəxs səninlə əlaqəsini kəsirsə, sən onun əksinə rəftar et, qohuмluq və dostluq bağlılığını unutмa; bir şəxs səni hansısa ne'мətdən мəhruм etsə, (sən ona yaxşılıq et və onu мəhruм qoyмa; sənə zülм edəni bağışla."(٢)

Başqa bir мəqaмda da həzrət Peyğəмbər uyğun мövzuya toxunaraq öz yaxınlarına deyir: "Mən qiyaмət günü мeydana çıxarılacaq sizlərə və bütün üммətiмə tövsiyyə edirəм ki, sileyi-rəhмdən qəflətdə qalмayasınız. Əgər bu ilahi işi görмəkdən ötrü uzaq bir səfərə çıxмaq lazıмdırsa, bu səfərin əziyyətinə dözüb, öz əxlaqi və ictiмai ".borcunuzu qaytarın

Əlbəttə ki, bir işin görülмəмəsi üçün qarşıda ondan da zəruri bir iş olмaмalıdır. Sileye-.rəhм də belədir

İslam dininə biganə insanlarla yaxınlıq etmək üçün bir neçə şərt var. Bu yaxınlıq həmin qohumların dinlə maraqlanmasına səbəb olmalıdır. Ən azı onların ruhiyyəsi insanın imanına təhlükə yaratmamalıdır. Demək, dinə biganə qohumlarla get-gəl insanın imanını zəifləşdirmirsə, sileyi-rəhm vacibdir. Amma dinə biganə qohumların ruhiyyəsi insanın .imanını süstləşdirirsə, bu iş ən azı bir müddət tərk olunmalıdır

**?İslam fəqirliyi ictimai zərurət kimi qəbul edirmi .۷۱**

Cavab: Əvvəla, iqtisadi məsələlərdən danışan hədislərdə bildirilir ki, İslam cəmiyyəti sağlam olarsa, insanlar Allah-təalanın müəyyənləşdirdiyi haqları ödəyərsə, fəqirlikdən əsər-əlamət qalmaz. İmam Sadiq (ə) buyurur: "Əgər insanlar mallarının zəkatını ödəyərsə, cəmiyyətdə yoxsul müsəlman qalmaz. Varlıların mülkündə olan fəqirlərin payı ödəndiyi halda kimsə iqtisadi cəhətdən çətinlik çəkməz. Əgər cəmiyyətimizdə fəqir, (möhtac, ac, çılpaq varsa, bu varlıların ilahi vacib haqları ödəməməsinin dəlilidir."(۱)

Bu mövzuda nəql olunmuş hədisləri araşdırdıqda görürük ki, fəqirliyin əsas səbəbi varlıların öz vəzifəsini bilməməsi və ya zülmə əl atmasıdır. Ona görə də İslam dini fəqirliyi ictimai natarazlıqdan doğmuş bir xəstəlik kimi qəbul edir. Nə Qur'an ayələrində, nə də .rəvayətlərdə fəqirlik ictimai zərurət və ya təbii bir gerçəklik kimi qəbul olunmur

İkincisi, İslam sağlam bir cəmiyyətdə doğulmamışdır. İslamın zühur etdiyi cəmiyyət siyasi, iqtisadi, əxlaqi problemlər burulğanında çabalayırdı. Bəli, İslam ayinləri belə bir mühitdə göz açdı. Təbii ki, azğın bir cəmiyyətdə heç bir müqəddiməsiz ideal cəmiyyət qurmaq olmazdı. Ona görə də mövcud



---

.Vəsailüş-şiə, c. ۶, s. ۴"[۱۲۶]-۱

azğınlıqdan ideal islami cəmiyyətə aparacaq proqram hazırlanmalı idi. Bu proqram əsasında fəqirlik, aclıq tədricən aradan qaldırılmalı idi. Məgər fəqirliyi “olmaz” əmri ilə !?aradan qaldırmaq olurmu

Üçüncüsü, hər bir azad cəmiyyətdə öz mənafeyini güdənlər var. Bu zümrə öz sərvətini artırmaq üçün cəmiyyətin qanını sovurur. Uyğun istismarçı zümrənin fəaliyyətlərini .məhdudlaşdırmaq ayrıca bir proqram istəyir

Məsələn, İslamda təcavüzkarlığa, istismara, oğurluğa, iffətsizliyə qarşı müxtəlif cəzalar nəzərdə tutulmuşdur. Əslində bütün mütərəqqi cəmiyyətlərdə bu sayaq qanunlar mövcuddur. Uyğun qanunları lazımsız və ya zərərli sayanlar öz iddialarına inanırmı?! Cinayətkarın qarşısını almadan cəmiyyəti sağlamlaşdırmaq mümkündürmü?! Şübhəsiz ki, yox! Heç bir insaflı insan cəmiyyətin islahını tə’min edəcək proqramlara qarşı çıxmaz. Axı cəmiyyət müxtəlif insanlardan təşkil olunmuşdur. Təcavüzkar təbiətli insanlara qarşı .tədbirlərin görülməsi zəruridir

Məsələn, xəstəxana və əczaxananın tikilməsində məqsəd cəmiyyətin sağlamlığını tə’min etmək, xəstələri nəzarət altına almaqdır. Amma xəstəxana və əczaxananın olması cəmiyyətin xəstə olması demək deyil. Ehtiyaclılara kömək məsələsi də eyni mahiyyəti daşıyır. Əgər yoxsullara yardım üçün proqramlar mövcuddursa, bu o demək deyil ki, cəmiyyətdə hökmən fəqir olmalıdır. Məqsəd, budur ki, fəqirlər olduğu təqdirdə onlara .yardım əli uzadılsın

Bundan əlavə, cəmiyyətdə himayəyə ehtiyac duyan kimsəsiz insanlar olur. Sonsuz qocalar, ata-anasını itirmiş yetimlər müstəqil şəkildə yaşamaq imkanına malik deyillər. Belə insanların ehtiyacı beytül-maldan, İslam büdcəsindən, imkanlı insanların yatırımlarından ödənməlidir. İş qüvvəsinə malik olmayan insanların böyük bir hissəsi təqaüdlərdən, aylıq yardımlardan məhrumdur. Bəli, yoxsullara yardımı zəruri sayan .İslam bu təzahürü ictimai zərurət kimi qəbul etmir

## ?Dİgər dİnlərİ haqlı saymaq olarmı .١

Sual: Əgər İslam dinindən sonra ondan əvvəlki dinlər gücdən düşürsə, nə üçün bə’zi Qur’an ayələrində Allaha iman gətirib saleh iş görən yəhudilər və məsihilər də nicat tapmış hesab olunur? Bildirilir ki, belələri üçün qiyamət günü heç bir qəm-qüssə yoxdur. Deyilənlərdən belə bir nəticə çıxarmaq olarmı ki, İslamdan qabaqkı dindən olanlar Allaha iman gətirib saleh iş gördükdə nicat tapırlar? Məgər onların iman gətirdiyi dinlər ?gücdən düşməmişdirmi

:Cavab: Yaxşı olar ki, əvvəlcə uyğun ayələrə nəzər salaq, sonra isə onları araşdıraq

İman gətirənlərdən, musəvi (yəhudi), isəvi (xristian) və sabiilərdən Allaha, axirət“ .١ gününə iman gətirib, yaxşı iş görənlərin mükafatı Rəbbinin yanındadır. Onlar üçün heç (bir qəm-qüssə yoxdur.”(١

Şübhəsiz ki, iman gətirən yəhudilərdən, sabiilərdən və məsihilərdən Allaha və axirət .٢ gününə inanıb yaxşı iş görənlərin heç bir qorxusu yoxdur, onlar qəm-qüssə (görməzlər.”(٢

Həqiqətən, Allaha iman gətirənlər, yəhudilər, sabiilər, xaçpərəstlər və müşriklər . ٣ (arasında qiyamət günü hökmünü verəcəkdir...”(٣

İlk baxışdan elə görünə bilər ki, Allaha iman gətirib, saleh iş görən, eləcə də, başqa dində olan insanlar qiyamət günü nicat tapacaqlar. Belə bir təsəvvür yarana bilər ki, Allaha doğru hansı yolla getməyin fərqi yoxdur. Hər bir kəs öz mənsub olduğu dinin yolu ilə nicat tapa bilər. Bütün bu fikirlər Qur’anı dərindən mütaliə etməyən insanlara .məxsusudur

Amma bilməliyik ki, Qur’an həqiqətlərini anlamaq üçün bir ayəni götürüb, digər ayələrə nəzər salmadan nəticə çıxarmaq düzgün deyil. Ayənin həqiqi mə’nasını dərk etmək üçün onun nazil olduğu şəraiti, özündən əvvəlki və sonrakı ayələri mütaliə etmək lazımdır. Əgər İslam zühur etdikdən

sonra ondan əvvəlki dinlər qüvvədə qalsaydı, İslam Peyğəmbəri (s) müxtəlif ölkə başçılarına də'vət məktubları ilə müraciət etməzdi. Axı həzrət (s) İslam dinini ümumbəşəri .bir din kimi təbliğ edir, başqa dindən olanları İslamı qəbul etməyə çağırır

Həzrət Peyğəmbərin (s) məktubları və də'vətləri, müsəlmanların kitab əhli ilə uzun sürən savaşları bir daha təsdiq edir ki, İslam zühur etdikdən sonra əvvəlki Peyğəmbərlərin .risaləsi tamam oldu və qiyamət günü İslamdan başqa bir din qəbul olunmayacaq

Bəs uyğun ayədə nəzərdə tutulan nədir? Ayədə icmali və təfsili olmaqla iki məsələyə :toxunulur

Əgər yəhudilər və məsihilər Allaha və qiyamət gününə doğrudan da iman .١ gətirmişlərsə, öz kitablarına – tövrat və incildəki mə'lumatlara əsasən İslam Peyğəmbərinə (s) üz tutmalıdırlar. Çünki həm Tövratda, həm də İncildə İslam Peyğəmbərinin gəlişi ilə müjdə verilmiş, onun əlamətləri sadalanmışdır. Maraqlıdır ki, Qur'ani-məcid uyğun məsələyə yuxarıda zikr olunmuş ayədən qabaq toxunur: "De ki, ey kitab əhli! Tövrata, İncilə və Rəbbinin tərəfindən sizə nazil edilmiş olana düzgün əməl etmədikdə siz heç bir şey üzərində deyilsiniz. Rəbbin tərəfindən sənə nazil edilən ( Qur'an) onlardan bir çoxunu yalnız azğınlığını və küfrünü artıracaqdır. Elə isə kafir (tayfanın halına acıma."(١)

Aydın görünür ki, uyğun səmavi kitaba diqqətə çağırılmasında məqsəd İslam Peyğəmbərinin risalətini önə çəkməkdir. Qur'anda bu məsələyə dəfələrlə işarə olunmuşdur. Bildirilir ki, əgər onlar, doğrudan da, Allaha və qiyamət gününə inanırlarsa, .İslam Peyğəmbərinin ümumbəşəri risalətini qəbul etməlidirlər

Bir sözlə, Allaha və qiyamət gününə iman gətirib, öz səmavi kitabına inanan şəxs bilməlidir ki, İslam Peyğəmbərinin zühuru onun öz kitabının tərkib hissələrindən biridir. İslam Peyğəmbəri zühur etdikdən sonra yəhudilər və məsihilər öz kitablarının hökmünə .əsasən növbəti dinə üz tutmalı idilər

Bəqərə" surəsinin uyğun ayəsindən mə'lum olur ki, ayədə öz Peyğəmbərlərinə" .٢ .həqiqətən iman gətirmiş kitab əhlinə müraciət olunur

Onlardan bə’ziləri yeni din zühur etdikdən sonra əvvəlki dində qalмaq qərarına gəldilər. Aммa elələri də tapılмışdı ki, vaxtı ilə Musaya belə deмişdi: “Allahı öz gözüмüzlə görмəsək, heç vaxt ona ibadət etмərik.” Bəni-İsrail bu sayaq rəftarlarına görə Allahın qəzəbinə düçar oldu. Başqa bir ayədə oxuyuruq: “Onlara zəlillik, мiskinlik daмğası (vuruldu və Allahın qəzəbinə düçar oldular...”(١)

Uyğun ayədən мə’luм olur ki, yalnız kitab əhlindən olub saleh iş görən o şəxslər nicat tapacaqlar ki, İslaм Peyğəмbərindən qabaq yaşaмışlar. Kitab əhlinə qurtuluş və’d edən ayənin İslaм Peyğəмbəri (s) dövründə yaşayan insanlara aidiyyatı yoxdur. Ayənin nazil olмa şəraiti də uyğun baxışı təsdiqləyir. Ayə nazil olan dövrdə bir çox мüsəlмanlar öz ata-babalarının aqibətindən narahat olaraq, iztirab keçirirdilər. Onlar düşünürdülər ki, əgər yalnız İslaм dini мəqbuldursa, bəs onların ata-babalarının aqibəti necə olacaq? Həмin мəqaмda uyğun ayə nazil oldu və rəsмi e’lan edildi ki, öz əsrində Allaha və qiyaмət gününə inanмış, saleh əмəl etмiş insanlar qiyaмət günü nicat .tapacaqlar

Salмan Farsi ilk dəfə həzrət Peyğəмbərin xidмətində olarkən Mosuldakı dostları və rəhbərləri haqqında danışaraq dedi: “Mosulun bütün rəhbərləri sizin bes’ətiniz intizarında idilər. Təəssüf ki, sizi görмəмişdən qabaq dünyaya gözlərini qapadılar.” Salмanın bu sözlərindən sonra oradakılardan biri dedi: “Onlar cəhənnəм əhlidir.” Bu sözlər Salмana ağır gəldi. Elə həмin мəqaмda yuxarıda haqqında danışdığıмız ayə nazil oldu və e’lan edildi ki, həzrət Peyğəмbərin fəzilətli dövrünü görмəмiş, keçмiş haqq dində olanlar nicat tapacaqlar. Bir sözlə, İslaм Peyğəмbərindən qabaq öz dövrünün həqiqi ayinlərinə iмan gətirib saleh işlər görənlər qiyaмət günü nicat tapanlardandırlar. Aydın olur ki, ayədə bütün dinlərdən olanların bağışlanмası nəzərdə tutulмur. Qur’anın həqiqi мəfhuмundan xəbərsiz olanlar elə düşünə bilərlər ki, bütün мəzhəblərdən olan .iмan əhli nicat tapasıdır

Həcc” surəsinin ١٧-ci ayəsinin deyilənlərlə heç bir əlaqəsi yoxdur. Ayədə yalnız bu“ bildirilir ki, Allah qiyaмət günü dünyanın bütün мillətləri

arasında hakimlik edəcək. Uyğun ayə qiyamətdə bütün məzhəbdən olanların nicat .tapacağına dəlil göstərilə bilməz

### ?Nə üçün namazda “bizi doğru yola hidayət et” deyilir .۲

Sual: Həzrət Peyğəmbər və başqa müsəlmanlar doğru yolda olduqları halda, nə üçün namazda “bizi doğru yola hidayət et” deyirdilər? Doğru yolda olan şəxsin belə bir istəyi ?necə izah oluna bilər

Cavab: Varlıq aləmində olan hər bir maddi və mə’nəvi şey dəyişkənliyə mə’ruz qalır. İstənilən bir hadisə hansısa şəraitdə baş verir. Hər hansı bir halın davam etməsi üçün müəyyən şərait lazımdır. Məsələn, otaqda elektrik lampası yandırılırsa, bu o demək deyil .ki, bu lampa sönə bilməz

Doğru yola hidayət mövzusu da uyğun qanuna əsaslanır. Doğru yolda olan fərdin və ya cəmiyyətin bu yolda qalması üçün xüsusi şərtlər ödənməlidir. Əks təqdirdə, doğru yolu tapmış şəxs gələcəkdə bu yoldan çıxa bilər. Demək, doğru yolu tapdıqdan sonra bu yolu .itirmək təbii bir haldır

Bu gün doğru yolda olan fərdin və ya cəmiyyətin gələcəkdə hansı yolda olacağı haqqında bir söz demək olmaz. Sadəcə, fərd əldə etdiyi vəziyyətdən faydalanaraq, Allah dərgahına üz tutub bu misilsiz ne’mətdən məhrum olmamağını istəməlidir. Doğru yolda olan insanın “bizi doğru yola hidayət et” deməsi həmin yoldan büdrəməmək üçündür. Doğru yol böyük bir ne’mətdir və bu ne’mətdən ötrü Allaha dua etmək .zəruridir

Böyük İslam təfsirçisi Təbərsi “Məcməül-bəyan”kitabında belə bir misal çəkir: “Biz belə tə’birlərdən tez-tez istifadə edirik. Biz qonağın süfrədən uzaqlaşmaq istədiyini gördükdə dərhal deyirik ki, xahiş edirəm çəkinməyin, buyurun yeyin. Bu sözlərlə onun ”.süfrədən uzaqlaşmamasını istəyirik

## ?Göylərİn və yerİn altı gündə yaradılması nə deməkdİr .۳

Sual: Allah-təala Qur’anda buyurur: “Rəbbiniz göyləri və yeri altı gündə xəlq etdi...”(۱)Məgər həmin vaxt gecə və gündüz vardımı? Bundan əlavə, nə üçün Allah aləmi ?bir anda yaratmadı

Cavab: Birinci sualda nəzərə çatdırılır ki, gecə və gündüzün olmadığı bir vaxtda altı gün necə müəyyənləşmişdi? “Gün” sözü müxtəlif məqamlarda müxtəlif mə’nalar kəsb edir. Bu söz adətən gecənin ziddi olan gündüz mə’nasında işlədilir. Qur’anda da tez-tez bu mə’na ilə rastlaşırıq. Amma “gün” sözünün dövran mə’nası da var. Əgər söhbət bir çox dövrdən gedirsə, bu dövrlər günlər kimi də ifadə oluna bilir. Məsələn, bir qoca kişi deyir: “Bir gün uşaq idim, bir gün cavan oldum, indi isə qocayam.” Əslində həmin qoca gün .dedikdə hansısa bir dövrü nəzərdə tutur. Söhbət üç gündən yox, üç dövrdən gedir

İmam (ə) buyurur: “Dövran iki gündən artıq deyil. Bir gün sənin xeyrinədir, o biri gün sənin zərərinə.” Yə’ni insan üçün ömür boyu dövran mövcuddur. O bir dövr qüdrətli :olur, bir dövr isə çətinliklər içində. Kaşani deyir

,Həyat iki gündən uzun çəkmədi

.Biri sevinc dolu, biri qəm dolu

,Bir gün könül qaçdı həvəs dalınca

.Bir günsə qayıtdı getdiyi yolu

.Şübhəsiz ki, Kaşani öz şe’rində “gün” dedikdə dövranı nəzərdə tutur

Beləcə, ayədə işlədilmiş altı gün sözü altı dövrana işarədir. Həmin altı dövran ərzində səmalar və yer bu günki formasını aldı. Bu gün yerdə və səmada gördüklərimiz bir silsilə hadisələrin nəticəsidir. Dövran mə’nasında işlənmiş gün isə on milyon, on milyard il .çəkmiş ola bilər

Növbəti sualda Allahın göyləri və yeri nə üçün tədricən yaratdığı soruşulurdu? Sualın cavabında deyə bilərik ki, bizim yaşadığımız dünya maddi dünyadır. Tədrici təkamül materiyanın, maddi varlığın xüsusiyyəti sayılır. Hər

bir maddə hansısa zaman ərzində bir formadan başqa formaya keçir. Göylər və yer də .maddi olduğundan uyğun qanun üzrə formalaşmışdır

Əgər ətrafınızda baş verən hadisələrə diqqətlə nəzər salsanız, bütün təbəddülatların tədricən baş verdiyinə şahid olarsınız. Bütün təbiət aləmi, otlar, ağaclar tədrici şəkildə formalaşır. Bu gün dükanları bəzəyən zinət əşyaları mə’dənlərdən çıxdıqdan sonra bir çox mərhələlərdən keçib uyğun formaya gəlmişlər. Bütün canlılar, eləcə də, insanlar müəyyən bir təkamül yolu keçməsələr, həyata qədəm qoya bilməzlər. Bu qanun bütün .maddi dünyada hökm sürür

**?Yeddİ qat göy dedİkdə nə nəzərdə tutulur .۴**

Sual: Qur’ani-kərimin bə’zi ayələrində yeddi qat göydən danışılır. Yeddi qat göy ?dedikdə nəyə işarə olunur

:Cavab

Qur’anda da adı çəkilən yeddi qat göy haqqında İslam alimləri və təfsirçilərinin bir neçə :baxışı var

Burada yeddi rəqəmi çoxluğu bildirir. (Yə’ni müxtəlif səmalar) İşarə olunur ki, müxtəlif .۱ kürələr xəlq olunmuşdur. Bir çox dillərdə hər hansı bir ədədi qeyd etməklə çoxluğu bildirmək istəyirlər. Yə’ni məqsəd konkret bir rəqəm yox, çoxluqdur. Məsələn, fars dilində belə bir söz işlədilir ki, bu sözü əlli dəfə demişəm! Deyənin məqsədi bu deyil ki, eyni bir sözü əlli dəfə təkrarlamışdır. O, sadəcə, bu sözü dəfələrlə dediyini nəzərə .çatdırır

Qur’ani-kərimdə Allahın buyuruqları haqqında belə mə’lumat verilir: “Əgər yerdəki bütün ağaclar qələm, dəryalar isə mürəkəb olsaydı və yeddi dərya belə ona qoşulsaydı, yenə də Rəbbinin sözləri tükənməzdi. Həqiqətən, Allah yenilməz qüdrət və hikmət sahibidir.”(۱) Təbii ki, ayədəki “yeddi” sözü çoxluğa işarədir. Əlbəttə ki, yeddi yox, yüz yeddi dərya da əlavə olunsaydı, Allahın sözlərini yazıb qurtarmaq olmazdı. Çünki Allah bütün cəhətlərdən sonsuzdur. Qur’anda, digər mətnlərdə yetmiş rəqəmi də çoxluğu bildirmək məqsədi ilə işlədilmişdir. Bu rəqəmlərin adı

.çəkildikdə konkret bir say nəzərdə tutulмur. Məqsəd çoxluğu nəzərə çatdırмaqdır

Yeddi qat göy dedikdə, Qur’an nazil olduğu vaxt xalqa мə’luм olan yeddi kürə .٢ .nəzərdə tutulur. İndi də həмin kürələri adi gözlə görмək мüмkün deyil

.Yeddi qat göy dedikdə atмosferin qatları nəzərdə tutulur .٣

Aмма bir çox tanınмış aliмlərin nəzərincə, gözlə görünən bütün kəhkəşanlar yalnız .۴ .birinci göyün tərkibidir. Gördüyüмüz göy qatından sonra da altı qat başqa göy vardır

Qur’an yeddi qat göy dedikdə yeddi aləмi nəzərdə tutur. Bu gün elм həмin yeddi aləмi kəşf edə bilмəsə də, gələcəkdə bu iş мüмkün olasıdır. Bu baxışın tərəfdarları sübut olaraq aşağıdakı ayəni göstərirlər: “Biz ən yaxın olan göy üzünü ulduzlarla bəzədik.”(١)Ayədən belə мə’luм olur ki, qeyd etdiyiмiz ulduzların haмısı birinci göy .qatına aiddir

Belə bir nöqtəni də xatırlatмaq lazıм gəlir ki, uyğun ayə və rəvayətlər bu gün atмosfer qatları haqqında olan bə’zi nəzəriyyələri təsdiq etмir. Çünki uyğun nəzəriyyələrə görə .göy qapıları doqquzdur

Qur’anda yeddi qat yer haqqında da danışılır. Bu rəqəм də çoxluğu bildirir. Təfsirçilərin .rə’yinə görə, yeddi qat göy dedikdə hər bir kürəni əhatə etмiş göy qatı nəzərdə tutulur

Başqa sözlə, hər bir kürə bir yer hesabındadır. Bu kürələrin hər birinin ətrafında səмa qatı var. “Səмa” dedikdə ərəb lüğətində yuxarıda qərar tutмuş hər bir şey nəzərdə .tutulur

Müxtəlif təfsirçilərin nəzərlərini diqqətinizə çatdırdıq. Hər bir nəzəriyyənin tərəfdarları öz baxışlarının sübutu üçün dəlillər göstərмişlər. Aмма sonuncu təfsir daha əsaslı .görünür

### ?İkİ şərq və İkİ qərb haradadır .۵

Sual: Qur’ani-kəriмdə belə bir ayə oxuyuruq: “O (Allah) iki şərq və iki qərbin ?Allahıdır.”(٢) İki şərq və iki qərb dedikdə nə nəzərdə tutulur

Cavab: Qur’ani-məciddə şərq və qərb həm “təsniyə” (cüt), həm də cəm formada yad edilmişdir. Məsələn: “İki məşriqin və iki məğribin Rəbbinə and olsun ki, biz həqiqətən, qadirik.”(١)Digər bir ayədə isə belə buyurulur: “Zəif salınmışları yer üzünün bərəkətli şərq və qərb tərəflərinə varis etdik...”(٢)Demək, şərq və qərb həm təsniyə, həm də cəm formasında xatırladılmışdır. Təfsirçilər bu barədə deyirlər: “İki şərq və iki qərb ifadələri yerin iki yarımkürəsinə aiddir. Yə’ni bu sözlərlə şimal və cənub yarımkürələrindən söhbət açılır. Doğrudan da, yerin istənilən bir nöqtəsi digər bir nöqtəyə nəzərən həm şərqdə, həm də qərbdə ola bilər. Başqa sözlə, yə’ni iki nöqtədən biri o birinin .şərqindədirsə, ikinci nöqtə birinci nöqtənin qərbində yerləşir

İkinci baxışa görə, şərqlər və qərblər ifadələri günəşin çoxsaylı tülu və qürub nöqtələrini bildirir. Çünki günəş heç vaxt eyni bir nöqtədən tülu etmir. Yə’ni günəş fərqli nöqtələrdən tülu edir və fərqli nöqtələrdə batır. Olsun ki, elə bu məqsədlə də “şərqlər və qərblər” ifadəsi işlədilmişdir. Əgər günəşin şimalda ən böyük meyl nöqtəsini və cənubda son meyl nöqtəsini nəzərə alsaq, “iki şərq və iki qərb ifadələrinin işlədilməsi yerli görünər. Bəli, Qur’an bu sayaq tə’birlərlə xalqın diqqətini varlıq aləmindəki incəliklərə yönəldir. Şübhəsiz ki, günəşin tülu və qürubunun dəyişməsi təbiət aləminə .əhəmiyyətli tə’sir göstərir

**?Qur’anda yerİn kürə formasında olması barəsİndə nə deyİlİr .۶**

Sual: Doğrudanmı Qur’anda və rəvayətlərdə yerin kürə formasında olmasını təsdiq ?edən dəlillər var

Cavab: Varlıq aləminin Qur’anda xatırladılmış sirlərindən biri yerin kürə formasında :olmasıdır. Aşağıdakı ayələrdə bu həqiqət belə bəyan olunur

Zəif salınmışları yer üzünün bərəkətli şərq və qərb tərəflərinə varis etdik.”(٣); ٢. “O,“ .١ göylərin, yerin və onların arasında olanların



---

.Məaric”, ۴٠“[١٣۶]-١

.Ə`raf”, ١٣٧“[١٣٧]-٢

Rəbbidir. Şərqlərin və qərblərin Rəbbi odur."(١); Məşriqlərin və məğriblərin Rəbbinə (and olsun ki, biz, həqiqətən, qadirik."(٢)

Bütün bu ayələrdə günəşin tülu və qürub nöqtələrinin çoxluğundan danışılır. Tülu və qürub nöqtələrinin, şərq və qərblərin çoxluğu yalnız yerin kürə formasında olması ilə izah edilə bilər. Əgər yer müstəvi formasında olsaydı, yalnız və yalnız bir tülu və bir qürub nöqtəsi olardı. Bəli, tülu və qürub nöqtələrinin çoxluğu yerin kürə formasında .olmasının möhkəm dəlilidir

Bəs rəvayətlərdə bu barədə nə deyilir? Mə'sumlardan (ə) nəql olunmuş hədislərdə yerin kürə formasında olması aşkar şəkildə bəyan olunur. Rəvayətlərdən birində imam Sadiq (ə) buyurur: "Bir şəxs mənimlə yol yoldaşı oldu. Bu şəxs şam namazı qılmaq üçün qaranlığın düşməsini, sübh namazını qılmaq üçün isə gecənin axırını gözləyirdi. Mənsə başqa cür hərəkət edirdim. Günəş batan zaman məğrib namazını, fəcr tülusu zamanı isə sübh namazını qılırdım. Həmin şəxs mənim bu hərəkətimə e'tiraz edərək dedi: "Günəş .bizim yerdə tülu etməzdən qabaq başqalarına tülu edir

Eləcə də, bizim yerdə gözdən itdiyi vaxt hələ də başqalarına görünür." Mən ona dedim: "Məğrib (Şam) namazını qılmaq üçün bizim vəzifəmiz günəşin öz üfüqümüzdə itməsini gözləməkdir. Başqa yerdə günəşin batması bizə aid deyil. Beləcə də, əgər bizim məntəqəmizdə fəcr tülu edirsə, sübh namazını qılmalıyıq. Başqa yerlərdə bizdən qabaq günəşin tülu etməsi bizə aid deyil. Onların öz üfüqü var, bizim öz üfüqümüz."(٣) Başqa bir hədisdə imam belə buyurur: "Bizim vaxt ölçümüz öz məntəqəmizin məşriqi və məğribidir." .Hər iki hədisdən mə'lum olur ki, yer kürə formasındadır

### Yerİn hərəkət forması .٧

Sual: Astranomlar bildirirlər ki, yer kürə formasındadır və öz oxu ətrafında hərəkət edir. Bu müddəalar elmi şəkildə sübuta yetirilmişdir, yoxsa bir ehtimaldır? Qibləni tə'yin etmək üçün istifadə olunan Oğlaq bürcü nə üçün həmişə eyni bir nöqtədə müşahidə olunur? ?Qur'an rəvayətlərində uyğun müddəalar təsdiqlənirmi

١- [١٣٩] “Saffat”, ٥.

٢- [١٤٠] “Məaric”, ٤٠.

٣- [١٤١] “Vəsailüş-şiə”, c. ١, s. ٢٣٧.

Cavab: Yerin kürə formasında olması və onun hərəkəti bu gün elmi təsdiqini tapmış məsələlərdəndir. Hər iki müddəanın sübutu üçün bir çox dəlillər gətirilmişdir. Yerin hərəkətdə olmasının sübuta yetirilməsi üçün belə bir təcrübə aparılmışdır. Ağır bir kürəcik ip vasitəsi ilə uca bir nöqtədən asılmışdır. Cisim hərəkətə gətirilmiş və onun hərəkəti uzun müddət izlənilmişdir.Əgər yer hərəkətsiz olsaydı, cisim yalnız bir xətt boyunca hərəkət etməli idi. Amma təcrübədən mə’lum oldu ki, həmin kürəcik vaxt ötdükcə öz hərəkət istiqamətini dəyişir. Bunun səbəbi yerin hərəkətdə olması idi. Eləcə də, çox yuxarıdan atılmış bir daş parçası yerə doğru düz xətt boyunca hərəkət etmir. Həmin daş azca da olsa, qərbə doğru meyl edir. Bu təcrübə də yerin hərəkətdə olmasını .göstərir

Bəs nə üçün Oğlaq bürcü daim bir yerdə olur? Çünki bu bürc təqribən yer kürəsinin oxu istiqamətində yerləşir. Başqa bir misal göstərək. Əgər iynəni almanın mərkəzinə batırıb, almanı həmin iynə ətrafında fırlatsaq, iynənin uc nöqtəsi dəyişməz qalacaq. Bu səbəblərdən qütb ulduzu, Oğlaq bürcü daim sabit şəkildə görünür. Eləcə də yer kürə şəklində olduğundan biz yer üzündə haraya getsək, başımızın üstündə səma, .ayağımızın altında yeri görəsiyik. Cazibə qüvvəsi bizi daim yer üzündə saxlayır

Bə’zi ulduzlar isə cənub yarımkürəsində göründüyü halda, şimal yarımkürəsində :görünmür. Yerin hərəkətdə olmasını sübuta yetirən bə’zi ayələri nəzərdən keçirək

١. “Dağlara baxıb onları hərəkətsiz zənn edərsən. Halbuki onlar buludlar ötüb-keçdiyi kimi ötüb-keçirlər. Bu hər şeyi bacarıqla, yerli-yerində edən Allahın gördüyü işdir.” (١)

Bə’zən bu ayənin qiyamətə aid olduğu qeyd edilir. Yə’ni insan qiyamət günü dağları bu şəkildə müşahidə edər. Amma uyğun ifadənin ardınca Allah-təalanın qüdrətinə işarə .olunması göstərir ki, söhbət varlıq aləmindəki nizamdan gedir

Ayədən belə nəzərə çarpır ki, dağlar da buludlar kimi hərəkətdədirlər. Soruşula bilər ki, nə üçün Allah yer haqqında yox, dağlar haqqında danışır? Məgər dağlar yerə aid deyilmi? Əgər yerin hərəkətinə işarə olunsaydı, bu daha münasib olmazdımı? Gözünüzün qabağına dişli bir çarx gətirin. Bu çarx hərəkətə gəldiyi vaxt həmin dişlər onun hərəkətdə olmasını daha aydın nəzərə çarpdırır. Dişsiz çarxın fırlanmasını hiss etmək çətin olur. Bundan əlavə, dağlar həmişə əzəmət nişanəsi olmuşdur. Bu da

.məluмdur ki, yer hərəkətə gəlмədən dağlar hərəkət edə bilмəz



---

.Nəмl, ۸۸“[۱۴۲] -۱

Bundan əlavə, ayənin mətnində dağlar hərəkətsiz yox, donmuş kimi təsvir olunur. Bəli, biz dağları yerində donmuş vəziyyətdə görürük. Onlar isə hərəkətdədirlər. Nə üçün Allah-təala dağların hərəkətini buludların hərəkətinə oxşadır? Biz buludların sür'ətlə .hərəkət etdiyini görürük. Ayədə dağların da sür'ətlə hərəkətdə olduğu bildirilir

O kəs ki yeri sizin üçün asayiş məhəlli qərar verdi."(۱) Qur'an bizim yeri beşiyə . ۲ .bənzədir. Beşik hərəkətdiə olduğu kimi, yer də hərəkətdədir

**?SUAL: "Fəla uqsİmu bİl-xunnəs; əl-cəvarİl-kunnəs" ayələrİnİn təfsİrİ nədİr .۸**

Cavab: "Xunnəs" "üz tutub geri dönən" mə'nasını verir. "Kunnəs" gizlənən deməkdir. "Cəvar" isə axan, gedən mənasında işlənir. Təfsirçilərin bildirdiyi kimi, ayələrdə gözlə görünən səyyarələr nəzərdə tutulur. Onlar hərəkət edir, bə'zən görünür, bə'zən isə gözdən itirlər. Qur'ani-məcid bu səyyarələrə and içməklə insanların diqqətini yaradanın (əzəmətinə yönəldir: "And olsun dönən ulduzlara; axıb gizlənmişlər."(۲

Maraqlıdır ki, astronomlar bu ulduzları "mütəhəyyirə", yə'ni "heyran qalmış" adlandırırlar. Çünki onlar bir-başa xətt üzrə hərəkət etmir, bir qədər hərəkət edib, azca geri dönür və ikinci dəfə hərəkətə başlayırlar. Olsun ki, ayədə "geri dönənlər" ifadəsi .bu məqsədlə işlədilmişdir

**?Böyük fəzİlətə malİk Qədr gecəsİ bütün yer üzündə eynİ gecədİrmİ .۹**

Sual: İslam dinində Qədr gecəsinin əhəmiyyəti və əzəməti haqqında çox danışılmışdır. Bu gecə ramazan ayının ya on doqquzuna, ay iyirmi birinə, ya da iyirmi üçünə düşür. Həmin .gecədə ibadətlərin böyük fəziləti vardır

Mə'lum olur ki, Qədr gecəsi ildə bir dəfə olur. Onu da bilirik ki, müxtəlif məntəqələrdə üfüqlər fərqləndiyindən bə'zi ölkələrdə ramazan ayının başqa məntəqələrdəkindən bir neçə gün fərqlənir. Bə'zi məntəqələrdə ramazan ayı tez, bə'zi məntəqələrdə isə gec başlayır. Bu hesabla Qədr gecəsi də ayrı-ayrı məntəqələrdə müxtəlif günlərə düşməlidir. Demək, Allahın və'd etdiyi rəhmət

mələkləri bir gecədə yox, bir neçə gecədə nazil olur. Yoxsa Qədr gecəsi təkcə həzrət ?Peyğəmbərin dövründə Məkkə mühitinə aid olmuşdur? Həqiqət haradadır

Cavab: Mənbələrə və çoxsaylı dəlillərə əsasən Qədr gecəsi təkcə Peyğəmbər dövrünə aid deyil. Bütün dövrlərdə, dünyanın müxtəlif nöqtələrində Qədr gecəsinin mövcudluğu şübhə doğurmur. Amma Qədr gecəsinin bütün dünya üçün eyni saatda başlayıb başa çatması yanlış fikirdir. Bilirik ki, yer kürə formasına malikdir. İki yarımkürədən birində gecə olduqda, birində gündüz olur. Deмək, Qədr gecəsi bütün yer üzündə eyni saata təsadüf edə bilməz. Yer üzünün bütün məntəqələrində qəməri təqvim üzrə bir Qədr .gecəsi vardır

Hər bir məntəqədə həmin məntəqənin üfüqünə uyğun olaraq qəməri təqvim hesablanır. Ramazan ayının girişi də həmin məntəqənin üfüqü ilə bağlıdır. Qədr gecəsi hər bir məntəqənin ramazan ayının ya on doqquz, ya iyirmi bir, ya da iyirmi üçüncü gecəsinə .təsadüf edir

Ayrı-ayrı məntəqələr arasındakı saat fərqləri təkcə Qədr gecəsinə tə’sir göstərmir. Bütün müqəddəs dini günlər ayrı-ayrı məntəqələrdə fərqli vaxtlarda qeyd edilir. Məsələn, İslamın böyük bayramlarından biri Fitr bayramıdır. Həmin günün xüsusi və çox fəzilətli ibadətləri vardır. Həmin günü hər bir məntəqədə həmin məntəqənin üfüqünə uyğun qeyd edirlər. Məsələn, qurban bayramı Səudiyyə Ərəbistanında İrandakından bir gün qabaq başlayır. Ayədə və’d olunan həqiqətlər, eləcə də, rəhmət mələklərinin .nazil olması hər məntəqənin öz üfüqünə uyğun Qədr gecəsində gerçəkləşir

### ?Zülqərneyn günəşİn batdığı yerdə nə gördü .١٠

Sual: Allah-təala Qur’ani-məciddə Zülqərneynin əhvalatı haqqında belə buyurur: “O yola çıxdı; Nəhayət, günəşin batdığı yerə gəlib çatdıqda onu qara bulaşıq bir çeşmədə batan gördü.”(١) Axı necə ola bilər ki, böyük bir əzəmətə malik olan günəş bulaşıq bir ?suda batsın? Məgər bu deyilənlər mövcud elmi mə’lumatlara zidd deyilmi

Cavab: İslam alimləri və təfsirçilərinin son araşdırmalarına əsasən Zülqərneyn məğribdən hərəkət edərək, dərya sahilinə çatdı. Günəşin qürub çağı

Zülqərneyn sahildə dayanmışdı və günəşin heyranedici qürub səhnəsinə tamaşa edirdi. Yer kürə formasında olduğundan günəşin qürub vaxtı sahildə olan hər bir insan günəşin dənizdə batdığını görür. Bu ayə sadəcə onun hisslərini bəyan etmişdir. Demək, ayə yerin kürə formasında olması ilə tam uyğundur. Qara, bulaşıq çeşmə isə Zülqərneynin qarşısında dalğalanan dərya olmuşdur. Bəs nə üçün Qur’anda bu dərya böyük su kütləsi kimi yad edilir. Dəniz və okeanlar suyu çox olduğundan çaylar uzun yollar keçib, nəhayətdə bu böyük su kütlələrinə qovuşur. Deməli, çaylar, dənizə, dənizlər isə okeanlara üz tutmuşdur. Ona görə də Qur’an Zülqərneynin qarşısındakı .dəryanı böyük su kütləsi adlandırır

Bəs nə üçün Qur’an dəryanın suyunu qara, bulaşıq kimi yad edir. Bunun bir neçə səbəbi :vardır

;Adətən, dənizlərin sahili bulaşıq olur .١

Günəş qürub etdiyi vaxt dənizin suyu qara rəngə çalır .٢

Su kütləsi artıb dərinləşdikcə onun maviliyi də tündləşir və qara rəngə çalır. Qur’an .٣ .bu tünd rəngi bulaşıq kimi təsvir etmişdir

### Qur’an və səma cİsmlərİnİn ram edİlməsİ .١١

Sual: Qur’ani-Kərimdə səma cisimlərinin alimlər tərəfindən hansısa bir həddə ram edilməsi barədə mə’lumat verilmişdirmi? Bəşəriyyət bu sahədə daha da irəli gedə ?biləcəkmi

Cavab: Şübhəsiz ki, insan həyata qədəm qoyduğu gündən təkamüldədir. İndi də elə bir gün olmur ki, yaranış aləminin hansısa bir sirri açılmasın. Bəli, insan nə vaxtsa öz yaşayış .məkanını başqa planetlərədək genişləndirə bilər

Qur’ani-Kərimin göylərin və yerin insan üçün ram edilməsi haqqındakı ayələri, olsun ki, yuxarıda deyilənlərə bir işarədir. Günəş, ay və başqa səma cisimləri ilk gündən ram edilməsinə baxmayaraq, onlardan faydalanmanın da dərəcələri var. Onların ən kamil :halı yaşayış üçün yararlı olmalarıdır. İndi isə bə’zi ayələrə nəzər salaq

١. Göylərdə və yerdə nə varsa, hamısını Öz tərəfindən sizin ixtiyarınıza qoyan da Odur. Həqiqətən, düşünən bir qövm üçün bunda ibrətlər var.”(١)

٢. Məgər Allahın göylərdə və yerdə olanları sizin üçün ram etdiyini, aşkar və gizli ne’mətləri sizə bolluca ehsan etdiyini görmürsünüzmü?!(٢)



---

١- [١۴۶] “Əlcasiyə”, ١٣.

٢- [١۴٧] “Loğman”, ٢٠.

Seyr edən günəşi və ayı, həmçinin gecəni və gündüzü sizin ixtiyarınızda qoyan .۳ (Odur."(۱)

Bəli, yuxarıdakı ayələrdə Qur’an bildirir ki, Allah-təala bütün ne’mətləri, eləcə də, göyləri və yeri insanın ixtiyarında qoymuşdur. Amma insan bütün bu ne’mətləri tədricən əldə etməlidir. Hər əsrin öz kəşfi, öz nailiyyətləri var. Allahın yer üzündə olanları insanın ixtiyarında qoyması o demək deyil ki, yerin təkində və üstündə olan bütün ne’mətlər heç bir zəhmətsiz ələ gələsidir. Xeyr, insan çalışmalı, araşdırmalar aparmalı, qiymətli xəzinələri kəşf etməlidir. Bə’zi dövrlərdə insan yalnız bə’zi mə’dənləri kəşf edə bilirsə, olsun ki, nə zamansa yerin təkindəki bütün ehtiyatlar kəşf olunacaqdır. Bəşər gələcəkdə elə mənbələr tapa bilər ki, hazırkı dövrümüzdə həmin mənbələr barədə zərrəcə mə’lumat yoxdur. Səma cisimləri elə ilk gündən bəşəriyyətə ram olmuş olsa da, .yalnız zaman keçdikcə onlardan daha çox istifadə olunacaq

Ərrəhman" surəsinin ۳۳-cü ayəsində buyurulur: "Ey cin və insan tayfası, əgər göylərin" və yerin ətrafından kənara çıxa bilərsinizsə, çıxın. Siz yalnız qüvvət və qüdrətlə çıxa bilərsiniz." Ayədən göründüyü kimi, insan elmi-texniki tərəqqinin nailiyyətləri ilə silahlanaraq fəzaya səfər edə bilər. Nə vaxtsa xəyal kimi görünən bu işlər indi adi bir .gerçəklikdir

### ?Sizin bilmədiyiniz neçə–neçə şeylər yaradacaqdır" ayəsində nəyə işarə olunur" .۱۲

Sual: Allah-təala Qur’ani-məcidin "Nəhl" surəsində dörd ayaqlı minik vasitələrini xatırlatdıqdan sonra buyurur: "Allah-təala sizin bilmədiyiniz neçə-neçə şeylər ?yaradacaqdır." Yoxsa ayədə bugünki nəqliyyat vasitələrinə işarə olunur

Cavab: Təfsirçilər arasında belə bir fikir var ki, ayədə həmin vaxt namə’lum olan bugünki nəqliyyat vasitələrinə işarə olunur. Ehtimala görə, dənizin dərinliyində, meşənin ənginliyində yaşayan və insanlara mə’lum olmayan canlı miniklər nəzərdə .tutulmuşdur



---

.İbrahim", ۳۳"[۱۴۸] -۱

## ?Qur’an ayələri transformizmi təsdiqləyirmi .۱۳

Sual: Transformizmi (mövcudların tədricən inkişaf edərək bir növdən başqa növə keçməsi) sübuta yetirməyə çalışan bir müəllif Qur’an ayələrini dəlil göstərmişdir. O, sübut etməyə çalışır ki, Qur’an da transformizm nəzəriyyəsini təsdiqləyir. Dəlil olaraq :göstərilən iki ayəyə nəzər salaq

İnsan xatırlamırmı ki, ilk öncə onu heçdən yaratdıq.”(۱) Yazıçı ayədən belə bir nəticə“ .۱ çıxarır ki, insan bir zaman hansısa formada olmuş, sonradan təkamül nəticəsində bugünkü şəkilə düşmüşdür. Guya insan əvvəl təkhüceyrəli olmuş, sonra insanabənzər .meymuna çevrilmiş və nəhayət, bugünkü müasir görkəmini almışdır

İnsanın xatırlamağa layiq olmayan bir keçmiş dövrü olmuşdur.”(۲) Müəllifin fikrincə,“ .۲ insan bir zaman heyvanlar cərgəsində olduğundan onun keçmişi xatırlanmağa layiq ?bilinmir. Doğrudanmı ayələr transformizmi dəstəkləyir

Cavab: Yuxarıda zikr olunan iki ayənin transformizm nəzəriyyəsi ilə heç bir əlaqəsi .yoxdur

Birinci ayənin təfsiri: İnsanın çətinliklə inanacağı mövzulardan biri məad, ölümdən sonrakı həyatdır. Ona görə də Qur’anın bir çox ayələrində məadı inkar edənlərə qarşı dəlillər gətirilmişdir. Allah-təala məadı inkar edənlərə belə cavab verir: “İnsan soruşur ki, mən öldükdən sonra çıxarılıb diriləcəyəmmi? Məgər insan ilk öncə onu heçdən yaratdığımızı xatırlamırmı? Rəbbinə and olsun ki, biz onları şeytanlarla birlikdə yığıb məhşərə gətirəcək, sonra onları diz üstə çökmüş halda cəhənnəmin ətrafına düzəcəyik...”(۳) Demək, transformizmin müdafiəsinə qalxmış müəllifin düşüncəsinin əksinə olaraq, uyğun ayədə məadı inkar edənlərə cavab verilir. Doğrudan da, insanı heçdən yaratmış Allah üçün onu yenidən diriltmək çətinmi olasıdır?! Bu gün maddə və enerjinin itməməsi haqqında qanun mübahisəsiz olaraq qəbul edilmişdir. İnsanı heçdən yaradan Allah onun ölümlə formasını dəyişmiş varlığını əvvəlki halına qaytara bilməzmi?! Bəli, insanın bugünkü şəklə düşməzdən qabaq hansısa canlı və ya hüceyrə şəklində olması boş bir xülyadır. Bu ayə də bir çox başqa ayələr kimi qiyamət və məad haqqında .danışır

İkinci ayənin təfsiri: Yenicə doğulmuş bir körpə hər hansı bir səbəbdən soyuq havada tənha qalarsa, şübhəsiz ki, qısa bir zamanda həlak olar. Əgər belə bir məqamda



---

۱- [۱۴۹]"Məryəm", ۶۷.

۲- [۱۵۰]"İnsan", ۱.

۳- [۱۵۱]"Məryəm", ۶۶-۶۸.

xeyirxah bir insan onu götürüb evə apararsa, ona qayğı göstərərsə, həmin körpə ixtiyarında qoyulmuş ne'mətlərdən istifadə edərək, böyüyüb boya-başa çatar. Təbii ki, bir müddət sonra, əvvəlki körpə yetkinlik yaşına çatıb, özünü tə'min etmək gücündə olacaq. O, bir zaman onu küçədən götürüb himayəsi altında böyütmüş xeyirxah şəxsə təşəkkür də edə bilər, onun zəhmətlərini unudub nankor da ola bilər. Əgər boya-başa çatmış yeniyetmə nankorluq edərsə, ona xeyirxahlıq göstərən şəxsin haqqı var ki, keçmişini xatırladıb, onu məzəmmət etsin.

Allah-təala da "İnsan" surəsində azğın, nankor insanı qəflət yuxusundan oyatmaq üçün onlara keçmişlərini xatırladır. İnsanın yadına salınır ki, Allah onu heçdən xəlq etmiş, yoxluğa varlıq libası geydirmişdir. Onlar isə bütün ilahi ne'mətləri unudaraq, nankorluq yolunu tutmuşlar! Bəli, ikinci ayənin məfhumu budur və onun tədrici təkamül nəzəriyyəsi ilə heç bir bağlılığı yoxdur.

### ۱۴. Qur'ani-kərimin bə'zi ayələri İslamın ümumbəşəri din olmadığını təsdiqləyirmi?

Sual: Qur'ani-kərimdə oxuyuruq: "Biz bütün Peyğəmbərləri yalnız öz millətinin dilində danışan göndərdik ki, onlara izah edə bilsin."(۱) Ayədən belə mə'lum olmurmu ki, Qur'an yalnız ərəblərə göndərilmişdir? Əgər İslam dini ümumbəşəri bir dindirsə, nə üçün o bir qövmün dilində nazil edilmişdir?

Cavab: Bütün bəşəriyyətin hidayəti üçün göndərilmiş peyğəmbərlər ilk öncə öz qövmlərinin arasında təbliğ etmişlər. Ona görə də bütün asimani kitablar Peyğəmbərlərə daha yaxın qövmlərin dilində nazil edilmişdir. Din ilk öncə Peyğəmbərin qövmü arasında möhkəmləndikdən sonra digər millətlər arasında da yayılmışdır.

Bu gün hər bir ölkənin yazıçısı öz kitabını öz millətinin dilində yazır. Hansı ki, kitabdakı məfhumlar bir millət üçün nəzərdə tutulmur. Yazıçı öz kitabını öz milləti arasında tanıtdırdıqdan sonra həmin kitab müxtəlif dillərə tərcümə olunur və dəyərli əsər hesab olunduqda bütün dünyaya yayılır.

İslam Peyğəmbəri (s) ərəb ümməti arasından çıxdığı üçün ilkin mərhələdə ərəblərlə ünsiyyətdə idi. Qur'anın ərəb dilində nazil olunması çox təbii və məntiqi bir işdir. Bununla belə, Qur'anın hökmləri bütün bəşəriyyətə ünvanlanmışdır.

Əgər Peyğəmbərin be’səti günü dünyada beynəlmiləl bir dil mövcud olsaydı, şübhəsiz ki, Qur’an da həmin dildə nazil edilərdi. Nə qədər ki, beynəlmiləl bir dil yoxdur, hətta yazıçılar da öz əsərlərini hansısa qövmün dilində yazmağa məcburdurlar. Demək, Qur’anın ərəb dilində olmasının onun ümumbəşəri bir din təbliğ etməsinə heç bir .maneçiliyi yoxdur

Başqa sözlə, ayədə bir qövmün dilində danışan Peyğəmbər göndərilməsi bildirilir. Bu isə Peyğəmbərin bir qövmə göndərilməsi deyil. Əgər səmavi kitab bir qövmün dilində .gəlmişdirsə, bu o demək deyil ki, kitab yalnız həmin qövmə aiddir

Onu da qeyd etməliyik ki, İslam millət, dil kimi fərqlərin fövqündə dayanaraq, bütün dünyanı özünə vətən bilir. Onun ərəb dilində nazil edilməsinin səbəbi isə həmin vaxtda beynəlmiləl dilin mövcud olmamasıdır. Qur’anın ümumbəşəri bir dini təbliğ etməsi isə .möhkəm dəlillərlə əsaslandırılmışdır

### ?Nə üçün Allah–təala Qur’anİ–kərİmdə bəzən “Mən” yox, “Bİz” kəlməsİNİ İşlədİr .۱۵

Sual: Allah Əhəd, Vahid, yeganə olduğu halda, kəlamlarında nə üçün “Biz” kəlməsindən ?istifadə edir

Cavab: “Mən” əvəzində “Biz” deyilməsi əzəmət və böyüklük nişanəsidir. Ərəb ədəbiyyatçılarının fikrincə, “Mən” yerinə “Biz” işlədilməsi əzəmətli isanlara xas olan xüsusiyyətdir. Böyük insanlar heç vaxt tək olmurlar. Ümumiyyətlə, çoxlu tərəfdarları olan şəxs danışarkən “mən” yox, “biz” kəlməsini işlədir. Qur’anda isə “biz” kəlməsi .Allahın əzəmətinə işarədir

Qur’anda hər dəfə Allahın Özünü “Biz” kəlməsi ilə təqdim etməsi Onun əzəmət və böyüklüyünü xatırladır. Bəli, bütün varlıq aləmi Onun hökmü altındadır. Belə bir ifadə .bizim tövhid inancımızı kamilləşdirir və diqqətimizi Allahın müqəddəs zatına yönəldir

### .Qur’anİ–məcİddə qəlb, göz və qulaq haqqında .۱۶

Sual: Qur’ani-məciddə buyurulur: “Allah onların qəlblərinə və qulaqlarına möhür vurmuşdur. Gözlərində də pərdə vardır.”(۱)Nə üçün bu ayədə qəlb və göz cəm halda, ?qulaq isə tək halda işlədilmişdir

Cavab: Bə'zi təfsirçilərin fikrincə, ayədəki "cəm" kəlməsi "qulaq" yox, eşitmə kimi tərcümə olunmalıdır. Eşitmə isə məsdər olduğundan əlavə edildiyi kəlmənin halı ilə müəyyənləşir. Yə'ni ayə "Allah onların qəlblərinə və eşitməsinə möhür vurmuşdur" kimi .tərcümə olunarsa, "eşitmə" "onlar" kəlməsinə bağlandığından cəm formanı bildirər

Başqa bir qrup təfsirçi isə qulaq kəlməsinin tək halda işlənməsini qulağın məhdud fəaliyyəti ilə əlaqələndirmişlər. Onların fikrincə, qəlb və gözün fəaliyyət sahəsi çeşidlidir. Məsələn, göz rəngləri, ölçüləri hiss edir, qəlb isə kədər, sevinc, qəzəb kimi hissləri yaşayır. Qulağın isə yeganə fəaliyyəti səsin eşidilməsidir. Həqiqətən də, qulaq müxtəlif səslər eşitmiş olsa da, onun fəaliyyət sahəsi gözün fəaliyyət sahəsi kimi .rəngarəng deyil

### ?Nə üçün batİl mə'budlar yanır .١٧

Sual: Qur'ani-məciddə oxuyuruq: "Siz də, Allahdan başqa ibadət etdiyiniz bütlər də cəhənnəmdə yanacaqsınız..."(١)Söhbət müşriklərin pərəstiş etdiyi bütlərdən gedir. Axı bütpərəstlər həm də canlı heyvanlara sitayiş etmişlər. Bəs bu şüursuz heyvanların ?günahı nədir ki, cəhənnəmdə yansınlar

Cavab: Böyük şiə təfsirçisi mərhum Təbərsi "Məcməul-bəyan" təfsirində yazır: "Ayədə Məkkə müşriklərinə xitab olunmuşdur. "Ənbiya" surəsinin bütün ayələri Məkkədə nazil edilmişdir. Məkkənin bütləri isə ağac, dəmir və daşdan idi. Məhz bu bütlərin cəhənnəmdə yanacağı bildirilmişdir. Başqa xalqların pərəstiş etdiyi canlı bütlər isə ayədə nəzərdə tutulmur. Maraqlıdır ki, həmin dövrdə Ərəbistan yarımadasında canlı ".bütlərə sitayiş edilmirdi

Bəli, Allah-təala batil bütləri cəhənnəmdə yandırasıdır. Bütlər odda yandığı vaxt !müşriklər anlayacaqlar ki, onların sitayiş etdiyi bütlərin zərrəcə gücü yox imiş

### ?Allahdan qeyrİsİnə səcdə etmək olarmı .١٨

Sual: Qur'ani-kərimdə oxuyuruq: "Yusif ata-anasını taxt üstündə oturtdu. Onlar səcdə etdilər. Yusif dedi: "Bu əvvəlcə gördüyüm yuxunun tə'biridir."(٢) Bəli, Yusif bir vaxt yuxuda görmüşdü ki, günəş, ay və on bir ulduz onun qarşısında səcdə edir. Tarixdə isə belə oxuyuruq: Əmirəl-mö'minin (ə) Siffeynə göndərildiyi vaxt yolun kənarında

durmuş bir dəstə adam öz adət-ən'ənələrinə uyğun olaraq, həzrəti görüb səcdəyə düşdülər. Bu mənzərə həzrəti çox narahat etdi və o buyurdu: "Necə də ləzzətsiz bir günaha yol verdiniz. Gedin işinizlə məşğul olun, mən də sizin kimi bir məxluqam." Bəs nə ?üçün Yusifin ata-anası və qardaşları Yusifə səcdə etdilər

Cavab: Pərəstiş məqsədilə edilən səcdə yalnız Allahın müqəddəs zatına məxsusdur və Ondan qeyrisinin qarşısında səcdə etmək caiz deyil. Amma Yusifin ata-anası və qardaşları şükür məqsədi ilə səcdə etdilər. Bu səcdə Yusifə yox, Allah-təalaya aid idi. Mələklərin Adəmə səcdə etməsi də bu qəbildəndir. Onlar Adəmə üz tutduqları halda Allaha səcdə edirdilər. Yusifin ata-anasının və qardaşlarının səcdəsi Əmirəl-mö'mininin .(ə) sözləri ilə ziddiyyət təşkil etmir

**?Nəsuh tövbə" nədİr" .١٩**

Sual: Qur'ani-məciddə oxuyuruq: "Ey iman gətirənlər, Allaha tövbə edin, nəsuh bir ?tövbə."(١) Xalq arasında da "nəsuh tövbə" ifadəsi çox işlədilir. Nəsuh tövbə nədir

Cavab: "Nəsuh" sözünün lüğət mə'nası xalis deməkdir. Nəsuh tövbə isə xalis tövbə mə'nasını daşıyır. Xalis tövbə odur ki, bir daha günaha qayıtmasın. Uyğun həqiqəti təsdiqləyən rəvayətlər çoxdur. İmam Sadiqdən (ə) soruşdular ki, "Allaha nəsuh tövbə edin" nə deməkdir? İmam (ə) buyurdu: "Məqsəd odur ki, bəndə günahına tövbə etsin və (bir daha həmin günaha qayıtmasın."(٢

İmam Sadiqdən (ə) nəql olunmuş başqa bir hədisdə həzrət buyurur: "Nəsuh tövbə odur (ki, tövbə edən insanın batini zahiri kimi olsun."(٣

**?Behİştə daxİl olmuş İnsan oradan çıxarıla bİlərmİ .٢٠**

Sual: Bizim əqidəmizcə, behiştə daxil olan insanlar orada əbədi qalasıdırlar. Əksər ayələrdə bu mə'na təsdiqlənsə də, "Hud" surəsinin ١٠٨ ci ayəsində uyğun məsələ şübhə altına alınır. Ayədə buyurulur: "Əgər Rəbbim bunu istəsə, xoşbəxt olanlar tükənməz bir ne'mət kimi göylər və yer durduqca cənnətdə əbədi qalacaqlar." "Əgər Allah istəsə" ifadəsindən belə bir fikir yaranır ki, kimlərsə behiştə daxil olduqdan sonra xaric edilə ?bilər. Həqiqət haradadır

Cavab: Aləmlərin Rəbbinin xoşbəxt insanlara həmişəlik behişt və'd etməsi doğrudur. Öz və'dinə xilaf çıxmayan Allah buyurur: "Allah və'd etdi. Allah öz və'dinə xilaf çıxmaz. Lakin onların əksəriyyəti bunu bilməzlər."(١)

Amma insanlar elə təsəvvür edə bilərdilər ki, Allah xoşbəxt insanları behiştə daxil etdikdən sonra ondan asılı bir iş qalmır. Hətta Allah-təala behiştə daxil etdiyi insanları oradan xaric də edə bilməz. Beləcə Allahın qüdrəti şübhə altına alınmış olardı. Ona görə Allah-təala hətta behişt əhli üçün də öz istəyini şərt qoyur. Bəli, O daimi behişt və'd etmiş və Öz və'dinə əməl edəsidir. Amma bununla Allahın qüdrət dairəsi məhdudlaşmır. Hətta behiştə daxil etdiyi insanların da taleyi Onun əlində olur. Allah istədiyini edər və Onun qüdrəti qeyri-məhduddur.

Allah Öz istəyini növbəti ayədə cəhənnəm əhli haqqında danışarkən önə çəkmişdir. Ayədə belə buyurulur: "Bədbəxt olanlar od içərisində qalacaqlar. Onları orada ah-fəryad gözləyir; Rəbbinin istədiyi istisna olmaqla."(٢)

Bununla belə haqqında danışılan ayənin son cümləsində ilahi ətaların sabit olduğu və heç vaxt insanlardan alınmayacağı buyurulur."

**٢١. Hər İşdən öncə Allahın adı çəkİlməsİnİn faydası nədİr?**

Sual: Deyirlər ki, işə başlamazdan qabaq Allahın adını çəkin. Məgər bunun işə tə'siri varmı?

Cavab: Allaha diqqətin əməlin paklığına tə'sirini nəzərə aldıqda aydın olur ki, hər hansı bir işdən qabaq Allahın adı çəkildikdə insanın diqqəti həmin işin paklığına, düzgünlüyünə yönəlir. Bu işin hətta başqa faydaları olmasaydı da, yuxarıda deyilən fayda bəs edərdi. İşin başlanğıcında Allahın adının çəkilməsi, onun müqəddəs zatından kömək istənilməsi həm də tərbiyə dərsidir. Allahın adını çəkib işə başlayan insan düzgünlüyə riayət etməyə çalışır, xəyanətdən çəkinir. Məgər bu gün cəmiyyətimizdəki bədbəxtliklərin mühüm bir hissəsini bu xəyanətlər təşkil etmirmi?!

Bundan əlavə, məhdud və zəif insan daim ilahi yardıma ehtiyaclıdır. O "bismillah" deməklə öz ehtiyacını izhar edir, Allahın sonsuz qüdrətindən yardım diləyir. Rəhim, mehriban, qadir, bacaran Allah insanı öz mərhəmət və xüsusi diqqətindən faydalandırır.

## ?Qur’anda təhrİf varmı .۲۲

Sual: Qur’ani-kərim İslam Peyğəmbərinə bu gün əlimizdə olduğu halda gəlmişdir, yoxsa ?son on dörd əsrdə hansısa təhriflər baş vermişdir

Cavab: Bilməliyik ki, Qur’anın təhrifi haqqında söz-söhbətlər daha çox məsihilər və yəhudilər tərəfindən yaradılır. Tarix şahiddir ki, bu iki qövmün asimani kitabı zaman keçdikcə təhrif olunmuş, dəyişdirilmiş və e’tibarını itirmişdir. Onlar Qur’an-kərimə də .belə bir damğa vurmağa çalışırlar

Tarix şahiddir ki, tövratın nüsxələri müxtəlif hadisələr, xüsusi ilə də yəhudilərə hücumlar zamanı dəfələrlə dəyişdirilmiş və yəhudi din xadimləri onu bəzəyib-düzəməyə .çalışmışlar

Tarixdən mə’lum olduğu kimi, “İncil dördlüyü” həzrət Məsihdən sonra bir qrup tərəfindən dəyişikliklərə mə’ruz qalmış və beləcə, həzrət İsaya nazil edilmiş səmavi .kitabdan əsər-əlamət qalmamışdır

Dini maarifi və üsulu bu sayaq e’tibarsız kitablar üzərində qurulanlar Qur’anı da belə bir aqibətə düçar etmək istəyirlər. Onlar iddia edirlər ki, zaman keçdikcə Qur’an da .təhrif edilmişdir

Hansı ki, Qur’anın toplanma və qorunma prosesindəki dəqiqlik Tövrat və İncilin tənzimlənməsi ilə müqayisə oluna bilməz. İslam tarixinin heç bir dövründə Qur’anın :dəyişdirilməsi üçün şərait olmamışdır. Bu məsələ ilə bağlı iki mövzunu nəzərdən keçirək

Qur’ani-məcid İslamın bütün ictimai dönəmlərində inqilablar yaratmışdır. Qur’an . ۱ cəmiyyəti sarımış şirk ən’ənələrini uçurub dağıdaraq, iman və bəşəri üsul əsasında həyat tərzi qurmuşdur. Qur’an daim ictimai meydanda olmuş, insanlar öz siyasətlərini, iqtisadiyyatlarını, əxlaqlarını, hətta adət-ən’ənələrini də Qur’an əsasında tənzimləmişlər. Böyük İslam dünyası gündə beş vaxt namaz zamanı Qur’anla təmasda olur, bütün işlərdə əvvəlcə Qur’an, sonra isə Peyğəmbər sünnəsinə müraciət edir. Dövlətçilikdə, cəmiyyətdə, ailədə daim diqqət mərkəzində olan belə bir kitab necə təhrif edilə bilər?! Hər bir ayəsi müsəlmanların könlündə yer almış bir kitaba məxfiyanə !?təcavüz mümkünmü idi

Heç kimin xəbəri olmadan Qur’anda təhrif aparılması fikri ona bənzəyir ki, dünyanın ən .qüdrətli dövlətinin konustitusiyasını gizlicə dəyişirlər və kimsə bundan xəbər tutmur

Hansı ki müsəlmanların ictimai həyatında Qur'anın rolu hər hansı konstitusiyadan qat-qat böyükdür. Bəli, əgər Qur'anda zərrəcə təhrif olunmuş olsaydı, bütün müsəlman .dünyası ayağa qalxardı

Başqa bir maraqlı nöqtə isə odur ki, bir çox müsəlmanlar Qur'anın ayə və surələrini əzbərləyirdilər. İş o qədər dəqiq şəkildə icra edilərdi ki, hətta Qur'anı əzbərləyən insanlara "qari" deyilərdi. Xalq daim onlara müraciət edər, Qur'anın dərin mə'nalarından .faydalanardılar

Tarixin maraqlı bir səhifəsinə nəzər salaq. Əbu-Bəkrin xilafəti zamanı Yəmamə döyüşü getdiyi vaxt bir çox Qur'an qariləri şəhadətə yetdi. Müsəlmanlar qərara gəldilər ki, Qur'anı hifz etmək üçün Qur'anın bütün mövcud nüsxələri bir yerə toplansın və düşmən .vəziyyətdən istifadə etməmiş yeni Qur'an hafizləri yetişdirilsin

Osmanın xilafəti dövründə əvvəlki nüsxələr əsasında Qur'anın yeni dörd nüsxəsi hazırlandı. Bütün məntəqələrə göstəriş verildi ki, yalnız və yalnız bu dörd nüsxə əsasında Qur'an tə'lim edilsin. Müsəlmanlar arasında Qur'ana diqqət o qədər güclü idi ki, bir hərf haqqında uzun-uzadı mübahisələr baş verərdi. Bir dəfə Əbu ibn Kə'b ilə xəlifə Osman arasında mübahisə düşür. Osman iddia edirdi ki, haqqında danışılan ayə "əlləzinə" kəlməsi ilə başlanır. İbn Kə'b isə onunla razılaşmır, ayənin "vəlləzinə" kəlməsi ilə başlandığını iddia edirdi. İbn Kə'b Qur'an kəlməsini həzrətdən bu sayaq eşitdiyini israrla bildirir və tutduğu mövqedən çəkilmirdi. Mübahisənin qızğın yerində qılıncını çəkərək deyir: "Hər kəs bu hərfi Qur'andan götürmək istəsə, onu qılıncdan keçirəcəyəm." İbn Kə'bin mövqeyi xəlifəni öz ehtimalından çəkinməyə məcbur etdi. Əgər Qur'anın bir hərfi haqqında bir bu qədər mübahisə olmuşdursa, hansı əhəmiyyətli !?dəyişiklikdən danışmağa dəyər

səh:۲۳۲

Yuxarıda deyilənlərdən əlavə, nəzərə almalıyıq ki, Qur’anın müxtəlif ayələrində onun təhrifinin mümkünsüzlüyü bəyan olunmuşdur. Qur’ani-kərimdə oxuyuruq: “Şübhəsiz ki, Qur’anı biz nazil etdik və sözsüz ki, biz də onu qoruyub saxlayacağıq.”(١) Eləcə də, İslam alimləri öz təfsir və kəlam kitablarında qəti şəkildə bildirmişlər ki, Qur’anda heç bir təhrif baş verməmişdir. Bəli, bə’zi Qur’an araşdırıcıları, qeyri-möhtəbər hədislərə asaslanaraq, Qur’anda dəyişiklik baş verməsini ehtimal etmişlər. Amma ehtimal ehtimal olaraq qalır və onu sübuta yetirmək lazımdır. Bu sayaq mə’lumatların heç bir elmi əsası .yoxdur

Uyğun mövzuda bir çox kitablar yazılmışdır. Həmin kitablarda Qur’anda təhrifin baş vermədiyi möhkəm dəlillərlə sübuta yetirilmişdir. Ərəb dili ilə tanış olmayanlar Mərhum .Hac Mirza Mehdi Bürucerdinin “Bürhane-rövşən” kitabını mütaliə edə bilərlər

Bə’ziləri qeyd edirlər ki, həzrət Əmirəl-mö’mininin (ə) ixtiyarında olan Qur’an başqa Qur’anlardan fərqlənmişdir. Bu isə Qur’anın təhrif olunduğunu sübuta yetirmir. Çünki həzrət Əmirəl-mö’mininin topladığı Qur’anda ayələrdən əlavə onların nazil olma şəraiti, təfsiri və həzrət Peyğəmbərdən nəql olunmuş izahlar da verilmişdir. Demək, fərq !izahlardadır, əsil mətndə yox

## ?Qur’anı kimlər qələmə almışdır .٢٣

Sual: Qur’anın hansı surəsi əvvəl, hansı surəsi axırda nazil olmuşdur? Ayələr nazil ?olduqdan sonra kim tərəfindən qələmə alınmışdır

Cavab: Mö’təbər İslam tarixçilərinin bildirdiyinə görə həzrət Peyğəmbərə nazil olmuş ilk surə “Ələq” surəsidir. Son surə isə “Tövbə” surəsi hesab olunur. Surələrin mətni də .deyilənləri təsdiq edir

Qeyd etməliyik ki, Peyğəmbərə nazil olan ayələri onun ən üstün səhabələri qələmə almışdır. Ayələr həmin dövrdə məşhur olan kufi xətti ilə yazılmışdır. Qur’anı qələmə alanları “Vəhy katibləri” və ya “vəhy yazıçıları” adlandırmışlar. Tarixçilər bildirirlər ki, Qur’an ۴٣ nəfər tərəfindən qələmə alınmışdır. Bu sahədə ən ciddi sə’ylər Əli ibn Əbu-Talibə və Zeyd ibn Sabitə aiddir. Daim Peyğəmbərin hüzurunda olan bu iki insan .Məhəmməd (s) Peyğəmbərin nəzarəti altında Qur’an ayələrini yazıya köçürmüşlər

Qur’ani-kərim İslamın əsasını təşkil etdiyindən, ictimai və fərdi həyatın müxtəlif sahələrində bu kitab əsas götrüldüyündən həzrət Peyğəmbər şəxsən özü Qur’anın qələmə alınmasına nəzarət etmişdir. Həzrət dünyasını dəyişdiyi vaxt Qur’an tam şəkildə müsəlmanların ixtiyarında olmuşdur. Bu gün əlimizdə olan Qur’an bir zaman Peyğəmbər .dövründə toplanmış Qur’andır

### ?Rə’yə əsasən təfsİr nə deməkdİr .۲۴

Sual: Müxtəlif rəvayətlərdə nəql olunmuşdur ki, kimsə Qur’anı öz rə’yi və nəzəri əsasında təfsir edə bilməz. Hətta elə iş görənlərə cəhənnəm əzabı və’d olunmuşdur. ?Rə’y əsasında təfsir nə deməkdir

Cavab: İslam təfsirçiləri və alimləri bu fikirdədirlər ki, kimsə Qur’anı öz nəzəri və rə’yi əsasında təfsir edə bilməz. Bu mövzu ilə bağlı çoxsaylı hədislər nəql olunmuşdur. :Onlardan bə’zilərini nəzərdən keçirək

Həzrət Peyğəmbər buyurur: “Hər kəs Qur’anı öz rə’yi əsasında təfsir etsə, özü üçün .۱ ”.cəhənnəm odunda yer seçmişdir

Həzrət buyurur: “Qur’anı öz rə’yinə əsasən təfsir edən kəs özünə oddan yer əxz .۲ (etmişdir.”(۱

Həzrət Peyğəmbər (s) buyurur: “Qur’anı öz rə’yinə əsasən təfsir edən kəs hətta .۳ ”.səhvə yol verməsə də, xəta iş görmüşdür

İndi isə aydınlaşdıraq ki, rə’yə əsasən təfsir nə deməkdir? Böyük təfsirçilərin fikrincə, .bu iş üç şəkildə baş verə bilər

Bə’zi təfsirçilər iki mə’naya malik olan söz üçün hansısa mə’nanı tə’yin edərkən heç .۱ bir əsas tapmadıqda özlərindən əvvəlki alimlərin mövqeyini əsas götürür. Yə’ni təfsirçi hər hansı kəlməni mə’nalandırarkən öz e’tiqadına əsaslanır. Hansı ki, Qur’an kəlməsini mə’nalandırmaq üçün möhkəm dəlillər olmalıdır. Belə bir təfsir şəxsi rə’y əsasında (təfsirdir.(۲

Mö’təzilə, əşairə, batiniyyə, sufiyyə məktəbində bu sayaq təfsirlər çoxdur. Hər hansı

bir мəktəbə aid olan aliм Qur’anı təfsir edərkən öz мəktəbinin e’tiqadlarına əsaslanır. Deмək, ayə həqiqi мə’nasında yox, hansısa мəktəbin e’tiqadı əsasında təfsir edilir. .Belələri Qur’ana tabe olмaq əvəzinə, Qur’anı özlərinə tabe edirlər



---

.Caмeul-bəyan”, c. ۳, s. ۳۲“[۱۶۲] -۱

.Məcмəul-bəyan”, c.۱, s. ۱۲“[۱۶۳] -۲

Zəməxşərinin “Kəşşaf” təfsiri e’tiqad məktəbinə əsaslanan təfsirlərə nümunə ola bilər. Fəxr Razinin “Məfatihul-qeyb” təfsiri isə əş’əri məktəbinə əsaslanmışdır. Bu iki təfsirdə alimlər özlərindən əvvəlki fikirlərə əsaslanır, keçmişdə mövcud olmuş fikirlərdən yaxa qurtara bilmirlər. Batiniyyə, sufiyyə və bə’zi fəlsəfə məktəblərinin nümayəndələri də təfsirlərində keçmişdə mövcud olmuş nəzəriyyələrə əsaslanmışlar. Məsələn, Molla Əbdür-Rəzzaq Kaşi öz təfsirində batiniyyə əqidəsini əsas götürmüşdür. Mühyiddin .Ərəbi isə Qur’anın ilahi maarifini sufi düşüncə tərzi əsasında təfsir etmişdir

Bu sayaq təfsirlər yalnız hansısa məktəbin dirçəldilməsinə xidmət edir. Uyğun təfsirlərdə diqqətəuyğun fikirlər olsa da, onlar bütövlükdə rə’y əsasında təfsir hesab .edilməlidir

On üçüncü əsrin sonu, on dördüncü əsrin başlanğıcında materialist düşüncə tərzi rövnəq tapmağa başladı. Dünyəvi elm sahələrindəki müxtəlif ixtiralar insanların düşüncəsini öz tə’siri altına aldı. Həmin dövrdə bə’zi təfsirçilər də ruh, mələk kimi qeybi anlayışları dövrün düşüncə tərzi əsasında təfsir etməyə çalışdılar. Bir çox üstün .məziyyətləri olan “Əl-minar” təfsirində də bu kimi meyllərlə rastlaşırıq

Bu alim dünyəvi elmlərin inkişafı tə’siri altında olduğundan bir çox Qur’an həqiqətlərini təbiət qanunları əsasında izah etməyə çalışmışdır. Hətta qeybi varlıq olan mələklərin .gizli təbii qüvvə olması ehtimalı ortaya atılmışdır

Bə’zi təfsirçilərin əxlaq məsələlərinə olan xüsusi bağlılığı “şeytanın” “əmmarə nəfs” kimi təfsir olunmasına gətirib çıxardı. Onlar şeytanın şeytan olaraq varlığını inkar etdilər. Bə’zi təfsirçilər hətta Fir’onu azğın nəfs simvolu kimi təfsir etməyə cəhd göstərdilər. .Onlar Fir’ona qarşı qiyamı azğın nəfsə qarşı qiyam kimi qiymətləndirirdilər

Bəli, bütün bu təfsirlər rə’y əsasında təfsirlər qəbilindəndir. Göründüyü kimi, alimi rə’y əsasında təfsirə sövq edən hansısa tə’sir altında olmasıdır. Təfsirçi alim Qur’an .ayələrinə azad şəkildə üz tutmalıdır

Bə’zi təfsirçilər Qur’anın hər hansı ayəsini əsas götürərək, onun mahiyyətinə . ۲ varmadan, bir çox başqa ayələri inkar etmiş olurlar. Məsələn, Qur’anın bir çox ayələrində Allahın cism olmadığı aşkar şəkildə bəyan edilir. Amma hansısa alim

Yədullah”, yə’ni “Allahın əli” kəlməsini əsas götürərək, Allahın cisм olмaмası fikrini“ .şübhə altına alır. Hansı ki ayədə uyğun kəlмə Allahın qüdrətinə işarədir

Qur’anın hər hansı ayəsinin onun digər ayələri əsasında təfsir edilмəsi ən düzgün .٣ yoldur. Bə’ziləri isə Qur’anı Qur’an vasitəsi ilə yox, başqa мənbələr vasitəsi ilə təfsir etмəyə çalışırlar. “Kəşfuz-zənun” kitabında rə’y əsasında təfsirin beş növü qeyd .olunur. Biz xülasə şəkildə bu haqda danışdıq

Belə bir nöqtəni xatırlatмaq lazıм gəlir ki, rə’yə əsaslanan təfsirlər haqqında danışdığıмız zaмan “əqlə əsaslanan təfsir ifadəsini işlətмədik. Rə’y əsasında təfsir haqqında danışan İslaм təfsirçiləri Peyğəмbərin əqlə yox, rə’yə əsaslanan təfsiri мəzəммət etdiyini qeyd etмişlər. İslaм aliмləri ağılı ilahi dəlillərdən sayır və onu kitab, sünnə, icмa ilə bir sırada qərar verirlər. Peyğəмbər əqlə əsaslanan təfsiri yox, rə’yə əsaslanan təfsiri nəzərdə tutмuşdur. Rə’y kəlмəsini ağıl kiмi qəbul etмək düzgün deyil. .Bə’ziləri də rə’y dedikdə zənn, güмan, təxмin мə’nalarını nəzərdə tutмuşlar

Əqlə əsaslanan təfsirin qəbul olunмaмası üмuмiyyətlə Qur’anın dərk olunмası .zərurətini inkar edir

Qur’anın təfsirində ağılın rolunu inkar edənlər Qur’anın Tövrat və İncil kiмi inhisara alınмası tərəfdarıdırlar. Bəli, həzrət Peyğəмbərin buyurduğu hədisin мə’nası budur ki, .hər kəs Qur’anı öz rə’yi əsasında təfsir etsə, özünə cəhənnəм odundan yer seçмəlidir

### ?Nə üçün bə’zİ ayələr təkrarlanır .٢٥

?Sual: Nə üçün Qur’anda bə’zi ayələr, eləcə də, мüəyyən əhvalatlar təkrarlanır

Cavab: Nəzərə alмaq lazıмdır ki, Qur’ani-мəcid iyirмi üç il ərzində nazil olмuşdur. Bu iyirмi üç il мüxtəlif hadisələrlə мüşayiət olunмuşdur. Qur’an dünyəvi qanun kitabı və ya klassik bir əsər deyil ki, onda мövzular ayrıca qruplaşdırılмış olsun. Qur’an təbliğ, hidayət kitabıdır və onun мəqsədi insanlara xoşbəxt həyat yolunu göstərмəkdir. Qur’an elə bir cəмiyyətin qurulмası üçün çalışır ki, bu cəмiyyətdə insanlar мaddi və мə’nəvi kaмala çata bilsinlər. Ona görə də Qur’anda bütün мövzulara toxunulмuşdur. Qur’an tədricən, мüxtəlif hadisələrlə əlaqədar nazil olмuş, dövrün suallarına cavab .verмişdir

Qur’anda iki növ təkrarla qarşılaşırıq: ١. Bir qism tarixlərin təkrarı; ٢. Xüsusi bir həqiqəti .bəyan edən ayələrin təkrarı

Keçmişdə baş vermiş əhvalatların Qur’anda təkrarlanmasının məqsədi insanların diqqətini keçmiş cəmiyyətlərdə hökm sürən qanunlara yönəltməkdir. Qur’an insanları həmin qanunlarla tanış etmək istəyir. Cəmiyyətlərin hansı səbəblərdən inkişaf etdiyi və hansı səbəblərdən süquta uğradığı bəyan olunur. Peyğəmbərlərin də’vətlərinin qəbul olunmaması nəticəsində cəmiyyətlərin hansı təhlükəli aqibətlərlə rastlaşdığı nəzərə çatdırılır. Bir sözlə, hər hansı bir cəmiyyətin inkişaf və süqut səbəbləri araşdırılır. Qur’an müxtəlif əhvalatları bəyan etməklə insanları qanunlarla tanış edir və itaətsizliyin acı nəticələrini yada salır. Əgər Qur’an müxtəlif məqamlarda Bəni-İsrail və ya Adəmin yaranışı haqqında danışırsa, nə vaxtsa nəzərdən qaçırılmış məsələləri bir daha insanlara xatırlatmaq istəyir. Qur’andakı əhvalatlara diqqət yetirməklə bir çox .həqiqətlər üzə çıxır

Ayələrin təkrar olunmasında məqsəd insanların ruhiyyəsinə tə’sir göstərməkdir. Məsələn, belə bir məqsədlə “Ərrəhman” surəsinin “fəbiəyyi alai rəbbikuma tukəzziban” ayəsi təkrar olunur. Allah-təala bir cəmiyyətin ruhunu, düşüncəsini oyatmaq istədiyi vaxt psixoloji tə’sirlərə malik mövzuları təkrarlayır. “Ərrəhman” surəsində insanın yaranışında, cəmiyyətin təşkilində mühüm rola malik olan ne’mətlər sadalandıqdan sonra insanların düşüncəsini oyatmaq üçün “belə olduqda Rəbbinizin hansı ne’mətlərini yalan saya bilərsiniz” ayəsi təkrar olunur. Bu ayə insanlarda haqşünaslıq hissini oyadır, onları nankorluqdan çəkinməyə çağırır. Bu sayaq təkrarlar insanların hidayəti cəhətindən xüsusi bir tə’sirə malikdir. Qur’andakı belə təkrarların fəsahət və bəlağət xarakterli olduğunu düşünmək düzgün deyil. Bu sayaq təkrarlar müxtəlif xalqların ədəbiyyatında təsadüf olunan bir metoddur. Bir çox qəsidələrdə şairin əsas məqsədini təşkil edən cümlə tez-tez təkrarlanır. Bu sayaq təkrarlar poetik gözəllik yox, oxucunun .diqqətini əsas məsələyə yönəltmək məqsədi daşıyır

**?Doğrudanmı Adəmə qadağan olunmuş ağac bİlİk ağacı İdİ .٢۶**

:Sual: Dinlər tarixi dərsləri silsiləsində belə oxuyuruq

Qadağan olunmuş meyvə nədir? Bu meyvə Tövratın təsdiq və Qur’anın işarə etdiyi kimi elm və bəsirətdir. Qur’an ayələrinə əsasən, Allah Adəm və Həvvanı çağırdığı vaxt onlar öz utandıqlarından utanmadan cavab verirdilər. Amma elə ki qadağan olunmuş meyvədən yedilər öz çılpaqlıqlarından utanaraq gizləndilər. Əvvəlki günlərdə Allahdan qətiyyən utanmadıqları halda, həmin meyvəni yedikdən sonra çılpaqlıqlarından xəcalət çəkdilər. Deməк, qadağan olunmuş meyvəni yedikdən sonra elm və bəsirət əldə etdilər. Belə çıxır ki, qadağan olunmuş ağac elm və bəsirət ağacı imiş. Görən Allah insanın qadağan olunmuş meyvədən yeməsini istəyirdimi? Başqa əhvalatlarda olduğu kimi, bu əhvalatla bağlı da “Allah istəmirdi” deyə bilmərik. Əgər Allah istəməsəydi, Adəmə həmin meyvədən yeməyə imkan verməzdi. Demək, Allah Adəmin həmin meyvədən yeməsini istəyirdi. Yalnız bu meyvədən yedikdən sonra həqiqi insan vücuda gəldi. Allah özü işi .belə qurdu ki, bugünki və tarix boyu olmuş insan ərsəyə gəlsin

?Yuxarıda deyilənlər həqiqətdirmi

Cavab: Uyğun dərslər haqqında bizə bir çox suallar ünvanlanmışdır. Suala aydınlıq :gətirmək üçün bə’zi məsələləri nəzərdən keçirməliyik

Tövratın təhrif olunmasının əsas dəlillərindən biri budur ki, Tövrat Adəmin . ١ yaranışından danışarkən qadağan olunmuş ağacın elm və bəsirət ağacı olduğunu bildirir. Belə çıxır ki, bəşəriyyətin ilk və ən böyük günahı həmin elm və bəsirətə marağı olmuşdur. Bəlkə elə bu baxımdan da orta əsr kilsəsi elm və biliklə mübarizə aparmış, böyük alimlər üçün məhkəmələr qurmuşdur. Bunların fikrincə, Adəm ilk gün o qədər mə’lumatsız idi ki, hətta öz çılpaqlığından da utanmırdı. Guya qadağan olunmuş .meyvədən yeyən kimi insan oldu və behiştdən, Allahın mərhəmət civarından qovuldu

Bütün bunlar, heç şübhəsiz, xürafat, qaranlıq bir dövrün uydurmalarından başqa bir şey deyil. Əksinə, Qur’an buyurur: “(Allah) Adəmə bütün şeylərin adlarını öyrətdi”(١)Qur’anın tanıtdırdığı Adəm Tövratın tanıtdırdığı Adəmdən köklü şəkildə fərqlənir. Qur’anın tanıtdırdığı Adəmin ən güclü tərəfi onun elm və bəsirəti idi. Qur’anın tanıtdırdığı Adəm həqiqi Adəm, Tövratın tanıtdırdığı Adəm isə böyük günahı elm olan .Adəmdir. Bəli, Qur’an məntiqi Tövrat məntiqi ilə daban-dabana ziddir

Tövratda deyilir ki, Adəm və Həvva ilk öncə çılpaq idilər və öz çılpaqlıqlarından . ٢

utanмırdılar. Məgər Qur'anda belə bir мə'luмat görмüsünüzмü?! Əksinə, Qur'anda nəql



---

.Bəqərə", ۳۱"[۱۶۴] -۱

olunur ki, Adəm və Həvva qadağan olunmuş ağacdan yeməmiş onların əynində libas vardı. Bu libas Allaha itaətsizlikdən sonra bədənlərindən töküldü və çılpaq qaldılar: "Ey Adəm oğulları, ayıb yerlərini özlərinə göstərmək üçün libaslarını soyundurub valideyninizi cənnətdən qovdurduğu kimi, şeytan sizi də aldadıb yoldan çıxarmasın..."(١) Başqa bir ayədə isə belə buyurulur: "Şeytan Adəm və Həvvanın örtülü yerlərini özlərinə göstərmək məqsədi ilə, dedi: "Rəbbiniz bu ağacı yalnız mələk olmadığınız və ya cənnətdə əbədi qalmamağınız üçün qadağan etmişdir."(٢) Deмək, Qur'anda qadağan olunmuş meyvədən yeyənədək Adəmin üryan və nadan olduğu bildirilmir. Qur'anın tanıtdırdığı .Adəm ilk öncə geyimli, hörmətli insan idi

Tövratın tanıtdırdığı Adəm isə ilk öncə çılpaq heyvanlardan fərqlənməyən bir varlıq idi. O, heyvan kimi öz çılpaqlığından çəkinmirdi. Bütün bunları nəzərə aldıqda heç vəchlə .Qur'anla Tövratı eyniləşdirmək olmaz

Ən təəccüblüsü isə "yemə" əmrinin "yeməlisən" əmri kimi verilməsidir. Əgər Adəmə həmin !?ağacdan yemək əmr olunmuşdusa, nə üçün bu ağac qadağan olunmuş ağac adlanır

Axı belə bir təfsir, mə'nalandırılma nəyə əsaslanır?! Onda başqa qadağalar haqqında da demək lazımdır ki, Allah qadağan olunmuş bir işin görülməsini istəmişdir. Məgər insan öz əməl və rəftarında azad deyilmi?! Bəli, Allah-təala insanı azad yaratmış, eyni zamanda onun tərbiyəsi üçün bir çox göstərişlər vermişdir. "İnsan bir işi görmüşsə, demək, Allah .belə istəmişdir" fikri kökündən yanlışdır. Onda günahkarlara da bəraət qazandırmalıyıq

Əziz oxucu, bu sayaq mövzuları geniş auditoriyaya çıxarmazdan qabaq, mütəxəssislərlə məsləhətləşmək yaxşı olmazdımı?! Əgər bir gənc uyğun mənbəni oxuyub inansa ki, Adəmə qadağan olunmuş ağac elm və bəsirət ağacı olmuşdur, onun elm və agahlığa münasibəti necə formalaşar? Əgər insan yalnız elm və bəsirəti səbəbindən !?behiştdən qovulursa, onda elm əldə etməyin faydası nədir

Həqiqət isə budur ki, qadağan olunmuş ağac həsəd, bir növ rəqabət ağacı olmuşdur. Bə'zi rəvayətlərdə isə bu ağacın buğda butası olduğu bildirilir və onun imtahan məqsədi .ilə qadağan edildiyi bəyan olunur

**Allah İstədİyİnİ yoldan çıxarar, İstədİyİnİ İsə doğru yola yönəldər.” ayəsİndə“ .٢٧ ?məqsəd nədİr**

Sual: Allahın ədaləti biz müsəlmanların bünövrə əqidələrindəndir. Biz inanırıq ki, Allah-təalanın bütün işləri ədalət və hikmət əsasında baş verir. “Nəhl” surəsinin ٩٣-cü ayəsi deyilənlərə zidd deyilmi? Əgər bizim doğru yolu tutmağımız və ya yoldan azmağımız Allahın istəyi ilə baş verirsə, onda nə üçün günahlarımıza görə cəzalanmalıyıq? Məgər ?bu Allahın ədalətinə sığırmı

Cavab: Qur’ani-məcidin ayələri bir-birini təfsir edir. Bir çox ayələr qrup şəklində nəzərdən keçirildikdə onların həqiqi mə’nası aydın olur. Zəlalət və hidayətdən danışan uyğun ayə də həmin qəbildəndir. Bu ayənin həqiqi mə’nasını dərk etmək üçün bə’zi .digər ayələrə də nəzər salmaq lazımdır

Qur’anın digər bir ayəsində buyurulur: “Allah kafirləri belə azdırar.”(١) Digər bir ayədə isə buyrulur: “Allah israf edən, şəkk içində olanları bu yolla azdırır.”(٢)Bu iki ayə insanların hansı səbəblərdən Allahın diqqətindən kənarda qalmasını aydınlaşdırır. Bu iki ayəni nəzərdən keçirməklə əvvəlki ayənin məfhumunu dərk edə bilərik. Mə’lum olur ki, .Allahın hidayətindən yalnız və yalnız günahkarlar, imansızlar və zalımlar məhrum olur

Doğrudan da, günaha batmış insanların Allahın tovfiqindən məhrum olması təbii bir işdir. İnsanın səadəti onun öz maddi və mə’nəvi iste’dadlarını hansı yolda sərf etməsindən asılıdır. İnsan təkamülünün ən yaxşı yolu Allahın Peyğəmbərlər vasitəsi ilə göndərdiyi göstərişlərə əməl etməkdir. Bu tə’limlərə əməl etməkdən boyun qaçıranlar, günaha batanlar özləri səadət qapısını üzlərinə bağlayırlar. Belə insanların Allahın tovfiqinə ləyaqəti yoxdur. Günaha üz tutan insan Allahın tovfiqini, diqqətini qazanmaq ləyaqətini .əlindən çıxardır. Bəli, insanlar günahları səbəbindən yolunu azır

Başqa bir ayədə uyğun mövzuya belə toxunulur: “Sənə yetişən hər bir yaxşılıq Allahdandır, sənə üz verən hər bir pislik isə özündəndir.”(٣)Ayədən göründüyü kimi, .insanın doğru yoldan azmasına, səadətdən məhrum olmasına onun özü səbəbkardır

Hidayət dedikdə Allahın lütfü, diqqəti, yardımı nəzərdə tutulur. İlahi hidayət isə Allahın yalnız xalis bəndələrinə nəsib olur. Bu insanlar bütün güclərini və iste’dadlarını ilahi

göstərişlərə əməl etməklə ilahi tovfiqin qazanılmasına sərf edirlər. Bəli, insan ilahi yolda .daha çox çalışdıqca, Allahın diqqətini daha çox qazanır



---

.Mö’min”,۷۴“[۱۶۷] -۱

.Mö’min”, ۳۴“[۱۶۸] -۲

.Nisa”, ۷۹“[۱۶۹] -۳

Deməli, Allahın hidayəti o kəslərə məxsusdur ki, haqq yolunda addım atır, mücahidə edirlər.(١) Zəlalət isə Allahın tovfiqindən məhrum olmaqdır – Allah günah yolunu tutanlara bütün yardımlarını kəsir. Şübhəsiz ki, ədalət sahibi olan Allah səbəbsiz yerə kimsəni yolundan azdırmaz!

**٢٨. Nə üçün “Tövbə” surəsİ “Bİsmİllah” İlə başlaNmır?**

Sual: Nə üçün “Bəraət” (“Tövbə”) surəsi “Bismillah”la başlanmır? “Nəml” surəsinin ortasında “Bismillah” nə üçün verilmişdir?

Cavab: “Bəraət” surəsinin məzmunundan göründüyü kimi, bu surədə müşriklər hədələnir, əhdi sındıranlara müharibə e’lan olunur. Bu surədə tövhid nurunu söndürmək istəyənlərə, Ərəbistan yarımadasında ilahi dinlə mübarizə aparanlara xəbərdarlıq olunur. Bu münasibətlə də surə mərhəmət nişanəsi olan “Bismillah”la başlanmır.

“Nəml” surəsində isə həzrət Süleymanın Səba mələkəsinə yazdığı məktubdan danışılır. Bu məktub “Bismillah”la başlayır. Qur’anda həmin məktubun bütün mətni nəql olunduğundan məktubun başlanğıcındakı “Bismillah” ifadəsi də verilmişdir.

**٢٩. Allah–təalanın özünü ən üstün yaradan sayması başqa yaradanların varlığından danışmırmı?**

Sual: Qur’ani-kərimdə Allah-təala buyurur: “Yaradanların ən gözəli olan Allah nə qədər uca, nə qədər uludur.”(٢) Ayədə belə görünmürmü ki, başqa yaradanlar da vardır?

Cavab: Ərəb lüğətində “Xələq” kökünün üç mə’nası var:

١. Bir şeyi ölçmək; ٢. Bir şeyin formasını dəyişmək; Məsələn, dəmirdən hər hansı alət düzəltmək; ٣. Heçdən bir şey yaratmaq; Yə’ni heç vaxt olmamış bir şeyə varlıq vermək.

Əlbəttə ki, üçüncü mə’na Allaha aiddir. Xaliq kəlməsi yalnız Allah haqqında işlədilir. Amma “xələq” sözünün birinci və ikinci mə’naları insana aiddir. Qur’ani-kərimdə bu söz bə’zən birinci və ikinci, bə’zən isə üçüncü mə’nasında işlədilmişdir. Məsələn, Məryəm oğlu İsa haqqında buyurulur: “Gildən quş şəklində bir şey

yaradırdım.”[(١)] Ayənin ərəbi mətnində işlədilmiş “xələq” kəlməsi düzəltmək mə’nasında işlədilmişdir. Haqqında danışılan ayədəki “xələq” kəlməsi də ilkin mə’nalardan birini .daşıyır

## ?Nə üçün İnfaq (sədəqə) yeddİ yüz dənlİ buğdaya oxşadılmışdır .٣٠

Sual: Qur’ani-kərimdə oxuyuruq: “Mallarını Allah yolunda sərf edənlərin halı yeddi sünbül verən bir toxuma bənzər ki, bu sünbüllərin hər birində yeddi yüz dən vardır. Allah istədiyi şəxs üçün bunu qat-qat artırır. Allahın lütfü genişdir, O hər şeyi biləndir.”[(٢)]Biz kənd təsərrüfatı üzrə mütəxəssislərə bu sualla müraciət etdik ki, əgər torpaq münbit olarsa, su ilə tam tə’min edilərsə, quşlar buğda dənini daşımazsa, buğda dənləri torpaqda xarab olmazsa, bir sözlə, ən münasib bir şəraitdə buğda nə qədər məhsul verə bilər? Onlar cavab verdilər ki, bir buğda dənindən maksimum otuz və ya qırx dən məhsul götürmək olar. Bəs necə olur ki, Allah-təala yeddi yüz dən verən ?buğdanı misal göstərir

:Cavab: Sualın cavabında iki nöqtəyə diqqət yetirmək lazım gəlir

Əvvəla, ayədə buğda sözü işlədilməmişdir. Tərcüməçilər və təfsirçilər uyğun ayənin tərcüməsində buğda kəlməsini işlətmişlər. Demək, bir dənəsindən yeddi yüz dən verən hansısa bitki ola bilər. Məsələn, bir qarğıdalıdan yeddi qarğıdalı cücərərsə və onların hər birində yüz dənə olarsa, ayədəki misal özünü doğruldar. Bə’zi təfsirlərdə ayədə .darının nəzərdə tutulduğu bildirilir

İkincisi, ayədəki ifadə təşbeh də ola bilər. Gündəlik danışığımızda da bu sayaq təşbehlərdən istifadə olunur. Məsələn, deyirlər ki, o heç vaxt qürub etməyən günəşdir”. Hansı ki, günəş qürub etməyə bilməz. Demək, təşbehdə məqsəd hansısa xüsusiyyəti önə çəkməkdir. Yə’ni ayədə infaqın yeddi yüz dən verən sümbülə oxşadılması onun böyük savaba malik olmasından danışır. Qur’anda bu sayaq təşbehlərdən çoxdur. Məsələn, Qur’an yaxşı söhbətləri “daim meyvə verən ağac” kimi xatırlayır. Əslində isə daim meyvə verən ağac yoxdur. Demək, məqsəd pak söhbətin böyük imtiyazını nəzərə .çatdırmaqdır

Zeytun haqqında belə bir oxşatma ilə rastlaşırıq. “Onun yağı atəşsiz də yanmağa

yaxındır.” Yaxşı bilirik ki, heç bir yağ atəşsiz işıqlana bilməz. Sadəcə bu təşbehlə



---

۱- [۱۷۲]“Maidə”, ۱۱۰.

۲- [۱۷۳]“Bəqərə”, ۲۶۱.

zeytun yağının imtiyazı önə çəkilir. Uyğun ayədəki misal da infaq dəninin bütün .dənlərdən üstün olduğunu bildirir

**?Nə üçün Nuhun övladı onun ailəsindən sayılmır .۳۱**

Cavab: Allah-təala Nuhun övladının cismən ondan olmadığını buyurmur. Şübhəsiz ki, həmin gənc Nuhun oğlu idi. Allah xəlq etdiyi şəxsin ruhən, mə’nən Nuhun oğlu olmadığını .bildirir. Çünki ata ilə oğul arasındakı mə’nəvi rabitə qırılmışdı

Nuhun bu övladı həm də saleh əməl sahibi deyildi. Bu övlad o qədər qeyri-saleh əməl .etmişdi ki, sanki özü zatən qeyri-saleh əməl olmuşdu

Allah-təala Nuha buyurdu ki, bilmədiyini soruşmasın. Bəli, insan əsrarını bilmədiyi bir şey haqqında mühakimə yürütməməlidir. Bəs Nuh nədən xəbərsiz idi? Nuha elə gəlirdi ki, Allah onun ailəsini qeyd-şərtsiz xilas edəcəyini və’d verib. Sonradan anladı ki, söhbət .mə’nən ona bağlı ailə üzvlərindən gedirmiş

**?Fəth” surəsi Peyğəmbərin (s) mə’sum olmasını inkar etmirmi“ .۳۲**

Sual: Əgər İslam Peyğəmbəri (s) və digər Peyğəmbərlər günahsızdırsa, nə üçün “Fəth” surəsində belə buyurulur: “Həqiqətən, biz sənə açıq-aşkar bir zəfər bəxş etdik; Allah sənin əvvəlki və sonrakı günahlarını bağışlayacaq, sənə olan ne’mətini tamamlayacaq ?və səni düz yola müvəffəq edəcək.”(۱) Ayələrdə hansı günahdan danışılır



---

.Fəth”, ۱-۲“[۱۷۵]-۱

Cavab: Əvvəla, nəzərə almalıyıq ki, bütün inqilabi insanlar hansısa mənfi ictimai fikirlərə qarşı addım atmışlar. Öz islahedici proqramları ilə meydana atılan bu insanlar ilk qədəmdə müxaliflərlə, yalanlarla, böhtanlarla üzbəüz gəlirlər. Böyük şəxsiyyətlər daim .geri qalmış cəmiyyətin bu sayaq hərbə-zorbası ilə rastlaşmışlar

Peyğəmbər də istisna deyil. Həzrət qüreyşin müxalifəti, onların əsassız böhtanları ilə üzbəüz gəlmişdi. Dünənədək e'tibarlı, doğruçu, pəhrizkar sayılan bir şəxs insanları cəhalətə, bütpərəstliyə qarşı çağıran tək, sehr-caduda, divanəlikdə ittiham olundu. Bu sayaq böhtanlar hamını çaşdırmasa da, cəmiyyətin sadəlövh və nadan təbəqəsini şəkk-şübhəyə salır. Doğrudan da, həmin vaxt qüreyş öz böhtanları ilə bir çoxlarını çaşdıra bildi. Bəs töhmət və iftiraları aradan götürüb, həqiqətin simasını necə aşkarlamaq olar? Bir çıxış yolu var: Mübariz, tərəqqipərvər insan qələbə çalıb, öz xeyir niyyətini sübuta yetirməklə haqqında deyilənləri puça çıxara bilər. Belə bir insan məğlub olduqda isə .onun haqqında deyilən böhtanlar uzun müddət zehnlərdən silinmir

Yuxarıda deyilənlər İslam Peyğəmbərinə (s) də aiddir. Həzrətin mütərəqqi proqramları məhrumların xeyrinə, zalım hakimlərin zərərinə idi. Haqq mübarizə meydanında qazanacağı qələbələrdən xəbər verirdi. Allahın lütfü, öz dözümü və ardıcıllarının vəfası sayəsində həzrət Peyğəmbər (s) şirk mərkəzini sarsıtdı və Məkkə parlaq bir qələbə ilə fəth olundu. Həmin günədək açıq düşmənçilik edən qüreyş İslam hakimiyyəti qarşısında diz çökməyə məcbur oldu. Ən böyük nəticə isə mə'nəvi inqilabın bəhrəsi idi. Qələbə sayəsində yalançı və böhtançı ağızlar bağlandı. Artıq həzrət Peyğəmbəri (s) divanə, sahir, kahin, şair adlandıran yox idi. Çünki deyilən sifətlərə malik olan insan belə .əzəmətli bir qələbə qazana bilməzdi

Adı çəkilən ayədə həzrət Peyğəmbərdən (s) baş vermiş hansısa günahdan yox, .Məkkənin fəthindən qabaq həzrətə aid edilən böhtanlardan danışılır

Uyğun qələbə bir çox sadəlöhv insanların qəlbində özünə yer tapmış şəkk-şübhələri aradan qaldırdı. Əgər Məkkənin fəthi baş verməsəydi, böhtanlar da davam edəsiydi. :Ayənin bu cür təfsir olunmasının iki dəlili var

Məkkənin fəthi gününədək həzrət Peyğəmbərin haqqında min bir yersiz söz . ١ danışılırdı. Qələbədən dərhal sonra həzrət Peyğəmbərə (s) nahaqdan aid edilən bütün

günahlar unuduldu. Əgər Peyğəmbər (s) özü günaha yol verмiş olsaydı, bu günahların .yuyulмası üçün Məkkəni fəth etмəyə ehtiyac yox idi. Günah tövbə vasitəsi ilə yuyulur

Ayəyə diqqət etsəniz, görərsiniz ki, ayədə təkcə keçmişdəki günahlardan yox, həm .٢ də gələcəkdəki günahlardan danışılır. Əgər gələcəkdə hansı günahın baş verəcəyi bilinmirsə, bu günah əvvəlcədən necə bağışlana bilər? Demək, yeganə düzgün təfsir Peyğəmbərə nahaq olaraq aid edilmiş günahların nəzərdə tutulmasıdır. Çünki həzrətə Məkkənin fəthindən qabaq da böhtan atılırdı, sonra da belə böhtanlar atılması mümkün idi. Ona görə də Allah-təala həzrət Peyğəmbərə (s) həm əvvəlki, həm də sonrakı .günahları, yə'ni böhtanların bağışlanacağını, yə'ni yuyulub gedəcəyini və'd edir

**?Allahdan başqa hər şey məhvə məhkumdur" ayəsİnİn məfhumu nədİr" .٣٣**

Sual: Qur'anda oxuyuruq: "Allahdan başqa hər bir şey məhvə məhkumdur."(١)Məgər insanın ruhu fani olurmu? Əgər insanın ruhu əbədidirsə, nə üçün ayədə belə ?buyurulur

Cavab: Nəzərə almalıyıq ki, ayədə "həlak" kəlməsi işlədilmişdir. Həlak olmaq isə məhv olmaq, fəna olmaq deyil. İnsanın nəinki ruhu, həm də cismi tamamilə məhv olmur. .Çürüyüb torpağa qarışan insan cismi qiyamət günü yenidən əvvəlki vəziyyətinə qayıdır

Demək, insanın nə ruhu, nə də cismi tamamilə məhv olub getmir. Ayədəki "həlak" kəlməsi parçalanma mə'nasında da işlənə bilər. Əgər insanın ruhu ilə cismi arasındakı əlaqə qırılırsa, onun haqqında "həlak oldu" demək olar. Amma bu o demək deyil ki, insan .tamamilə fani olur

Məsələni aydınlaşdırmaqdan ötrü başqa ayələrə nəzər salaq: "Əvvəlki Ad qövmünü o həlak etdi. Səmud qövmünü də; onlardan kimsə qalmadı; Nuh qövmünü isə onlardan da qabaq;(٢) Şübhəsiz ki, Ad, Səmud və Nuh qövmünün həlak edilməsi onların öldürülməsinə işarədir. Ona görə də haqqında danışılan ayəni "fani olmaq" mə'nasında yox, "parçalanıb dağılmaq" mə'nasında başa düşməliyik. Bəli, doğrudan da, yalnız .Allahın pak zatı istənilən bir viranəlikdən uzaqdır



---

.Qəsəs", ٨٨"[١٧۶]-١

.Nəcm", ۵٠-۵٢"[١٧٧]-٢

## ?Nə üçün Yusİf öz qardaşlarına böhtan atılması İlə razılaşdı .۳۴

Sual: Həzrət Yusif qardaşlarını Misir vilayətində saxlamaq məqsədi ilə qiymətli bir piyaləni özü şəxsən onun buğda yükünün arasında gizlədi. Sonra karvan içində bir şəxs fəryad çəkərək, "ey karvan əhli, siz oğrusunuz", dedi. Axı Yusif öz qardaşları olan Fələstin karvan əhlini oğurluqda nə üçün ittiham etdi? Məgər günahsız xalqa böhtan ?atmaq haram deyilmi

Cavab: Aşağıdakı ayədə uyğun əhvalata işarə olunur: Yusif onların yüklərini bağladığı vaxt "padşah piyaləsini" qardaşının yükünün içinə qoydu. Sonra bir carçı haray çəkib dedi: "Ey karvan əhli siz həqiqətən oğrusunuz."(۱)Ayədə bildirilir ki, piyaləni qardaşının yükünə Yusif qoydu. Oğurluq haqqında car çəkən isə başqa bir şəxs idi. Bu nöqtəni .nəzərdən qaçırmaq olmaz

Bəs nə üçün Yusif belə bir iş gördü? Məsələni aydınlaşdırmaq üçün surənin başqa bir ayəsini nəzərdən keçirək: "Yusif qardaşının yükündən qabaq onların yükünü axtarmağa başladı. Sonra su qabını qardaşının yükündən tapıb çıxardı. Biz Yusifə belə bir tədbir öyrətdik. Yoxsa padşahın dininə görə, o, qardaşını öz yanında saxlaya bilməzdi. Allah öz istədiyini dərəcələrə yüksəldir..."(۲) Ayədən göründüyü kimi, Yusif öz qardaşını yanında saxlamaq üçün başqa yol tapa bilmədi. Həmin qıtlıq illərində nə Misir qanunları buna icazə verirdi, nə də Yusifin o biri qardaşları bu məsələ ilə razılaşmırdılar. Bir çox təfsirçilərin fikrincə, Yusif bu məsələni qardaşı ilə əvvəlcədən razılaşmışdı. O gizli bir görüşdə qardaşını qarşıda baş verəcək hadisədən xəbərdar etmişdi. Bütün bunları nəzərə alsaq, Yusifin gördüyü işə nöqsan tutmamalıyıq. Çünki məqsəd başqa idi .və qardaşı da bu işə razılıq vermişdi

Digər bir tərəfdən, Yusif qardaşına böhtan atmadı, yalan demədi. Hansısa mə'mur oğurluq olduğunu ehtimal edərək, yükləri yoxlamağa başladı. Beləcə, Yusifin qardaşı ittiham edildi və onu həbs olundu. Hadisənin mahiyyətindən xəbərdar olan Yusifin .qardaşı susurdu



---

.Yusuf", ۷۰"[۱۷۸]-۱

## ?Doğrudanmı, mö'min az gülüb, çox ağlamalıdır .۳۵

Sual: Qur'ani kərimdə oxuyuruq: "Qazandıqları günahların cəzası olaraq, az gülüb, çox ağlasınar."(۱) İslam dinində insana zərərli işlərə icazə verilmir. Məgər çox ağlamaq zərərli deyilmi? İkinci bir tərəfdən, gülüş və şadlıq insan sağlamlığı üçün çox faydalıdır. ?Nə üçün onun qarşısı alınır

Cavab: Ayəni yuxarıda qeyd olunan şəkildə anlayanlar onun əvvəlinə və axırına diqqət yetirmirlər. Uyğun ayə islami cihad göstərişləri haqqında danışan, münafiq və müxaliflərin halını bəyan edən ayələrin davamında gəlmişdir. Haqqında danışılan ayədən qabaqkı ayəyə nəzər salaq: "Cihadda arxada qalan münafiqlər Allahın rəsuluna qarşı çıxaraq, oturub qalmaqlarına sevindilər. Allah yolunda malları və canları ilə cihad etmək istəmədilər və dedilər: "Bu istidə döyüşə çıxmayın." De ki, cəhənnəm odu daha istidir. Kaş biləydilər!" Məhz bu ayənin davamında buyurulur: "Qazandıqları günahların cəzası olaraq, az gülüb çox ağlasınlar." Əvvəlki ayəyə nəzər saldıqdan sonra növbəti ayənin münafiqlərə aid olduğu qətiyyən şübhə doğurmamalıdır. Ayəni bütün xalqa aid etmək düzgün deyil. Ayədə işarə olunur ki, həmin şəxslər qarşıda onları gözləyən .cəzalardan xəbərdar olsaydılar, çox ağlayar, az gülərdilər

## ?Qİyamət günü günahkarlar sorğuya çəkİləcəkmİ .۳۶

Sual: "Ərrəhman" surəsində oxuyuruq: "O gün nə bir insan, nə bir cin günahı haqqında sorğu-sual olunmayacaq."(۲) Hansı ki, Qur'anın bir çox başqa ayələrində günahkarların ?sorğu-suala çəkiləcəyi bildirilir. Həqiqət haradadır

Cavab: Ayənin əsil mahiyyətini növbəti ayə açıqlayır. Həmin surənin növbəti ayəsində oxuyuruq: "Günahkarlar üzlərindən tanınacaq, kəkillərindən və ayaqlarından tutulub yaxalanacaqlar."(۳) "Yasin" surəsində də uyğun məsələyə toxunulmuşdur. Buyurulur: "Bu gün onların ağızlarını möhürləyirik. Etdikləri əməllər barəsində onların əlləri bizimlə danışar, ayaqları isə şəhadət verər."(۴)Demək, haqqında danışılan ayədəki "sorğuya .çəkilməz" ifadəsinin əsil mə'nası odur ki, insan dili ilə cavab verməz

**Həzrət Peyğəmbər vəhy mənbəyİ İlə əlaqədə olduğu halda, hərbİ və İctİmaİ . ۳۷ ?məsələlərdə öz səhabələrİ İlə məsləhətləşməsİnə nə ehtİyac vardı**

Həzrət Peyğəmbər elm və bilik, siyasət baxımından bütün yaradılmışlardan üstün olduğu halda, nə üçün ona göstəriş verilir ki, başqaları ilə məsləhətləşsin? Qur’ani-kərimdə oxuyuruq: “O kəslər ki... işlərini öz aralarında məsləhət-məşvərətlə ?görər...”(۱)Ayənin məqsədi nədir

Cavab: Qur’anın özündə bu sayaq suallara cavab verilmişdir. Allah-təala buyurur: “Həqiqətən, Allaha, qiyamət gününə ümid bəsləyənlər və Allahı çox zikr edənlər üçün Allahın rəsulu gözəl nümunədir.”(۲) Demək, həzrət Peyğəmbərin başqaları ilə məsləhətləşməkdə məqsədi onların tə’lim-tərbiyəsidir. Həzrət öz ətrafındakılara öyrədir ki, ondan sonra problemlərlə üzləşdikdə məsləhət-məşvərət yolu ilə ictimai çətinliklərini həll etsinlər. Bir halda ki, maarif, elm, siyasət, tədbir sahəsində hamıdan üstün olan bir şəxs özünü başqalarının məsləhətindən ehtiyacsız bilmir, ətrafındakılar da onun bu .işindən nümunə götürüb, çətinlik zamanı özbaşına iş görməməlidirlər

**Nə üçün Allah–təala “Rəbbuş–Şİra”, yə’nİ Şİra (prosİon) ulduzunun Rəbbİ kİmİ . ۳۸ ?tanıtdırır**

Sual: Qur’anda Allah-təala belə təqdim olunur: “Şira ulduzununda Rəbbi Odur.(۳)Belə bir sual yaranır ki Şira ulduzunun hansı xüsusiyyətləri onu önəmli etmişdir? Məgər Allah ?bütün ulduzların Rəbbi deyilmi

:Cavab: Allahın Özünü “Rəbbuş-şira” adlandırmasının iki səbəbi var

Xuzaə adlı ərəb qəbiləsi Şira ulduzuna pərəstiş edir, ona həmd oxuyurdular. Onların .۱ nəzərincə, yer üzündə əlamətlərin mənbəyi bu ulduz olmuşdur. Ona görə də Allah-təala bu ulduzun da başqa varlıqlar kimi yaradılmış bir varlıq olmasını önə çəkərək buyurur: “Şira ulduzunun da Rəbbi Odur.” Həmin qəbilənin nəzərinə çatdırılır ki, onlar yanlış yol .tutaraq, Allahın yaratdıqlarından birinə pərəstiş edirlər

Şira ulduzu səmadakı parlaq ulduzlardandır. Nücum sahəsinin biliciləri onu “alfa” və .۲ ya “ulduzlar padşahı” adlandırmışlar. Bu ulduzun bə’zi maraqlı xüsusiyyətləri vardır. Bu :xüsusiyyətlərdən bir qismini nəzərdən keçirək

a) Paris rəsədxanasında aparılmış tədqiqatlara əsasən, Şira ulduzunun səthində temperatur yüz iyirmi min dərəcə santiqraddır. Hansı ki, planetimizi işıqlandırıb, onda həyatı tə'min edən günəş səthində temperatur altı min beş yüz dərəcə santiqraddır. .Demək, Şira ulduzunun temperaturu fövqəl'adə dərəcədə böyükdür

b) Bu ulduzun xüsusi çəkisi suyun xüsusi çəkisindən ۵۰ min dəfə ağırdır. Hansı ki, günəş sisteminin ən ağır xüsusi çəkiyə malik olan planeti Merkurinin xüsusi çəkisi sudan cəmi altı dəfə çoxdur. Belə bir xüsusi çəki Şira ulduzunun tərkibi haqqında maraqlı .fərziyyələr doğurmuşdur

v) Şira ulduzu, mərkəzində bir xətt boyunca düzülmüş üç ulduz olan gözəl bir .trapesiyanın altında yerləşir

q) Şira səmanın ən parlaq ulduzlarındandır. O, adətən, qış fəslində zühur edir. Amma qədim Misir münəccimlərinin dövründə, təqribən yeddi min il bundan qabaq Şira ulduzu .yayın əvvəllərində görünərdi

d) Şira ulduzu ilə bağlı aparılan araşdırmalardan mə'lum olmuşdur ki, bu ulduz günəşdən təqribən iyirmi dəfə böyük həcmə malik olan əzəmətli bir kürədir. Amma bu ulduz yer planetindən çox-çox uzaqdır. Bilirik ki, işıq sür'əti saniyədə üç yüz min kilometrdir. Günəşin nuru yüz əlli milyon kilometr məsafəni səkkiz dəqiqə on üç saniyədə qət .edərək, yerə çatır. Amma Şira ulduzunun işığı bizim yer kürəsinə on il yol gəlir

.İnkar etmirik ki, bu sayaq xüsusiyyətlərə malik başqa ulduzlar da var

### ?Peyğəmbərİn me'rac səfərİnİn elmİ İzahı varmı .۳۹

Cavab: Peyğəmbərin me'rac hadisəsi haqqında az adamlar eşitməmiş olar. Əksər insanlar bu hadisənin necə baş verməsi ilə maraqlanırlar. Kimi qaneedici cavab tapır, kiminin sualları cavabsız qalır. Bə'ziləri də bu hadisəni xürafat hesab edirlər. Kimi də :susaraq, şübhəli halda bu əhvalatı dinləyir. Bu mövzuda bir neçə sualla müraciət edirik

Bu hadisə haqqında yalnız qeyri-mö'təbər rəvayətlərdə xəbər verilir, yoxsa Qur'an .۱ ?və səhih rəvayətlər də belə bir hadisənin baş verməsini təsdiqləyir

Əgər e’tibarlı мənbələr bu hadisənin baş verмəsini təsdiqləyirsə, İslaм Peyğəмbəri .۲ ?cisмən мe’raca getмişdir, yoxsa bu hadisə yuxuda baş verмişdir

Həmin dövrdə fəzaya qalxmaq üçün heç bir vasitə olmamışdırsa, həzrət Peyğəmbər .۳ me'rac səfərini necə həyata keçirmişdir? Əgər qəbul etsək ki, belə bir səfər doğrudan da, baş tutmuşdur, onda irad edilə bilər ki, belə bir səfər üçün çox böyük bir zaman ?fasiləsi lazım idi. Fəzaya doğru belə bir səfər üçün insan ömrü bəs edərmi

?Belə bir səfər hansı zərurətdən doğmuşdur .۴

Cavab: ۱. "İsra" surəsinin ilk ayəsində belə oxuyuruq: "Bə'zi ayətlərimizi göstərmək üçün bəndəsini bir gecə Məscidül-Həramdan ətrafını mübarək etdiyimiz Məscidül-Əqsaya aparan Allah pak və müqəddəsdir. O, doğrudan da eşidən və biləndir." Bu ayədə me'rac hadisəsinin müqəddiməsinə, yə'ni Məkkədən Beytül-müqəddəsə hərəkətə işarə olunur. Ayədən mə'lum olur ki, uyğun səfər Məscidül-həramdan (Məkkədən) başlamışdır. Cəmi bir gecə çəkmiş bu səfərin məqsədi Allah əzəmətinin müşahidəsi olmuşdur. Ayədən belə görünür ki, cərəyan yuxuda yox, aşkarda baş .vermişdir

Ayənin ərəbi mətninin "sübhan" kəlməsi ilə başlaması mövzunun əhəmiyyətini göstərir. .Çünki yuxu bir o qədər də əhəmiyyətli məsələ deyil ki, onun zikri uyğun tə'birlə başlana

Nəcm" surəsinin ۱۳-۱۸-ci ayələrində buyurulur: "And olsun ki, (Peyğəmbər (s) Cəbrəili)" .۲ başqa bir dəfə də görmüşdü, Sidrətül-Müntəhanın yanında. Mə'va cənnəti də onun yanındadır; o zaman Sidrəni nələr bürümüşdü, nələr! Göz nə yayındı, nə də uzağa getdi; And olsun ki, öz Rəbbinin ən böyük qüdrət nişanələrindən bir qismini gördü." Ayələrdə me'rac kəlməsi işlədilməsə də, əhvalatların me'rac səfəri zamanı baş verdiyi şübhə doğurmur. Əbədi behiştdə baş verən görüşlərin məhz me'rac səfərində .gerçəkləşdiyini bütün şiə və sünni təfsirçiləri təsdiqləyirlər

Uyğun ayələrdən görünür ki, hadisə oyaq vaxtı baş vermişdir. "Göz nə yayındı, nə də uzağa getdi" ayəsi deyilənləri bir daha təsdiqləyir. "Rəbbinin ən böyük qüdrət nişanələrindən bir qismini gördü." ayəsi də me'rac səfərinin aşkar şəkildə baş verməsinə növbəti dəlildir. Bir sözlə, Qur'ani-kərimdə me'rac mövzusu yetərincə .işıqlandırılmışdır

Bəs hədislərdə bu barədə nə deyilir? İslam alimləri tərəfindən tərtib olunmuş müxtəlif

əqidəsi olduğu bəyan olunur. Əlbəttə ki, ayrı-ayrı qruplar arasında müəyyən baxış fərqləri də vardır.

Amma əksər İslam alimləri me’rac hadisəsində nəql olunmuş hədislərin mütəvatir, yetərli sayda, məşhur olduğunu təsdiqləyirlər. Bə’zi alimlərin fikirləri ilə tanış olaq:

١. Böyük şiə alimi şeyx Tusi öz təfsirində uyğun ayə haqqında deyir: “Şiə alimləri inanırlar ki, Allah-təala öz Peyğəmbərini Məkkədən Beytül-müqəddəsə apardığı vaxt onu səmaya qaldırdı, öz əzəmət nişanələrini ona göstərdi. Bu hadisə yuxuda yox, ayıq vaxtı baş verdi.” Təfsirin “Nəcm” surəsinin uyğun altı ayəsi haqqındakı qeydlərində me’rac səfərinin ikinci hissəsi, yə’ni səmaya səfər haqqında mə’lumat verilir.

٢. Böyük təfsirçi mərhum Təbərsi “Məcməul-bəyan” təfsirində “Nəcm” surəsinin uyğun ayələri haqqında belə buyurur: “E’tibarlı mənbələrimizdə bildirilən budur ki, Allah Öz Peyğəmbərini cismi ilə, oyaq vaxtı səmaya qaldırdı. Əksər təfsirçilər bu əqidədədirlər.”

٣. Mühəddis Əllamə Məclisi “Biharul-ənvar” kitabının altıncı cildində yazır: “İslam Peyğəmbərinin Məscidül-həramdan Beytül-müqəddəsə və oradan da səmaya səfərini Qur’an ayələri və şiə və sünnilərin mütəvatir hədisləri təsdiqləyir. Yalnız mə’sum imamların buyuruqlarından xəbərsiz olanlar bu səfərin ruhani bir səfər olması haqqında danışırlar...” Sonra əlavə olunur: “Əgər bu hadisə haqqında mə’lumatları toplamaq istəsək, böyük bir kitab alınar.”

Sonra alim uyğun mövzu ilə bağlı yüzdən çox hədis nəql edir. Bu hədislərin böyük hissəsi mö’təbər şiə kitabı “Kafi”dən nəql edilmişdir.

Sünni hədis alimləri və təfsirçiləri də me’rac hadisəsini məşhur bir hadisə kimi tanıyır, “İsra” və “Nəcm” surələrinin təfsirində me’rac hadisəsini təsdiqləyirlər.

“Məcməul-bəyan” kitabında deyilir: “Me’rac mövzusu ilə bağlı hədislər dörd qrupdur:

١. Mütəvatir hökmündə olan rəvayətlər;

٢. Əqli və nəqli baxımdan şübhə doğurmayan hədislər;

٣. Bir qədər əsassız olan rəvayətlər;

Həqiqi İslaм aliмləri мe’rac səfərinin şişirdilмiş şəkildə təqdiм olмasına tərəfdar deyillər. Heç bir tarixi мə’luмat мəs’uliyyətsiz insanlardan aмanda olмadığı kiмi, мe’rac hadisəsi haqqında da мəntiqsiz sözlər danışılмışdır. Ağıl və мəntiqə, tarixi мə’luмatlara .əsaslanaraq, uydurмa hədislərin aradan götürülмəsi zəruridir

?Bəs мe’rac səfəri elмi cəhətdən necə izah olunur

:Bu мövzunu aydınlaşdırмaq üçün bir neçə sualı cavablandırмağa çalışaq

?Üмuмiyyətlə, мe’rac, yə’ni səмaya səfər elмi baxıмdan мüмkündürмü .١

?Əgər belə bir iş olмuşdursa, hansı vasitələrlə olмuşdur .٢

Birinci sual elмi baxıмdan yetərincə cavablandırıla bilər. Çünki artıq fəza təcrübi şəkildə öyrənilir və neçə illərdir ki, atмosferə səfərlər həyata keçirilir. İnsanın fəzaya qalxмası bir zaмan şübhəli görünə bilərdi. Hətta bə’zi keçмiş aliмlər fəzaya səfəri atмosfer üçün .təhlükəli sayırdılar. Bu gün isə fəza səfərləri kiмsədə təəccüb doğurмur

Artıq sərnişinli və sərnişinsiz peyklər atмosferi dələrək kosмosa çıxır. Veneraya qədər gedən peyklər vardır. Kosмosun bugünki fəthi varlıq aləмi ilə мüqayisədə kiçik bir iş görünsə də, artıq belə bir səfərlər мüмkünsüz sayılмır. Bir işin мüмkün sayılмası üçün .ən yaxşı dəlil onun baş verмəsidir

İkinci sualın cavabında e’tiraf etмəliyik ki, kosмos səfərlərinin hansısa texniki vasitəyə ehtiyacı var. Kosмosa çıxмaq üçün atмosfer qatını dəlмək lazıм gəlir. Bu isə hansısa texniki vasitələrlə həyata keçirilir. Kosмosa çıxan şəxs əvvəlla cazibə qüvvəsini dəf etмəlidir. Cazibə qüvvəsindən çıxмaq üçün isə ən azı saatda ۴٠ мin kiloмetr sür’ətə мalik olan мinik lazıмdır. İkinci мaneə yer kürəsini əhatə etмiş atмosfer qatıdır. Atмosferin yalnız yerə yaxın olan hissəsində nəfəs alмaq мüмkündür. Pərakəndə oksigen qatını keçdikdən sonra oksigen azlığı insanı boğмağa başlayır. Təcrübədə sübut olunмuşdur ki, yerdən ١۵ kм. yüksəkliyə qalxмış insan bir neçə saniyə ərzində huşunu itirir. Buna görə də hava nəqliyyat vasitələrində sərnişinlər üçün ehtiyat .oksigen götürülür

Digər bir мaneə atмosferdəki yandırıcı istilikdir. Yuxarı qatlarda cisмin günəş

düşməyən hissəsi soyuqdan donur, günəş şüaları düşən hissəsinin hərarəti isə olduqca yüksəyə qalxır.

səh:۲۵۲

Başqa təhlükəli bir maneə günəşin ultrabənövşəyi şüalarıdır. Bu şüalar insan .orqanizminə öldürücü tə’sir göstərir

Fəzada xaotik hərəkətdə olan meteor və meteoritlər də hərəkətə böyük maneçilik törədir. Belə səma cismi ilə toqquşma böyük fəlakətlə nəticələnir. Belə maneələrdən .qorunmaq üçün xüsusi avadanlıqlara ehtiyac duyulur

Digər bir maneə isə çəkisizlikdir. İnsan yerdən uzaqlaşdıqca onun çəkisi azalır. Çünki çəkini yaradan yerin cazibə qüvvəsidir. Sadəcə, yerin cazibə dairəsindən çıxdıqdan sonra insan çəkisizlik şəraitinə düşür. Fəzada olan müsafir öz ağırlığını hiss etmir. Sür’ət özü də çəkini azaldan amillərdəndir. Çəkisizlik kosmonavtlar üçün adi bir hal olsa da, adi insanlar bu vəziyyətə tab gətirə bilmirlər. Ona görə də fəza səfərinə çıxmazdan qabaq .ciddi şəkildə hazırlaşmaq lazım gəlir

Fəza səfərinə çıxmış insanın qarşılaşacağı maneələri sadaladıq. Amma bu maneələr səfəri mümkünsüz etmir. Hansısa vasitələrlə həmin maneələri aradan qaldırmaq olar. Əsrimizdə həmin maneələri ötüb keçə bilən cihazlar mövcuddur. Əlbəttə ki, daha .mükəmməl cihazlar hazırlana bilər

İndi isə me’rac səfərinə qayıdaq. Bilməliyik ki, həzrət Peyğəmbər (s) bu fəza səfərini adi bəşəri bir qüvvə ilə başa vurmamışdır. Həzrət, heç şübhəsiz qeybi qüvvələrin yardımı ilə uyğun məsafəni qət edə bilmişdir. Əlbəttə ki, Allahın sonsuz qüdrətinə inanan allahpərəst bir şəxs deyilənlərə təəccüb etməz. Allah sonsuz qüdrət sahibidir və Öz Peyğəmbərini səmaya qaldırıb əzəmətini ona göstərməyə qadirdir. Me’rac səfərinin bir gecədə baş verməsi zaman baxımından məntiqidirmi? Alimlər hesablamışlar ki, günəş sistemindən kənarda yerləşmiş ən yaxın ulduz olan proksima ulduzuna çatmaq üçün ən azı dörd il vaxt lazımdır. Bu baxımdan me’rac səfəri necə izah olunur? Məsələnin iki həll :yolu var

Mümkündür ki, me’rac səfəri günəş sistemi daxilində baş vermişdir. Həzrət .١ Peyğəmbərin günəş sistemini tərk etməsi haqqında dəlilimiz yoxdur. Əgər bu ehtimalı qəbul etmiş olsaq, zaman baxımından şübhəli nöqtə qalmır. Əvvəldən günəş sisteminin ən uzaq planetinədək olan məsafə min dörd yüz milyon kilometrdir. İşıq sürətinə malik .bir minik üçün bu məsafəni qısa bir zamanda qət etmək çətin deyil

Maraqlıdır ki, şiə və sünni hədislərində həzrət Peyğəmbərin merac səfərini Büraq adlı bir miniklə həyata keçirdiyi bildirilir. Hədis alimləri bildirirlər ki, həmin minik

çox sürətli olduğu üçün Büraq adlandırılmışdır. “Büraq” kəlməsinin lüğət mənası “işıqlı” deməkdir. Hədislərdə bu qeyri-adi minik haqqında maraqlı məlumatlar verilmişdir. Bildirilir ki, bu miniyin hər qədəmi onun baxışı qədər olmuşdur. Dünyanın görünməsi işıq vasitəsi ilə baş verdiyindən görmə sürəti işıq sürətinə bərabərdir. Hədisdən məlum olur ki, bu miniyin işıq sürətinə bərabər sürəti olmuşdur. Amma işıq sürəti də ən böyük sürət deyil. Bəzi alimlər iddia edirlər ki, hər hansı amil bir şeyin sürətini işıq sürətindən yuxarı qaldıra bilməz. Amma bu baxış özünü doğrultmur. İşıq sürətindən üstün sürətin də olması mümkündür. Məsələn, cazibə qüvvəsinin hər hansı sahəni əhatə etməsi üçün zamana ehtiyac yoxdur. Alimlərin fikrincə, bu sahə bir anda yaranır. Bu barədə yazırlar: “Elə bir sürət mövcuddur ki, bir anda dünyanın bir başından o biri başına təsir göstərir. Bu tipli sürət cazibə qüvvəsi dalğalarının sürətidir.” Aydın olur ki, sürətin məhdudluğu nəzəriyyəsi sübuta yetirilməmiş bir nəzəriyyədir. Gələcəkdə sübut oluna bilər ki, hətta torpaqdan yaranmış bir cisim xüsusi bir şəraitdə işıq sürətindən də yuxarı sürətlə hərəkət edə bilər. Əgər bu baxış sübuta yetrilərsə, Peyğəmbərin meracı günəş sistemindən kənarda da mümkün sayıla bilər. Sürət məhdudiyyəti nəzəriyyəsi özünü doğrultmasa, Peyğəmbərin merac səfəri hansı fəzada baş verməsindən asılı olmayaraq, .bir gecədə mümkün sayılar

Bəs me’rac səfərinin məqsədi nə idi? Təəssüf ki, Peyğəmbərin me’rac səfəri haqqında həqiqətə uyğun gəlməyən xürafi əhvalatlar uydurulmuşdur. Bu xürafi mə’lumatlar səbəbindən me’rac səfərini sonadək mütaliə etməkdən çəkinmişlər. Amma me’rac səfərinin əsil məqsədini Qur’andan öyrənmək lazımdır. Bütün islami həqiqətlər yalnız Qur’ani-məcid vasitəsi ilə yetərincə dəyərləndirilə bilər. Me’racla bağlı Qur’an ayələrindən ikisində uyğun səfərin məqsədi belə açıqlanır: “Bə’zi ayələrimizi göstərmək üçün bəndəsini bir gecə Məscidül-həramdan ətrafını mübarək etdiyimiz Məscidül-Əqsaya aparan Allah pak və müqəddəsdir.(۱)Ayədə açıq-aşkar bildirilir ki, bu səfərin məqsədi Allahın əzəmətinin həzrət Peyğəmbərə göstərilməsidir. Növbəti ayədə isə belə buyurulur: “And olsun ki, öz Rəbbinin ən böyük qüdrət nişanələrindən bir qismini gördü.”(۲) Ayələrdən mə’lum olur ki, me’rac səfərinin məqsədi bə’zi uydurma .mə’lumatlarda bildirildiyi kimi Allahın camalının müşahidəsi olmamışdır

Biz müsəlmanların əqidəsinə görə Allahın xüsusi məhəlli yoxdur. Qur’anda buyurulur: “Haraya üz tutsanız Allah oradadır.” Başqa bir ayədə isə belə buyurulur: “Onun kürsüsü ”.göylərlə yer vüs’ətindədir

Bəli, me’rac səfərinin məqsədi ilahi ayətlərin müşahidəsi olmuşdur. Bu səfər həzrət Peyğəmbərin (s) qəlbini daha da nurlandırmış, düşüncəsini daha da dərinləşdirmişdir. Həzrət Peyğəmbər me’rac səfərindən sonra xalqa rəhbərlik və insanların hidayəti üçün .daha ciddi hazırlığa malik oldu

## Yeddinci hissə–Müxtəlif suallar

### ?Bİr zaman tərəqqİ etmİş müsəlmanların bugünkü gerİlİyİnİn səbəbİ nədİr .۱

Sual: Nə üçün müsəlmanlar bir zaman sür’ətlə inkişaf etdilər? Bəs bugünkü geriliyin səbəbi nədir? Nə üçün bir zaman dünya mədəniyyətinin önündə gedən müsəlmanlar ?tənəzzülə uğramışlar

Cavab: Doğrudan da, bu sual maraqlı və həssas suallardandır. Bu mövzuda kitab yazmaq daha yaxşı olardı. Tanınmış Misir alimi Fərid Vəqdi öz ensiklopediyasının elm bölməsində müsəlmanların bir vaxtkı inkişafının on səbəbini göstərmişdir. Bu mövzuda başqa alimlərin də araşdırmaları vardır. Əslində isə uyğun tərəqqi və bugünkü geriliyin bir əsas səbəbi vardır: İslamın ali tə’limlərinə diqqət! İlkin İslam dövründə bütün müsəlmanlar ictimai və fərdi həyatın bütün sahələrində bu tə’limlərdən ilhamlanardılar. Amma bu gün əksər müsəlman ölkələrində vəziyyət başqadır. Çoxlarını yalnız coğrafi baxımdan müsəlman hesab etmək olar. Hər halda bir zamankı inkişafın və bugünkü :tənəzzülün səbəblərini araşdıraq

Çoxsahəli fədakarlıq: İlkin müsəlmanlar bütün mə’nalarda fədakar idilər. İslam ayinləri .۱ onlar üçün qardaşdan, qadından, məqamdan, sərvətdən, mənsəbdən əziz idi. Onlar bütün imkanlarını İslam yolunda sərf edirdilər. İslam tarixindəki döyüşlər deyilənlərin canlı şahididir. Bugünkü həyatımızda isə din ikinci dərəcəli rol oynayır. Azca da olsa, dini fədakarlıq gözə çarpmır. Çoxları yalnız öz varlıqlarını qorumaq üçün İslamı möhtərəm tuturlar. Azca çətinliyə düşdükləri zaman İslamdan üz döndərirlər. Çox az

insanlar şəxsi mənafeyini İslama qurban verir. Bəli, misilsiz zəhmətlər, şəhid qanları .hesabına əldə olunmuş dəyərlərin qiyməti bilinmir

İttifaq və birlik: İlkin İslam dövründə müsəlmanlar bir-birlərini İslam hökmləri əsasında .٢ qardaş sayırdılar. Həzrəti Peyğəmbərin (s) vəfatından sonra Əmirəl-mö’minin və onun mə’sum övladları sayəsində İslamda əldə olunmuş nailiyyətlər bir müddət qorundu. Onlar İslam əsaslarını qorumaq üçün özlərini qurban verdilər. Bu günsə müsəlman başçıları arasındakı fikir ayrılığı son həddə çatmışdır. Artıq neçə əsrdir ki, müxtəlif məzhəb və qrup nümayəndələri bir-birləri ilə müxalifətçilik edir, bir-birlərini dindən xaric sayırlar. Bu gün İslamın həqiqi çöhrəsi müxtəlif xürafatların pərdəsi altında qalmışdır. !?Belə bir vəziyyətdə hansı əzəmətdən danışmaq olar

Dövrün şəraiti ilə tanışlıq: Dövrün şəraiti ilə tanışlıq İslamın inkişafında mühüm amildir. .٣ Bir vaxt müsəlmanlar ən müasir silahlarla, elmin böyük nailiyyətləri ilə təchiz olunmuşdular. Hüneyn döyüşü zamanı həzrət Peyğəmbər xəbər tutdu ki, Yəməndə qalaları uçurmaq üçün yeni silah ixtira olmuşdur. Dərhal Yəmənə adam göndərib, həmin .silahın hazırlanma və istifadə etmə qaydalarını öyrənməyi tapşırdı

İslamın ilkin dövründə ötən əsrin elmi nailiyyətləri, fəlsəfə, fizika, kimya, riyaziyyat, həndəsə, astranomiya kitabları ərəb dilinə tərcümə olundu. Müsəlmanlar həmin elmləri təkmilləşdirib, böyük mədrəsələr, kitabxanalar tə’sis etdilər. Çox tez bir zamanda müsəlman cəmiyyəti biganə cəmiyyətlərdən ehtiyacsız oldu. Qısa bir müddətdə Bağdad, Şam, Misir, İran dini təhsil mərkəzləri dünyanın elmi təhsil mərkəzlərinə çevrildi. Bu gün müsəlmanlar günün tələbini nəzərə almadan öz qədim üsullarını tətbiq etməklə İslamı dünyaya yaymağa çalışırlar. Hansı ki, dünya həmin dünya deyil. E’tiraf etməliyik ki, .İslamın təbliğat vasitələri əsrin təbliğat vasitələri ilə ayaqlaşa bilmir

Yuxarıda sadalanan üç amil bir zaman müsəlmanların tərəqqisinə səbəb olmuşdur. Müsəlmanların üstünlük səbəbi Qur’ani-kərimdə də yad olunmuşdur. Bu mövzuda söhbətimizi həmin ayə ilə başa çatdırırıq: Allah-təala buyurur: “İmanınız olmuş olsa, siz (daha üstünsünüz.”(١)

Qeyd olunmuş ayədən başqa bir sualın da cavabı aydın olur. Soruşula bilər ki, müsəlmanlar itirilmiş əzəmətlərini qaytara biləcəklərmi? Birinci sualın cavabı bu

məsələyə də aydınlıq gətirir. Bir zaman İslamın tərəqqisinə səbəb olmuş üç amilə diqqət .yetirilərsə, müsəlmanlar yenidən inkişaf edə bilərlər

Bügünkü müsəlmanlar ilkin dövrün müsəlmanları kimi fədakar olsalar, əl-ələ verib təfriqələri aradan qaldırsalar, İslam rəhbərləri dövrün şəraitini dərk etsələr, heç şübhəsiz ki, ilkin əzəmət geri qaytarılasıdır. Əlbəttə ki, hər növ dəyişiklik və təkamül İslam qanunları hüdudunda olmalıdır. Zamanın ruhunu duymaq o demək deyil ki, İslam .qanunları bir kənara qoyulsun

### ?Nə üçün gənclər dİnİ məclİslərdən qaçırlar .٢

Sual: Bir çox gənclərin dini məclislərə maraq göstərməməsinin səbəbi nədir? Problem hansı yolla həll edilə bilər? Gənclərin diqqətini cəlb etmək üçün hansı metodlardan ?istifadə etmək lazımdır

Cavab: Düşünürük ki, bir çox gənclərin dini yığıncaqlardan uzaqlaşmasının iki əsas :səbəbi var

İslam düşmənlərinin müsəlman gənclərə qarşı hazırladığı zəhərli proqramlar onları dini .١ məclislərə, ruhaniyyətə münasibətdə bədbinləşdirmişdir. Düşmən öz iti təbliğat vasitəsi .ilə ağı qara göstərməyi bacarır

Bə’zi məclislərdə natiqlik qaydalarına, təbliğat üsullarına əməl edilmir. Zəif, küt, elmi .٢ .əsassız təbliğat bugünkü təhsilli gəncin mə’nəvi susuzluğunu yatıra bilmir

Bəli, məhz bu iki səbəbdən müsəlman gənclər dini yığıncaqlardan qaçır. Amma xoşbəxtlikdən son dövrlər əksər müsəlman gənclərində İslama yeni bir maraq oyanmışdır. Bu gün əzəmətli dini mərasimlərə nəzər salsanız, iştirakçıların əksəriyyətinin gənclərdən olunduğunu görərsiniz. Gənclər ilahi eşq yanğısında İslama üz tuturlar. Onların ehtiyaclarına cavab verilib-verilməməsi isə başqa bir mövzudur. Mövcud mə’nəvi ehtiyacların ödənməsi üçün günün nəbzini tuta bilən təbliğatçılara ehtiyac var. Biz dəyərli təbliğatçıların mövcudluğunu inkar etmirik. Təəssüf ki, onlar mövcud ehtiyacı .ödəyəcək sayda deyillər

### ?İslamın çoxarvadlılıq hökmündən suİ-İstİfadənİn qarşısını necə almaq olar .٣

Sual: Bilirik ki, cəмiyyətdə kişi-qadın tarazlığı pozulduqda, çoxarvadlılıq hökмünün müstəsna əhəмiyyəti var. Əlbəttə, bu hökмlə o zaмan razılaşмaq olar ki,

kişilər qadınlara münasibətdə ədalət və insafı gözləsinlər, evlənib-boşanma əyləncəyə .çevrilməsin, qadının şəxsiyyəti qorunsun

Amma dövrümüzdə bir çox müsəlmanlar coğrafi müsəlman olduğundan dini göstərişlərə biganə yanaşırlar. Beləlləri çoxarvadlılıq hökmündən də sui-istifadə edirlər. İslamın ictimai əhəmiyyətli bir hökmündən çirkin məqsədlə istifadə edənlərə qarşı hansı ?tədbirlər görülməlidir

Cavab: Şübhəsiz ki, qanun nə qədər gözəl olsa da, onu icra edən lazımdır. Əks təqdirdə .istənilən gözəl qanunun cəmiyyət üçün faydası olmur

İslam tə’limləri, Allaha iman bir çox insanların çirkin işlərdən çəkindirsə də, bütün cəmiyyət öz istəyinin ixtiyarına buraxıla bilməz. İstər-istəməz qanunu pozanlar, qanundan sui-istifadə edənlər tapılasıdır. Ona görə də ictimai ədalətin tə’min olunması üçün həmin qanunlara nəzarət edənlər lazımdır. İslami hökumətin əsas vəzifələrindən biri də elə budur. İman və əxlaq yolu ilə özünü düzəldə bilməyən insanların qarşısını yalnız işlək qanunla almaq olar. Haqqı tapdanan insanların şərəf və ləyaqətinin .qorunması İslam hökumətinin müqəddəs vəzifəsidir

İslami qanunlara nəzarət məsələsi təkcə çoxarvadlılıq hökmünə aid deyil. İslam bütün sahələrdə müsəlmanların hüquqlarını qoruyur, onların insani haqlarının pozulmasına qarşı çıxır. Çoxarvadlılıq da uyğun sahələrdən biridir. İslam hökumətinin ixtiyarı var ki, çoxarvadlılıqdan sui-istifadə edənləri cəzalandıraraq, qadınların şərəf və ləyaqətini qorusun. Başqa bir nöqtəni də daim diqqətdə saxlamaq lazım gəlir. İslam qanunları zəncir halqaları tək bir-birinə bağlıdır. Əgər bir qanun icra olunmursa, demək, bu zəncir dairəsində qırıqlıq var. Hədd, diyə, qəzavət, təlaq və sair hökmlər İslam qanunlarının kompleks şəkildə işlədiyi cəmiyyətlərdə qoruna bilər. Əgər bütün İslam qanunları cəmiyyətdə icraya qoyularsa, kimsə bu qanunlar silsiləsini pozmağa cür’ət etməz. .Unutmamalıyıq ki, İslam qanunları təkcə izdivac və təlaqdan ibarət deyil

### ?Səbİr vuran adam bİr qədər gözləməlİdİrmİ .۴

Sual: Bə’ziləri işə başlamaq istəyərkən səbir vurduqda bir qədər gözləyirlər. İslamda ?belə bir göstəriş varmı

Cavab: İslaмda belə bir göstəriş yoxdur. Üмuмiyyətlə, bu sayaq işlər İslaм ruhundan uzaqdır. Hətta bildirilir ki, bir iş görмək qərarına gəldikdə pis əlaмətlə

səh:۲۵۸

rastlaşsanız, e’tina etməyin və Allaha təvəkkül edərək işinizin ardınca gedin. Pis fal, pis .əlamət əslində şirk nişanəsidir

Bəli, səbir haqqında buyurulmuşdur ki, əgər aranızda bir şəxs səbir vursa, ona dua edin və “Yərhəməkumullah”, yə’ni Allahın mərhəməti halına şamil olsun,” deyin. Qarşı tərəf də ”.dua edib belə deməlidir: “Yəğfirəllahə ləkum”, yə’ni “Allah sizi bağışlasın

Amma səbirdən sonra bir qədər gözləmək, tək səbir, cüt səbir deyə dayanmaq əfsanədən başqa bir şey deyil. Agah və alim müsəlmanlar belə əfsanələrdən .çəkinməlidirlər

### ?Peyğəmbər barİgahının xadİmİnİn adından yayılan yuxu namələrİ düzgündürmü .۵

Sual: Bə’zən Peyğəmbər barigahının xadimi adından yuxu nameləri yayılır. Bu şəxs xalqı günahdan çəkinməyə çağıraraq, əsrin imamının (ə) zühuru haqqında Peyğəmbərin dilindən mə’lumatlar verir, zühur vaxtını göstərir. Bu yuxu naməsini düzgün saymaq ?olarmı

Cavab: Bə’zi İslam və şiə düşmənləri tərəfindən görülən bu çirkin iş təəssüf doğurur. Bu iş illər uzunudur ki, davam edir. Hər il həmin xadimin adından namələr yayılır. Bir namədə və’d edilmiş vaxt düz çıxmadıqda, xadim təzə bir yuxu görür. Bu nameləri yayanların məqsədi həzrət Mehdinin (ə) intizarında olanları süstləşdirməkdir. Əlbəttə ki, əksər şiələr bu sayaq uydurmalara inanmırlar. Hətta bir şəxs belə bir yuxu görmüş olsa da, .dini baxımdan e’tibarlı sayılmamalıdır

### ?Seyİdlİk nə zamandan başlamışdır .۶

?Sual: Seyidlik nə vaxtdan başlamışdır və bu zümrəyə uyğun adı kim qoymuşdur

Cavab: Seyidlik həzrət Peyğəmbər (s) xanədanında mövcud olan mə’nəvi bir şərəfdir. Həzrət Peyğəmbər (s) nəslindən olan bu insanlara xüsusi ehtiram göstərilir. Bu ehtiramın əsasını, şübhəsiz ki, həmin insanların həzrət Peyğəmbərlə (s) qohumluq əlaqəsi təşkil edir. “Seyyid” ərəbcədən tərcümədə “ağa” deməkdir. Bu

.kəlmə həzrət Peyğəmbərin (s) və mə’sum imamların bə’zi buyuruqlarında da işlədilmişdir

Amma belə bir titul seyyid olan şəxsə icazə vermir ki, İslam qanunlarını pozsun və özünü qanunlara münasibətdə başqalarından üstün saysın. Əslində seyyidliyin kökü Peyğəmbərin (s) və Peyğəmbər (s) əhli-beytinin əzəmətidir. Onlar öz uca şəxsiyyətləri sayəsində ağa, seyyid olmuşlar. Bu şəxsiyyət ucalığı həzrət Peyğəmbərin (s) babası .Haşimədən gedir. Onun övladları da bu yolla iftixar qazanmışlar

### ?Məhəmməd Peyğəmbəri (s) yenidən tanımaq lazımdır” kitabı mö’təbərdirmi“ .٧

Sual: Bu kitabın güclü və zəif nöqtələrini “İslam məktəbi” jurnalının saylarının birində oxuduq. Elə görünür ki, kitabın yeganə zəif nöqtəsi şiə dünyasını, Əmirəlmö’minin Əlinin (ə) şəxsiyyətini diqqətdən kənar saxlamasıdır. Yeganə zəif nöqtə budur, yoxsa həzrət ?Peyğəmbərin (s) də şəxsiyyəti lazımınca işıqlandırılmamışdır

Cavab: Uyğun kitabın güclü və zəif nöqtələri vardır. Onun zəif nöqtələri təkcə şiə məzhəbi ilə bağlı deyil. Uyğun kitabda heç bir müsəlmanın inanmadığı məsələlər qeyd olunur. Məsələn, kitabın ٢٢٥-ci səhifəsində “Me’rac” fəslində oxuyuruq: “Orada Peyğəmbər (s) Allaha o qədər yaxınlaşdı ki, Allahın qələminin səsini eşitdi və anladı ki, Allah bəşəriyyətin əməllərinin hesabı ilə məşğuldur. Amma Allahın qələminin səsini eşitsə də, Onu görmürdü. Çünki kimsə Allahı görə bilməz, hətta Peyğəmbər də olmuş olsa!” Müəllifin bu lətifəni hansı mənbədən götürdüyü bizə mə’lum deyil. Əvvəla, Allahın məkanı yoxdur ki, Peyğəmbər (s) ona doğru tələsə. Me’rac Qur’an-məcidin bildirdiyi kimi, Allahın əzəmət ayələrinin müşahidəsi məqsədi ilə baş vermişdir. İkincisi, Allah bütün bəndələrinin əməllərindən xəbərdardır. Onun əməlləri tələsə-tələsə siyahıya alması hətta qələmin səsinin çıxması gülünc bir uydurmadır. Əgər əməlləri qeydə alan bir belə mələk varsa, Allahın bu işlə məşğul olmasının səbəbi nədir?! Üçüncüsü, kitabda Allah cisim kimi təqdim olunur. Bunu isə ən sadəlövh müsəlman belə qəbul edə bilməz. Əlbəttə ki, xarici yazarların İslam Peyğəmbərinin şəxsiyyəti və əzəməti haqqında yazması dəyərli bir işdir. Amma hər halda xarici yazıçı müsəlman aləminə həzrət Peyğəmbərin

həyatını öyrədə bilməz. Bunυnla belə qeyd etmək lazımdır ki, uyğun kitabın müsbət .cəhətləri də vardır

### ?Müsəlmanların savadsızlığının səbəbİ nədİr .۸

Sual: Həzrət Peyğəmbər xalqı ardıcıl şəkildə elm və biliyə də’vət etdiyi halda, savadsızlıqla mübarizə apardığı vəziyyətdə nə üçün müsəlmanlar bu qədər ?savadsızdırlar

Cavab: Nə qədər ki müsəlmanlar İslamın ali tə’limlərindən uzaq düşməmişdilər, İslam dünyasında elm və bilik ildırım sür’əti ilə yayılırdı. Misilsiz elm mərkəzləri, kitabxanalar deyilənlərin əyani sübutudur. Həmin vaxt kağız istehsalı və çap vasitələri olmadığı halda, təkcə Marağa kitabxanasında dörd yüz min cild, Bağdad kitabxanalarında isə dörd yüz milyon cild kitab vardı. Müsəlman ölkələrindəki kitabxanaları ən dəyərli elmi .kitablar bəzəyirdi

Qərb dünyasının istismar kölgəsi müsəlmanların başının üstünü alanadək müsəlmanlar arasında saysız-hesabsız savadlı insanlar vardı. Məsələn, Fransa istismarından qabaq .Əlcəzairin əksər sakinləri savadlı idilər

Son dövrlərdə bə’zi İslam başçılarının bir-birləri ilə çarpışması İslam mədəniyyətini daha da tənəzzülə uğratdı. Hal-hazırda əksər müsəlmanların ibtidai savadı da yoxdur. Amma ümid edirik ki, son dövrlərdə müsəlman dünyasında müşahidə edilən oyanış uyğun .sahədə də əhəmiyyətli dəyişikliklər yaradacaqdır

### ?Yaxşı adamlar namaz qılmalıdırlarmı .۹

Sual: Qur’anda qeyd olunur ki, namaz insanı çirkin işlərdən çəkindirir. Əgər bir şəxs pis ?iş görmürsə, onun namaz qılmasına nə ehtiyac var

Cavab: Namaz qəti və ümumi göstərişdir. Çirkin işləri tərk edib, yalnız saleh əməllərlə məşğul olan insan da bu vəzifədən azad edilməmişdir. Namaz hökmən qılınmalıdır. Namazın qılınmaması üçün yaxşı əməllər şərt sayılsaydı, çoxları min bir bəhanə ilə bu .ilahi, tərbiyəvi göstərişdən boyun qaçırardılar

Bundan əlavə, Allahın zikrindən ibarət olan bu ibadət heç nə ilə əvəz olunmur. Təcrübədən görünür ki, namaz qılmayan insanlar ən azı təmizlik məsələlərinə

əməl etmirlər. İnsan günahdan çəkinməklə kamala çata bilmir. İnsanı kamala çatdıran Allaha ibadətdir. Məhz ibadət insana iman tərbiyəsi verir, onun ruhunu kamala çatdırır. .Bütün hallarda bu dini vəzifəni yerinə yetirmək vacibdir

### ?İnsan mələkdən üstündürmü .١٠

Sual: Deyirik ki, insan yaranmışların əşrəfidir. Bu o demək deyilmi ki, insan Allahın xəlq ?etdiyi ən kamil varlıqdır, hətta mələkdən də üstündür

Cavab: İnsanlar və mələklər digər mövcudlar kimi Allahın məxluqlarıdır. Amma insanda mələkdə olmayan fövqəl'adə iste'dadlar vardır. Əgər insanda nəfs varsa, mələkdə nəfs yoxdur. Əgər heyvanda ağıl yoxdursa, mələkdə ağıl var. İnsanda isə həm nəfs vardır, həm ağıl. İnsan bu iki zidd qüvvəyə malik olduğundan məs'uliyyəti də ağırdır. Əgər insan ağlına itaət edib iman ardınca getsə, nəfsini boğsa, mələkdən uca olur. Yox əgər ağlını .ayaq altına alıb, nəfsinə itaət etsə, heyvandan da alçaq olur

Qur'an ayələrinə əsasən, Allah-təala Adəmi yaratdığı vaxt mələklərə əmr etdi ki, ona səcdə etsinlər. Adəmə öz bildiklərini mələklərə danışması əmr olundu. Bəli, Adəm .mələklərə müəllim qərar verildi

### ?Başqa planetlərdə həyat varmı .١١

Sual: Başqa planetlərdə canlı həyat vardırmı? Əgər yerdən kənarda həyat vardırsa, mədəniyyət də vardırmı? Yoxsa mədəniyyət yalnız yer kürəsindədir? İslam alimləri bu ?barədə nə deyir

Cavab: Varlıq aləmi o qədər geniş və əzəmətlidir ki, bu əzəmət qarşısında bütün alimlər heyrətdədirlər. Yalnız bizim qalaktikada yüz əlli milyard ulduz vardır. Onların bir çoxu bizim günəşə oxşayır. Varlıq aləminin genişliyini nəzərə aldıqda inanmaq olmur ki, həyat təkcə yer üzərindədir. Hər halda astronomların fikrincə, günəş sistemindəki digər planetlərdə həyat olması ehtimalı zəifdir. Hələ ki aparılan tədqiqatların nəticəsi həmin planetlərdə həyat olması fikrini təsdiqləmir. Amma bütün deyilənlər hələ ki fərziyyədir. Çünki biz günəş sisteminin digər planetlərindən birindən yerə doğru baxsaydıq, güman ki, yerdə həyat olmadığını zənn edərdik. Başqa planetdə olanlar bizim planet haqqında araşdırma aparsaydılar, öldürücü oksigenlə əhatə olunmuş yerdə həyat olmadığını

həmin bu oksigenlə tənəffüs almaq üçün tənzimlənmişdir! Yerdən başqa planetlərə göndərilən stansiyalar üç yüz kilometrdən şəkillər çəkirlər. Bu şəkillər əsasında qəti bir .söz demək çətindir

Məşhur dünya astronomlarının yazdığı "Biz dünyada tək deyilik" kitabında bildirilir ki, yerdən kənarda həyat mövcuddur. Hətta onların fikrincə, yerdən kənar həyat daha inkişaf etmiş səviyyədədir. Əgər təkcə bizim qalaktikada yüz əlli milyarda yaxın ulduz varsa, eləcə də, hər bir ulduz sisteminin öz planetləri olarsa, həmin sistemlərdə həyat olmadığını iddia etməyə heç bir əsasımız yoxdur. Hər halda bu işlə məşğul olan elmi .mərkəzlərdə tədqiqatlar davam etdirilir

Bu məsələyə münasibətdə İslamın mövqeyi aydındır. Qur'an və islami hədislər on dörd əsr bundan öncə uyğun sualları cavablandırmışlar. Həmin mövzuda danışmazdan qabaq :bir mühüm nöqtəni qeyd edək

Müvəhhid, allahpərəst bir fərdin nəzərində varlıq aləmi ilahi hikmətlə yaradılmışdır. Bütün varlıq aləmi hikmətlə yarandığı təqdirdə bu nəhayətsiz okeanın təkcə bir nöqtəsində həyat olması şübhə doğurur. Canlı həyatın yalnız yerdə olması ilahi hikmətlə bir araya sığmır. Qur'ani-məciddə səmadakı canlı varlıqlar yad edilərək, Allahın qüdrətinin vəsfində belə buyurulur: "Göyləri, yeri və orada canlıları yaradıb yayması Onun qüdrət nişanələrindəndir..."(١)Başqa bir ayədə oxuyuruq: "Göylərdə və yerdə olan bütün məxluqlardan elə biri yoxdur ki, Rəhmanın hüzuruna bir qul kimi gəlməsin."(٢) Bu kimi ayələrdən görünür ki, səmalarda canlı və düşüncəli varlıqlar mövcuddur. Onlar da Allah qarşısında vəzifəlidirlər və qiyamət günü Allahın hüzuruna toplanasıdırlar. Uyğun mövzuda bir rəvayət də nəql etməklə kifayətlənirik: Əmirəl-mö'minin (ə) ulduzlar (haqqında belə buyurur: "Bu ulduzlar yer üzərindəki şəhərlər kimi şəhərlərdir..."(٣

Şəhidlər ağası həzrət Hüseyn (ə) öz duasında belə deyir: "Pərvərdigara, kəlmələrinə, sözlərinə, hikmət ocaqlarına, səmalarına və yerinin sakinlərinə and verirəm!" Duanın mətnindən aydın şəkildə görünür ki, səmaların da sakinləri vardır. Bə'zi alilmlər səma .sakinlərinin mələklər olduğunu bildirsələr də, bu baxışın qəti bir dəlili yoxdur

۱- [۱۹۰] “Şura, ۲۹.

۲- [۱۹۱] “Məryəм”, ۹۳.

۳- [۱۹۲] “Səfinətul-bihar”, c. ۲, s. ۵۷۴.

### ?Özünü qorumalı olan İnsanın canından keçməsİ nəyə əsaslanır .۱۲

Sual: Qeyd olunur ki, insanın bütün fəaliyyətləri onun maddi və mə’nəvi mənafelərinin qorunmasına yönəlmişdir. Bu da yoxsullara yardım, yetimin başına sığal çəkmək kimi işlərdə də insanın mənafeyi olur. İnsan imkansızlara məhəbbət göstərməklə öz ruhunu iztirabdan qurtarır. Demək, insanı fəaliyyətə sövq edən mənafedir. Necə olur ki, maddi ?və mə’nəvi mənafelər uğrunda çarpışan insan fədakarlıq göstərib, canından keçir

İnsanın öz övladına məhəbbəti böyük fədakarlıq nümunəsidir. İnsan öz övladına xidmətdən ləzzət alır. Onunçün bu əziyyət çox şirindir. Məgər ananın bu sayaq ?nəvazişlərini fədakarlıq saymaq olarmı

:Cavab: Uyğun suala iki yolla cavab vermək olar

İsar və fədakarlıq odur ki, insan bir işi əvəzsiz görsün. Əlbəttə ki, söhbət maddi .۱ .mənafedən gedir

Məsələn, yoxsulların acınacaqlı halını müşahidə edib, əziyyət çəkən bir şəxs təsəvvür edin. O, yoxsullara kömək etməklə şadlanır. Əgər onun özünü göstərmək, şöhrət qazanmaq məqsədi yoxdursa, etdiyi əməllər isar adlanır. Gördüyü işlər onun vicdanını .rahatlaşdırsa da, ona heç bir qazanc vermədiyindən fədakarlıq sayılmalıdır

Başqa sözlə, hansı əməlin fədakarlıq və isar olduğunu müəyyənləşdirmək üçün bu işə sövq edən amillər nəzərə alınmalıdır. O əməllər isar və fədakarlıq sayılır ki, həmin işlər zamanı hesab-kitab aparılmasın, işi görən şəxs heç bir maddi mənafe güdməsin, kimsə .onu bu işə sövq etməsin, iş görən şəxs kimsədən “əhsən” gözləməsin

Amma hansısa şəkildə maddi mənafe, ad-san güdülürsə, fədakarlıq, isar saymaq olmaz. .Bu, sadəcə, bir alış-verişdir

Bə’zən iş elə bir həddə çatır ki, insan məşuqundan savay hər şeyi unudur. Belə .۲ məqamlarda hətta özünü də unudan insan, təbii ki, mənafeləri də yaddan çıxarır. Aşiq insan yalnız məhbubunun mənafelərini düşünür. Alış-veriş, ticarət, bank hesabı, bir sözlə, hər şey yaddan çıxır. İnsanda eşq elə bir həddə çata bilər ki, o, məhbuba xidməti dünyanın ən böyük ləzzəti sayar. Axı özünü unutmuş adam hansı mənafe barədə

düşünə bilər?! Belə aşiq üçün son mərhələ fəna mərhələsidir. Fəna mərhələsində artıq .insan öz varlığını unudur

Bir çox övliyalarımız Allahın hüzurunda belə bir hal tapmışlar. Onlar Allaha eşq .səbəbindən ona sitayiş etmiş, Onun yolunda isar və fədakarlıq göstərmişlər

Əmirəlmö'minin Əli (ə) buyurur: "Pərvərdigara! Mən sənə nə cəhənnəm qorxusundan, nə behişt tamahından ibadət edirəm. Sənə pərəstişimin səbəbi budur ki, səni ibadətimə layiq bilirəm." Bəli, öz mə'şuqu qarşısında Əli (ə) fəna olurdu. Və özünü elə bir həddə unudurdu ki, hətta ayağında qalmış oxun çıxarılmasını da hiss etmirdi. Belə bir insan Allaha ibadət edərkən heç bir fayda gözləyə bilməz. Çünki o yalnız Allahı görür, yalnız .Allah üçün çalışır

### ?Kamİl əxlaq sahİblərİnİn dİnə ehtİyacı varmı .۱۳

Sual: Bə'zi ölkələrdə ictimai münasibətlər çox gözəl şəkildə qurulmuşdur. Onlar bir-birlərinin haqlarını pozmur, ədalətə riayət edir, xoş davranırlar. Belə ölkələrdə dinin nə ?rolu var

Cavab:Şübhə yoxdur ki, əxlaq fəsadın qarşısını hansısa həddə ala bilər. Amma zahiri nizam cəmiyyətin islahı üçün kifayət edirmi? Şübhəsiz ki, yox! Əgər bəzi ölkələrdə bizim ölkələrimiz üçün xarakter olan fəsadlar aradan qaldırılmışdırsa, onların yerini daha təhlükəli ictimai fəsadlar tutmuşdur. Maskalanmış fitnə-fəsad cəmiyyətdə öz mənfi işini görür. Əgər bir vaxt oğurluq vardısa, indi qanqsterlik var. İndi oğrular həyətin barısından aşıb toyuq oğurlamır. Onlar texniki vasitələrlə silahlanıb böyük bankları yarırlar. Bu gün zahiri əxlaq normalarına riayət edən ölkələrdə qeyri-qanuni doğulmuş uşaqların sayı ildə iyirmi mini ötür. Əgər əxlaq dinin rolunu oynaya bilsəydi, bir bu qədər intihar, boşanma, terrorla rastlaşmazdıq. Bəzi alimlərin təbirincə, əxlaq imana istinad etdikdə cəmiyyətdə onun islahedici rolu güclənir. İmana istinad etməyən əxlaq etibarsız bir dəyərdir. Onu da qeyd edək ki, dünyanın sivil ölkələrində nəzərə çarpan əmin-.amanlığın səbəbi həmin ölkələrin vətəndaşlarının dini təlimlərə əməl etməsidir

Dini, əxlaqdan fərqləndirən əsaslı bir xüsusiyyət odur ki, əxlaq yalnız insanlar arasında münasibət yaradır, din isə eyni zamanda Allahla insan arasında münasibətləri

nizaмlayır. Bu isə insanın təkaмülü üçün çox ciddi bir şərtdir. Allah qarşısında məs’uliyyətlə мüşayiət

olunan ilahi əxlaqı yalnız dünyəvi səadət xatirinə olan əxlaqla müqayisə etməyə .dəyməz

İmanı əxlaqdan üstün edən xüsusiyyətlərlə daha yaxından tanış olmaq üçün zəngin .İslam ədəbiyyatından istifadə edə bilərsiniz

## ?Praqmatizm nə deməkdir .۱۴

?Sual: Praqmatizmin əsasları nədir, onların fəlsəfi baxışı nədən ibarətdir

Cavab: Praqmatizm məktəbinə mənsub olan alimlər hissi və əməli müddəalara əsaslanır və əqli müddəaları inkar edirlər. Bu cərəyanın nöqsanlı cəhətlərini aydınlaşdırmaq üçün :praqmatizmin bə’zi müddəalarını nəzərdən keçirək

Fəlsəfə konkret bir sahəni əhatə etmir və həqiqətin müəyyənləşdirilməsi ilə məşğul olur. Məsələn, “səbəb və nəticə” fəlsəfənin mövzularından biridir. Əgər cismin zahiri haqqında fizika, daxili haqqında kimya araşdırma aparırsa, “səbəb və nəticə” kimi :mövzular fəlsəfənin payına düşür. Fəlsəfi məsələlər iki qismə bölünür

Hiss üzvləri ilə duyulmayan, maddi elmi vasitələrlə təcrübədən keçirilməyən məsələlər. .۱ Bəli, müəyyən məsələlər vardır ki, onlar yalnız əqli araşdırmaların predmetidir. Bu .araşdırmalarla fəlsəfə məşğul olur

.Dəqiq elmlər vasitəsi ilə sübuta yetirilə bilən ümumi mövzular .۲

Praqmatizm məktəbinin əqidəsincə, hiss üzvləri vasitəsi ilə duyulmayan, təcrübədən keçirilə bilməyən məsələlər haqqında fikir yürütmək olmaz. Onlar bildirirlər ki, filosoflar min illər boyu mübahisələr aparsalar da, hansısa məsələdə vahid rə’y bildirməyiblər; filosoflar arasındakı ixtilaflar göstərir ki, uyğun məsələlər həll ediləsi deyil. On yeddinci .əsrdə bünövrəsi qoyulmuş bu nəzəriyyənin xülasə halda şərhini verdik

İlahiyyat alimləri praqmatistlərə qarşı çox iradlar bildirmişlər. İlahiyyat alimlərinin nəzərincə, sözdə yalnız hiss oluna bilən şeyləri qəbul edən praqmatistlər əməldə öz dediklərinə müxalif çıxırlar. Məsələn, onlar deyirlər ki, işıq sür’əti saniyədə üç yüz min kilometrdir. Hansı ki, bu mə’lumat təcrübə vasitəsi ilə əldə olunmamışdır. Bəs işıq sür’əti

necə müəyyən olunmuşdur? Alimlər işıq sür’əti ilə bağlı apardıqları araşdırmalarda bu sür’ətin sabit olması qənaətinə gəlmişdilər. Ümumi

araşdırmalar əsasında əqlə əsaslanaraq ümumi bir qanun təsdiqlənmişdir. Sual oluna bilər ki, bu qanun təkcə təcrübəninmi məhsuludur? Əlbəttə ki, uyğun qanunun kəşfində əqli araşdırmaların müstəsna rolu olmuşdur. Bu gün təbiətşünasların cəmiyyətə təqdim etdiyi qanunların əksəriyyəti hansısa həddə əqli araşdırmaların nəticəsidir. Məsələn, yerin torpaq qatları, bu qatların qalınlığı və tərkibi haqqında dəqiq mə'lumatlar verilir. !?Məgər bütün bunlar təcrübədə sübuta yetrilmişdirmi

Praqmatistlərin fikrincə, əgər bir məsələ ətrafında ixtilaf varsa və tərəflər əqli dəlillərə əsaslanırlarsa, bu məsələ həll olunası deyil. Hansı ki, hər bir ixtilaf həqiqətə doğru addımdır. Əgər iki alim hansısa elmi məsələ əsasında mübahisə edirsə, onların hər ikisini .haqsız saymaq olmaz

**?Yoqa məktəbİ nədİr .۱۵**

Sual: Hindistanda və dünyanın başqa məntəqələrində Yoqa məktəbinin çoxlu ?tərəfdarları var. Bu məktəbin baxışı nədən ibarətdir

Cavab: Yoqa məktəbi insanın qurtuluş yolunu yalnız ruhun təkamülündə görən sufilik tipli məktəbdir. Onlar öz məqsədlərinə çatmaq üçün üzücü pəhriz rejimlərindən istifadə .edir və inanırlar ki, bu yolla azğın nəfsi ram etmək olar

Yoqa məktəbinin ən böyük məqsədi ruhu dünyadan ayırmaq və onu Brəhmənə qovuşdurmaqdır. Onların nəzərincə, belə bir məqsədə yalnız tənha yaşamaq vasitəsi ilə .çatmaq olar. Yoqa fəlsəfəsində şirk və bütpərəstlik nişanələri vardır

Onların nəzərincə, maddi dünyanı yaradan Allah başqadır, nöqsansız ruhu yaradan .Allah isə tamam başqadır

Əlbəttə ki, nəfsin pəhrizlə tərbiyəsi (riyazət) təkcə Yoqa məktəbinə məxsus deyil. Hindistanda bu sayaq məktəblər çoxdur. Ona görə də Hindistanı mürtazlar (asketlər) .ölkəsi adlandırırlar

Şübhəsiz ki, bu sayaq ifratçı məktəbləri İslam rədd edir. İslam insanın qurtuluşunu dünyadan çəkinməkdə görmür. Dinimizdə dünyanı tərk etmək yox, dünyaya əsir olmamaq tapşırılır. Mə'nəvi kamilliyə çatmaq üçün dünyaya arxa çevirmək yox, nəfs

istəklərini cilovlamaq lazımdır. İslamda üzücü riyazətlər qəbul olunmur və qadağan edilir. Şirk qoxusu gələn ikiallahlılıq İslam tərəfindən qəti rədd edilir və yeganə Allah .aləmlərin Rəbbi kimi tanıtdırılır

## ?Elм canlı HÜCEYRƏ yaratмağa мüvəffəq olмuşdurмu .۱۶

Sual: Canlı varlıq aləмinin ən kiçik tərkibi olan hüceyrə, sözsüz ki, bir мö’cüzədir. Doğrudanмı, мüasir alimlər canlı hüceyrə yaratмağa мüvəffəq olмuşlar? Hüceyrə yaradıldıqdan sonra kaмil insan yaratмaq мüмkündürмü? Əgər alimlər belə bir ?мəqsədə nail olsalar, Allahın qüdrətinə xələl gəlməzмi

Cavab: Ciddi araşdırмalara baxмayaraq, hələ ki, həyat vahidinin, yə’ni hüceyrənin sirri açılмaмış qalır. Hüceyrənin yaranışının və xüsusiyyətlərinin aydınlaşdırılмası bir vəzifə olaraq qarşıya qoyulsa da, hələ ki hansısa мüvəffəqiyətdən danışмağa dəyмəz. Alimlərin ciddi sə’ylərinə baxмayaraq, canlı hüceyrə yarada bilмəмişlər. Aмма bu iş qeyri-мüмkün də hesab olunмur. Canlı hüceyrə yaradılacağı təqdirdə ana bətnindən kənarda insanın yaradılмası мəsələsi o qədər probleмdir ki, alimlər bu barədə danışмaqdan çəkinirlər. İnsan yaratмaq üçün sperмatozoid və ovul adlı iki hüceyrə sün’i şəkildə alınмalıdır. Aмма kaмil insan yaratмaq üçün selloldakı genlərin və xroмosoмların tə’yini çox zəruridir. İnsanın necəliyini мəhz selloldakı genlər və xroмosoмlar tə’yin edir. Hələ ki sperмatozoid və ovulun yaradılмası мüмkünsüz görünür. Sadə bir canlı hüceyrə yaratмaq мinlərlə fiziki və ruhi xüsusiyyətlərə мalik bir .varlıq yaratмaq deyil. Deмək, bu sahədə aparılan tədqiqatlar hələ ki, nəticəsizdir

Bir zaмan insan nütfəsinin sün’i şəkildə əldə ediləcəyini və ondan kaмil insan yaradılacağını güмan etsək, düşünмəмəliyik ki, bu iş Allahın qüdrətinə tə’sir göstərəcəkdir. “Həyat Allahın əlindədir” ifadəsi o deмəkdir ki, bütün мövcudlar Allahdan varlıq tapмışlar. Həyatın, bütün мaddi və qeyri-мaddi varlıqların yaranışının Allahın əlində olduğu gerçək bir həqiqətdir. Özündən мaddə yarada bilмəyən aliм, bu мaddəyə həyat da verə bilмəz. Harada həyat varsa, onun yaradıcısı Allahdır. Əgər bir gün alimlər canlı hüceyrə yaratмağa мüvəffəq olsalar, bilмəlidirlər ki, onlar bu hüceyrəni heçdən yaratмaмışlar. Alimlərin iste’dadı ilə yanaşı, təcrübədə olan bütün мaddələrin yaradıcısı Allahdır. Bir мisal çəkək. Əgər bir ölkədə xaricdən gətirilмiş avtoмobil hissələrindən avtoмobil yığılarsa, bu o deмək deyil ki, avtoмobil yığıldığı .ölkənin мəhsuludur. Belə bir avtoмobilin əsil istehsalçısı onun hissələrini hazırlayandır

## ?İnsanın İdrak və düşüncə mərkəzİ onun ürəyİdİrmİ .١٧

Sual: Qur’ani-kərimdə oxuyuruq: “Həqiqətən, gözlər kor olmaz, lakin sinədəki ürəklər kor olar....”(١) Bəli, ayədən göründüyü kimi, sinədə yerləşən ürək idrak və düşüncə mərkəzi kimi tanıtdırılır. Amma fizioloqlar uzun araşdırmalardan sonra belə bir nəticəyə gəlmişlər ki, insanın təfəkkür mərkəzi onun beynidir. Onların nəzərincə, ürəyin vəzifəsi ?orqanizmdə qan dövranını tə’min etməkdir. Həqiqət haradadır

Cavab: Bir çox alimlər, eləcə də fizioloqlar və psixoloqlar isbat etmişlər ki, insanın sinir sistemi və beyni bədənin digər üzvləri kimi xüsusi vəzifəyə malikdirlər. Bədən sinirləri beyin sinirləri ilə xüsusi bir əlaqəyə malikdir. Ona görə də bədən sinirləri xaricdən duyduğu tə’sirləri beyinə ötürür. Məsələn, əlimizi oda tutduqda dərhal bütün bədəndə bu tə’sir hiss olunur. Eləcə də, göz gördüyü mənzərələri xüsusi siqnallarla görmə .sinirlərinə ötürür. Beləcə görmə əməliyyatı gerçəkləşir

Fizioloqlar beyinin fəaliyyətləri haqqında deyirlər: “İnsan düşündüyü vaxt onun beyin hüceyrələri bir çox fəaliyyətlər yerinə yetirir. Beyin güclü qidalanır və fosfor xaric edir. Düşüncəyə xidmət edən sinirlərin hər birinin xüsusi fəaliyyəti vardır. Əksər alimlər belə bir nəticəyə gəlmişlər ki, düşüncə və şüur mərkəzi məhz beyin hüceyrələridir. Amma bu düzgün deyil. Aparılan təcrübələr yalnız bunu sübut edir ki, xarici amillərin insan idrakına tə’siri var. Uyğun fəaliyyətlərsiz insan düşünməyə, görməyə və eşitməyə qadir .deyil. Amma beyin maddəsinin dərk etdiyi, gördüyü və eşitdiyi sübuta yetirilməmişdir

Buna görə də dünyanın böyük alimləri bu fikirdədirlər ki, bədənin bu maddi mexanizmindən əlavə bir mexanizm də var. Orqanizmdəki mexanizm həmin mexanizmin öhdəsindədir. Gerçəklikləri dərk edən də odur. Pərdə arxasında olan bu qüvvəni əql, .ruh, qəlb adlandırmışlar

Gündəlik həyatımızda da əksər insanlar “qəlb” dedikdə həmin əql və ruhu başa düşürlər. “Qəlbimdə bir arzum var”, “sizi görməkdən qəlbim şad oldu”, “Qəlbimə gəldi ki” .kimi tə’birlərdə həmin pərdəarxası qüvvə nəzərdə tutulur

Şübhəsiz ki, qəlb dedikdə sinədə yerləşən ürək nəzərdə tutulmur. Qəlbin ən çox işlənən mə’nalarından biri ruhdur. Məhz bu ruh düşüncə və şüur mərkəzi

sayılır. (Azərbaycan dilində qəlb sırf pərdə arxası qüvvə mə’nasında başa düşülür, orqanizmdə qan dövranını tənzimləyən və sinədə yerləşən orqan isə ürək adlanır; ürək özü də iki mə’nada işlənir: Pərdəarxası qəlb mə’nasında və fizioloji orqan mə’nasında) Sinədə yerləşən ürək fizioloji bir orqandır və yuxarıdakı söhbətlərdən mə’lum oldu ki, insanın düşüncə və şüur mərkəzi pərdəarxası bir ürək və ya qəlbdir. Sinədəki ürəyin döyüntüləri insanın ümumi əhval-ruhiyyəsini göstərir. İstənilən bir hadisə ilk növbədə .ürəyə tə’sir edir

Qur’ani-məciddə xalq dilində danışılır. Ayədəki “ürək” kəlməsi həmin pərdəarxası ürək :və ya qəlb, ağıl, ruhdur. Bə’zi Qur’an ayələrinə nəzər salaq

Qur’ani-məcid qiyamət günü haqqında danışarkən buyurur: “Onlar düşüncə sahibləri .١ üçün bir xatırlatmadır.”(١)Mə’lum olur ki, Qur’ani-məcid qiyamət səhnəsini insanlar üçün düşüncə vasitəsi kimi qərar vermişdir. Əgər biz sinədəki fizioloji orqan olan ürəyi nəzərdə tutsaq, ayədəki mə’nalar özünü doğrultmaz. Çünki bu güc hamıda var. Demək, .məqsəd ağıl və düşüncə gücüdür

Qur’ani-kərim qəlbi (ürəyi) bir sıra xüsusiyyətlərin və ruhiyyələrin mərkəzi kimi .٢ tanıtdırır. Əlbəttə ki, maddi ürək nəzərdə tutulmur. Bu sifətlər insanın ruhuna aid olan sifətlərdir. Məsələn, bir şəxs haqqında “Onun qəlbi daşdır” və ya “Onun qəlbi xəstədir” deyirlər. Əlbəttə ki, söhbət sinədəki orqandan getmir. Qur’an ürəyi (qəlbi) paklıq, iman, (küfr, səadət mərkəzi kimi tanıyır.(٢

Şübhəsiz ki, bu kimi sifətlər və hallar ruha aiddir. Yuxarıda deyilənlərdən mə’lum olur ki, .nəzərdə tutulan məhz ruhdur. Xalq arasında isə ona həm qəlb, həm də ürək deyirlər

Qur’anda zikr olunmuş ayənin mə’nası aydın oldu. Yə’ni Qur’an “sinədəki qəlb” ifadəsini işlətsə də, bu tə’birlə ruh və əqlə işarə edir. Belə bir tə’birin səbəbi sinədəki ürəyin ruhla möhkəm bağlı olmasıdır. Doğrudan da, ruhun əksər halları, ölüm və həyat ürəkdə .öz əksini tapır

Qur’anda təkcə ürək sözü yox, sinə sözü də ağıl və ruh mə’nasında işlədilir. Bir ayədə belə oxuyuruq: “Sənin sinəni genişləndirmədikmi?!”(٣) Başqa bir ayədə isə belə oxuyuruq: “Allah hidayət etmək istədiyi şəxsin sinəsini İslamın qəbulu üçün

genişləndirər.”(۴) Mə’lum məsələdir ki, İslamı qəbul etməklə insanın sinəsi genişlənmir. Mə’lum olur ki, sinə tə’biri də insanın ruhuna işarədir. Bir çox ruhi hallar



---

۱- [۱۹۴] “Qaf”, ۳۷.

۲- [۱۹۵] “Bəqərə”, ۷.

۳- [۱۹۶] “İnşirah”, ۱.

۴- [۱۹۷] “Ənfal”, ۱۲۵.

ürəkdə təzahür etdiyindən, ürək məhz sinədə yerləşdiyindən bu bənzəmələrdən .istifadə olunmuşdur

**?Nə üçün Məkkənİ "Ümmül–Qura" adlandırırlar .١٨**

Sual: Təfsirlərdə və digər mənbələrdə bildirilir ki, ilk dəfə "Ümmül-qura" (Məkkə məntəqəsi) adlanan yer yaradılmışdır. Yer günəşdən ayrılmış planetdirsə, uyğun ?mə'lumatı məntiqi saymaq olarmı

Cavab: Alimlər bildirirlər ki, yer kürəsi günəşdən qopub ayrıldıqdan sonra əvvəlcə soyudu, sonra isə onu sel-sular bürüdü. Yer üzünü basmış su azaldıqca suyun üzərində quru torpaqlar görünməyə başladı. Olsun ki, uyğun yer sair məntəqələrdən qabaq görünmüş torpaq ərazilərindəndir. Buna görə də həmin baxış yerin günəşdən ayrılmış .bir planet olması fikri ilə zidd deyil

**?Nə üçün dİnİ günlər eynİ fəsİlə təsadüf etmİr .١٩**

Sual: Həzrət Əli (ə) mübarək ramazan ayının ١٩-cu günü zərbəyə mə'ruz qaldı. Bildiyimiz kimi, qəməri il şəmsi ildən təqribən on bir gün qısadır. Uyğun tarix bə'zən qışa, bə'zən isə yaya düşür. Belə çıxır ki, qəməri təqvim düzgün deyil. Əksər dini bayramlar və əlamətdar günlər də gah ilin bir fəslinə düşür, gah da başqa bir fəslinə. Bütün bunları ?nəzərə alaraq, qəməri tarixi dəqiq tarix hesab etmək olarmı

Cavab: Əslində il və ay ictimai işləri nizama salmaq üçün bir vasitədir. Yaradılmış təqvimin təbii əsasları olsun deyə, onları səma cisimlərinin hərəkəti ilə nizamlamışlar. Əgər il və ay yerin günəş ətrafındakı dövrü əsasında hesablanarsa, belə təqvim günəş təqvimi (şəmsi təqvim) adlanar. Bə'zən isə təqvimin nizamlanmasında ayın yer ətrafındakı hərəkəti əsas götürülür. Belə təqvim ay təqvimi (qəməri təqvim) adlanır. Günəş təqvimi yerin günəş ətrafında hərəkəti ilə ölçüldüyündən bu təqvimdə dörd fəsil mövcuddur. Ay təqvimində isə təbii ki, fəsillər nəzərə alına bilməz. Hər hansı təqvimin tənzimlənməsində məqsəd hadisənin baş verdiyi vaxtı bilməkdir. Hadisənin hansı fəsildə baş verməsi isə başqa məsələdir. İslam tarixi bütünlüklə qəməri təqvim əsasında qeydə alınmışdır. Ay təqvimi dini xarakterə malik olduğundan bizim üçün günəş təqvimindən daha möhtərəm .sayılır

Bəs ay təqviminin günəş təqvimindən hansı üstünlükləri var? Ay təqvimi ilə tarixin müəyyənləşdirilməsi olduqca sadədir. Belə ki, səhrada yaşayan bir insan da qəməri tarixi ilə vaxtı müəyyənləşdirə bilər. Amma günəş təqvimi ilə hesabat üçün hökmən .təqvim lazımdır

Aya baxdıqda onun neçə gecəlik olduğunu təqribən müəyyənləşdirmək olur. Əgər ay bədr formasındadırsa, deməli ayın ortasıdır. Qəməri təqvimlə ay sona yetdikcə dairəvi formalı, bədrlənmiş ay nazilməyə başlayır. Ayın son günlərində nazilmiş ay itir və yeni nazilmiş ay göründükdə təzə ay başlayır. Amma təqvim olmadan günəş təqvimi ilə vaxtı müəyyənləşdirmək mümkünsüzdür. Yalnız astronomik hesablamalarla günəş təqviminə .uyğun vaxtı tapmaq olar

Ay təqvimi isə sanki səmadan asılmışdır. Ay

təqviminin ayları fəsillərə bölünmürsə də, bir çox üstünlükləri var. (Ay təqviminin üstünlüklərindən biri də budur ki, dini bayramlar bütün fəsilləri gəzir. Əslində bu özü də bir gözəllikdir. Yə’ni insan ömrü boyu həm yazda, həm yayda, həm payızda, həm də qışda oruc tutur.)

### ۲۰. “Nüdbə” duası hansı mənbədəndİr?

Sual: Bu gün şiə müsəlmanlar arasında geniş yayılmış “Nüdbə” duasının e’tibarlı bir mənbəsi varmı?

Cavab: “Nüdbə” duası mö’təbər sənədə malik, ali, fəsih, dəyərli, könül oxşayan bir duadır. Əgər bu duanı oxuyan şəxs kamil agahlığa malik olarsa, onun oxuduğu dua cəmiyyəti islaha sövq edər, zülmlə mübarizəyə qaldırar.

Amma bə’zilərinin bu duaya qarşı mənfi münasibətini anlamaq olmur. Bə’zən onun mətninə, bə’zən də onun mənbələrinə hücum edilir. Hansı ki, onun nə məzmununda bir nöqsan var, nə də sənədi e’tibarsızdır. Bu dua daha çox keysaniyyə əqidəsinə oxşarlığına görə tənqid olunmuşdur. Əvvəlcə ən əsas iradlardan birinə cavab veririk:

Bə’ziləri duanı “Onun ruhunu səmalara apardın” cümləsini şiə əqidəsinə uyğun saymırlar. Bildirirlər ki, me’rac təkcə ruha aid deyil. Amma duanın mətninə diqqətlə nəzər salsaq, uyğun irad yersiz görünər. Duanın ən ilkin mənbələrindən biri Məhəmməd ibn Cə’fər əl Məşhədinin “Məzare-kəbir” kitabıdır. Bu alim altıncı əsr

alimlərindəndir. Onun kitabında duanın uyğun cümləsi belə ifadə olunmuşdur: “Onu .səmalara me’raca apardın.” Həmin mətndə ruh sözü işlədilməmişdir

Duanın ikinci qədim nüsxəsi “Məzare-qədim” kitabındadır. Bu kitabın da müəllifi altıncı əsrdə yaşamışdır. Həmin kitabda da uyğun cümlə “Onu göylərə me’raca apardın” kimi .işlənmişdir

Yalnız Seyyid ibn Tavusun “Misbahuz-zair” kitabında “ruh” sözü işlədilmişdir. Demək, .duanın ilk üç mənbəsindən (sənədindən) ikisində ruh kəlməsi işlədilməmişdir

Üçüncü mətnin də müxtəlif nüsxələri vardır. Bugünkü dua kitabları da həmin mənbədən götürüldüyündən uyğun cümlədə ruh kəlməsi işlədilmişdir. Duanın ilk mənbələrində isə .ruh kəlməsi yoxdur

Yuxarıda qeyd edildiyi kimi, dua üç məşhur kitabda verilmişdir: ١. Altıncı əsrin məşhur mühəddisi Məhəmməd ibn Cə’fər əl Məşhədinin “Məzare-kəbir” kitabı; ٢. “Ehticac” kitabının müəllifi mərhum Təbərsinin “Məzare-qədim” kitabı; ٣. Seyyid Rəziyyəddin ibn .Tavusun “Misbahuz-zair” kitabı

Mərhum Əllamə Məclisi də “Biharul-ənvar” kitabının iyirmi ikinci cildinin ٢۶٢-ci səhifəsində həmin duanı nəql etmişdir. Hər üç kitabda dua Məhəmməd ibn Əliyy ibn Yə’qub ibn İshaq ibn Əbi Qurzədən və Məhəmməd ibn Hüseyn ibn Süfyan əl Bəzəvfərdən nəql olunmuşdur. İkinci şəxs əsrin imamının kiçik qeybəti dövründə yaşamış və adətən, imamın naibləri vasitəsi ilə onunla təmasda olmuşdur. Müəllif bildirir .ki, bu duanın oxunmasının həzrət Mehdi (ə) göstəriş vermişdir

Duanı ilk dəfə nəql edən bu iki şəxs dövrünün mö’təbər alimlərindəndir. Məhəmməd ibn Hüseyn ibn Süfyan Bəzəvfəri şeyx Müfidin ustadlarındandır. Şeyx Müfid bu ustadı daim xoşluqla yad etmişdir. “Əz-zariə” kitabının müəllifi “Nüdbə” duasının Məhəmməd ibn Hüseyn Bəzəvfərinin kitabında verildiyini bildirir. Bəli, duanın mənbələri e’tibarlıdır. Uyğun dua hansısa az tanınmış şəxs tərəfindən nəql edilməmişdir. Əgər onun sənədləri mö’təbər olmasa belə, vacib olmayan işlərin sənədinin araşdırılması zəruri deyil. Ona görə də uyğun duanın mənbələrinə bu qədər ciddi yanaşmağa dəyməz. Ciddi dəlillərə əsasən İslam alimləri müstəhəb işlərin və duaların mənbələrini son nöqtəyədək

araşdırмırlar. Əgər uyğun мəsələ мəşhur bir kitabda nəql olunмuşdursa, bununla .qənaətlənirlər

Bizim əlimizdə olan ən məşhur duaların da çoxunun yalnız bir mənbəsi vardır. Bu sahədə .ciddi araşdırma aparanlar İslam fiqhinin uyğun qaydasından xəbərsizdirlər

Uyğun duaya barışmaz münasibətlə yanaşan müəllif bildirir ki, hər kəs həmin duanın mənbəsini tapsa, onu on min tümən pulla mükafatlandıracaq. Müəllifin nəzərinə çatdırırıq ki, bu yazıları oxuduqdan sonra və'd etdiyi məbləğin heç olmaya onda birini .yoxsullara paylasın ki, gələcəkdə uyğun məsələyə qayıtmasın

**?İstixarə nədir .٢١**

Sual: Necə ola bilər ki, insan öz taleyini istixarəyə həvalə edə? Ağıl və düşüncəni ?kənara qoyub, təsbeh dənələrinə inanmaq nə dərəcədə düzgündür

Cavab: Əvvəla, istixarənin lüğət mə'nası Allahdan xeyir istəməkdir. Bütün varlıq aləmi hakimiyyəti altında olan, bütün mövcudların taleyini müəyyənləşdirən Allah Öz .bəndəsini yaxşılığa yönəldə bilər

İstixarə odur ki, insan bir işi görmək istədiyi vaxt son dərəcə diqqətlə görəcəyi işi götür-qoy etsin və səmimi qəlbdən Allahdan xeyirli yol istəsin. Yə'ni insan böyük bir iş görmək istədiyi vaxt həmin işin nəticəsi aydın olmursa, belə vaxtlarda Allahdan yardım diləməlidir. Bu sayaq Allahdan xeyir istənilməsi mö'təbər rəvayətlərdə təsdiqlənmiş bir işdir. Belə bir istixarədə nə Qur'ana, nə də təsbehə ehtiyac var. İnsan daxili bir diqqətlə .hər gün bu işi dəfələrlə görə bilər

Rəvayətdə oxuyuruq: "Allah-təala ondan xeyir istəyən bütün bəndələrinə bu xeyiri yetirir." İstixarə o demək deyil ki, insan istixarə vasitəsi ilə şübhəli vəziyyətdən qurtarsın. Əksinə, düşünülmüş bir işi gördükdən sonra Allahdan xeyir istənilməsi əsil istixarədir. Allahın yardımına səmimi qəlbdən ümid edən insan bir çox problemləri .asanlıqla həll edə bilir

İkincisi, bu gün xalq arasında başqa bir istixarə məşhurdur. Amma taleyini istixarəyə :tapşıran adam aşağıdakı şərtləri nəzərə almalıdır

Ağıl və düşüncənin yardımı: Allah-təala insanlara ağıl və düşüncə kimi bir ne'mət . ١ vermişdir. Ağıl bir çox hallarda xeyir və ziyanı tə'yin edə bilir. Belə hallarda təsbeh və ya

.Qur’anla istixarə etmək düzgün deyil

Mə’lumatlı adamlarla məsləhət: İslam dini məsləhət-məşvərət məsələsinə böyük . ۲ əhəmiyyət vermişdir. Məsləhət iman əlamətlərindən

sayılır. Qur’ani-məcid buyurur: “İşlərini öz aralarında məsləhət-məşvərətlə görərlər…”(١)Allah-təala Öz Peyğəmbərinə göstəriş verir ki, mühüm işlərdə yaxın adamları ilə məsləhətləşsin.(٢) Əgər insan çətinlik çəkdiyi sahədə mütəxəssislərlə .məsləhətləşərsə, istixarəyə ehtiyac qalmaz

Amma əgər bir məsələni ağıl və məsləhət yolu ilə həll etmək mümkün deyilsə, tərəddüddə olan insan öz narahatçılığını istixarə yolu ilə aradan qaldıra bilər. Qur’an və təsbehlə istixarənin ən böyük əhəmiyyəti insanın narahatlıqdan çıxmasıdır. Belə bir istixarədə insan Qur’an və ya təsbeh yolu ilə Allahın ona xeyir yolunu göstərməsini istəyir. Artıq bütün qapılar üzünə bağlanmış insan səmimi qəlbdən məsləhətli yolun göstərilməsini Allahdan diləyir. Əgər bu iş ciddi diqqət və ixlasla görülərsə, tə’sirli olar. Allahın bu yolla .insana xeyir yolu göstərməsinin heç bir maneəsi yoxdur

Təbii ki, istixarə etməyən adam da qarşısındakı iki yoldan birini seçməlidir. Bu sayaq tərəddüdlü hallarda insan səmimi qəlbdən Allaha üz tutaraq istixarə vasitəsi ilə ən .xeyirli yolu tə’yin edə bilər

### ?Ay təqvimindəki (qəməri) aylar nə üçün bİr–birindən fərqlidir .٢٢

Sual: Bilirik ki, yer günəşin, ay isə yerin ətrafında fırlanır. Nə üçün ay təqviminin bə’zi ?ayları iyirmi doqquz, bə’zi ayları isə otuz gündür

Cavab: Ay yer ətrafında iyirmi doqquz gün, on iki saat, qırx dörd dəqiqə və üç saniyə ərzində dövr edir. Yə’ni, ayın yer ətrafında dövr müddəti otuz gündən azdır. Ona görə də bə’zi aylar iyirmi doqquz, bə’zi aylar isə otuz gün götürülmüşdür. Bir növ iyirmi doqquz gündən artıq qalan hissə, yə’ni on iki saat qırx dörd dəqiqə və üç saniyə müəyən günlər arasında bölünmüşdür. Ona görə də qəməri təqvimdə bə’zi aylar otuz .gün davam edir

### ?İki qəməri ay ardıcıl şəkİldə otuz gün ola bilərmİ .٢٣

Sual: Əvvəlki sualdan mə’lum oldu ki, qəməri təqvimi bir ay iyirmi doqquz, o biri ay isə otuz gün olur. Belə bir sual yaranır ki, ardıcıl olaraq iki ay hərəsi iyirmi doqquz gün çəkə bilərmi? Çünki bir aydan artıq qalan müddət daim növbəti aya artırıldığından növbəti ay otuz gün olmalıdır. Hansı ki, bə’zən iki ay ardıcıl olaraq iyirmi doqquz gün çəkir. Bundan

əlavə, əgər iki qəməri ay ardıcıl otuz gün çəkərsə, üçüncü ay otuz gün ola bilməz. Din kitablarında bildirilir ki, ramazan ayının tə’yinində başqa yollarla bu işi görmək olmursa, ?həmin ay otuz gün hesablanmalıdır. Belə bir hesabat düzgündürmü

Cavab: Bilirik ki, hər bir qəməri ay ayın yer ətrafında bir dövrəsindən yaranır. Astronomlar hər bir günü tam saatla bildirməyə məcburdurlar. Tarix qeyd olunarkən bir gündə baş vermiş hadisəni bir ayın sonu, gələn ayın əvvəli üçün qeyd etmək olmaz. Buna görə də qəməri ayın günləri ya iyirmi doqquz, ya da otuz gün hesablanmalıdır. .Astronomlar iki növ qəməri ay müəyyənləşdirmişlər: ١. Hesabi ay; ٢. Hilali ay

Qəməri ay iyirmi doqquz gündən on iki saat qırx dörd dəqiqə və üç saniyə artıq olduğundan ilin ilk ayı olan məhərrəm ayını otuz gün götürürlər. Eləcə üçüncü, beşinci, yeddinci, doqquzuncu və on birinci aylar da otuz gün hesablanır. Cüt aylar isə iyirmi .doqquz gün müəyyənləşdirilmişdir. Bu sayaq aylar hesabi aylar adlanır

Belə bir təqvimdə heç vaxt iki ay ardıcıl otuz gün və ya iyirmi doqquz gün olmur. Hilali ay isə ayın gözlə görünməsi ilə tə’yin olunur. İslam hökmləri də məhz bu təqvim üzrə yerinə ?yetirilir. Sual oluna bilər ki, fəqihlər nə üçün hesabi ayı mö’təbər saymırlar

Rəvayətlərdə buyurulur: “Ayın görünməsi ilə oruc tutun və ayın görünməsi ilə iftar edin.” Hilali ayda ay ayın görünməsi ilə başlayır və gözdən itməsi ilə başa çatır. Hilali .aylar gün sayı ilə hesablanmır

Belə də ola bilər ki, dörd ay ardıcıl otuz gün, üç ay ardıcıl iyirmi doqquz gün olsun. Bu .fərq ayın bə’zi mövqeləri ilə bağlı yaranır

### ?Aşura hansı gündür .٢۴

Sual: Kərbəla hadisəsi ilin hansı fəslində və şəmsi (günəş) təqvimlə hansı gündə baş ?vermişdir

Cavab:Təqvimlərdən məlum olur ki, hicri-qəməri min üç yüz doxsanıncı ildə aşura günü hicri-şəmsi təqvimlə min üç yüz qırx səkkizinci il, isfənd ayının iyirmi yeddisinə təsadüf etmişdir. Bildiyimiz kimi, qanlı Kərbəla hadisəsi hicri-qəməri altmış birinci ildə baş vermişdir. Şəmsi il üç yüz altmış beş, qəməri il isə üç yüz əlli dörd gündən ibarətdir. Bu iki

il arasında təqribən on gün fərq vardır. Bu fərqi nəzərə alsaq, hicri qəмəri altмış birinci .ilin aşura günü təqribən мehr ayının iyirмisinə düşür

səh:۲۷۶

## ?KUTUBE–ƏRBƏƏNİN" MÜƏLLİFLƏRİ KİMLƏRDİR" .٢٥

Sual: Dini mənbələrdə xəbər verilir ki, şiələrin dörd mö'təbər kitabı ("Kutube-ərbəə") mövcuddur. Əsrlər boyu İslam alimləri hökmlər verərkən bu dörd kitaba əsaslanmışlar. ?Bu kitabların müəllifləri kimlərdir

Cavab: Həzrət Peyğəmbər (s) dünyasını dəyişdikdən sonra Əli (ə) və onun şiələri həzrətin yolunu davam etdirərək həzrət Peyğəmbər (s) və onun canişinlərinin buyuruqlarını toplamağa başladılar. Uzun müddət hədisləri qeydə almamış sünnilərdən fərqli olaraq, şiələr iki yüz əlli il ərzində müxtəlif İslam elmləri haqqında çoxsaylı kitablar yazdılar. Əksər islamşünaslar təsdiq edirlər ki, İslam elmlərinin banisi şiələr olmuşdur. Bu kitabların adları ilə tanış olmaq üçün nəfis "Əz-zəriə" kitabına müraciət etməyiniz .yaxşıdır

Yalnız imam Sadiq (ə) dörd min şagird tərbiyə etmişdir ki, bu şagirdlər tərəfindən dörd yüzə yaxın kitab yazılmışdır. İmam Sadiqin (ə) atası imam Baqir (ə) olduqca keşməkeşli bir dövrdə ləyaqətli şagirdlər tərbiyə etmişdir. Bu işi digər mə'sum imamlar da davam .etdirmişlər

Əhli-beytin dəyərli buyuruqları toplanmış bu kitablar şiə alimləri tərəfindən çoxaldılmış və hədis dərslərində tədris olunmuşdur. Bu kitablar hazırda İranın və Bağdadın böyük .kitabxanalarında saxlanır

.İndi isə həmin dörd kitabın müəllifləri ilə tanış olaq

(.Kuleyni (٣٢٨ h.q .١

Əsrin imamının kiçik qeybət dövründə qiymətli kitablar tərtib etmiş ilk böyük alim mərhum Məhəmməd ibn Yə'qub Kuleyni Razi olmuşdur. O imam Həsən Əskərinin (ə) dövründə dünyaya göz açmışdır. Kiçik qeybətin son illərində dünyasını dəyişmişdir. (٣٢٨-ci il) Ondan yadigar qalmış kitab "Kafi" kitabıdır. Kitab Qur'an və "Nəhcül-bəlağə"dən sonra ən mühüm şiə kitablarından sayılır. Müəllif bu kitabın tərtibi üçün xeyli əziyyət çəkmiş, uzunmüddətli səfərlərdə olmuşdur. Kitabda yüz altmış altı min yüz doxsan doqquz hədis toplanmışdır. Kitab iki hissəyə bölünür. Kitabın bir hissəsi əqidə, digər bir hissəsi isə əməli hökmlərə həsr olunmuşdur. Kitabın əqidə ilə bağlı hissəsində Əhli-beyt maarifi

geniş şəkildə nəzərə çatdırılır. İslamın əqidə əsasları imamların dili ilə ətraflı şəkildə açıqlanılır. Mərhum Kuleyni bu kitabı bə’zi şiələrin istəyinə

cavab olaraq yazmışdı. Nəqqaşinin bildirdiyinə görə, Kuleyni bu kitabı iyirmi il müddətinə .yazmışdır

Kuleyninin bundan başqa da kitabları vardır. Təəssüf ki, həmin kitablar günümüzə gəlib .çatmamışdır

(.Şeyx Səduq (۳۰۶-۳۸۰ h.q .۲

Kuleynidən sonra ikinci böyük şəxsiyyət şeyx Səduq kimi tanınmış mərhum Məhəmməd ibn Babəveyhdir. Bu müəllifdən olduqca dəyərli əsərlər qalmışdır. Dörd mühüm kitablardan ikincisi şeyx Səduqun "Mənla yəhzurul-fəqih" kitabıdır. Bu kitabda şeyx Səduqun e'tibarlı saydığı hədislər toplanmışdır. Kitabda beş min doqquz yüz altmış üç .hədis toplanmışdır. Şiə alimləri üçün ikinci e'tibarlı hədis kitabı bu kitabdır

( Şeyx Tusi (üç yüz həştad beş-dörd yüz altmış .۳

qədim Nəcəf təhsil ocağının bünövrəsini məhs bu alim qoymuşdur. Tus şəhərində doğulmuş bu şəxs təhsilini davam etdirmək üçün dörd yüz səkkizinci ildə Bağdada yola düşmüşdür. O, mərhum şeyx Müfid, Seyyid Mürtəza ələmül-huda kimi alimlərdən təhsil almışdır. Mərhum Seyyid Mürtəza dünyasını dəyişdikdən sonra şiə mərceyyəti (elmi rəyasəti) şeyx Tusiyə çatmışdır. Əbbasi xəlifəsi İslamla bütün düşmənçiliklərinə baxmayaraq, şeyx Tusiyə xüsusi hörmət göstərmiş, onu "Əlqaimu be əmrillah" adlandırmışdır. Şeyx Tusi İslam alimləri arasında misilsiz bir mövqe qazanmışdır. Ondan qiymətli təfsir, kəlam, fiqh, üsul, hədis kitabları qalmışdır. Alimin dərin düşüncəsi, geniş mə'luматı təkcə "Ət-tibyan" təfsirindən mə'lumdur. Şeyx öz "Təhzibul-əhkam" kitabını şagirdlərinin xahişi əsasında yazmışdır. Uyğun kitab Şeyx Müfidin risaləsinin izahıdır. Dörd kitabdan biri də məhz bu kitabdır. Şeyx bu kitabında mərhum Kuleyni və Səduqun .toplaya bilmədiyi hədisləri toplamışdır. Kitabda on üç min beş yüz doxsan hədis var

Kutube-ərbəə"nin dördüncü kitabı da Şeyx Tusiyə məxsusdur. O bu kitabında bütün " mövcud şübhələri və ixtilafları aradan götürməyə çalışmışdır. Kitabda altı min beş yüz .otuz bir hədis toplanmışdır

## ?Allahdan qorxmaq nə deməkdİr .۲۶

Sual: Allah мərhəмətli olduğu halda nə üçün Qur’an və hədislərdə Allah qorxusu ?tövsiyyə olunur? Mehriban və bağışlayan Allahdan qorxмağın nə мə’nası var

səh:۲۷۸

Cavab: Bilməliyik ki, müsbət qorxu insana əhatə olunmuş ilahi ne’mətlərdən biridir. İnsanda müdafiə hissini yaradan da qorxudur. Əgər insan təhlükəli məqamlarda qorxmasaydı, məsələn, yırtıcı heyvanlardan, uçmaqda olan evdən, təhlükəli xəstəliklərdən qorunmasaydı, qısa zamanda boş yerə məhv olub gedərdi. İnsan məhz bu qorxu hissi səbəbindən yoluxucu xəstəliklərdən çəkinir, uçurum qarşısında ehtiyatlı olur, təhlükəli hücumlardan özünü müdafiə edir. Əgər insanda təhlükə qorxusu olmasaydı, çoxlarının aqibəti ölümlə nəticələnərdi. Amma söhbətimizin mövzusu məntiqi və ağrılı bir qorxudur. Əsassız, məntiqsiz qorxu pislənilir və belə qorxu “cübn” adlandırılır. Cübn insanı inkişafdan saxlayır, onu bir çox ne’mətlərdən məhrum edir. Yersiz qorxu odur ki, insan heç bir dəlil olmadan qorxuya düşsün. Cihad meydanında .qorxub qaçmaq, əlbəttə ki, məzəmmət olunası bir işdir

Qur’ani-məcid buyurur: “Allahın məqamından qorxub, nəfsini cilovlayan kəsin yeri hökmən behiştdir.”(۱)Ayədə “Allahdan qorxu” əvəzinə “Allahın məqamından qorxu” ifadəsi işlədilmişdir. Bəs Allahın məqamından qorxmaq nə deməkdir? Allahın məqamından qorxu dedikdə Onun ədalət və mühakiməsi nəzərdə tutulur. Bəs Allahın ədaləti kimin üçün qorxuludur? Başqasının haqqına təcavüz etməyən çox insanlar üçün Allah ədalətindən qorxu yoxdur. Amma əməl naməsi qara olanlar, başqalarının haqqına təcavüz edənlər, fitnə-fəsad girdabına yuvarlananlar təbii olaraq Allahın ədalətindən qorxurlar. Çünki ilahi ədalət əsasında bu insanlar öz əməllərinin cəzasına ?məhkumdurlar. Allahın qəzəbinə düçar olmaq qorxulu deyilmi

Deyilənlərdən mə’lum olur ki, Allahın ədalətindən qorxu insanın öz günahlarından, .günahlarının cəzasına çatmasından qorxudur

Əmirəl-mö’minin (ə) öz buyruqlarından birində bu məsələyə belə işarə edir: “Yaxşı olar (ki, hər bir fərd yalnız öz nalayiq əməlindən qorxsun.”(۲

Sual oluna bilər ki, əgər Allah qorxusu insanın öz günahından qorxudursa, nə üçün mə’sum imamlar və övliyalar da Allahdan qorxmuşlar? Təbii ki, mə’sum imamların və övliyaların günahı olmamışdır. Onların qorxduğu şey “tərke-ovladır”. Tərke-ovla dedikdə yaxşı işlərin tərk olunması nəzərdə tutulur. Elə işlər var ki, bu günah sayılmadığı halda Allah dostları üçün qəbahətdir. Övliyalara qarşı tələblər adi insanlara

qarşı tələblərdən fərqlənir. Adi bir insan üçün halal olan bir iş övliyalar üçün büdrəmə .sayıla bilər

səh:۲۷۹

---

.Naziat”, ۴۰-۴۱“[۲۰۰] -۱

.Nəhcül-bəlağə”, k. ۸۲“[۲۰۱] -۲

## Niyyət və əməl .۲۸

Sual: Həzrət Peyğəmbər (s) buyurur: “İmanlı insanın niyyəti onun əməlindən üstündür. Kafirlərin niyyəti onların pis əməllərindən də pisdir.” Axı necə ola bilər ki, bir insanın ?niyyəti onun əməlindən üstün və ya alçaq olsun

Cavab: Yuxarıda qeyd olunan hədis İslamın məşhur hədislərindəndir. Bu hədisi həm (sünni, həm də şiə alimləri nəql etmişlər.(۱

Uyğun hədis ayrı-ayrı alimlər tərəfindən müxtəlif cür təfsir olunmuşdur. Biz bu təfsirlər :içində daha münasib saydığımız təfsiri nəzərinizə çatdırırıq

Mö’minin niyyəti və himməti onun əməlindən daim üstündür. Mö’min şəxs nəzərdə tutduğu xeyir əməlin onda bir hissəsini görmüş olsa da, xeyir niyyətinə görə böyük .mükafatla mükafatlandırılır

Əksinə, kafir şəxs Allaha inanmadığından və əməlinin cəzasından qorxmadığından onun vücudu çirkin fikirlər ocağıdır. O daim hansısa pis bir iş görmək haqqında düşünür. Hansısa maneələrə görə həmin çirkin niyyətlərini həyata keçirə bilməsə də, onun niyyəti çirkinliyində qalır. Ona görə də həzrət buyurur ki, kafirin niyyəti onun əməlindən (də pisdir. Haqqında danışdığımız hədis imam Baqir (ə) tərəfindən nəql olunmuşdur.(۲

SON



---

.Kafi”, c. ۲, s. ۸۲“[۲۰۲] -۱

.Muhəccətul-bəyza”, c. ۸, s. ۱۱۰“[۲۰۳] -۲

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha məxsusdur.

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik


:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

